## Kitabı nəşrə hazırlayanlar:

***Vidadi Cəmil oğlu Xəlilov*** – pedaqogika üzrə elmlər doktoru, professor, Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycan Respublikasının əməkdar müəllimi, akademik M.Mehdizadə adına mükafat laureatı.

***Hidayət Ağakişi oğlu Musayev*** – tədqiqatçı biblioqraf. Azərbaycan Respublikasının Təhsil əlaçısı, "Qızıl qələm" və akademik M.Mehdizadə adına mükafat laureatı.

***Elmi redaktoru: Əjdər Ağayev*** – pedaqogika üzrə elmlər doktoru, professor, Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycan Respublikasının əməkdar müəllimi, Prezidentin fərdi təqaüdçüsü, akademik M.Mehdizadə adına mükafat laureatı.

Kitabda akademik, Azərbaycanın Əməkdar Elm Xadimi, pedaqoji elmlər doktoru, professor, 25 ilə yaxın bir müddətdə Respublikanın Maarif Naziri vəzifəsində ləyaqətlə çalışmış, maarif quruculuğunun müxtəlif mərhələlərində özünəməxsus müstəsna rolu olmuş Mehdi Məmməd oğlu Mehdizadənin nəsillərə nümunə olan pedaqoji fəaliyyətinin əsas istiqamətləri, heyrətamiz cəhəti işıqlandırılmışdır. Həmkarlarının, sənət adamlarının, yetirmələrinin bu böyük insan haqqında xatirələrinin bir qismi də kitabda öz əksini tapmışdır.

X $\frac{742000000}{079}$ 908 – 2012



## ÖN SÖZ

Azərbaycanda pedaqoji elminin, maarif quruculuğunun görkəmli xadimlərindən biri – Mehdi Məmməd oğlu Mehdizadə çox çətin, zəngin və şərəfli bir yol keçmiş, geniş, hərtərəfli elmi-pedaqoji fəaliyyəti ilə böyük rəğbət qazanmış, parlaq nümunə göstərmişdir.

O, 1920-ci ildə kənd qiraət komasının müdiri kimi əmək fəaliyyətinə başlamış, daha sonra kənd müəllimi, istedadlı metodist, maarif xadimi kimi çalışmış, xalq arasında savad, xeyirxahlıq toxumu səpmiş, bu sahədə fitri istedada malik olduğunu nümayiş etdirmişdir. M.Mehdizadə 30 ildən artıq bir müddətdə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji institutunda (indiki Azərbaycan Dövlət Pedaqoji Universitetində) assisent, dosent, kafedra müdiri, dekan, professor, prorektor və rektor vəzifələrində səylə çalışmış, peşə məharəti, şəxsiyyət zənginliyi ilə tanınmışdır.

Azərbaycan Respublikasının Maarif Nazirliyinə rəhbərlik etdiyi 25 ilə yaxın bir müddətdə M.Mehdizadə xalq maarifinin böyük təşkilatçısı məharəti ilə yanaşı, geniş diapazonlu bir pedaqoq alim kimi də tükənməz yaradıcılıq axtarışlarını davam etdirirdi.

Uzun illərdən bəri pedaqoji ictimaiyyət tərəfindən rəğbətlə qarşılanan və çoxlarının stolüstü kitabına çevrilən "Azərbaycan Sovet məktəbinin tarixinə dair xülasələr" (1958), "Məktəbdə təlim-tərbiyə işinin yenidən qurulmasının bəzi məsələləri" (1961), "Azərbaycan xalq maarifi yeni yüksəlişdə" (1967), "Azərbaycanda xalq maarifinin sürətli inkişafı" (1980), "Ümumtəhsil

məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" (1982) kimi bir sıra samballı monoqrafiyaların müəllifi akademik M.Mehdizadə nəinki respublikamızda və keçmiş SSRİ-də, eyni zamanda YUNESKO-nun konfrans, müşavirə və iclaslarındakı məruzə və çıxışları, habelə alman, ingilis, fransız, ispan, ərəb və s. dillərdə çap olunmuş jurnal məqalələri ilə beynəlxalq aləmdə də böyük nüfuz qazanmışdı. Azərbaycanı – Azərbaycan pedaqoji elmini, maarifini dünya miqyasında təmsil etmiş böyük vətənpərvər alimin həyatından, elmi yaradıcılığından bəhs edən tədqiqat əsərləri, o cümlədən tədqiqatçısı-biblioqraf H.Musayevin Respublika Elmi Pedaqoji Kitabxanasının xətti ilə 1992-ci ildə çap etdirdiyi "Akademik Mehdi Mehdizadə" biblioqrafik məlumat kitabçası (anadan olmasının 90 illiyi münasibətilə) bu böyük alimin, ictimai xadimin həyat və fəaliyyəti haqqında aydın təsəvvür yaradır. Məlumdur ki, adətən, görkəmli alimlərin, yazıçıların, sənətkarların həyatından, yaradıcılığından bəhs edən kitablar əlamətdar yubiley günlərində çap olunur. Bu cəhətdən M.Mehdizadənin həyatında, ömür yolunda qeyri-adi cəhətlər var. Belə ki, onun 50 illik (1953), 60 illik (1963), 70 illik (1973) yubileyləri respublikada maarif nazirliyinə rəhbərlik etdiyi dövrə təsadüf olunub. Şübhəsiz, həmin dövrlərin sərt qanunlarına görə vəzifəli şəxslərin yubileylərini keçirməkdən söhbət açmaq belə mümkün deyildi.

Akademik M.Mehdizadə 1980-ci ildə təqaüdə çıxdıqdan sonra Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda elmi məsləhətçi kimi fəaliyyət göstərərkən onun anadan olmasının 80, elmi-pedaqoji fəaliyyətinin 60 illiyi respublikanın pedaqoji ictimaiyyəti



tərəfindən 22 yanvar 1983-cü ildə təntənəli şəkildə qeyd olundu. Təəssüf ki, bu əlamətdar tədbirdən bir il sonra – 1 may 1984-cü ildə əzizimiz Mehdi müəllim vəfat etdi, haqq dünyasına qovuşdu.

29 yanvar 1993-cü ildə N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universitetində M.Mehdizadənin anadan olmasının 90 illiyi onsuz keçirildi. Həmkarları, görkəmli elm-sənət xadimləri, yetirmələri, Mehdi müəllimlə yaxın ünsiyyətdə olmuş, bir sahədə çalışmış adamlar bu böyük insan, qüdrətli vətəndaş haqqında ürək sözlərini, xatirələrini söylədilər.

Akademik M.Mehdizadənin keçdiyi mənalı ömür yolu nəsillərə nümunədir. Onun anadan olmasının 100 illiyi münasibətilə keçirilən tədbirlər də bu böyük insanın həyat və fəaliyyətinə həsr edildi.

Nazir əvəzi İsgəndər İsgəndərovun 16 may 2002-ci ildə imzaladığı 481 nömrəli əmrilə Azərbaycan Respublikasının Təhsil Naziri, fizika-riyaziyyat elmləri doktoru, professor, əməkdar elm xadimi M.C.Mərdanovun sədrliyi ilə xüsusi təşkilat komitəsi yaradıldı. 2003-cü ilin yanvar ayında Azərbaycan Dövlət Pedaqoji Universitetində SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü akademik Mehdi Mehdizadənin anadan olmasının 100 illiyinə həsr olunan elmi konfransın keçirilməsi qərara alındı. Pedaqoji mətbuatda bu böyük insanın, görkəmli ictimai xadimin, təhsil qurucusunun elmi-pedaqoji fəaliyyətini əks etdirən silsilə məqalələrin dərc olunması vacib sayıldı (həmin məqalələr kitabın xüsusi bölməsində əks etdirilir).

M.Mehdizadənin anadan olmasının 100 illiyi ayrı-ayrı elm-təhsil müəssisələrində də geniş qeyd olundu.

28 noyabr 2003-cü ildə Azərbaycan Müəllimlər İnstitutunda akademik Mehdi Mehdizadənin anadan olmasının 100 illiyinə həsr edilən elmi konfrans keçirildi. Görkəmli pedaqoq alimlər, təhsil işçiləri bu böyük elm–maarif xadiminin keçdiyi mənalı ömür yolunun heyrətamiz cəhətləri üzərində dayandılar.

Azərbaycan Müəllimləri Yaradıcı İttifaqının 6 dekabr 2003-cü ildə Bakının N.Nərimanov rayonundakı 177 nömrəli məktəbdə keçirdiyi tədbir də akademik M.Mehdizadənin anadan olmasının 100 illiyinə həsr olunmuşdu.

Azərbaycan Müəllimləri Yaradıcı İttifaqının sədri, professor Ramiz Məmmədzadənin, pedaqoji elmlər doktorları, professorlar Əjdər Ağayevin, Vidadi Xəlilovun, 177 nömrəli məktəbin direktoru Həqiqə Məmmədovanın və başqalarının çıxışları akademik M.Mehdizadənin keçdiyi mənalı ömür yollarını bir daha nəzərə çatdırdı.

8 dekabr 2003-cü ildə Respublika Təhsil Nazirliyində nazir, professor M.C.Mərdanovun rəhbərliyi ilə M.Mehdizadənin anadan olmasının 100 illiyinə həsr olunan müşavirə keçirildi. Müşavirəyə Cəbrayıl rayon İcra Hakimiyyətinin başçısı Mahmud Quliyev, rayon Təhsil Şöbəsinin müdiri Validə Həsənova, şöbənin baş mütəxəssisi Arif Xəlilov və digər aidiyyatı şəxslər dəvət olunmuşdular.

Müşavirədə 13 dekabr 2003-cü ildə akademik M.Mehdizadənin anadan olmasının 100 illiyi ilə əlaqədar Azərbaycan Dövlət Pedaqoji Universitetində keçiriləcək yubiley tədbiri ilə əlaqədar görülən işlər haqqında məlumat dinlənildi. Zalın tərtibatı, tədbirlə bağlı nəfis



şəkildə hazırlanan dəvətnamə-proqram və orada görkəmli elm-maarif xadiminin ömür yolunu əks etdirən yazı da bəyənildi. Lakin dekabrın 12-dən 13-nə keçən gecə Amerikadan ölkəmizə çatdırılan qara xəbər – ümummilli liderimiz Heydər Əlirza oğlu Əliyevin uzun sürən xəstəlikdən sonra vəfatı xəbəri nəzərdə tutulan yubiley tədbirinin ikinci hissəsini təxirə saldı. Bununla belə 2003-cü ilin 13 dekabrında Təhsil Nazirliyinin şöbə müdirlərinin, habelə pedaqoji ictimaiyyətin tanınmış nümayəndələrinin iştirakı ilə akademik Mehdi Mehdizadənin dəfn edildiyi ikinci Fəxri Xiyabanda onun əziz xatirəsi anıldı. Ruhunun şad olması naminə dualar oxundu, ürək sözləri deyildi.

Akademik Mehdi Məmməd oğlu Mehdizadənin mənalı ömür yolu, həyatı və elmi-pedaqoji, ictimai fəaliyyəti həmişə diqqət mərkəzində olub. Təsadüfü deyil ki, Azərbaycan Respublikasının təhsil naziri, əməkdar elm xadimi, fizika-riyaziyyat elmləri doktoru, professor Misir Mərdanovun layihəsi əsasında hazırlanan və 2010-cu ildə «Bakınəşr» tərəfindən nəfis şəkildə çap olunan «Azərbaycanın təhsil nazirləri» kitabının «Azərbaycan xalq maarifi nazirləri» bölməsində Mehdi Mehdizadənin ömür yolu, elmi-pedaqoji və ictimai fəaliyyəti konkret faktlar, tarixi fotolövhələrin imkanları əsasında nəzərə çatdırılır (səh. 99-105).

«Azərbaycan müəllimi» qəzetinin 11 oktyabr 2011-ci il tarixli nömrəsində də Mehdi Mehdizadənin yaşadığı şərəfli ömür yolunu canlandıran xüsusi səhifə verilmişdir.

Yeri gəlmişkən, Mehdi müəllimin şəxsiyyətinə həmişə böyük qayğı və diqqətlə yanaşan, bu kitabın nəşri üçün öz xeyirxahlıq niyyətləri ilə çalışan həmkarlarımıza,

ali təhsil müəssisələrinin, rayon təhsil şöbələrinin rəhbərlərinə, müvafiq mütəxəssislərinə, o cümlədən, xatirə materiallarının toplanılmasında kömək göstərmiş "Azərbaycan məktəbi" jurnalı redaksiyasının, Azərbaycan Respublikası Xalq Təhsili Muzeyinin, "Nərgiz" nəşriyyatının əməkdaşlarına səmimi minnətdarlığımızı bildiririk. Güman edirik ki, bütün şüurlu həyatını, ömrünün 60 ildən çoxunu xalq maarifinin inkişafına, çiçəklənməsinə həsr edən böyük bir insanın, müəllimlər müəllimi akademik Mehdi Mehdizadənin həyatına, ömür yoluna, zəngin pedaqoji irsinə həsr edilən bu kitab böyük şəxsiyyətin həyat və fəaliyyəti nümunəsində sağlam nəsil tərbiyə etmək baxımından mühüm əhəmiyyət kəsb edəcək.





# ELMİ REDAKTORDAN: AKADEMİK M.MEHDİZADƏNİN ÖMÜR YOLU VƏ ELMİ-PEDAQOJİ FƏALİYYƏTİNİN ƏSAS MƏRHƏLƏLƏRİ

Pedaqogika elminin görkəmli nümayəndəsi, tanınmış ictimai xadim, SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycan Respublikasının əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor Mehdi Məmməd oğlu Mehdizadə 1903-cü ilin yanvar ayının 5-də dünyaya göz açmışdır. Onun doğulduğu Cəbrayıl qəzasının Daşkəsən kəndi böyük və abad idi. Kənddə molla məktəbini qurtaranlardan başqa dünyəvi təhsil görmüş savadlılar da var idi. Məmməd kişi də oğlunu savadlı görmək istəyirdi. O, arzulayırdı ki, oğlu Mehdi böyüsün, məktəb qurtarsın, doğma Daşkəsənə maarif işığı gətirsin, məktəb açıb kəndin uşaqlarına savad öyrətsin. 1914-cü ildə Azərbaycanın bir çox kəndlərində təlim rus dilində olan ibtidai məktəblər açıldı. Onlardan biri də Daşkəsən civarına düşmüşdü. Mehdi ibtidai məktəbə daxil olanda artıq onun on bir yaşı var idi. Üç il sonra rus çar imperiyasının süqutu ilə əlaqədar olaraq, Azərbaycan kəndlərindəki azəri türklərinin oxuduqları rus dilli məktəblər buraxıldı. Yeni yaranan müstəqil Azərbaycan Demokratik Cümhuriyyəti tədris ana dilində olan məktəbləri bərpa etdi. Mehdiyə xoşbəxtlik nəsib oldu. O, maddi çətinlik çəksə də, 1919-cu ildə 16 yaşında müstəqil Azərbaycan Dövlətinin milli ibtidai məktəbinin ilk məzunlarından idi. Lakin çox çəkmədi ki, millət

balalarının müstəqil Azərbaycan Cümhuriyyətinə xidmət etmək arzuları ürəklərində qaldı. 1920-ci ilin aprelində Sovet Rusiyası imperiyasının qırmızı ordu dəstələri Azərbaycanı işğal etdi, müstəqil Azərbaycan dövlətini devirdi. Azərbaycanda Sovet hökuməti yarandı. Yerli xalqı narazı salmamaq üçün məktəblərin ana dilində olması davam etdirildi, savadsızlığın aradan qaldırılması üçün bir sıra tədbirlər həyata keçirilməyə başlandı. Bu zaman gənc Mehdi həvəslə mədəni quruculuq işlərinə girişir. 1920-ci ilin noyabrında doğma Daşkəsən kəndində qiraət komasının müdiri kimi müxtəlif mədəni tədbirlər həyata keçirməyə başlayır. Lakin Mehdi müəllim olmaq, millət balalarına dərs demək, bilik öyrətmək arzusundan əl çəkə bilmir. Altı aylıq pedaqoji kursların açılması onun arzusunu yerinə yetirməyə imkan yaradır. Gənc Mehdi böyük həvəslə Cəbrayıldakı pedaqoji kursa daxil olub orada oxuyur. Pedaqoji kursu bitirdikdən sonra müəllim kimi Daşkəsəndə doğma kənd məktəbində işləməyə başlayır. Azərbaycanda sovet tədris ilinin ikinci ili Mehdi müəllimin pedaqoji fəaliyyətinin başlanğıc ili olur. O, 1921-ci ilin oktyabr ayını – uşaqlığından qəlbində bəslədiyi müəllim olmaq arzusuna çatdığı həmin ayı həm də sonrakı bütün uğurli pedaqoji fəaliyyətinin təməli hesab edərək həmişə sevinc hissi ilə xatırlayardı. O zamandan başlayaraq, gənc Mehdi ömrünü sonsuz məhəbbətlə, böyük maraqla müəllimlik işinə həsr edir. Müdiri olduğu birinci dərəcəli məktəbdə təlim-tərbiyə işini yüksək səviyyəyə qaldırır. Kəndli balalarını sevə-sevə, əzizləyə-əzizləyə məktəbə cəlb edir, onlar üçün dəftər-kitab, kağız-qələm tapıb gətirir, ciddi-cəhdlə onlara savad öyrədir, kövrək, kiçik ürəklərə əsl müəllim ürəyinin



nəhayətsiz məhəbbətindən pay verir. Mehdi müəllim həm öyrədir, həm də öyrənir. Özünütəhsillə çox ciddi məşğul olur. Əlinə düşən kitabları acgözlüklə oxuyur, peşə savadını artırır. Az keçməmiş öz işində böyük müvəffəqiyyət qazanır. 1923-cü ilin fevralında Azərbaycan Xalq Maarif Komissarlığının inspektoru, görkəmli maarif xadimi C.Cuvarlı Mehdi Mehdizadənin müdiri olduğu birinci dərəcəli məktəbdə yoxlama aparır və bu müvəffəqiyyətlərin şahidi olur. Yüksək tədris nəticəsinə görə qəzanın 6 müəllimini, o cümlədən, gənc müəllim M.Mehdizadəni mükafatlandırırlar.

Artıq müəyyən pedaqoji təcrübəyə və nəzəri hazırlığa yiyələnmiş Mehdi müəllimdə yeni arzu oyanır: tam pedaqoji təhsil almaq. 1923-cü ilin mayında Cəbrayıl qəzasından Bakıya üç aylıq ali pedaqoji kursa yeddi müəllim göndərilir. Onlardan biri Mehdi Mehdizadə idi. Lakin bu kurs da onun öyrənmək təlabatını ödəmir. Buranı bitirən kimi Qəza Xalq Maarif Şöbəsinin icazəsi ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun hazırlıq kursuna daxil olur. Hazıqlıq kursunun sonunda imtahan verərək fizika-riyaziyyat fakultəsinin birinci kursuna qəbul edilir. Ali təhsil Mehdi Mehdizadənin istər fizika və riyaziyyat elmləri üzrə, istərsə də ideya-mənəvi inkişafına güclü təsir göstərir. O, institutun ictimai həyatında fəal iştirak edir, tələbə nümayəndəsi kimi formalaşır.

1926-cı ildən sonra Mehdi Mehdizadənin müəllimlik fəaliyyətinin ikinci mərhələsi başlanır. O, ali təhsilli fizika və riyaziyyat müəllimi kimi Cəbrayıl qəzasının Qaryakin (indiki Füzuli) şəhərindəki ikinci dərəcli məktəbdə (orta təhsil verən məktəb – red.) pedaqoji işini davam etdirir.

M.Mehdizadə yalnız tədris-metodik işlərlə deyil, ümumpedaqoji problemlərlə maraqlanır. Buna görə də qəza metodbürosunun sədrliyini də rəsmi olaraq ona tapşırırlar. O, müəllim işləməklə bərabər, qəza metodik mərkəzinə böyük həvəs və məharətlə rəhbərlik edir. Müəllimlər arasında, qəza müəllimlərinin konfranslarında, ayrı-ayrı məktəblərdə ümumpedaqoji və metodik istiqamətlərdə iş aparır, söhbətlər keçirir. O, ibtidai məktəblərin yeni proqramları, təlim metodları, məktəbin həyatla əlaqəsi və o dövrün digər aktual problemləri haqqında göstərişləri ilə qəza müəllimlərinin işinə metodik yardım göstərir. Qəzada olduğu kimi, Respublika Xalq Maarif Komissarlığında da M.Mehdizadənin pedaqoji və ictimai fəaliyyəti yüksək qiymətləndirilir. 1930-cu ilin martında onu Azərbaycan Xalq Maarif Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və Xalq Komissarının birinci müavini Ayna Sultanovanın köməkçisi təyin edirlər. Lakin M.Mehdizadə bu vəzifədə çox qalmır. Elmi-pedaqoji işə böyük maraq onu məzunu olduğu Azərbaycan Dövlət Pedaqoji İnstitutunun aspiranturasına gətirir. 1931-ci ilin sentyabrından onun elmi-pedaqoji fəaliyyəti başlayır. O, V.İ.Lenin adına APİ-də pedaqogikadan mühazirələr oxuyur. Elmi-pedaqoji fəaliyyətini, ictimai işlərdəki fəallığını getdikcə genişləndirir. Pedaqogika tarixinə, müasir təlim-tərbiyə məsələlərinə aid məqalələrlə dövrü mətbuatda çıxış edir. 1941-ci ildə ibtidai təhsilin məzmununa həsr edilmiş namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edir. 1942-ci ilin sentyabrından 1946-cı ilin iyununa qədər isə Sovet ordusu sıralarında xidmətdə olur, faşist işğalçılarına qarşı mübarizədə qanlı döyüşlərdə iştirak edir.



M.Mehdizadə ordudan tərxis edildikdən sonra V.İ.Lenin adına APİ-də elmi-pedaqoji fəaliyyətini davam etdirir. Onun ömrünün 30 ili məhz bu ali təhsil ocağı ilə bağlı olmuşdur. O, burada müxtəlif vəzifələr daşımış, doktorluq dissertasiyasını müdafiə etmiş (1956-cı il), pedaqogika professoru elmi adını almış, kafedra müdiri, dekan, elmi işlər üzrə diraktor müavini, direktor (rektor – red.) vəzifələrində çalışmışdır. 1952-ci ildə isə Azərbaycan Respublikasının Maarif Naziri vəzifəsinə təyin olunmuşdur və 25 ilə yaxın müddətdə (1952-1954: 1960-1980) respublikanın xalq maarifinə rəhbərlik etmişdir. Köksündə həmişə əsl müəllim ürəyi gəzdirən M.Mehdizadənin nazir işlədiyi dövrü onun pedaqoji fəaliyyətinin yeni mərhələsi adlandırsaq, yəqin ki, səhv etmərik. M.Mehdizadə nazir olduğu müddətdə xalq maarifimizin inkişafına böyük təşkilatçılıq əməyi sərf etmişdir. O, təhsilin yüksək peşəkarlıq səviyyəsində, elmi əsaslarla təşkili və idarə edilməsi sahəsində əsl nümunə göstərmişdir. Onun problemlərin həllində işə bələdliklə yanaşması, səbrli, təmkinli olması, şəxsi keyfiyyətləri ilə müdriklik, saflıq, təmizlik, işgüzarlıq nümunəsi göstərməsi xalq təhsili sahəsində çalışan digər işçilərin də bu keyfiyyətlərə yiyələnməsinə təsir göstərirdi.

Zəhmətsevərlik və xüsusi qabiliyyət Mehdi müəllim üçün qoşa qanad olub, onu zirvədən-zirvəyə uçurub. O, adi kənd müəllimi olanda da, metodist kimi tanınanda da, Pedaqoji İnstitutun rektoru səviyyəsinə qalxanda da, nazir işləyəndə də, pedaqoji elmlər doktoru, professor elmi dərəcəsi və adı alanda da, Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü olanda da (1967) sadəliyi, təvazökarlığı ilə seçilmiş, müəllimlərin və xalq təhsili

işçilərinin, alim həmkarlarının hörmət və ehtiramına layiq görülmüşdür. O, xidməti işini ictimai və elmi-pedaqoji fəaliyyəti ilə məharətlə əlaqələndirmiş, fəaliyyətinin əsas məqsədini pedaqogika elminə və xalq təhsilinin inkişafına xidmətdə görmüşdür. O, təhsil üzrə beynəlxalq əlaqələrin inkişafı sahəsində böyük işlər aparmışdır. 1961-1964-cü illərdə YUNESKO-nun təhsil üzrə komitələrindən birinin üzvü olmuş, inkişaf etməkdə olan dünya ölkələrində xalq maarifi quruculuğu təcrübəsinin yayılmasında fəal iştirak etmişdir. Polşada, Hollandiyada, Fransada, Afrika ölkələrində və digər yerlərdə pedaqoji elmin nailiyyətlərinin bəhrələrindən danışmışdır.

Görkəmli maarif xadimi və ictimai xadim kimi tanınan M.Mehdizadə Azərbaycan pedaqoji elminin inkişafında xüsusi mərhələ təşkil edir. O, 50 illik elmi yaradıcılıq fəaliyyətində təhsilin tarixi, nəzəri və əməli problemlərini diqqətlə araşdırmış, Azərbaycan pedaqoji elminin inkişafına qüvvətli təsir göstərmişdir. Onun respublikamızda məktəb quruculuğu, xalq maarifinin təşkili, təhsilin məzmununun, təlim metodlarının təkmilləşdirilməsi, tərbiyəvi işlərin səmərəliliyinin artırılması, xalq maarifinin idarə edilməsinin yüksəldilməsi sahəsindəki tədqiqatları pedaqoji ictimaiyyət arasında geniş yayılmış, əməli tətbiqi nəticələri ilə fayda vermişdir. Akademik M.Mehdizadənin elmi çıxışları Pedaqoji Elmlər Akademiyasının müşavirə və yığıncaqlarında, elmi şuralarda, respublika elmi-praktik konfranslarında, xalq maarifi işçilərinin müşavirələrində dərin məzmunu, elmiliyi, istiqamətvericiliyi ilə diqqəti həmişə cəlb etmiş, "Azərbaycan məktəbi", "Sovetsyaka pedaqoqika", "Narodnoye obrazovaniye" və digər



jurnallarda, toplularda dərc edilmiş məqalələri faydalılığı ilə seçilmişdir.

Akademik M.Mehdizadənin "Azərbaycanda sovet məktəbinin tarixinə dair xülasələr" (Azərbaycan və rus dillərində, Bakı, 1959; Moskva, 1962), "Azərbaycan xalq maarifi yeni yüksəlişdə" (Bakı, 1967), "Azərbaycanda xalq maarifinin sürətli inkişafı" (Azərbaycan və rus dillərində, Bakı, 1980), "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" (Bakı, 1982) kimi iri həcmli monoqrafiyaları və yüzdən artıq kitabça, jurnal məqaləsi Azərbaycan pedaqogikası elmində sanballı yer tutan əsərlərdir.

Alimin "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" monoqrafiyası məktəblilərin fəal həyat və idrak mövqeyi məsələlərini, onlarda ictimai və əmək fəallığının formalaşdırılması yollarını, təlim metodlarının təkmilləşdirilməsi və şagirdlərin müstəqil işinin səmərəli təşkili təcrübəsini geniş şəkildə əks etdirir.

Akademik M.Mehdizadə elmi maraq dairəsi geniş olan alimlərdən idi. Onun elmi əsərlərinin bir qismi Azərbaycanda 1920-ci ilə qədərki məktəb quruculuğu məsələlərinə, təhsilin təşkilinə, ayrı-ayrı pedaqoqların pedaqoji fəaliyyətinin öyrənilməsinə həsr edilmişdir. XIX əsrdə və XX əsrin əvvəllərində də Azərbaycanda pedaqoji fikir, mətbuat və təlim rus dilində olan məktəblərin tarixi, təhsilin məzmunu və digər məsələlərlə əlaqədar elmi-tədqiqat nəticələrindən yalnız Azərbaycanda deyil, Rusiyada nəşr edilən pedaqoji fikir və məktəb tarixinə aid elmi nəşrlərdə, oçerklərdə geniş istifadə edilmişdir. O, ilk dəfə olaraq Azərbaycanda və eləcə də bütün Qafqazda

fəaliyyət göstərən təlim rus dilində olan məktəbləri rus məktəbləri adlandırmış, onun açılmasını çar Rusiyasının siyasi məqsədləri, istilaçılıq niyyəti ilə əlaqələndirmişdir. Eyni zamanda, rus məktəblərinin cəmiyyətdəki mütərəqqi rolunu da göstərmişdir.

M.Mehdizadə görkəmli pedaqoq Rəşid bəy Əfəndiyevin həyatı və pedaqoji fəaliyyətinin tədqiqi sahəsində də əvəzsiz xidmət göstərmişdir.

Alimin ən böyük xidmətlərindən biri Azərbaycanda məktəb tarixinin 1920-ci ildən sonrakı dövrünün öyrənilməsi ilə bağlıdır. Xüsusilə keçən əsrin 20-30-cu illərindəki təhsil quruculuğu axtarışları, birinci və ikinci dərəcəli məktəblərindən vahid əmək politexnik məktəblərə doğru inkişaf, müxtəlif təlim metodlarının tətbiqi, kompleks proqramlar və digər mühüm pedaqoji məsələlərin həlli onun tədqiqatlarının aparıcı qollarını təşkil edir.

Akademik M.Mehdizadənin əsərlərinin xeyli qismi bilavasitə təlimin təşkili, dərsin qurulması və aparılması, ayrı-ayrı fənlərin öyrənilməsi mexanizminin açılmasına, təlim-tərbiyə prosesinin pedaqoji ustalıqla, yaradıcılıqla qurulmasından irəli gələn digər məsələlərin şərhinə aiddir. O, öz əsərləri ilə dövrünün pedaqoji salnaməsini yaratmış, təhsil quruculuğu tarixini yazmışdır. Onun Azərbaycanda məktəb işi təcrübəsindən bəhs edən monoqrafiyası başqa müəlliflərlə birlikdə 1984-cü ildə YUNESKO xətti ilə ingilis, fransız, rus və digər dillərdə nəşr edilmişdir.

M.Mehdizadənin tədqiqatlarının bir qismi qabaqcıl müəllimlərin iş təcrübəsinin öyrənilməsi, ümumiləşdirilməsi və yayılması ilə sıx bağlıdır. O, təlimin texniki vasitələrindən istifadəyə, təlimin həyatla, təsərrüfat



quruculuğu ilə əlaqələndirilməsinə, şagirdlərin peşəyönümü işinə, məktəbdə tədris edilən dillərin mükəmməl öyrədilməsi məsələlərinə xüsusi diqqət yetirmişdi. Təsadüfi deyildir ki, onun apardığı hər bir kollegiya iclası pedaqoji iş sahəsində nəyisə ümumiləşdirir, nəyisə öyrədir, nəyisə proqnozlaşdırırdı. M.Mehdizadə öz ətrafında çoxsaylı yaradıcı müəllimləri, pedaqoq alimləri, metodistləri birləşdirmişdi. Hər ay çağırdığı geniş elmi yığıncaqlarda əvvəlcə öz həmkarlarını dinlər, sonra isə özünün yeni pedaqoji ideyaları ilə onları tanış edərdi. Zahid Şöyübov, Mustafa Salamov, Məhər Quliyev, Humay Həsənzadə, Mustafa Mustafayev, Sona Tağıyeva, Zara Safarova, Rima Hənifəyeva, Raisa Tahirova, Zərbəli Səmədov kimi adlı-sanlı müəllimlər, məktəb rəhbərləri ondan çox şey öyrənmişlər. Nurəddin Kazımov, Zahid Qaralov, Yəhya Kərimov, Yusif Talıbov, Bəşir Əhmədov, Şəmistan Mikayılov, Vidadi Xəlilov, Rəfiqə Mustafayeva, Zəhra Əliyeva kimi məşhur pedaqoq alimlər onun pedaqoji məktəbindən qidalanaraq yeni-yeni uğurlar qazanmış, elmi-pedaqoji fəaliyyətləri ilə tanınmışlar.

Bu sətirlərin müəllifi də Mehdi Mehdizadə "dərslərində" iştirakçı olduğu üçün ömrü boyu ona minnətdar olacaqdır.

M.Mehdizadə tədqiqatlarının digər bir qismini onun xalq maarifinin idarə edilməsinə həsr edilmiş əsərləri təşkil edir. O, bu sahədə yalnız Azərbaycanda deyil, Rusiyada, Ukraynada, Belorusiyada, Orta Asiyada, Baltikyanı və digər respublikalarda hamının hesablaşdığı tədqiqatçılardan sayılırdı. Rusiyada təhsilin inkişafında xüsusi xidməti olan M.Prokofyev məruzə və çıxışlarında,

məqalələrində M.Mehdizadənin adını görkəmli pedaqoqların ilk sırasında çəkərdi. Dünya şöhrətli pedaqoqlardan M.Skatkin, İ.Lerner, M.Maxmutov, Ə.İzmaylov, M.F.Şabayeva və başqaları onunla dostluq əlaqələri saxlayır, Azərbaycanda təlim-tədris işi ilə onun əsərləri vasitəsi ilə tanış olurdular.

M.Mehdizadə təhsilin məzmununun dövrün sosial, iqtisadi, elmi, texniki tələbatına cavab verməsinə xüsusi diqqət yetirərdi. O, tədris planlarının, fənn proqramlarının, dərsliklərin yüksək keyfiyyətlə, elmi-pedaqoji əsaslarla yaradılmasına, təhsil ocaqlarının dövlət sənədləri ilə vaxtında təchiz olunmasına həmişə səy edərdi. Təsadüfi deyildir ki, elmi yaradıclığında dərslik yaratmaq fəaliyyəti ayrıca yer tutur. Onun yaxından iştirakı və müəllifliyi ilə hazırlanmış iki hissədən ibarət "Pedaqogika" dərsliyi 1941, 1958-1959-cu illərdə nəşr edilmiş, uzun illər azəri türkü tələbələrinin istifadə etdiyi yeganə dərs vəsaiti olmuşdur. O, yüksək ixtisaslı elmi-pedaqoji kadrların yetişməsi üçün də əlindən gələni əsirgəməmişdir. Onun rəhbərliyi ilə bir neçə doktorluq və namizədlik dissertasiyası müdafiə edilmişdir. Moskva, Tbilisi, Bakı və digər şəhərlərdəki elm və təhsil ocaqlarının elmi şuralarında müdafiə edilən namizədlik və doktorluq dissertasiyalarına opponent olmuşdur.

M.Mehdizadə 1980-ci ildən təqaüdə çıxaraq sırf elmi yaradıcılıq işinə qoşulmuşdur. Az müddətdə məktəbli şəxsiyyətinin hərtərəfli inkişafından bəhs edən monoqrafiyasını çap üçün Moskvanın "Pedaqoqika" nəşriyyatına təqdim etmişdi. 1982-ci ildə Bakıda "Maarif" nəşriyyatında təlim-tərbiyə işinin təkmilləşdirilməsi yollarından bəhs edən iri həcmli monoqrafiyası çap



edilmişdi. Azərbaycan pedaqoji fikir antologiyasının redaksiya heyətində kitabın giriş məqaləsini yazmağa başlamışdı. "Azərbaycanda məktəb təhsili və pedaqoji fikrin inkişafı" adlı əsərini böyük həvəslə yazırdı. O, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnsititutunun elmi məsləhətçisi kimi elmi-tədqiqat problemlərinin seçilməsi və planlaşdırılmasında yaxından iştirak edir, gənc alimlərə məsləhətlər verir, xalq maarifinin və pedaqoji elmin aktual məsələləri ilə əlaqədar tədbirlərin təşkilində və keçirilməsində fəallıq göstərir, o zamankı SSRİ PEA-nın müxtəlif komissiyalarına rəhbərlik edirdi. Lakin amansız ölüm böyük alimin yaradıcılıq axtarişlarını davam etdirməyə imkan vermədi. 1984-cü ilin may ayının 1-də dünyasını dəyişdi, əbədilik dünyasına qovuşdu. O, öz iştirakı ilə hazırlanan Azərbaycan pedaqoji fikir antologiyasına pedaqoji fikrimizin görkəmli nümayəndəsi kimi daxil oldu.

Akademik M.Mehdizadənin böyük şəxsiyyəti, zəngin pedaqoji irsi haqqında sahə mütəxəssislərində aydın təsəvvür yaratmaq məqsədilə çap olunan bu kitab vasitəsilə Mehdi müəllimlə mənən bir daha görüşür, saf su kimi təmiz, büllur kimi parlaq şəxsiyyətin zəngin mənəviyyatı qarşısında baş əyirik! Ruhun şad olsun, - deyirik, - ustad! Sənin yaratdıqlarından, xoş əməllərindən, ömür yollarından yaranan bu kitab yetirmələrindən sənə bir ərmağandır. Ümid edirik ki, Sənin zəngin pedaqoji irsini dərindən tədqiq edən Aəzrbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər institutunun aspirant və dissertantları hələ pedaqoji ictimaiyyətimizə bəlli olmayan bir sıra mətləbləri də aşkar edəcəklər. Sən bizdən uzaqlaşdıqca, biz sənə yaxınlaşırıq. Sənin cismən yoxluğunu duyduqca, varlığına

ehtiyacımızı daha çox hiss edirik. Təsəllimiz əsərlərindir, yaratdıqlarındır, ülvi nişanələrindir. Bu gün Sənin ruhunla birgə onların başına toplaşmışıq. Ömrün mənalı həyatını həsr etdiyin millətinin ömrünə qovuşub qərinələrcə, əsrlərcə uzun olsun, USTAD!





# GÖRKƏMLİ ALİMLƏR, İCTİMAİ XADİMLƏR AKADEMİK M.MEHDİZADƏ HAQQINDA

Akademik Mehdi Məmməd oğlu Mehdizadə pedaqogika elminin korifeylərindən biri, maarif quruculuğunun görkəmli təşkilatçısı kimi tanınmışdı.

*M.A.PROKOFYEV,*
*Akademik, keçmiş SSRİ Maarif Naziri.*

Akademik M.Mehdizadə çox nadir istedada malik alim, müdrik el ağsaqqalı kimi SSRİ Pedaqoji Elmlər Akademiyası Rəyasət heyətində, akademiyanın həqiqi və müxbir üzvləri arasında böyük nüfuza malik idi.

*A.G.XRİPKOVA,*
*Akademik, keçmiş SSRİ PEA-nın vitse-prezidenti.*

Akademik M.Mehdizadənin pedaqogika elminin, pedaqoq alimlərin inkişafında, formalaşmasında böyük zəhməti, mühüm rolu olmuşdur.

*M.İ.KONDAKOV,*
*Akademik, keçmiş SSRİ PEA-nın prezidenti.*

Akademik M.Mehdizadə müdrik insan, çox böyük nəzəriyyəçi pedaqoq alim və etibarlı məsləhətdaşımız idi.

*D.O.LORDKİPANİDZE,*
*Akademik, Gürcüstan Respublikasının əməkdar elm xadimi.*

Pedaqogikanın tarixi və nəzəriyyəsi sahəsində böyük alim kimi M.Mehdizadənin şöhrəti Azərbaycanın hüdudlarından çox-çox kənara çıxmışdır... Bu gözəl insanda xalq maarifinin böyük təşkilatçısı məharəti ilə böyük alimin tükənməz yaradıcı axtarışları son dərəcə uğurla uzlaşmışdır.

*Ə.E.İZMAYLOV,*
*Akademik, Qırğızıstan Respublikasının əməkdar elm xadimi.*





# MEHDİ MEHDİZADƏNİN HƏYATI VƏ ELMİ-PEDAQOJİ FƏALİYYƏTİNİN ƏSAS TARİXLƏRİ

Mehdi Məmməd oğlu Mehdizadə 1903-cü il yanvar ayının 5-də Cəbrayıl rayonunun Daşkəsən kəndində anadan olmuşdur.

1919-cu il – Daşkəsən kənd ibtidai məktəbini bitirmişdir.

Noyabr 1920-ci il – Daşkəsən kənd qiraət komasının müdiri kimi əmək fəaliyyətinə başlamışdır.

1921-ci il – Altı aylıq pedaqoji kursu bitirmişdir.

Sentyabr 1921-ci ildən – I dərəcəli Daşkəsən kənd məktəbində müəllim işləmişdir.

1923-cü il – Azərbaycan Pedaqoji İnstitutu yanında hazırlıq kursuna daxil olmuşdur.

1924-cü il - Azərbaycan Pedaqoji İnstitutunun fizika-riyaziyyat fakültəsinə daxil olmuşdur.

1926-cı il - Azərbaycan Pedaqoji İnstitutunu bitirmiş və Qaryagin (indiki Füzuli) şəhərində II dərəcəli məktəbə fizika və riyaziyyat müəllimi göndərilmişdir.

1927-ci il – Cəbrayıl qəza Xalq Maarif Şöbəsi yanında metodika bürosunun rəhbəri təyin edilmişdir.

Mart 1930-cu il – Azərbaycan Xalq Maarif Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və Xalq komissarının birinci müavini Ayna Sultanovanın köməkçisi vəzifəsinə təyin edilmişdir.

Sentyabr 1930-cu il - Azərbaycan Pedaqoji İnstitutunun aspiranturasına qəbul olmuşdur.

İyun 1933-cü il – Aspiranturanı bitirmişdir.

Avqust 1934-cü ildən APİ-də pedaqoji fakültənin dekanı vəzifəsində çalışmışdır.

1934-1937-ci illər – APİ-də elmi işlər üzrə direktor müavini vəzifəsində işləmişdir.

Fevral 1938 – iyun 1939-cu il – istintaqa cəlb edilmiş və bəraət almışdır.

İyun 1940-cı il – YİK (b)P sıralarına daxil olmuşdur.

1941-ci il – "Azərbaycan məktəblərində savad təliminin tarixi" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək pedaqoji elmlər namizədi alimlik dərəcəsi almışdır.

May 1941 – sentyabr 1942-ci il – APİ-də direktor müavini vəzifəsində çalışmışdır.

1942-1946-cı illər Sovet Ordusu sıralarında xidmət etmişdir.

1946-1950-ci illər – APİ-də kafedra müdiri, dekan, elmi işlər üzrə direktor müavini vəzifələrində çalışmışdır.

1950-ci il – 315-ci seçki dairəsindən Bakı Şəhər Sovetinə deputat seçilmişdir.

Azərbaycan KP XX qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilmişdir.

1950-1951-ci illər – APİ-nin direktoru olmuşdur.

Noyabr 1951-ci il – Bakı şəhər Soveti İcraiyyə Komitəsi sədrinin müavini vəzifəsinə seçilmişdir.

1951-ci il – Dəstəfur seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.

Mart 1952-ci il – Azərbaycan SSR Maarif Naziri vəzifəsinə təyin edilmişdir.



1954-1959-cu illər – "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" mövzusunda dissertasiya müdafiə edərək, pedaqoji elmlər doktoru alimlik dərəcəsi almışdır.

1957-ci il – APİ-nin professoru vəzifəsinə seçilmişdir.

29 aprel 1959-cu il – "SSRİ maarif əlaçısı" döş nişanı ilə təltif edilmişdir.

Sentyabr 1959-cu il – Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Komitəsi sədrinin birinci müavini təyin edilmişdir.

1960-cı il – Azərbaycan KP XXIV qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilmişdir.

Mart 1960-cı il – Azərbaycan SSR Maarif Naziri təyin edilmişdir.

17 noyabr 1960-cı il – Lenin ordeni ilə təltif edilmişdir.

1961-ci il – Azərbaycan KP XXV qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilmişdir.

218 № seçki dairəsindən Bakı Şəhər Sovetinə deputat seçilmişdir.

1961-1964-cü illər – YUNESKONUN təhsil üzrə komitələrindən birinin üzvü olmuşdur.

Aprel 1961-ci il – "Zaqafqaziyada yaşlı əhali arasında savadsızlığın ləğvi təcrübəsindən" adlı məqaləsi YUNESKO-nun Şərq ölkələri üzrə mətbuat orqanında Ərəb dilində çap olunmuşdur. (Məlumat redaksiyasının müəllifə göndərdiyi 20 may 1961-ci il tarixli məktubundan götürülmüşdür).

15-29 may 1961-ci il – YUNESKO-nun BMT İqtisadi Komissiyası ilə birgə müşavirəsində Sovet

müşahidəçisi kimi professor M.Mehdizadə və Beloded (Ukrayna) çıxış etmişdir.

19-27 iyun 1961-ci il – YUNESKO yanında Yaşlıların Təhsili üzrə Beynəlxalq Komissiyanın sessiyasında iştirak etmişdir.

"Afrika ölkələrində yaşlı əhalinin təhsilinin əsas məsələləri" adlı çıxışı Əddis-Əbəbə şəhərində YUNESKO-nun sənədlərində ingilis, fransız və ispan dillərində çap olunmuşdur. (Məlumat YUNESKO-nun qonorarın alınması ilə əlaqədar müəllifə göndərdiyi məktubdan götürülmüşdür).

1962-ci il – "Azərbaycan Sovet Məktəbinin tarixinə dair xülasələr" adlı monoqrafiyası Moskvada rus dilində nəşr olunmuşdur.

26-30 mart 1962-ci il – Afrika ölkələri maarif nazirlərinin Paris şəhərində keçirilən konfransında çıxış etmişdir.

1963-cü il – Xaldan seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.

1964-cü il – Azərbaycan KP XXVI qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilmişdir.

1966-cı il – "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif edilmişdir.

Azərbaycan KP XXVII qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilmişdir.

1967-ci il – Surra seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.

"Azərbaycan məktəb təhsili yeni yüksəlişdə" adlı monoqrafiyası rus dilində nəşr olunmuşdur.

9 avqust 1967-ci il – SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü seçilmişdir.



1968-ci il – II Ümumittifaq Müəllimlər qurultayının nümayəndəsi olmuş və orada çıxış etmişdir.

1971-ci il – Azərbaycan KP XXVIII qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilmişdir.

1972 ci il - ikinci dəfə "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif edilmişdir.

3 yanvar 1973-cü il – Böyüməkdə olan nəslin təlim və tərbiyəsi sahəsindəki xidmətlərinə görə "Krupskaya medalı" ilə təltif edilmişdir.

1975-ci il – Surra seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.

1976-cı il – Üçüncü dəfə "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif edilmişdir.

4-15 oktyabr 1976-cı il – SSRİ maarif işçiləri nümayəndə heyətinin tərkibində Niderlandda (akademik M.Mehdizadə, akademik M.Lebedev və V.İvanova) olmuşdur.

İyun 1978-ci il – Azərbaycan Müəllimlərinin VI qurultayında iştirak etmişdir.

29 iyun 1978-ci il – III Ümumittifaq Müəllimlər Qurultayına nümayəndə seçilmişdir.

1952-1984-cü illər – Qısa fasilələrlə "Azərbaycan məktəbi" jurnalı redaksiya heyətinin üzvü olmuşdur.

1976-1984-cü illər – Azərbaycan Sovet Ensiklopediyası Baş redaksiya heyətinin üzvü olmuşdur.

12 fevral 1980-ci il – Xalq Maarifi sahəsində uzun illər səmərəli işlədiyinə görə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilmişdir.

24 fevral 1980-ci il – Təqaüdə çıxması ilə əlaqədar olaraq Azərbaycan SSR Maarif Naziri vəzifəsindən azad edilmişdir.

1980-1984-cü illər – Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun elmi məsləhətçisi olmuşdur.

1980-ci il – "Azərbaycanda xalq maarifinin sürətli inkişafı" adlı (T.Allahverdiyev və Q.Əliyevlə birlikdə) monoqrafiyası Azərbaycan və rus dillərində nəşr edilmişdir.

31 avqust 1981-ci il – "Əmək veteranı" medalı ilə təltif edilmişdir.

1982-ci il – "Azərbaycan Respublikasının Əməkdar elm xadimi" fəxri adına layiq görülmüşdür.

"Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı monoqrafiyası Azərbaycan dilində kütləvi tirajla nəşr olunmuşdur.

1 may 1984-cü il – vəfat etmiş və Bakı şəhərindəki İkinci Fəxri Xiyabanda dəfn olunmuşdur.

1984-cü il – "Xalq maarifinin inkişafında Sovet Azərbaycanının təcrübəsi" (R.Avakov, Q.Əliyev, A.Atakişiyev və E.İsmayılov ilə birlikdə) kitabı YUNESKO tərəfindən (vəfatından sonra) ingilis və fransız dillərində kütləvi tirajla nəşr edilmişdir.





## AKADEMİK M.MEHDİZADƏNİN XATİRƏSİNİ ƏBƏDİLƏŞDİRMƏK ÜÇÜN HƏYATA KEÇİRİLMİŞ TƏDBİRLƏR

Alimin xatirəsini əbədiləşdirmək üçün Bakı şəhərinin küçələrindən birinə M.M.Mehdizadənin adı verilmişdir.

Bakı şəhər Xalq Deputatları Soveti Rəyasət heyəti akademik Mehdi Məmməd oğlu Mehdizadənin yaşadığı binaya (Mirzə Şəfi küçəsi, 19) xatirə lövhəsi vurulması haqqında xüsusi qərar (21.09.1993-cü il 17/165 saylı) vermişdir (lakin həmin qərar indiyədək yerinə yetirilməmişdir – tərtibçilər).

Azərbaycan Uşaq Fondu M.Mehdizadənin Azərbaycan maarifinin inkişafında böyük xidmətlərini nəzərə alaraq qərar qəbul etmişdir. Qərarda deyilir: "Azərbaycan Uşaq Fondunun respublikanın pedaqoji ali, orta ixtisas, texniki peşə, ümumtəhsil məktəblərində, eləcə də təmayüllü internat məktəblərində təhsil alan istedadlı tələbə və şagirdlərə verdiyi təqaüd "Akademik Mehdi Məmməd oğlu Mehdizadə adına təqaüd" adlandırılsın".

Azərbaycan Müəllimlərinin Yaradıcı İttiqafı 1995-ci ildə akademik Mehdi Mehdizadə adına mükafat təsis etmişdir.

Cəbrayıl rayonundakı 1 nömrəli şəhər orta məktəbinə akademik Mehdi Mehdizadənin adı verilmişdir.

Beyləqan rayonundakı 3 nömrəli şəhər orta məktəbinə akademik Mehdi Mehdizadənin adı verilmiş və orada onun büstü qoyulmuşdur.

Böyüməkdə olan nəslin təlim-tərbiyəsi sahəsində zəngin ənənələri ilə tanınan Gəncə şəhərindəki 4 nömrəli tam orta ümumtəhsil məktəbi akademik Mehdi Mehdizadənin adını daşıyır.

Akademik Mehdi Mehdizadə adına mükafat laureatları – pedaqoji elmlər doktoru, professor Vidadi Xəlilov, tədqiqatçı biblioqraf Hidayət Musayevin hələ 1997-ci ildə çap etdirdikləri "Akademik Mehdi Mehdizadə ömrünün işığı" kitabı indi də Mehdisevərlərin yoluna işıq tutur.

Azərbaycan Dövlət Televiziya Şirkəti professor Vidadi Xəlilovun ssenarisi əsasında "Əsrə bərabər ömür" filmini çəkərək dahi şəxsiyyətin nəsillərə nümunə olan ömür yoluna həsr etmişdir. Həmin film hazırda şirkətin qızıl fondunda saxlanılır.

Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun dissertantı Ramiz Əliyev pedaqoji elmlər doktoru, professor Əjdər Ağayevin rəhbərliyi ilə "Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti və pedaqoji görüşləri" mövzusunda namizədlik dissertasiyasını 2007-ci ildə müvəffəqiyyətlə müdafiə etmişdir. İnanırıq ki, bu cür tədqiqatlar sonuncu olmayacaq. Çünki ustadımızın elmi-pedaqoji, maarif quruculuğu sahəsindəki fəaliyyəti geniş və çoxcəhətlidir. Ayrı-ayrılıqda tədqiq olunmalıdır.





# AKADEMİK MEHDİ MEHDİZADƏ ADINA MÜKAFAT LAUREATLARI:

Görkəmli pedaqoq alim, akademik M.M.Mehdizadə adına mükafat Azərbaycan Müəllimlərinin Yaradıcı İttifaqı tərəfindən 1995-ci ildə təsis edilmişdir. Bu işə respublikanın görkəmli alimləri, dövlət təşkilatları və ictimai təşkilatlar, xeyriyyə cəmiyyətləri fəal cəlb olunmuşlar.

Mükafatın təsis olunmasında əsas məqsəd:

- Azərbaycan Respublikasının təhsil sisteminin yaradılmasında, ölkənin təhsil qanununun həyata keçirilməsində pedaqoq alimlərin, yaradıcı müəllimlərin fəal iştirakını təmin etmək, təlim-tərbiyə prosesinin aktual problemlərinin həllində öz dəyərli tədqiqatları ilə fərqlənən alimləri, yüksək göstəricilər qazanan yenilikçi, qabaqcıl təcrübə yaradan müəllimləri aşkar etmək;
- Ali məktəblərin professor-müəllim heyətini, ixtisasartırma və yenidənhazırlanma institutlarını, elmi-tədqiqat müəssisələrini, ümumtəhsil məktəbləri və digər təlim-tərbiyə müəssisələrində çalışan müəllim və tərbiyəçiləri təlim-tərbiyə ocaqlarına fəal köməklik göstərməyə, pedaqoji elmlərin nailiyyətlərini, qabaqcıl, yenilikçi iş təcrübəsi nümunələrini təbliğ etməyə cəlb etmək;
- Məktəbin yeniləşməsi prosesində fəal iştirak edən alim və müəllimləri maddi və mənəvi cəhətdən həvəsləndirməkdir.

Müsabiqəyə pedaqoq alimlərin son üç ildə hazırlanmış, dərc olunmuş, ölkəmizin tədris müəssisələrində təlim-tərbiyə işinin yeniləşməsi, habelə Təhsil Qanununun həyata keçirilməsi ilə bağlı ən yaxşı tədqiqat işləri təqdim edilir.

Praktik müəllimlərin qabaqcıl, yenilikçi, yüksək göstəricilər əldə etməyə imkan vermiş iş təcrübəsini əks etdirən materiallar (müəllimlərin iş təcrübəsini geniş əks etdirən elmi məruzə, əyani, didaktik materiallar, çap olunmuş əsərlər, rəylər və s.) Müəllimlərin Yaradıcı İttifaqının yerli bölmələri müvafiq şəhərin (rayonun) Təhsil Şöbəsinin rəyi əsasında təqdim edilir. Mükafata əsas etibarilə respublika səviyyəsində yayılmağa layiq bilinmiş, Pedaqoji Kadrların İxtisasının Artırılması və Yenidən hazırlanması Baş İnstitutunda müzakirə olunub bəyənilmiş iş təcrübəsi nümunələri təqdim olunur.

M.Mehdizadə Mükafatı Laureatı adı təhsil qurucusu, görkəmli alim, pedaqoq, akademik M.Mehdizadə irsini davam etdirən, pedaqoji-psixoloji problemləri Azərbaycan xalqının milli xüsusiyyətlərinə istinad edərək praktik fəaliyyətində və elmi əsərlərində Azərbaycan müstəqilliyi şəraitində məktəbin təlim-tərbiyə prosesinin yeniləşməsində, milliləşməsində fəal rol oynayan alimlərə, təcrübəli müəllimlərə təqdim olunur.

Müsabiqənin qaliblərinə Müəllimlərin Yaradıcı İttifaqının imkanları və xeyriyyəçilərin yardımı nəzərə alınaraq pul mükafatı və xüsusi laureat diplomu verilir. Həmin mükafatların ikisi alimlər, üçü isə ümumtəhsil məktəblərinin müəllimləri və tərbiyəçiləri üçün – dəqiq elmlərin tədrisi üzrə 1 mükafat, humanitar elmlərin tədrisi



üzrə 1 mükafat, tərbiyəçilər üçün 1 mükafat olmaqla nəzərdə tutulur.

Müsabiqənin qalibləri Müəllimlərin Yaradıcı İttifaqının Respublika Şurası tərəfindən təsdiq edilmiş görkəmli alimlərdən, müəllimlərdən ibarət münsiflər heyəti tərəfindən müəyyənləşdirilir.

Mükafat bir qayda olaraq "Müəllim günü" münasibətilə Yaradıcı İttifaqın rəhbərləri tərəfindən təntənəli şəraitdə təqdim olunur.

***Ramiz Məmmədzadə*** - Azərbaycan BPKİA və YHİ-nun rektoru, professor, Respublikanın Əməkdar müəllimidir; ***İlham Məmmədzadə*** - fəlsəfə elmləri doktorudur. Mükafat hər iki alimə pedaqoji sahədə səmərli fəaliyyətlərinə, "Xeyir və şər" arasında monoqrafiyasında mühüm fəlsəfi, etik pedaqoji problemlərin ilk dəfə geniş elmi tətbiqinə görə 1995-ci ildə verilmişdir.

***Sayad Rüstəmova*** – Binəqədi rayonu, 83 nömrəli litseyin Azərbaycan dili və ədəbiyyatı müəllimi, pedaqoji elmlər namizədidir. Təlim-tərbiyə prosesində, gənc nəslin mənəvi tərbiyəsində yüksək göstəricilərinə görə mükafata 1995-ci ildə layiq görülüb.

***Oqtay Məmmədov*** – Saatlı rayonu, I nömrəli şəhər orta məktəbinin riyaziyyat müəllimi, pedaqoji elmlər namizədidir. Riyazi biliklərin gənc nəslə mənimsədilməsi sahəsində yüksək göstəricilərinə görə mükafata 1995-ci ildə layiq görülüb.

***Əmiraslan Bəşirov*** – Yevlax şəhər 5 nömrəli orta məktəbin tarix müəllimidir. Gənc nəslin vətənpərvərlik tərbiyəsi sahəsində qazandığı nailiyyətlərinə görə mükafata 1995-ci ildə layiq görülüb.

***Həqiqə Məmmədova*** – Azərbaycan Müəllimlərin Yaradıcı İttifaqının sədr müavini, 264 nömrəli müəllif məktəbinin direktoru – məktəbdə təlim-tərbiyə prosesinin yeniləşməsi sahəsində səmərəli fəaliyyətinə və əldə etdiyi nailiyyətlərə görə mükafata 1995-ci ildə layiq görülüb.

***Ağanəcəf Quliyev*** – Maştağa Xeyriyyə Cəmiyyətinin sədridir. Milli təhsil sisteminin yaradılmasında, müəllim-şagird əməyinin qiymətləndirilməsində xeyriyyəçilik fəaliyyətinə görə mükafata 1995-ci ildə layiq görülüb.

***Nurəddin Kazımov*** – Pedaqoji elmlər doktoru, professor, Azərbaycan Respublikasının Əməkdar elm xadimidir. Pedaqogika sahəsində apardığı səmərəli tədqiqat işlərinə, pedaqoji elmlərin inkişafında böyük nailiyyətlərə və anadan olmasının 70 illiyi münasibətilə mükafata 1996-cı ildə layiq görülüb.

***Əbdül Əlizadə*** - Psixologiya elmləri doktoru, professordur. Son illərdə respublikamızda psixologiya elminin inkişafında görkəmli xidmətlərinə, "Məhəbbət aləmi", "Azərbaycan xalqının güzəranında məişət psixologiyası" əsərinə görə mükafata 1996-cı ildə layiq görülüb.

***Rəfiqə Mustafayeva*** – Pedaqoji elmlər doktoru, professor, Azərbaycan Respublikasının Əməkdar müəllimidir. Respublikada pedaqoji sahədə ixtisasartırma sistemində və orta məktəbdə səmərli fəaliyyətinə, təlim-tərbiyə prosesinin yeniləşməsi problemlərinə həsr olunmuş samballı tədqiqatlarına görə 1996-cı ildə mükafata layiq görülüb.

**"Azərbaycan müəllimi"** qəzetinin yaradıcı heyəti – Təhsil Qanununun yerinə yetirilməsində böyük xidmətlərinə, müəllimlərin bu işə səfərbər edilməsində



roluna, pedaqoji problemlərin obyektiv işıqlandırılmasına görə 1996-cı ildə mükafata layiq görülüb.

***Aleksandr Brosalin*** – Bakı şəhəri, Səbail rayonu, 6 nömrəli orta məktəbin fizika müəllimidir. Orta ümumtəhsil məktəbində fizikanın tədrisi sahəsində böyük nailiyyətlərinə, pedaqoji mətbuatda səmərli çıxışlarına görə 1996-cı ildə mükafata layiq görülüb.

***Həşim İsmayılov*** – Zaqatala rayonu, Sumaylı kənd orta məktəbində Azərbaycan dili və ədəbiyyatı müəllimi, pedaqoji elmlər namizədidir. Gənc nəslin təlim-tərbiyəsində böyük göstəricilərinə görə 1996-cı ildə mükafata layiq görülüb.

***Heybət Qədirov*** – Yardımlı rayonu, Alçabulaq kənd orta məktəbinin kimya müəllimdir. Orta məktəbdə kimya tədrisinin keyfiyyətinin yüksəldilməsində xidmətlərinə görə 1996-cı ildə mükafata layiq görülüb.

***Əhməd Seyidəhmədov*** – Qobustan rayonu, Ş.Şikarov adına Sündü kənd orta məktəbinin biologiya müəllimidir. Biologiyanın tədrisində yüksək göstəricilərinə görə 1996-cı ildə mükafata layiq görülüb.

***Əliheydər Həşimov*** – Pedaqoji elmlər doktoru, professor; ***Fərahim Sadıqov*** – pedaqoji elmlər doktoru, professor. Xalq pedaqogikası sahəsində son illərdə apardıqları samballı tədqiqat işlərinə, orijinal "Pedaqogika" dərsliyinə görə 1996-cı ildə mükafata layiq görülüblər.

***Hüseyn Əhmədov*** – Pedaqoji elmlər doktoru, professor, Rusiya Təhsil Akademiyasının həqiqi üzvüdür, Azərbaycanın Əməkdar Ali Məktəb İşçisidir. Pedaqogika tarixi və nəzəriyyəsi sahəsində apardığı tədqiqatlara, gənc

pedaqoqlar nəslinin yetişdirilməsində böyük fəaliyyətinə görə 1996-cı ildə mükafata layiq görülüb.

*Yəhya Kərimov* – Pedaqoji elmlər doktoru, professor, Azərbaycan Respublikasının Əməkdar müəllimidir. İbtidai siniflərdə ana dilinin tədrisinin yeniləşməsi sahəsində səmərəli fəaliyyətinə, yeni dərslik, proqram, metodik vəsaitlər yaradılması sahəsində xüsusi xidmətlərinə görə 1997-ci ildə mükafata layiq görülüb.

*Əjdər Ağayev* – Pedaqoji elmlər doktoru, prosfessor, Azərbaycan Respublikasının Əməkdar müəllimi. Səmərəli elmi-pedaqoji fəaliyyətinə və "Akademik Mehdi Mehdizadə ömrünün işığı" kitabının hazırlanmasında əməyinə görə 1998-ci ildə mükafata layiq görülüb.

*Vidadi Xəlilov* – Pedaqoji elmlər doktoru, professor. Səmərəli elmi-pedaqoji fəaliyyətinə və "Akademik Mehdi Mehdizadə ömrünün işığı" kitabının hazırlanmasında əməyinə görə 1998-ci ildə mükafata layiq görülüb.

*Bahadur Mehdiyev* – Qabaqcıl Maarif Xadimi, Cəbrayıl rayon Təhsil Şöbəsinin inspektoru. Ümumtəhsil məktəblərində tədris prosesinin təkmilləşdirilməsi sahəsində səmərəli pedaqoji fəaliyyətinə görə 1998-ci ildə mükafata layiq görülüb.

*Ataş Abdullayev* – Pedaqoji elmlər namizədi, dosent. Respublikamızın ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin yeniləşməsi sahəsində səmərəli elmi-pedaqoji fəaliyyətinə görə 1998-ci ildə mükafata layiq görülüb.

*Hidayət Musayev* – Azərbaycan Respublikasının Təhsil Əlaçısı. Təlim-tərbiyə prosesinin yeniləşməsi sahəsində maarifçilik işlərinə və "Akademik Mehdi Mehdizadə ömrünün işığı" kitabının hazırlanmasında əməyinə görə 1999-cu ildə mükafata layiq görülüb.



*Muxtar Həmzəyev* – Psixologiya elmləri doktoru, professor. Respublikamızda psixologiya elminin inkişafında xidmətlərinə və anadan olmasının 75 illiyinə görə 1999-cu ildə mükafata layiq görülüb.

*Yusif Talıbov* – Pedaqoji Elmlər doktoru, professor, Azərbaycan Respublikasının əməkdar müəllimi. Pedaqogika sahəsində apardığı səmərəli, dəyərli tədqiqat işlərinə görə və anadan olmasının 70 illiyi münasibətilə mükafata 2000-ci ildə layiq görülüb.

*Fərrux Rüstəmov* – Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü. Pedaqogika tarixi sahəsində apardığı sistemli tədqiqatlara və gənc pedaqoqlar nəslinin yetişməsində səmərəli fəaliyyətinə görə 2000-ci ildə mükafata layiq görülüb.

**"Azərbaycan məktəbi"** jurnalının yaradıcı heyəti – Respublikamızda pedaqoji mətbuatın flaqmanı olaraq elmi-pedaqoji fikrin inkişafında və geniş yayılmasında səmərəli fəaliyyətə görə 2001-ci ildə mükafata layiq görülüb.

*Nəcəf Nəcəfov* – Təhsil Nazirliyinin dərslik və nəşriyyat şöbəsinin müdiri, filologiya elmləri namizədi. Təhsil sisteminin yeniləşməsi və tədris vəsaitləri ilə təmin olunması sahəsində göstərdiyi səmərəli, elmi-pedaqoji fəaliyyətə görə 2003-cü ildə mükafata layiq görülüb.

*Bilal Həsənli* – Pedaqoji elmlər namizədi, dosent. Məktəbdə təlim-tərbiyə prosesinin yeniləşməsi sahəsində səmərəli elmi-praktik fəaliyyətinə görə 2003-cü ildə mükafata layiq görülüb.

*Malik Mirzəyev* – Coğrafiya elmləri namizədi, dosent. Məktəbdə təlim-tərbiyə işlərinin yeniləşməsi

sahəsində səmərəli elmi-pedaqoji fəaliyyətinə görə 2003-cü ildə mükafata layiq görülüb.

*Fatma Şahmərdanova* – Naxçıvan şəhərindəki Hərbi litseyin fizika müəllimi. Məktəbdə təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi və tədris etdiyi fənn üzrə qazandığı nailiyyətlərə görə 2003-cü ildə mükafata layiq görülüb.

*İltifat Bağırov* – Cəlilabad şəhər 8 nömrəli məktəbin sinif müəllimi. Məktəbdə təlim-tərbiyə prosesinin yeniləşməsi və təhsil islahatının həyata keçirilməsi sahəsində səmərəli fəaliyyətinə görə 2003-cü ildə mükafata layiq görülüb.





**“AKADEMİK MEHDİ MEHDİZADƏNİN PEDAQOJİ FƏALİYYƏTİ VƏ PEDAQOJİ GÖRÜŞLƏRİ” mövzusunda pedaqoji elmlər namizədi alimlik dərəcəsi almaq üçün Ramiz Cəlal oğlu Əliyevin müdafiə etdiyi dissertasiyanın**

## AVTOREFERATINDAN

Akademik Mehdi Məmməd oğlu Mehdizadənin mənalı ömür yolunu, elmi-pedaqoji fəaliyyətini işıqlandıran dissertasiyanın avtoreferatının əsas məzmunundan bəhs etməzdən əvvəl bu istiqamətdə pedaqogika nəzəriyyəsi və tarixi üçün zəruri olan bir sıra cəhətlərin üzərində dayanmaq istərdik. Əvvəla onu deyək ki, Mehdi müəllimin hələ sağlığında ikən ayrı-ayrı elmi məclislərdə onun haqqında dissertasiya işlərinin yazılması təklifi irəli sürülürdü. Lakin son dərəcə sadə və təvazökar insan olan akademik M.Mehdizadə bu haqda düşünmək belə istəmirdi. Heç şübhəsiz, bu böyük insanın vəfatından sonra bu məsələyə bir də qayıdıldı. Keçən əsrin 90-cı illərinin əvvəlində Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun direktoru, professor Zahid Qaralovun, elmi işlər üzrə direktor müavini professor Yəhya Kərimovun, Pedaqogikanın nəzəriyyəsi və tarixi şöbəsinin müdiri, professor Əjdər Ağayevin tövsiyəsi və təkidi ilə o vaxt Bakıdakı 17 nömrəli ümumtəhsil məktəbində tədris hissə müdiri vəzifəsində çalışan Ramiz Əliyevin “Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti və pedaqoji görüşləri” mövzusunda namizədlik dissertasiyası üzərində işləməsi lazım bilindi. Professor Əjdər Ağayev çox böyük razılıq hissi ilə tədqiqata rəhbərlik etməyi öz

üzərinə götürdü. Aradan xeyli vaxt keçməsinə baxmayaraq, Ramiz Əliyev həmin mövzuda dissertasiyanı 2006-cı ildə tamamladı. Şöbə müzakirəsindən sonra açıq müdafiəyə buraxılması qərara alındı. Həmin dövrdə institutda fəaliyyət göstərən dissertasiya şurasına təqdim olundu.

İndi həmin anları xatırlayarkən və əziz müəllimimiz-ustadımız akademik M.Mehdizadə ilə bağlı arxiv sənədlərinə baxarkən bir məktub diqqəti cəlb etdi. Elə bilirəm ki, 21 noyabr 2006-cı ildə yazılan həmin məktubu olduğu kimi nəzərə çatdırmaq yerinə düşər:

***N 02.191 dissertasiya şurasının nəzdində fəaliyyət göstərən elmi seminarın rəhbəri professor V.C.Xəlilova***

Hörmətli Vidadi müəllim!

Təhsil Problemləri İnstitutunun nəzdində fəaliyyət göstərən N 02.191 – pedaqoji elmlər üzrə dissertasiya şurasına Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun sabiq dissertantı Ramiz Cəlal oğlu Əliyevin "Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti və pedaqoji görüşləri" (13.00.01 – ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi ixtisası üzrə) mövzusunda namizədlik dissertasiyası daxil olmuşdur (Elmi rəhbəri: prof. Ə.Ə.Ağayev).

Dissertasiyada nəzərdən keçirilən problemin aktuallığını, elmi və praktik dəyərini, müdafiə şurasının profilinə uyğunluğunu nəzərə alaraq, onun elmi seminarda müzakirəsini təşkil etməyi Sizdən xahiş edirəm.

Hörmətlə,

N02.191

Dissertasiya şurasının sədri: prof. A.O.Mehrabov.



Təbii ki, akademik M.Mehdizadə ilə bağlı dissertasiya işinin bu mərhələyə çatması çox böyük marağa səbəb oldu. Dissertasiya 20 dekabr 2006-cı ildə elmi seminarda geniş müzakirə olunaraq açıq müdafiəyə təqdim edildi.

Dissertasiya şurasının 17 aprel 2007-ci il tarixli iclasında Ramiz Cəlal oğlu Əliyev "Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti və pedaqoji görüşləri" mövzusunda dissertasiyanı uğurla müdafiə edərək pedaqoji elmlər namizədi – indiki pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsinə layiq görüldü. Rəsmi opponenetlər pedaqoji elmlər doktoru, professor Fərrux Rüstəmov, professor Fikrət Seyidov dissertasiyanın mühüm nəzəri və praktik əhəmiyyətə malik olduğunu qeyd etdilər. Məhz belə bir cəhəti nəzərə alaraq dissertasiyanın avtoreferatından müvafiq hissələri nəzərə çatdırmağı məqsədəmüvafiq sayırıq.

**Tədqiqatın aktuallığı.** Təhsili millətin gələcəyi adlandıran ümummilli liderimiz H.Əliyevin təhsil quruculuğu sahəsində səy və təşəbbüsləri bu gün böyük nəticələr verir. Təhsilin inkişafına təkan verən təhsil islahatı layihələri innovasiyalara yol açır, müasir tələblərə, dövlət standartlarına cavab verəcək təhsil quruculuğunu meydana çıxarır. Tarixə çevrilmiş dünənki nailiyyətlərimiz müasir olan bu günkü keyfiyyətləri şərtləndirir. Təhsil tarixinin, pedaqoji fikrin, ayrı-ayrı görkəmli şəxsiyyətlərin ideyalarının, pedaqoji təcrübənin öyrənilməsi yeniliyin düzgün müəyyənləşdirilməsində mühüm əhəmiyyət kəsb edir.

M.F.Axundovun, M.T.Sidqinin, M.H.Rüşdiyyənin, S.M.Qənizadənin, R.B.Əfəndiyevin və digər maarif xadimlərinin əsərləri tariximizin zəngin səhifələrini təşkil edir.

XX əsrin əvvəllərində məktəb, təhsil, təlim işi sahəsində milli kadrların çox böyük əksəriyyəti müəllim kimi əməli fəaliyyət göstərən şəxslər idi və onlar elmi və metodik məqalələr, dərsliklər yazmaqla təhsilin inkişafına xidmət göstərirdilər. Ötən əsrin 30-40-cı illərindən başlayaraq Azərbaycanda sırf pedaqoji tədqiqatla məşğul olan, pedaqoji elmlər üzrə elmi dərəcəyə layiq görülən milli kadrlar yetişməyə başladı. Belə kadrlardan pedaqoji elmlər doktoru, professor Əhməd Seyidov, akademik, pedaqoji elmlər doktoru, professor Mehdi Mehdizadə, professor Mərdan Muradxanov həm ilkinlər sırasında olmaları, həm də daha önəmli fəaliyyət göstərmələri ilə diqqəti cəlb edirlər. Onların hər birinin elmi-pedaqoji yaradıcılıq irsinin araşdırılıb, təhlil edilməsi, ideyalarının sistemə salınması, öz dövrlərində gördükləri səmərəli işlərin nəticələrinin üzə çıxarılması və hazırkı inkişaf mərhələsində istifadə imkanlarının müəyyənləşdirilməsi həm elmi-nəzəri, həm də praktik baxımdan xüsusi əhəmiyyət və aktuallıq kəsb edir.

Akademik M.Mehdizadənin fəaliyyəti, təhsilin və pedaqogika elminin inkişafında mövqeyi daha geniş və çoxistiqamətlidir. Çünki o, sırf pedaqoq-tədqiqatçı, orta məktəb müəllimi, ali məktəb professoru, elmi kadrlar hazırlayan rəhbər olmaqdan əlavə, uzun illər Azərbaycan maarifinə rəhbərlik etmiş, Maarif Naziri vəzifəsini daşımışdır. Bir təhsil mütəxəssisi kimi yalnız o zamankı SSRİ-də deyil, beynəlxalq aləmdə də tanınmışdır.



Alim–pedaqoqun diqqətini ilk cəlb edən problemlərdən biri Azərbaycanda ibtidai təhsilin və sovet məktəbi tarixinin XIX əsrin sonu XX əsrin əvvəllərində fəaliyyət göstərmiş görkəmli pedaqoqların irsinin araşdırılması olmuşdur. O, namizədlik və doktorluq dissertasiyalarını məhz tarixi mövzulara həsr etmişdir.

Akademik M.Mehdizadənin əsərlərinin xeyli qismini təhsilin məzmunu, təlimin təşkili, dərsin qurulması və aparılması, ayrı-ayrı fənlərin tədrisi – didaktika məsələləri təşkil edir. O, həmçinin tərbiyəyə aid, xüsusilə şəxsiyyətin hərtərəfli inkişafı, fəal həyat mövqeyi, əmək tərbiyəsi məsələlərinə aid sanballı tədqiqat əsərləri yaratmışdır.

M.Mehdizadənin tədqiqatlarının bir qismi qabaqcıl müəllimlərin iş təcrübəsinin öyrənilməsinə həsr edilmişdir. Qeyd etməliyik ki, alim təhsilin idarə edilməsinə aid əsərləri ilə də diqqəti cəlb etmiş, sovet pedaqogikasına qiymətli töhfə bəxş etmişdir.

M.Mehdizadənin elmi-pedaqoji irsi, elmi-ictimai fəaliyyəti sağlığında və ölümündən sonra yüksək qiymətləndirilmişdir. Bundan əlavə, tədqiqatçılar bu və ya digər problemlə əlaqədar araşdırmalar apararkən, müəllimlər öz iş təcrübələrində M.Mehdizadənin əsərlərindən etibarlı mənbə kimi istifadə etmişlər və edirlər.

M.Mehdizadənin elmi-pedaqoji irsi və pedaqoji fəaliyyəti ayrı-ayrı məqalələrdə və müəyyən problemlərlə əlaqədar şərhlərdə əks etdirilmiş, onun pedaqoji fikirlərinə münasibət bildirilmiş və elmi əhəmiyyəti göstərilmişdir.

Keçmiş SSRİ PEA-nın həqiqi və müxbir üzvləri N.Qonçarov, M.Prokofyev, Ə.İzmaylov, H.Əhmədov, M.Kondakov, M.Maxmutov, D.Lordkipanidze və başqa

görkəmli alimlər M.Mehdizadənin pedaqogika elmində və təhsil quruculuğundakı xidmətlərindən, pedaqoji ideyalarından bəhs etmiş, onu yüksək qiymətləndirmişlər.

Azərbaycanda M.Mehdizadənin elmi-pedaqoji fəaliyyəti və yaradıcılıq irsi haqqında M.Muradxanov, Ə.Həşimov, Y.Talıbov, Ə.Ağayev, Z.Qaralov ilk araşdırma nəticəsi olan məqalələrini müxtəlif illərdə nəşr etdirmişlər.

M.Mehdizadə haqqında ilk kitab 1992-ci ildə "Akademik M.Mehdizadənin biblioqrafiyası" adı ilə nəşr olunmuşdur. Kitabda Ə.Ağayevin alimin həyat və fəaliyyətindən bəhs edən məqaləsi onun haqqında yazılmış ilk tədqiqi materialdır. Daha sonra 1998-ci ildə V.Xəlilov, H.Musayev M.Mehdizadə haqqında yazılmış məqalə və xatirələri toplayaraq iri həcmli "Akademik Mehdi Mehdizadə ömrünün işığı" adlanan kitab nəşr etdirmişlər. Bu kitabda alim haqqında çox dəyərli fikirlər, onun insani keyfiyyətlərini və elmi ideyalarını aşkarlayan faktlar vardır. Bütün bunlar tədqiqat işi deyil, daha çox təəssürat və xatirələrdir. Tədqiqatçı F.Rüstəmovun "Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri (1920-1991-ci illər)" kitabında isə M.Mehdizadənin problemlərə uyğun olaraq pedaqoji ideyalarına toxunulmuş, pedaqoji elmin inkişafında xidmətlərindən bəhs edilmişdir.

M.Mehdizadənin pedaqoji görüşlərinin xüsusi tədqiqat aparılaraq öyrənilməsinə ehtiyac vardır. Bu işin görülməsi M.Mehdizadənin pedaqoji elmin inkişafında mövqeyini konkret aşkarlamaqla bərabər, onun müasir əhəmiyyətini meydana qoyar və Azərbaycanda pedaqogika elminin zənginləşməsinə yardımçı olar.



M.Mehdizadənin Azərbaycanda təhsilin və pedaqogika elminin inkişafında xüsusi rolu olmasına baxmayaraq, yaradıcılığı hələ də tədqiqat obyekti olmamış, dərindən öyrənilməmişdir. Məhz buna görə də bu irsin tarixi rolunu və müasir əhəmiyyətini nəzərə alaraq "Akademik Mehdi Mehdizadənin pedaqoji fəaliyyəti və pedaqoji görüşləri" mövzusunda dissertasiya yazmağı zəruri hesab etdik.

Əsərin I fəsli **"XX əsrin I yarısında Azərbaycan Respublikasında ictimai-siyasi vəziyyət və təhsil məsələlərinə bir nəzər"** adlanır.

Hər bir xalqın sosial-iqtisadi, mədəni-mənəvi inkişafına ayrı-ayrı dövrlərdə mövcud olan ictimai-siyasi vəziyyət müəyyən təsir göstərir. Belə ki, təhsilin bir ölkə daxilində inkişafı həmin ölkədəki ictimai-siyasi vəziyyətlə, sosial-iqtisadi islahatlarla sıx bağlıdır. Bu proses ayrı-ayı görkəmli şəxsiyyətlərin formalaşmasında, onların konkret baxışlara yiyələnməsində, praktik fəaliyyət istiqamətinin müəyyənləşməsində mühüm rol oynayır. Pedaqoji irsini tədqiqat obyekti seçdiyimiz Mehdi Mehdizadə də yaşadığı dövrdə formalaşmış bir şəxsiyyətdir. Buna görə də onun yaşadığı, təhsil aldığı, fəaliyyət göstərdiyi dövrün səciyyəsini verməyi zəruri hesab edirik. Əvvələn, Mehdi Mehdizadənin doğulduğu il (1903) XX əsrin əvvəllərində mövcud olan özünəməxsus cəhətlərlə müşayiət olunur. O zaman Rusiyada baş verən hadisələr onun tərkibinə qatılmış Şimali Azərbaycan üçün də xarakterik idi. Xüsusilə, 1905-1907-ci illər hadisələri ziyalılar arasında demokratik baxışların yüksəldiyi bir dövr idi. Bu illərdə Azərbaycanda sənaye, xüsusilə neft sənayesi sürətlə inkişaf edirdi. Mehdi Mehdizadənin

anadan olduğu Daşkəsən kəndində filiz istehsalı sənayesi mövcud idi. Tarixdən bəlli olduğu kimi, bu illərdə fəhlələrin inqilabi hərəkatı özünü göstərirdi. Söz və mətbuat azadlığı ideyaları yayılırdı. Mehdi Mehdizadənin yazdığı kimi, 1905-1907-ci illər inqilabı məktəb işləri sahəsində böyük qaynaşmaya səbəb olmuşdu. Bu qaynaşma Rusiyadan fərqli olaraq Azərbaycanda, xüsusilə ana dilində məktəb açmaq və məktəbləri demokratikləşdirmə məsələləri ətrafında özünü göstərirdi.

XX əsrin əvvəllərinə qədər ana dilində məktəb açmaq məsələsi Azərbaycanda kortəbii şəkildə ayrı-ayrı maarifpərvərlər tərəfindən, əsas etibarilə, pedaqoji fikir kimi irəli sürülürdü. Lakin XX əsrin əvvəllərindən etibarən məktəb məsələsi bütün milli məsələlərin vacib bir cəhəti kimi siyasi səviyyədə müzakirə və mübarizə mövzusu oldu. Bu vəziyyət təkcə görkəmli tərəqqipərvərlərin deyil, müxtəlif siniflərin və siyasi partiyaların fikrini özünə cəlb etməyə başladı.

Məlum olduğu kimi, çarizm siyasətində Rusiya tərkibində olan xırda millətlərə ana dilində məktəb açmaq qadağan edilmişdi. XX əsrin əvvəllərində nisbətən mütərəqqi mahiyyət daşıyan rus-müsəlman məktəblərində Azərbaycan dili tədris olunsa da, təlim rus dilində idi.

1918-ci il aprel ayının 25-də Bakı Xalq Komissarları soveti təşkil edildi. Çox təəssüf ki, bu, sovet Azərbaycanında milli tərəqqiyə kömək etmədi. O dövrün hadisələri sırasında 1918-ci ilin martında erməni daşnaklarının təşkil etdiyi qırğınlar ən faciəli hadisələrdən idi. Erməni daşnak qüvvələrinin müsəlmanları qırmaq siyasəti yalnız Bakıda deyil, Azərbaycanın müxtəlif regionlarında həyata keçirilirdi. Ölkədə siyasi durum



bərbad vəziyyətdə idi. 1918-ci ilin may ayının 28-də Azərbaycan Demokratik Cümhuriyyətinin müstəqil dövlət olaraq yaranması o dövrün ən böyük hadisələrindən biri idi. ADC dövlət quruculuğu sahəsində ardıcıl işlər görməklə yanaşı, təhsil sahəsində də sırf milli siyasət yeridilirdi. Belə ki, ADC-nin təhsil siyasətinə təlim dilinin ana dilində olması cinsindən, silkindən asılı olmadan hamının təhsilə cəlb edilməsi, dərsliklərin milliləşdirilməsi, milli pedaqoji kadr hazırlığı, orta ixtisas və ali məktəblərin yaradılması daxil idi. Bir neçə il əvvəl təlim rus dilində olan məktəblərdə təhsilə başlayan azərbaycanlı uşaqlar 1918-ci ilin payızında öz təhsillərini ana dilində davam etdirdilər. Mehdi Mehdizadə belələrindən biri idi.

1918-1920-ci illərdə vaxtilə Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasını və digər ali və orta ixtisas məktəblərini bitirən ziyalılar yaranmış vəziyyətdən istifadə edərək milli intibahda fəallıq göstərirlər. Bu dövrdə demokratik maarifçilik ideyaları geniş yayılırdı. İnsanların vətənpərvərlik ruhu çox yüksək idi. Böyüyən gənclər 1918-ci ilə qədərki çarizm siyasətinin ağrı-acılarını gördükləri üçün ADC-nin milli demokratik ideyalarına böyük maraq göstərir və həmin ruhda formalaşırdılar. Mehdi Mehdizadə də onlardan biri idi. O illərdə Azərbaycan demokratik ziyalılar dəstəsinin liderləri M.Ə.Rəsulzadənin, M.Topçubaşovun, N.Usubbəyovun, N.Nərimanovun və digər mütərəqqi fikirli sənət adamlarının yeniyetmə və gənclərin quruculuq işlərinə hazırlaşmalarına böyük təsiri var idi.

XX əsrin ilk onilliklərinin tarixi obrazını yaradan cəhətlərdən biri 1920-ci ilin aprelin 28-də Azərbaycan

yeni bir hakimiyyətin – Rusiyanın təsirində olan sovet hakimiyyətinin yaranmasını təcəssüm etdirir. Yeni siyasi quruluş iqtisadi münasibətləri tamamilə dəyişdirdi, kapitalist münasibətlərini sosialist münasibətləri ilə əvəz etdi. Xalq Maarif Komissarlığı yarandı. Insanların sosial bərabərliyi, milli azadlıqları qorundu. Lakin ideologiyada partiyalılıq mövqeyi formalaşdı. Yaxşı hal idi ki, təhsilin ana dilində qurulması, təhsilin genişləndirilməsi, savadsızlığın ləğvi və digər bu kimi mədəni-mənəvi işlər geniş şəkildə həyata keçirilməyə başladı. Lakin konstitusiyasına görə müstəqil sovet respublikası hesab edilən Azərbaycan yenə də Rusiyadan – sovet Rusiyasından asılı vəziyyətə düşdü. Bununla yanaşı, sovet hakimiyyətinin fəhlə-kəndli balalarına, yoxsullara şərait yaratması, onların təhsilinə və cəmiyyətdə yer tutmalarına qayğı göstərilməsi rəğbət doğuran cəhətlərdən idi.

1920-ci ildən başlayaraq digər sahələrdə olduğu kimi, təhsil sahəsində də konkret və sistemli işlər görülməyə başlandı. Həmin dövrdə həyata keçirilən tədbirlər öz qloballığı və əhəmiyyəti ilə seçilirdi. O dövrün 1920-30-cu illər mərhələsi nisbətən demokratik mahiyyəti və milli-mədəni mövqeyi ilə seçilirdi. 1930-cu illərdən başlanan mərhələ isə azadlıqsevər insanların, görkəmli ziyalıların repressiyası ilə müşayiət olundu. Buna baxmayaraq, sosializm ideyalarına inam və bu ideyalara yiyələnmə təsiri çox güclü idi.

1907-1908-ci illərdə təlimin ana dilində qurulması uğrunda mübarizə aparan və ana dilində məktəblər üçün dərsliklər yazan F.Köçərli, R.Əfəndiyev, S.M.Qənizadə, S.S.Axundov, A.Ş.Talıbzadə, M.Mahmudbəyov, F.Ağazadə, Ü.Hacıbəyli, Ə.Cavad və digər



maarifpərvərlər 1918-1920-ci illərdə də öz ideyalarını həyata keçirməyə başlamışdılar. Təxminən, 1926-1927-ci illərə qədər təcrübəli müəllim-pedaqoqların əvvəlki illərdə hazırladıqları milli dərsliklərdən istifadə edildi. Eyni zamanda, bir neçə yeni milli dərsliklər də yazıldı. Bunlar, xüsusilə, Azərbaycan dilinə, coğrafiyaya, hesaba aid dərsliklər idi. 1920-ci illərdə məktəbin tipləri dəyişdirildi, təhsilin məzmunu və təlimin metodları yeniləşdirildi.

1926-cı ildə yeni tədris planları qəbul edildi. Ümumi icbari ibtidai təhsil məsələsi 1928-ci ildə həll olundu. İlk dəfə 1928-1929-cu tədris ilindən Azərbaycanın Naxçıvan, Dağlıq Qarabağ, Gəncə, Salyan bölgələrində ibtidai ümumi təhsilin icbariliyi tətbiq olundu.

Bəhs edilən dövrün pedaqoji problemləri sırasında kadr hazırlığı məsələsini xüsusi qeyd etmək lazımdır. Həmin dövrdə A.Ş.Talıbzadə, F.Rzabəyli, H.Mahmudbəyov, X.Kələntərli, P.Qasımov, A.Əmirov, C.Cəbrayılbəyli, S.S.Axundov və başqaları pedaqoji kadr hazırlığı sahəsində geniş fəaliyyət göstərirdilər.

M.Mehdizadə şərh etdiyimiz o dövrdə formalaşmış və fəaliyyət göstərərək ümumi inkişafa xidmət göstərmişdir. Təbii ki, ayrı-ayrı illərin siyasi hadisələrinin doğurduğu ziddiyyətlər ondan da yan keçməmişdir. Lakin o, şəxsiyyət bütövlüyünü, əqidə saflığını, vətəndaş ləyaqətini, müsəlmançılıq və azərbaycançılıq ənənələrini qoruyub saxlamış və bu əsasda formalaşaraq şərq və qərb mədəniyyətinə yiyələnmişdir.

Dissertasiyanın II fəsli **"Akademik M.Mehdizadənin həyatı, pedoqoji fəaliyyəti və irsi"** adlanır. Bu fəsil iki yarımfəsli özündə birləşdirir.

M.Mehdizadənin həyatı XX əsrin böyük bir hissəsini – 80 ilini tam əhatə edir. Bu illər ərzində o, bir neçə siyasi quruluş, iqtisadi münasibətlər, müxtəlif baxışlar, ideologiya, müxtəlif tələb və vəzifələrlə qarşılaşmışdır.

Mehdi Məmməd oğlu Mehdizadə 1903-cü ildə yanvar ayının 5-də Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olmuşdur. Atası Məhəmməd kişi yenilik tərəfdarı, təhsillənmə, savadlanma istəyi olan bir adam idi. Lakin ailəsini çətinliklə dolandırdığından oğlanlarını Cəbrayıla təhsil almağa göndərə bilmirdi.

1914-cü ildə Daşkəsən kəndində 3 sinifli rus-tatar məktəbi açıldı. Bir il hazırlıq sinfində oxuduqdan sonra uşaqlar rus dilini öyrənərək təlimə hazırlanır, daha iki sinif (hər sinif iki il idi) oxuyub bir illik ibtidai təhsili başa vururdular.

On bir yaşlı Mehdi rus-tatar məktəbinin hazırlıq sinfinə daxil oldu və 1919-cu ildə 16 yaşında ikən həmin məktəbi bitirdi.

1920-ci ilin aprelində Sovet Rusiyası ordusunun XI hissələri ADC-ni işğal edərək, onu devirdi. Azərbaycanda tamamilə yeni dövlətçilik prinsiplərinə əsaslanan bir hökumət – Sovet hökuməti quruldu. Yeni hökumət də təlimin ana dilində aparılmasını, məktəblər şəbəkəsinin genişləndirilməsini, üstəlik təhsilin pulsuz, təhsil haqqının dövlət tərəfindən ödənildiyini elan etdi. Savadsızlığın ləğvi ilə əlaqədar tədbirlərə başladı, kurslar təşkil etdi. Qiraət komaları, kitabxanalar yaratdı. Daşkəsən kəndində də belə oldu. M.Mehdizadə 1920-ci ilin noyabrından yeni açılmış qoraət komasının müdiri kimi əmək fəaliyyətinə başlayır, savadsızlığın ləğvi kurslarında çalışırdı. Azərbaycanın bir çox şəhərlərində ibtidai sinif müəllimi



hazırlayan kurslar təşkil edilirdi. Belə bir aylıq kurs Cəbrayılda da açılmışdı. Mehdi 1921-ci ildə həmin kursda oxumağa başlayır. Kursu bitirib ibtidai məktəbdə müəllim işləmək imtiyazı qazanır. 1921-ci ilin sentyabrından Daşkəsən kənd birdərəcəli məktəbində müəllim və müdir kimi fəaliyyətə başlayır. Həm dərs deyir, həm də məktəbdə təlim-tərbiyə işini təşkil edir, ən çətin problemlərin öhdəsindən layiqincə gəlir.

1923-cü ilin may ayında M.Mehdizadə Bakıya ali pedaqoji kursda təhsil almağa göndərilir. Üç aylıq ali pedaqoji kursu bitirən kimi onu Azərbaycan Dövlət Pedaqoji İnstitutunun hazırlıq kursuna göndərirlər. Bir il oxuduqdan sonra uğurla imtahan verərək, fizika-riyaziyyat fakültəsinə qəbul edilir.

1926-cı ildə təhsilini başa vuran M.Mehdizadə Cəbrayıl qəzasının Qaryağın şəhərindəki ikidərəcəli məktəbə fizika-riyaziyyat müəllimi göndərilir. 1927-ci ildə Cəbrayıl qəza metodbürosuna rəhbərlik etmək üçün irəli çəkilir.

Nəzəri və praktik hazırlığını, şəxsiyyətcə yetkinliyini, bacarığını nəzərə alaraq 1930-cu ilin martında M.Mehdizadə Azərbaycan Xalq Maarif Komissarlığının yeni təşkil olunmuş İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və Xalq Maarif Komissarının birinci müavini Ayna Sultanovanın köməkçisi vəzifəsinə təyin edilir. O, 1931-ci ildə SSRİ Elmlər Akademiyasının Azərbaycan filialı nəzdində təzəcə təşkil edilmiş aspiranturaya pedaqogika ixtisası üzrə qəbul olunur. 1932-ci ildə isə yeni yaradılmış Azərbaycan ETPİ-nin aspiranturasına köçürülür. 1932-ci ilin sentyabrından V.İ.Lenin adına ADPU-nin pedaqogika kafedrasında

müəllim kimi işə başlayır. 1934-35-ci tədris ilini dekan vəzifəsində qarşılayan M.Mehdizadəni elə həmin il elmi işlər üzrə direktor müavini vəzifəsinə irəli çəkirlər. 1941-ci ildə "Azərbaycan məktəblərində ana dilində savad təliminin inkişaf tarixi" adlı namizədlik dissertasiyasını müdafiə edib pedaqoji elmlər namizədi alimlik dərəcəsini alır.

M.Mehdizadə 1942-1946-cı illərdə II Dünya müharibəsinin iştirakçısı olur. Ordudan tərxis olunduqdan sonra 1950-ci ilədək APİ-də pedaqogika kafedrasının müdiri, dekan, elmi işlər üzrə direktor müavini vəzifəsində çalışır. 1951-ci ilin noyabrından Bakı Şəhər Soveti İcraiyyə Komitəsi sədrinin müavini vəzifəsinə və 1952-ci ilin mart ayında Azərbaycan SSR-nin Maarif Naziri vəzifəsinə təyin edilir. Cəmi üç il nazir vəzifəsində işləyən M.Mehdizadəni 1954-cü ildə yenidən APİ-yə göndərirlər. Görünür, bu, 1953-cü ildə İ.V.Stalinin ölümündən sonra Azərbaycanda baş verən rəhbər vəzifələrdə dəyişikliklərlə əlaqədar olmuşdur.

M.Mehdizadə 1954-1959-cu illərdə elmi-pedaqoji fəaliyyət göstərir və bu sahədə yeni uğurlar qazanır. Belə ki, 1956-cı ildə Moskvada "Azərbaycan sovet məktəbinin tarixi" mövzusunda yazdığı doktorluq dissertasiyasını müdafiə edir.

M.Mehdizadənin 1961-ci illərin əvvəllərində Azərbaycan, rus və digər dillərdə nəşr etdirdiyi məqalələr, kitablar, etdiyi çıxışlar Azərbaycan məktəbi və pedaqoji elminin dünyada tanınmasına təkan verdi. Onun "Azərbaycan məktəbləri yenidənqurma yollarında", "Məktəbdə təlim-tərbiyə işinin yenidən qurulması" adlı kitabları, "Təlimin məhsuldar əməklə birləşdirilməsinə



dair bəzi qeydlər", "Məktəb sisteminin yenidən təşkili məsələlərinə dair qeydlər", "Dərsdə şagirdlərin fəallığını artırmaq haqqında bəzi qeydlər" və digər məqalələri gördüyü işlərin əhəmiyyətinin nə qədər çoxsahəli olduğunu başa düşməyə imkan verir.

Azərbaycan Respublikasının Maarif Naziri M.Mehdizadə 1961-1965-ci illərdə YUNESKO-nun Yaşlıların Təhsil İşləri üzrə Məsləhət Komitəsinin daimi üzvü olmuş, 1960-cı ildən başlayaraq düz 20 il məharətlə, şəxsi nümunə göstərməklə xalq maarifi sistemimizə rəhbərlik etmişdir. M.Mehdizadənin "Məktəbdə təlim-tərbiyə işinin yenidən qurulmasının bəzi məsələləri", "Azərbaycan xalq maarifi yeni yüksəlişdə" monoqrafiyaları ciddi elmi-nəzəri, praktik əhəmiyyəti ilə seçildiyindən yalnız Azərbaycanda deyil, o zamankı İttifaqda elmi-pedaqoji ictimaiyyət arasında çox böyük maraq doğurdu.

Təhsil təşkilatçısı, məhsuldar tədqiqatçı alim kimi böyük nailiyyətlər qazanmış elmlər doktoru, professor M.Mehdizadənin 1967-ci ilin avqust ayında yeni yaradılan SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü seçilməsi onun elmi səviyyəsini təsdiqləyən Ümumittifaq qiyməti oldu. Onun fəaliyyətində beynəlxalq əlaqələr, beynəlxalq təşkilatların təşkil etdikləri tədbirlərdə fəal iştirak (YUNESKO və YUNİSEF xəttilə), bu tədbirlərdə dərin məzmunlu elmi pedaqoji məruzə və çıxışlar əsaslı yer tutur.

M.Mehdizadənin geniş fəaliyyətində Azərbaycan Sovet Eksiklopediyası Baş redaksiya heyətinin və digər nəşr orqanlarının üzvü kimi çalışması da əhəmiyyətli olmuşdur. O, 10 cildlik "Azərbaycan Sovet

Ensiklopediyası", Moskvada nəşr olunmuş 4 cildlik "Pedaqoji Ensiklopediya"nın, 2 cildlik "Pedaqoji lüğət"in əsas müəlliflərindən biri kimi tanınır.

M.Mehdizadə elmi-pedaqoji və təşkilatçılıq xidmətlərinə görə xalq, partiya və dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. Ona 1982-ci ildə "Azərbaycan Respublikasının əməkdar elm xadimi" fəxri adı verilmişdir.

1 may 1984-cü ildə akademik M.Mehdizadə vəfat etmiş və Bakı şəhərindəki İkinci Fəxri Xiyabanda dəfn edilmişdir. Onun dünyasını dəyişməsindən xeyli vaxt keçməsinə baxmayaraq, əsərləri tədqiqatçıların və müəllimlərin tez-tez müraciət etdikləri mənbə olaraq qalmaqdadır.

M.Mehdizadə ömrünün təxminən 50 ili elmi-pedaqoji yaradıcılıqla keçmişdir. "Mehdi Mehdizadə Azərbaycanda pedaqoji elmin inkişafında xüsusi mərhələ təşkil edir" (Əjdər Ağayev). 1940-50-ci illər pedaqoji fəaliyyətindən sonra 1960-1980-ci illərdə Azərbaycanda məktəb təhsilinin təşkili, tədris-təlim işinin təkmilləşdirilməsi, tərbiyə işinin qoyuluşu, məktəb tikintisi, maddi-texniki təchizat, təlimin texniki vasitələri və digər aktual problemlərin həlli bilavasitə bir nazir kimi M.Mehdizadənin rəhbərliyi ilə həyata keçirilmişdir. Fikrimcə, həyatdan, tələbatdan nazirliyin kollegiyasına məsələ kimi daxil olan, nazirin çıxışlarında ideyaca həllini tapan, sonra məqalələrində ümumiləşdirilən və pedaqoji mahiyyəti açılan, praktikada həyata keçirilən bir sıra məsələlər – M.Mehdizadənin dediklərinin hamısı onun elmi-pedaqoji işinə daxildir.



Dissertasiyanın **"Akademik Mehdi Mehdizadənin pedaqoji görüşləri"** adlanan üçüncü fəsli 5 yarımfəsli əhatə edir. Burada ilk növbədə alimin pedaqogika elminə nəzəri-metodoloji baxışları araşdırılır. Tədqiqatdan belə nəticəyə gəlirik ki, M.Mehdizadənin metodoloji baxışlarının əsasında marksizm təlimi, dialektik materializm dayanır. O, təhsilin, tərbiyənin cəmiyyətin inkişafında böyük rol və eyni zamanda təhsil və tərbiyə işinin qurulmasında təsirli baza rolunu oynadığı qənaətində olmuşdur.

Pedaqoji prosesdə elmi-pedaqoji əsas olan şəxsiyyətin formalaşdırılması ideyasını, bir çox xarici amillərdən fərqli olaraq, tarixi dialektik inkişaf prosesində qəbul etmiş, irsiyyətin, mühitin, şəxsiyyətin formalaşmasında rolu olduğunu və əhəmiyyət daşıdığını, tərbiyənin isə aparıcı rol oynadığını qəbul etmişdir. Cəmiyyətdə tərbiyə işindəki qüsurları metodoloji sapıntı kimi qiymətləndirmiş, gələcəkdə bunun daha ağır nəticələr verə biləcəyi qənaətində olmuşdur.

Fəslin ikinci yarımfəsli M.Mehdizadənin təlim məsələlərinə dair fikirlərini əhatə edir. Təhsilin və təlimin məzmunu, mahiyyəti, dərsin təşkili, təlimin prinsipi və metodlarının təkmilləşdirilməsi haqqında fikirləri araşdırılır.

M.Mehdizadənin didaktik baxışları quru nəzəriyyəçiliklə ifadə olunmur. Bu baxışlar təcrübəyə ötürülmüş elmi ideyaların, didaktik təlimatın təcrübədə özünü doğrultması ilə təsdiqlənir.

M.Mehdizadə öz zamanına görə müasir sayılan dərsin mahiyyətini açmış, ona verilən tələbləri göstərmişdir. Onun qənaətincə, müasir dərs ənənəvi dərsə

nisbətən həm məzmunu, həm də metodlara, priyomlara və vasitələrə görə çox-çox zəngindir, təşkili və keçirilməsi cəhətdən xeyli mürəkkəbdir. O, müəllimdən yalnız bacarıq deyil, həm də gərgin, yaradıcı iş tələb edir.

M.Mehdizadənin bu kimi baxışları hazırki təhsil islahatında xüsusi aktuallıq kəsb edir. O, bu günün təşəkkülünü əvvəlcədən görə bilmişdir.

M.Mehdizadə təhsil prosesinin permanent (fasiləsiz) olduğunu nəzərə alaraq, məktəblilərə hər şeyi öyrətməyə cəhd etməkdənsə, onlara "öyrənməyi öyrətməyi" vacib bilir.

Təlim metodlarının təkmilləşdirilməsi və yeniləşdirilməsindən bəhs edən M.Mehdizadə müqayisə yolu ilə daha səmərəli metodları üzə çıxarır və onların tətbiqi priyomlarını, əməli nəticələrini aşkarlayır.

M.Mehdizadənin təlimin müxtəlif metod və priyomlarından dərsdə istifadə edilməsinə dair fikirləri dövrünə görə yenilikçi ruhu ilə seçilir. M.Mehdizadə fikrini daha da inkişaf etdirərək "kitab üzərində işi, laborator məşğələlərini, müşahidə yolu ilə tədqiqatçılıq metod və formalarını tədris prosesinə cəsarətlə daxil etməyi" vacib bilir. O, həmçinin bildirir ki, şagirdləri düşünməyə, axtarmağa, tapmağa məcbur edən evristik müsahibədən geniş istifadə edilməlidir.

M.Mehdizadə didaktik priyom kimi dərsdə problem situasiyanın yaradılmasını, əks əlaqənin qurulmasını, tədris və təlim prosesinin intensivləşdirilməsini, təlim prosesinin fərdiləşdirilməsini, təlimin müasir texniki vasitələrindən dərsdə istifadə olunmasını zəruri sayır və bunları dərsə verilən tələblər səviyyəsinə qaldırır.



Görkəmli pedaqoq dərsin təkmilləşdirilməsi, təlim məsələləri ilə əlaqədar illərlə düşündüklərini tədqiqat əsəri kimi əlimizdə olan "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı kitabında ümumiləşdirmişdir. Alimin belə bir fikri də maraqlıdır ki, təlimdə müxtəlif metodların tətbiqində heç də dərsi "yüngülləşdirmək", "sadələşdirmək" məqsədə çevrilməməlidir, çünki əqli inkişaf məhz şagirdlər çətin tapşırıqlar üzərində işlədikdə, çətinliklər qarşısında qaldıqda təmin edilir.

M.Mehdizadənin yalnız təlim məsələlərinə aid irsi ilə tanışlıq göstərir ki, o, təlim nəzəriyyəsinin zənginləşdirilməsi sahəsində önəmli xidmət göstərmiş, təlim prosesinin optimallaşdırılması, təlim sisteminin, xüsusilə dərsin təkmilləşdirilməsi yollarını nəzəri cəhətdən aydınlaşdırmış və müvafiq olaraq qabaqcıl iş təcrübəsini ümumiləşdirmişdir.

"M.Mehdizadənin tərbiyə məsələlərinə dair fikirləri" bu fəslin üçüncü yarımfəslində araşdırılır. Burada ilk növbədə məktəbəqədər və məktəbyaşlı uşaqların tərbiyəvi xüsusiyyətləri, məzmun və metodları təhlil edilmişdir.

M.Mehdizadənin əsərlərində estetik tərbiyə problemi mühüm yer tutur. Hər şeydən əvvəl, məktəbdə estetik tərbiyənin vəzifələrindən bəhs edən alim qeyd edirdi ki, estetik tərbiyə geniş məfhum olmaq etibarilə birinci növbədə həm həyatdakı, həm də incəsənətdəki gözəlliyi onun bütün rəngarəng təzahürlərində məqsədə yönəldilmiş halda duymaq və düzgün qavramaq, dərk etmək və qiymətləndirməyi bacarmaq qabiliyyətini tərbiyə etməkdir. Bundan əlavə o, həyat və əməyin bütün sahələrinə özünün gözəllik ünsürlərini daxil etmək,

həyatda və incəsəntdə eybəcərliyə qarşı mübarizə aparmaq səyi və bacarığı tərbiyə etməyi nəzərdə tutur.

Müəllif belə bir nəticəyə gəlmişdir ki, estetik tərbiyə obyektiv varlığı incəsənət vasitəsilə başa düşməyə kömək edir. Aqillər çox gözəl demiş və göstərmişlər ki, dünyanı dərk etməyin iki yolu vardır: elmi dərk etmə və incəsənət vasitəsilə dərk etmə.

M.Mehdizadə haqlı olaraq yazırdı ki, estetik tərbiyə bədii ədəbiyyatın tədrisindən başlayır. Çünki əsas təlim-tərbiyə məsələləri ilə yanaşı, şagirdlərin estetik tərbiyəsinə kömək edən ədəbiyyat fənni bütün məktəblərdə, bu və ya digər dərəcədə, birinci sinifdən başlayaraq axırıncı sinfə qədər tədris edilir. Bədii ədəbiyyatın tədrisində estetik tərbiyənin effektli olması üçün proqram və dərsliklərin yüksək keyfiyyətlə hazırlanması əhəmiyyətini sübut etməyə ehtiyac yoxdur.

Müəllifin fikrincə, şagirdlərin estetik tərbiyəsində musiqi və nəğmə mühüm vasitələrdəndir. Bu isə təsadüfi deyildir, çünki musiqi və nəğmə incə, gözəl, xeyirxah hisslər, nəcib arzular doğurur.

M.Mehdizadənin nöqteyi-nəzərincə estetik tərbiyənin çox mühüm vasitələrindən biri də rəsm dərsidir. Tərbiyə işində onun oynadığı rol maarif işçilərinə aydındır. Aqillər demişkən, "Rəssamlıq gözlə görünən poeziyadır".

O, sübut edirdi ki, şagirdlərin estetik tərbiyəsində sinifdənxaric və məktəbdənkənar işlərin rolu çox böyükdür.

Orta məktəb şagirdlərinin əmək tərbiyəsindən bəhs edən M.Mehdizadə qeyd edirdi ki, əmək hər bir vətəndaşın müqəddəs borcu, şərəfli vəzifəsidir.



Bunun üçün məktəbin aşağı siniflərindən etibarən şagirdləri əməyə və əmək adamlarına hörmət etməyə, əməkdən qaçmaq deyil, əməyi sevməyə, var qüvvələrilə cəmiyyət xeyrinə işləməyə alışdırmaq lazımdır. Şagirdləri elə yetişdirmək lazımdır ki, onlar fəaliyyətsizlikdən can sıxıntısı çəksinlər, əməkdən, onun müsbət nəticələrindən zövq alsınlar. Əməyin hər iki növünü – həm zehni əməyi, həm də fiziki əməyi sevsinlər, buna adət edib alışsınlar.

M.Mehdizadəyə görə, əmək tərbiyəsinin əməli vəzifələrindən biri gələcək fəaliyyətləri üçün öz qüvvə və qabiliyyətlərinə müvafiq olan peşə seçməkdə şagirdlərə əlverişli imkan yaratmaqdırsa, digəri şagirdləri xüsusən fiziki əmək vərdişlərilə silahlandırmaqdan, onları müəyyən əmək sahəsində işləmək üçün hazırlamağa xidmət etməkdən ibarətdir.

"Əmək tərbiyəsini peşə təhsili ilə eyniləşdirmək olmaz" – yazan pedaqoq qeyd edirdi ki, əmək tərbiyəsi peşə təhsili üçün əlverişli zəmin yaradır, peşə təhsilindən səmərəli istifadə etməyə xidmət edir. M.Mehdizadənin fikrincə, əmək tərbiyəsinin mühüm bir vəzifəsi də şagirdlərə əmək mədəniyyəti aşılamaqdır. Əmək mədəniyyəti aşılamaq dedikdə, şagirdlərdə iş yerini səliqəli saxlamaq adəti yaratmaq, işə sürətlə başlaya bilmək, işi səmərəli planlaşdıra bilmək, vaxtı düzgün qiymətləndirə bilmək bacarıqları yetişdirmək nəzərdə tutulur. Şagird fiziki və zehni əməyin səmərəli tərz və üsullarını tətbiq edə bilməyə, əməklə istirahəti növbələşdirməyə, işinin nəticələrinə düzgün qiymət verə bilməyə alışmalıdır. Müəllifə görə əmək mədəniyyətinə bir sıra təşkilati vərdişlər də daxildir: o cümlədən kollektivdə çalışmaq, yoldaşa kömək edə bilmək, iş

yoldaşları arasında işi düzgün bölüşdürə bilmək, kollektiv əməkdə yarış və qarşılıqlı yardım təşkil edə bilmək və s.

Alimin fikrincə əmək tərbiyəsinin mühüm bir vəzifəsi də şagirdlərin zehni və fiziki qabiliyyətlərinin ahəngdar inkişaf etməsinə xidmət göstərməkdən ibarətdir.

Müəllif qeyd edir ki, əmək tərbiyəsi şagirdlərin bütün təlim və əmək fəaliyyəti prosesində yerinə yetirilir. Şagirdlər əsasən təlimdə, ictimai faydalı işdə, özünə xidmətdə, məişət əməyi və oyunda fəaliyyət göstərirlər. Bu fəaliyyət növlərinin hər birinin əmək tərbiyəsində müəyyən rolu vardır.

O, əmək tərbiyəsinin prinsiplərini aşağıdakı kimi təsnif edir:

- şagirdlərin sərf etdikləri hər növ əməyin, göstərdikləri hər növ fəaliyyətin təlim-tərbiyə məqsədlərinə, o cümlədən əmək tərbiyəsi məqsədinə tabe edilməsi;
- şagirdlərin sərf etdikləri əməyin ictimai əhəmiyyətini dərk etmələri;
- şagird əməyinin onların qüvvə və imkanlarına uyğun olması;
- ictimai-faydalı işlərin və əmək tapşırıqlarının sistematikliyini və planlığını təmin etmək, şagirdlərin əmək fəaliyyətinin müxtəlifliyini təmin etmək;
- şagirdlərin ictimai-məhsuldar əməyinin kollektiv səciyyə daşıması.

M.Mehdizadə əmək tərbiyəsinin məlum əsas vasitələri və yollarını geniş qeyd edərək, təlim işlərini, sinifdən və məktəbdənkənar ictimai-faydalı əməyi, ictimai işləri, ailədə məişət əməyi işlərini ətraflı təhlil etmişdir.



Alim istehsalat təlimi məsələlərindən, istehsalat təliminin təşkilat formaları və üsullarından, istehsalat təliminə verilən əsas tələblərdən bəhs edərkən də bütün bunları əmək tərbiyəsinə xidmət edən vasitə kimi nəzərə almış və əsas mahiyyətini şərh etmişdir.

Bundan əvvəl qeyd etdiyimiz kimi, M.Mehdizadənin tədqiqlərində tərbiyə probleminin əsas sahələrindən hesab edilən məktəblilərin fəal həyat mövqeyi məsələsi 70-ci illərdə ciddi araşdırmalar nəticəsində şərhini tapan aktual problemə çevrilmişdir.

Müəllif qəti müəyyənləşdirmişdir ki, məktəblilərin fəal həyat mövqeyinin formalaşdırılması mənəvi tərbiyənin vəzifəsidir. O, eyni zamanda sübut etmişdir ki, şəxsiyyətin əmək fəallığı mövqeyi təmin edilmədən onun fəal həyat mövqeyinin formalaşdırılmasına nail olmaq mümkün deyil. Mahiyyətcə individin (fərdin – R.Ə.) əmək fəallığı mövqeyi, onun bütün mövqeyinin özəyini təşkil edir.

Məktəblilərin əmək fəallığı mövqeyinin formalaşdırılmasının yolları və vasitələrindən bəhs edən pedaqoq-alim əmək təliminin təşkili və həyata keçirilməsini bu sahədə əsas hesab etmişdir. Əmək təlimi və tərbiyəsinin praktikada bir-birindən ayırlmadığını nəzərə alan alim bu problemə ayrı-ayrılıqda, yəni sırf təlim nəzəriyyəsi baxımından və ya sırf tərbiyə nəzəriyyəsi baxımından yanaşmamış, onları vəhdətdə götürmüş və əlbəttə, əmək tərbiyəsinin məzmununa daxil etmişdir.

M.Mehdizadə şəxsiyyətin fəal həyat mövqeyinin təzahür formalarından biri kimi ictimai-siyasi fəallıq mövqeyini qəbul edirdi. O, sosializm şəraitində

şəxsiyyətin əsas əməyinin, onun ictimai-siyasi əməyi ilə əlaqələndirilməsini qanunauyğun hadisə hesab edir və öz fikrini əsaslandıraraq yazırdı ki, əgər şəxsiyyətin fəal mövqeyi bütünlüklə kollektivdə, onun vasitəsi və təsiri altında formalaşırsa, ictimai-siyasi fəallığın formalaşdırılması burada istisna təşkil edə bilməz.

Fəal həyat mövqeyinin formalaşdırılması probleminin həllində də M.Mehdizadənin tərbiyə və təlim prosesindən vəhdətdə istifadə ideyası bir daha özünü göstərir. Fəal həyat mövqeyini idrak fəallığından ayrı təsəvvür etməyən alim məhz ilk növbədə əqli-idraki imkanlardan istifadə edilməsini məsləhət görmüş, idrak fəallığı olmadan hər hansı məhsuldar sahədə fəallıq mümkün deyildir qənaətinə gəlmişdir.

M.Mehdizadə fəal həyat mövqeyindən danışarkən onu əhalinin ayrı-ayrı yaş qruplarına görə, yəni kiçik və yuxarı yaşlı məktəblilərə, yaxud yetkin yaşlı əməkçilərə görə fərqləndirməyi vacib saymış, bu prosesə dinamik yanaşdığına görə onu kiçik yaş dövründən başlayaraq insanlarda mənəvi tərbiyənin vəzifəsi kimi yerinə yetirməyi lazım bilmişdir.

Ümumiyyətlə, məktəblilərin fəal həyat mövqeyinin formalaşdırılması pedaqoji problem kimi Azərbaycan ədəbiyyatında ilk dəfə Mehdi Mehdizadə tərəfindən qoyulmuşdur. Bu problemi mənəvi tərbiyənin vəzifəsi sırasında götürsə də, onun həllinə əqli, iradi, ictimai fəallıq, əmək fəallığı mövqeyindən kompleks yanaşmışdır.

Üçüncü fəsildə nəzərdən keçirilən məsələlərdən biri M.Mehdizadənin tarixi-pedaqoji baxışlarıdır. Onun əsərləri ilə tanışlıq göstərir ki, təhsil tarixinə aid araşdırmaları müntəzəm davam etdirmişdir. Ayrıca sırf



tarixi mövzulardan başqa, onun bütün kitablarında bəhs edilən mövzu əvvəlcə tarixi baxımdan nəzərdən keçirilmiş və sonra müasir məzmun və mahiyyətin şərhinə başlanmışdır. Buradan belə bir nəticə hasil olur ki, alim müasir problemləri daha əsaslı anlamaq üçün onun tarixini bilməyi vacib sayır.

M.Mehdizadənin ciddi, monumental tarixi-pedaqoji əsərləri olan namizədlik və doktorluq dissertasiyaları məktəb tarixinin tədqiqinə həsr edilmiş, dəyərli əsərlərdən sayılır.

M.Mehdizadənin orta əsr dövründən başlayaraq Azərbaycan məktəb və pedaqoji fikrin inkişaf tarixini əks etdirən əsərləri alimin orta əsrlər Yaxın və Orta şərq fəlsəfi fikrinə, klassik pedaqoji ənənə və tendensiyalara yaxından bələd olduğunu, bu tədqiqatlarda da onun tarixi reallıqlara sadiq qaldığını, formalaşmış tarixi-pedaqoji baxışlarının obyektivliyini, milli və ümumbəşəriliyini görürük.

Beləliklə, tədqiqi araşdırma belə bir qənaətə gəlməyə əsas verir ki, M.Mehdizadə çox geniş tarixi-pedaqoji təfəkkürə, axtarıcılıq səriştəsinə, vətəndaşlıq və vətənpərvərlik duyğusuna malik bir tədqiqatçı olmuş, nəzəri fikir və təcrübi nəticələri vəhdətdə öyrənmiş, qiymətli irsi ilə pedaqoji fikir tarixini zənginləşdirmişdir.

M.Mehdizadənin təhsilin idarəedilməsinə dair fikirləri də bu fəsildə nəzərə çatdırılır. O, həm nəzəri, həm də əməli olaraq (təbii ki, vəzifə funksiyasına görə) bu cəhətə fəal münasibət göstərmişdir.

M.Mehdizadənin təhsili idarəetmə məsələlərinə dair baxışları, fikirləri elmi-nəzəri və praktik dəyəri ilə öz

dövründə yüksək qiymətləndirilmiş, elmi məcmuələrdə, rəsmi müşavirələrdə təqdir edilmişdir.

Qeyd edək ki, o zaman "təhsil sistemi" əvəzinə "maarif sistemi" işləndiyindən M.Mehdizadənin işlətdiyi "maarif islahatını" "təhsil islahatı" kimi başa düşmək lazımdır.

Alim idarəetməyə elm kimi yanaşaraq onun elm kimi qavranılmasında mahiyyətcə necəliyini açmağa çalışaraq yazır: "Maarif sistemini idarəetmə elmi dedikdə, biz idarəetmənin məqsəd və məzmununu işıqlandıran və müəyyənləşdirən prinsip və metodları nəzərdə tuturuq ki, onlar idarəetmənin səmərəli aparılmasını təmin edir".

M.Mehdizadə maarif sistemini idarəetmənin prinsiplərini müəyyənləşdirir və bu prinsiplər sırasında demokratik mərkəziyyət, elmilik, planlaşdırma, uçot və nəzarət prinsiplərini qeyd edir. Göründüyü kimi, kommunist partiyasının demokratik mərkəziyyət prinsipi demokratikliyi, humanist yanaşmanı, müstəqil yaradıcı yanaşmanı prinsip kimi elmi cəhətdən əsaslandırmağa imkan vermirdi. Lakin elmilik, planlaşdırma, uçot və nəzarət kimi prinsiplər mühüm əhəmiyyət daşıyır, bu gün də öz aktuallığı ilə seçilir.

M.Mehdizadə elmilik prinsipinin əsasını maarifin idarəedilməsi üçün qərar və tədbirlərin qəbul edilməsində elmi qanunauyğunluqda görür. Ona görə də qeyd edir ki, maarif sistemini idarəetmədə həmin prinsipin tətbiq edilməsi yalnız idarə edilən obyektlərin hərtərəfli uçotunun xüsusiyyətlərini deyil, həm də başlıca olaraq iqtisadi-riyazi metodların, habelə tez həll edən hesablayıcı və idarəedici texnikanın geniş tətbiq olunması deməkdir.



Alim kollektiv rəhbərliklə təkbaşına rəhbərliyin əlaqələndirilməsinin təmin edilməsini də idarəetmənin prinsipi kimi qəbul edir və bunun nəzərə alınmasının əhəmiyyətini əsaslandırır.

M.Mehdizadənin idarəetmə metodları ilə əlaqədar fikirləri və təsnifatı böyük maraq doğurur. Alim maarifi idarəetmə metodlarını dörd qrupa bölür: a) normativ sənədlərlə idarəetmə metodları; b) təşkilati-inzibati idarəetmə metodları; ç) idarəetmənin sosioloji-psixoloji metodları.

Alim normativ sənədləri həm işin həyata keçirilməsinin hüquqi əsası, həm də görülən işlərin tənzimləyicisi kimi görür. O, təsdiq olunmuş məktəb Nizamnaməsini, tədris planını, hər növ tədris fənni üzrə proqram və dərslikləri, tərbiyə işlərinin nümunəvi proqramını, şagirdlər üçün davranış qaydalarını və s. normativ sənədlər kimi qəbul edərək, onları hər bir təhsil müəssisəsi üçün vacib sayır. Lakin məktəb müvafiq şəraitə - bina, şagird, müəllim kadrları, fənn kabinetləri, əyani vəsait və s. malik olduqdan sonra yuxarıda göstərilən normativ sənədlərə əsaslanaraq, zəruri maliyyə vəsaiti sərf etməklə üzərinə düşən vəzifəni – şagirdlərin təlim-tərbiyə vəzifəsini yerinə yetirə bilər.

M.Mehdizadə təşkilati-inzibati idarəetmə metodlarının məzmununu müəyyənləşdirir və buraya idarəetmənin qarşısında duran vəzifələri, onların quruluş prinsiplərini, ştat cədvəlini, zəruri şərait yaradılan və yuxarı təşkilatlar tərəfindən təsdiq olunan müəssisənin fəaliyyəti haqqında əsasnaməni və bu qəbilli sənədləri daxil edir.

Alim təşkilati-inzibati metodlar qrupuna yerlərdə (məktəb, uşaq bağçası və s.) işlə tanışlığı, inspektor yoxlamasını, yerli maarif orqanları nümayəndələrinin iştirakı ilə keçirilən və lazımi məsləhət və zəmanət qəbul edən müşavirələri, seminar-müşavirələrini, konfransları, müəllimlər qurultayını, idarə olunan obyektlərin fəaliyyəti ilə əlaqədar olan, həmçinin yerinə yetirilməsi məcburi xarakter daşıyan və nəticəsi barədə hesabat verilməsi zəruri sayılan müxtəlif yazılı sərəncamların, əmr və qərarların yerlərə göndərilməsini daxil edir. O, idarəetmə metodunun bu qrupuna rəhbər kadrların seçilməsi, tərbiyə edilməsi və yerləşdirilməsi, müəllim kadrları və uşaq müəssisəsi tərbiyəçilərindən düzgün və səmərəli istifadə edilməsi, onların hazırlanması və ixtisasının artırılması, həmçinin maarif təşkilatları və idarələrin maliyyələşdirilməsi və onların planlaşdırılmasını da daxil edir.

Yeni ictimai-siyasi quruluşa və iqtisadi münasibətlərə keçidlə əlaqədar olaraq bu metodlar qrupuna daxil edilən metodların müəyyən hissəsi öz aktuallığını itirsə də, müəyyən hissəsi isə əksinə, daha da aktuallaşmışdır.

M.Mehdizadə idarəetmənin pedaqoji metodları sırasında müəyyən metodik tədbirlər vasitəsilə subyektin obyektə təsirinin təmin olunmasına xidmət edən üsul və priyomları nəzərdə tutur. Məsələn, avqust müşavirələrini, təlim-tərbiyə məsələlərinə dair qabaqcıl pedaqoji təcrübənin ümumiləşdirilib yayılmasına bu və ya digər pedaqoji problemlər üzrə görülən işlərin yekunlaşdırılıb qiymətləndirilməsinə həsr olunan müəllimlərin, metodist və elmi işçilərin elmi-praktik konfranslarının keçirilməsi,



pedaqoji eksperimentlərin aparılması, disput və müzakirələrin təşkili, müəllim və məktəblərin müvafiq metodik ədəbiyyatla təmin olunması və s.

İdarəetmənin sosioloji-psixoloji metodlarından bəhs edən alim bu metodlar qrupuna işin gedişinin müzakirəsinə dair istehsalat müşavirələrini, işçilərin həvəsləndirilməsini və s. daxil edir. İnandırmanı isə rəhbər işçilərin tabe olanlarla apardığı işin əsas metodu kimi səciyyələndirir. Bunlarla yanaşı, o idarəetmə işində məcburiyyət və tənbeh metodlarının da tətbiq olunduğunu bildirir.

M.Mehdizadənin təhsilin idarəedilməsi ilə əlaqədar fikirlərində rəhbər kadrlara verilən tələblər haqqında irəli sürdüyü nöqteyi-nəzər maraq doğurur. Onun ilk tələbi rəhbər kadrların düzgün seçilməsi, yerləşdirilməsi və tərbiyə edilməsi ilə əlaqədardır. Bu tələbin həqiqətən çox böyük əhəmiyyəti vardır. Rəhbər kadr ixtisasını dərindən bilən, ləyaqətli, metodik ustalığa malik, təcrübəli, təşkilatçılıq qabiliyyəti ilə seçilən şəxs olarsa, onun rəhbərliyi mütləq iş uğurları gətirir. Təəssüf ki, hazırda ölkəmizdə idarəetmənin bu tələbinə həmişə riayət edilmir. Ona görə də rəhbər kadrlar işin öhdəsindən gələ bilmir, vəzifəsinə şəxsi qazanc mənbəyi kimi baxır, nəticədə işdən uzaqlaşdırılırlar.

M.Mehdizadənin çox əhəmiyyətli, maraqlı olan tələblərindən biri də budur ki, hər şeydən əvvəl, rəhbər həmin sahənin başlıca məqsədi, onun qarşısında duran praktik vəzifələr haqqında aydın təsəvvürə malik olmalıdır. O, rəhbər kadrların ümumi hazırlığı və şəxsi keyfiyyətlərini də nəzərə almağı lazım bilir.

Alim rəhbər işçinin psixoloji qabiliyyətləri ilə diqqəti cəlb etməsini xüsusi keyfiyyət kimi qeyd edir. "Bu, ilk növbədə qayğıkeşlik, müşahidəçilik, təşəbbüskarlıq, qətiyyət, müstəqillik, təmkinlilik kimi insana xas olan ümumi xarakter əlamətlərindən ibarətdir".

Göründüyü kimi, akademik M.Mehdizadə təhsilin idarə edilməsində gərəkli olan prinsip və metodlarla, vasitələrlə kifayətlənmir, rəhbər kadrın insani keyfiyyətlər daşıyıcısı kimi də seçilməsini, bundan sonra həmin prinsip və metodlara bələdliyi şərtini irəli sürür.

Qeyd edilənləri belə ümumiləşdirə bilərik ki, M.Mehdizadə təhsilin idarəedilməsinə elmi və metodik baxımdan yanaşaraq, onun nəzəri-konseptual mahiyyətini açmış və əsas məzmununu şərh etmişdir. Diqqəti cəlb edən cəhət budur ki, o, təhsilin uğurlarını onun düzgün elmi əsaslarla idarə edilməsində görür. Bu prinsipial cəhət bu gün də çox aktualdır.

Tədqiqatla əlaqədar aşağıdakı **nəticələrə** gəlmək mümkündür:

Akademik M.Mehdizadənin elmi-pedaqoji fəaliyyəti və irsi XX əsrdə Azərbaycanda təhsil və pedaqoji elmin inkişafı tarixində xüsusi mərhələ təşkil edir. O, yarıməsrlik bir müddətdə pedaqogika nəzəriyyəsi və tarixinin tədrisi, tədqiqi və tətbiqi ilə məşğul olmuş, pedaqogika elminin tarixi, nəzəri və praktik istiqamətdə zənginləşməsində müstəsna rol oynamışdır.

M.Mehdizadə Azərbaycanda təhsil quruculuğu sahəsində təşkilatçı olaraq xeyli səmərəli işlər görmüş, təlim, tərbiyə işinin təkmilləşdirilməsi, müasir tələblər səviyyəsində qurulması üçün elmi-nəzəri və əməli fəaliyyəti ilə aparıcı mövqe nümayiş etdirmişdir.



M.Mehdizadə pedaqogika elminin görkəmli nümayəndəsi kimi keçmiş SSRİ məkanında və BMT vasitəsilə beynəlxalq aləmdə faydalı ideyalar, səmərəli fikir sahibi kimi təqdim olunmuş, konfrans və sessiyalarda, müşavirə və qurultaylarda, elmi toplantılarda məruzə və çıxışları ilə diqqəti cəlb etmiş, mütərəqqi elmi-pedaqoji baxışları ilə bəşər sivilizasiyasına yardım göstərmişdir.

M.Mehdizadə elmi-pedaqoji kadrların yetişdirilməsində, yaradıcı təşəbbüskar müəllimlər nəslinin qabaqcıl pedaqoji təcrübəsinin formalaşmasında xüsusi rol oynamış, zəngin təcrübə məktəbi yaratmışdır.

M.Mehdizadənin nəzəri-metodoloji baxışları daim inkişafda olmuş, dialektik təlimə əsaslanmışdır. Bu inkişafı 1930-1950-ci və 1960-1970-ci illərə ayırmaqla iki mərhələdə görmək mümkündür.

M.Mehdizadənin elmi-pedaqoji irsi pedaqogika tarixi və nəzəriyyəsinin ən aktual sahəsini, o cümlədən təlim nəzəriyyəsi, tərbiyə işinin elmi-pedaqoji əsasları, qabaqcıl pedaqoji təcrübənin ümumiləşdirilməsi, əmək təlimi və nəzəriyyəsi və s. kimi problemləri əhatə edir. Bu irs pedaqogika elminin və təhsilin məzmunu, metodları və vasitələrinin praktik istiqamətlərdə formalaşmasında əsas baza rolunu oynamış və oynamaqdadır.

M.Mehdizadə tərbiyəni geniş pedaqoji proses kimi qəbul edərək, təhsil və təlimi bunun əsas vasitələrindən saymışdır.

Məktəblinin fəal həyat mövqeyinin formalaşdırılması problemi Azərbaycan pedaqoji ədəbiyyatında ilk dəfə M.Mehdizadə tərəfindən qoyulmuş və həll edilmişdir. O, bu problemi mənəvi tərbiyənin

vəzifəsi hesab edərək, onun həllinə idraki, iradi, ictimai fəallıq, əmək fəallığı mövqeyindən yanaşmışdır.

M.Mehdizadə təlim nəzəriyyəsinin görkəmli nümayəndələrindən biri kimi ardıcıl tədqiqat işi aparmış, təlim sistemini təkmilləşdirməyin konsepsiyasını vermişdir.

M.Mehdizadə öz tədqiqatları ilə Azərbaycan məktəbi və pedaqoji fikir tarixinin qaranlıq sahələrini üzə çıxarmış, onun zənginləşməsinə çalışmışdır. Azərbaycanda sovet məktəbinin 35 illik inkişaf tarixini və kütləvi savad təlimi verilməsi problemini işləmiş, Azərbaycanda XIX əsrə qədərki dövrdə məktəb təhsilinin inkişaf istiqamətlərini müəyyənləşdirmişdir. Şəxsiyyətin hərtərəfli inkişafına dair təlimin elmi əsaslarla təşəkkülü haqqında qiymətli fikirlər söyləmişdir.

M.Mehdizadə təhsil sisteminin elmi əsaslarla idarə edilməsi problemini Azərbaycan pedaqoji ədəbiyyatında ilk dəfə qoymuş və onun üsulları və prinsiplərini müəyyənləşdirmişdir.

Tədqiqatla bağlı aşağıdakı **təklifləri** irəli sürməyi məqsədəmüvafiq sayırıq:

1. M.Mehdizadənin pedaqoji fəaliyyəti və elmi-pedaqoji irsinin ali pedaqoji məktəblərdə xüsusi kurs kimi tələbələrə öyrədilməsi onların pedaqoji işə hazırlanmasına olduqca səmərəli təsir göstərə bilər.

2. M.Mehdizadənin əsərlərini problemlər üzrə ayrı-ayrı cildlərdə toplayaraq nəşr edilməsi elmi-pedaqoji və praktik pedaqoji kadrların onlardan istifadəsini sistemləşdirər və işə müsbət təsirinə şərait yaradar.

3. M.Mehdizadənin şəxsiyyəti, mənəvi keyfiyyətləri və elmi üslubu haqqında pedaqoji kollektivlərdə, tələbələr arasında söhbətlərin, müzakirələrin aparılması onun şəxsi nümunəsindən müntəzəm, sistemli şəkildə öyrənmək işinə etibarlı zəmin yaradar.





## M.M.MEHDİZADƏNİN ANADAN OLMASININ 100 İLLİYİ MÜNASİBƏTİLƏ PEDAQOJİ MƏTBUATDA DƏRC EDİLMİŞ MƏQALƏLƏR

# HƏYATI ÖRNƏK OLAN İNSAN


***ƏJDƏR AĞAYEV,***

*Respublika Təhsil Şurasının sədri*
*pedaqiga üzrə elmlər doktoru, professor*


Azərbaycanın XX əsr təhsil və pedaqoji fikir tarixində praktik fəaliyyəti və elmi yaradıcılığı ilə görkəmli yer tutmuş şəxsiyyətlərdən biri akademik Mehdi Məmməd oğlu Mehdizadədir.

O, 1903-cü ildə yanvar ayının 5-də Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olmuşdur. 1914-cü ildə Daşkəsəndə açılmış rus-tatar tipli ibtidai məktəbin birinci sinfinə daxil olan Mehdi 1919-cu ildə oranı bitirmişdir. Siyasi, ictimai, iqtisadi dəyişikliklər dövrünün çevik mədəni hadisələrinin iştirakçısına çevrilən gənc Mehdi bir müddət kitabxananda işləmiş, savadsızlığın ləğvi məqsədi ilə kurslar təşkil etmişdir. O, 1921-ci ildə Cəbrayılda açılmış 6 aylıq müəllimlik kursunda pedaqoji təhsil almış, 1921-ci ilin sentyabrından Daşkəsən kənd birdərəcəli məktəbində müəllim və müdir vəzifəsində çalışmışdır. Böyük həvəslə işə girişən Mehdi az vaxtda uşaqların, xüsusilə qızların məktəbə cəlbi sahəsində nailiyyət qazanmış, yüksək təlim-tədris işi qura bilmişdir. 1923-cü ilin fevralında Azərbaycan Xalq Maarif Komissarlığı Daşkəsən məktəbini kompleks yoxlamadan keçirərkən, məşhur maarif xadimi C.Cuvarlı M.Mehdizadənin, digər 6 müəllim ilə birlikdə, təlim-tərbiyə işində xüsusi qabiliyyətinin olduğunu və yüksək nəzəri və praktik hazırlığını sezmiş, bu barədə məlumatı Komissarlığın diqqətinə çatdırmışdır. Onlar mükafatlandırılmışlar.

Yoxlamada ali pedaqoji təhsil almaq üçün seçilmiş 7 nəfər müəllim 1923-cü ilin mayında Bakıya çağırılır. M.Mehdizadə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun hazırlıq kursunda bir il oxuduqdan sonra, uğurla qəbul imtahanı verərək fizika-riyaziyyat fakültəsinə qəbul olunur. Hələ tələbəlik illərində institutun ictimai həyatında fəal iştirak edir.

1926-cı ildə təhsilini başa vuran Mehdi, Cəbrayıl qəzasının Qaryagin (indiki Füzuli) şəhərindəki orta məktəbə fizika və riyaziyyat müəllimi təyin olunur. O, ilk gündən yüksək metodik ustalıq nümayiş etdirir. 1927-ci ildə Cəbrayıl qəza metodbürosuna rəhbərliyi ona tapşırırlar. Üç il sonra – biliyi, bacarığı, rus və Azərbaycan dillərində işləyə bilməsi nəzərə alınaraq Mehdi müəllim Azərbaycan Xalq Maarif Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və AXMK-nın birinci müavini Ayna Sultanovanın köməkçisi təyin olunur. O, Bakıya gəlir. Amma iki il sonra aspiranturaya pedaqogika ixtisası üzrə qəbul olunur. 1932-ci ildə indiki Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun aspiranturasında təhsil alır, eyni zamanda 1932-ci ilin sentyabrında indiki ADPU-nun pedaqogika kafedrasında müəllim kimi işə başlayır. Burada da öz təşkilatçılığı, bacarığı ilə seçilir. Dekan (1934), elmi işlər üzrə direktor

müavini (1935) vəzifələrinə irəli çəkilir. 1941-ci ildə aspirantura müddətində yazıb tamamladığı "Azərbaycan məktəblərində ana dilində savad təliminin inkişafı tarixi" adlı namizədlik dissertasiyasını BDU-da müdafiə edib, pedaqoji elmlər namizədi alimlik dərəcəsi alır. O, həmin il iki həmkarı ilə birlikdə (S.Xəlilov və D.Mustafayeva) "Pedaqogika" kitabını yazıb, nəşr etdirir. Elə həmin il yenidən APİ-nin direktor müavini vəzifəsinə təyin olunur. Bir il sonra (1942, sentyabr) onu əsgəri xidmətə çağırırlar. O, 1946-cı ilədək bir zabit kimi qələbə dolu döyüş yolu keçir. Ordudan qayıtdıqdan sonra yenidən APİ-də elmi-pedaqoji fəaliyyətini davam etdirir. "Azərbaycan məktəbi" jurnalında tez-tez sanballı elmi məqalələrlə çıxış edir. "Pedaqogikanın fəlsəfi əsasları", "Şagirdlərin yaş xüsusiyyətləri və tərbiyə", "Dərs haqqında, "Çalışmaların ümumi əsasları haqqında", "Şagirdlərin biliyin yoxlamaq və ona qiymət vermək", "Təlim-tərbiyə işinin siyasi-məfkurəvi səviyyəsini daha da yüksəldək" və digər məqalələrini 1947-1948-ci illərdə dərc etdirir. 1950-ci ilədək pedaqogika kafedrasının müdiri, dekan, direktor müavini vəzifələrində çalışır. Parlaq zəkası, iş bacarığı onun yüksəlişinə təkan verir. 1950-ci ildən APİ-nin direktoru, 1951-ci ilin noyabrından Bakı Soveti İcraiyyə Komitəsi sədrinin müavini, 1952-ci ilin mart ayından maarif naziri vəzifələrində çalışır.

M.Mehdizadə keçmiş SSRİ məkanında ən nüfuzlu təhsil naziri kimi tanınmış, 25 ilə yaxın bir müddətdə Azərbaycan maarifinə rəhbərlik etmişdir.

M.Mehdizadə pedaqoji tədqiqatlar aparmağa başlayan adi ali məktəb müəllimliyindən, sadə elmi işçilikdən böyük zəhməti nəticəsində pillə-pillə elmi



dərəcələr, adlar almağa nail olmuş, keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü (akademiki) seçilmişdir. Beynəlxalq təşkilatlarda, o cümlədən YUNESKO xətti ilə dünyanın bir sıra ölkəsində təhsil problemlərinə aid dəyərli çıxışları ilə dünya təhsil ictimaiyyətinin rəğbətini qazanmışdır. Onun əsərləri Azərbaycan, rus, ingilis, fransız və digər dillərdə nəşr olunmuş, Azərbaycanda təhsil quruculuğunun nəzəri və praktik məsələləri ilə dünya mütəxəssislərinin bələd olmasına şərait yaratmışdır.

M.Mehdizadə yalnız elmi irsi, əməli fəaliyyəti ilə deyil, həm də əsil örnək olan insani böyüklüyü, saf su kimi təmiz, büllur kimi parlaq şəxsiyyəti, halallığa tapınan əqidəsi, əxlaqi paklığı ilə tariximizin pozulmayan mənəviyyat mücəssəməsidir. O, yalanı, nankorluğu, əyriliyi, haramı, kələyi, fırıldağı, yerlipərəstliyi, dəstəbazlığı, qanunsuzluğu, ədalətsizliyi, eqoizmi, mənəm-mənəmliyi sevməzdi. O, böyük vətəndaş, qeyrətli vətənpərvər, ləyaqətli dövlət xadimi, xalqı, vətəni üçün qəlbən yanan insan idi.

M.Mehdizadə bir alim kimi zəngin elmi irs sahibidir. Onun elmi irsi pedaqogikanın nəzəriyyəsi və tarixi üzrə bir çox problemi əhatə edir. O, təlim-tərbiyə, idarəetmə məsələləri, təhsilin məzmunu, təcrübi işlərin ümumiləşdirilməsi, dərsin təşkili və onun təkmilləşdirilməsi yolları, yaşlıların təhsili, ayrı-ayrı şəxsiyyətlərin pedaqoji görüşləri, məktəb tarixi və digər problemlərlə əlaqədar ciddi əsərlər yazıb, nəşr etdirmiş, pedaqoji elmin inkişafına təkan vermişdir. Onun XX əsrin 40-50-ci illərində həmkarları ilə birlikdə ali məktəb tələbələri üçün yazdığı pedaqogikanın tədris vəsaitləri

(dərslikləri) həm ilkinliyi, həm də o dövr üçün təkmilliyi baxımından çox əhəmiyyətli idi.

Akademik M.Mehdizadənin elmi-pedaqoji irsində tarixi-pedaqoji tədqiqat istiqaməti ayrıca yer tutur. Qeyd etməliyik ki, onun istər namizədlik, istərsə də doktorluq işi pedaqogika tarixinin mühüm problemlərini əhatə edir. Onun bu yönümlü axtarışlarının nəticəsi olan məqalələri "Azərbaycan məktəbi" və digər elmi mətbuat orqanlarında dərc edilərək elmi-pedaqoji ictimaiyyətə çatdırılmışdır. Həmin materiallardan "Tərbiyə, təhsil və təlimin tarixi inkişafı" (1947), "İnqilabdan əvvəl Azərbaycanda olan rus məktəblərinin rolu haqqında" (1951), "Azərbaycanda sovet məktəbinin tarixinə dair" (1955), "Azərbaycan sovet məktəbinin inkişaf yolu" (1957), "R.B.Əfəndiyevin pedaqoji ədəbi fəaliyyəti və irsi haqqında" (1964), "SSRİ-nin 60 illiyi və Azərbaycanda pedaqoji elmlərin inkişafı haqqında" (1982), "Şəxsiyyətin hərtərəfli inkişafına dair təlimin elmi əsaslarla təşəkkülü haqqında" (1982) və digər məqalələr faktlar bolluğu və analitik təhlil məziyyətləri ilə səciyyələnir.

Mehdi müəllimin məktəb və pedaqoji fikir tarixinə dair tədqiqatlarının xeyli qismi Moskvada rus dilində çap olunan fundamental elmi nəşrlərdə yer tutmuşdur. Həmin tədqiqatlardan "Şkola i pedaqoqiçeskaya mısl v Azerbaydjane", "M.Ş.Vazex" (1973), "A.O.Çernyayevskiy" (1976), "Prosveşeniye i pedaqoqiçeskaya mısl v Azerbaydjane" (Z.İ.Qaralov və Ə.Ə.Ağayevlə birlikdə) və digər ensiklopedik məqalələr Azərbaycan pedaqoji fikrinin dünya oxucularına çatdırılmasına kömək etmişdir.



Onun Azərbaycan məktəblərində Azərbaycan dilinin, rus dilinin, əmək təliminin qoyuluşu, tədrisi tarixinə aid rus və Azərbaycan dillərində nəşr olunmuş məqalələri, kitabları artıq bu gün qiymətli elmi məxəzlərə çevrilmişlər.

Azərbaycanda təlim-tərbiyə, məktəb quruculuğu, təhsilin inkişafı, təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi, yenidənqurulması, görülmüş işlər və yeni vəzifələrin təhlili kimi məsələlər M.Mehdizadənin elmi-pedaqoji irsinin mühüm sahələrini təşkil edir. Ötən əsrin 50-70-ci illərində həyata keçirilən təhsil islahatları, təlim-tədris prosesinin təkmilləşdirilməsi işləri onun həm elmi-pedaqoji, həm də təşkilati-pedaqoji fəaliyyətində geniş yer tutmuşdur. "Məktəb quruculuğu sahəsində nailiyyətlərimiz" (1957), "Birgə təhsil sisteminin yenidən təşkili məsələlərinə dair bəzi qeydlər" (1958), "Azərbaycan məktəbləri yenidənqurma yollarında" (Azərbaycan və rus dillərində, 1960), "Məktəbdə təlim-tərbiyə işinin yenidənqurulmasının bəzi məsələləri" (1961), "Azərbaycan xalq maarifinin sürətli inkişafı" (Azərbaycan və rus dillərində, 1980), "Xalq maarifi orqanlarının və pedaqoji kollektivlərinin vəzifələri haqqında" (1980) və digər məqalə və məruzələri istiqamətvericiliyi və yenilik mahiyyəti ilə seçilən əsərlərdir.

Akademik Mehdizadə pedaqoji kollektivlərin, ayrı-ayrı qabaqcıl müəllimlərin pedaqoji təcrübələrinin öyrənilməsi, ümumiləşdirilməsi və yayılması sahəsində də əhəmiyyətli işlər görmüşdür. O, hələ 1963-cü ildə "Məktəbdə müəllimlərin qabaqcıl təcrübəsi və bu təcrübədən yaradıcılıqla istifadə edilməsi" mövzusunda

çap etdirdiyi məqalədə ("Azərbaycan məktəbi" jurnalı) qaldırdığı ideyaya ömrünün sonunadək sadiq qalmış, həmişə müəllim işini məktəb təcrübəsini öyrənməyi təbliğ etmişdir. Təlim-tərbiyə işinin təkmilləşdirilməsinə həsr edilən bütün kitablarında qabaqcıl təcrübəyə həm istinad etmiş, həm də onun mahiyyətini aşkarlamışdır.

M.Mehdizadənin elmi-pedaqoji yaradıcılıq fəaliyyətində didaktika-təlim nəzəriyyəsi məsələləri ayrıca yer tutmuşdur. O, dərs problemlərinə aid çox sanballı əsərlər yazmış, məruzələr etmişdir. Onun "Müasir dərsə verilən tələblər" (1971), "Dərsin təkmilləşdirilməsi yolları" (1979), "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" (1982) kitabları, "Dərs haqqında" (1948), "Çalışmaların ümumi əsasları haqqında" (1949), "Şagirdlərin biliyini yoxlamaq və ona qiymət vermək haqqında" (1949), "Dərsdə şagirdlərin fəallığını artırmaq haqqında bəzi qeydlər" (1961), "Dərsin təkmilləşdirilməsi yolları haqqında" (1979), "Na putyax soverşenstvovaniya uroka v şkolax Azerbaydjana" (1973) və digər məqalələri bu günün də aktual mövzularıdır. O, bu yazılarında həm nəzəri-pedaqoji-didaktik elmi mövqeyini bildirmiş, həm də praktik istifadə yollarını göstərmişdir.

M.Mehdizadə tərbiyə məsələlərini, xüsusilə əmək təlimi və tərbiyəsi, təlimin məhsuldar əməklə əlaqələndirilməsi, məktəblilərin bədii-estetik tərbiyəsi məsələlərini də şərh etmiş, öz üslubuna sadiq qalaraq, nəzəri və praktik istiqamətə eyni dərəcədə diqqət yetirmişdir. Alimin "Orta məktəb şagirdlərinin əmək tərbiyəsi haqqında" (1959) kitabında əmək tərbiyəsinin vəzifələri, əsas vasitələri, prinsipləri, təşkili formaları



haqqında ətraflı məlumat vermişdir. Onun "Məktəbdə estetik tərbiyənin vəziyyətinə dair" (1965), "Respublikanın ümumtəhsil məktəbi şagirdlərinin ideya-siyasi tərbiyəsini təkmilləşdirmək tədbirləri haqqında" (1969) və digər məqalə və məruzələri problem üzrə mövcud vəziyyəti öyrənmək, həm də alimin proqnostik ideyalarının əhəmiyyətini dərk etmək baxımından diqqəti cəlb edir.

M.Mehdizadənin elmi-pedaqoji irsində ümumtəhsilin məzmunu, fənlərin tədrisi metodikasına aid araşdırmalar geniş yer tutur. O, Azərbaycan dilinin, ədəbiyyatın, rus dilinin, musiqinin, ümumiyyətlə, bütün fənlərin tədrisi vəziyyətini yaxşılaşdırmaq, səviyyəsini yüksəltmək yollarını göstərmişdir. O, eyni zamanda uşaq ədəbiyyatı, sinifdənxaric oxu məsələlərinə aid dəyərli fikirlər söyləmişdir.

"Milli məktəb şagirdlərinin təlim və tərbiyəsi sistemində rus dilinin əhəmiyyəti" (1969), "Azərbaycan dili və ədəbiyyat tədrisini əsaslı surətdə yaxşılaşdırmalı" (1965), "Uşaq ədəbiyyatı haqqında bəzi qeydlər" (1966), "Respublikanın ümumtəhsil məktəblərində biologiyanın tədrisi vəziyyəti və şagirdlərin bilik keyfiyyətləri haqqında" (1972-1973) və digər məqalə və məruzələri adi bir alim şərhi deyil, praktik işdə öz həllini tapmağa yönəldilmiş metodik göstərişlər idi. Ona görə də tədrisin səviyyəsinin yüksəldilməsinə kömək etmişdir.

M.Mehdizadə nazir işlədiyi müddətdə təhsilin məzmunu ilə əlaqədar əsaslı təkmilləşmələr həyata keçirmiş, necə deyərlər, respublikanın baş pedaqoqu kimi ona elmi istiqamət vermiş və rəhbərlik etmişdir. Nəinki dil, ədəbiyyat, riyaziyyat, tarix və s. kütləvi tədris

fənlərinin hətta bədən tərbiyəsi, musiqi-nəğmə, əmək təlimi kimi fənlərin proqram və dərsliklərinin hazırlanıb nəşr edilməsi, təlimdə texniki vasitələrdən istifadənin genişlənməsi, linqofon kabinetlərinin geniş tətbiqi və s. kimi yeniliklər məhz onun səyi və qayğısı ilə tədrisdə geniş tətbiq edilmişdir.

Nazir M.Mehdizadə təlim-tədris işini tərbiyə işindən heç vaxt ayrı götürməmişdir. Təlim tərbiyənin vəhdətindən yaranan şagird ictimai fəallığını yüksək qiymətləndirmişdir. Şagirdlərin fəal mövqeyə yiyələnməsi – ictimai fəallığı, əmək fəallığı məsələlərini tədqiqi olaraq öyrənmiş, şagird şəxsiyyətinin inkişafı problemi ilə əlaqədar qiymətli əsərlər yazmışdır. "Şəxsiyyətin hərtərəfli inkişafına dair təlimin elmi əsasları" (1982), "Şagird şəxsiyyətinin hərtərəfli və ahəngdar inkişafı" (1982) kimi məqalələri bu istiqamətli elmi axtarışların nəticəsi idi.

M.Mehdizadənin elmi-pedaqoji irsi Azərbaycan pedaqoji fikir və məktəb tarixinin ən möhtəşəm səhifələrini təşkil edir. Bu səhifələr sadəcə tədqiqatçı alim araşdırmalarının üzə çıxardığı tarix deyil, həm də yaşadığı, yazdığı tarixdir. Onun əsərlərinin bir qismi özündən yüz il əvvəlləri əhatə edirsə, əksəriyyəti özünün rəhbər kimi iştirak etdiyi təhsil quruculuğunun tarixidir. Təsadüfi deyildir ki, təhsili idarəetmə elminə dair ən sanballı tədqiqat da məhz təhsil naziri M.Mehdizadə təfəkkürünün məhsuludur. Onun "Maarif sistemini idarəetmənin elmi əsaslarına dair" (1976) tədqiqat işi "Sovetsyaka pedaqogika" və "Azərbaycan məktəbi" jurnallarında dərc edilərkən, o zamanın sovet pedaqoqları



və maarif nazirləri tərəfindən ən yüksək səviyyədə dəyərləndirilmişdir.

M.Mehdizadə indi də dünyada aktual olan, yaşlıların təhsili probleminə həsr edilən əsərlər yazmış, bu sahədə beynəlxalq əhəmiyyətli fəaliyyət göstərmişdir. O, Azərbaycanda icbari orta təhsilə keçidlə əlaqədar 1965-ci ildə kəndli gənclərin təhsilinin səmərəli təşkili yollarını göstərmiş, bu məsələnin əhəmiyyətini şərh etmişdir. Beynəlxalq aləmdə isə YUNESKO xətti ilə bu problem üzrə əhəmiyyətli çıxışlar etmişdir. Bu cəhətdən onun ingilis dilində "Yaşlıların təhsilinə ciddi münasibət" ("Efiopiya xəbərləri", 1961), Afrika ölkələri təhsil nazirlərinin konfransındakı məruzəsi (Kurer YUNESKO, 1962, №6, rus, ingilis, ispan, fransız, alman, ərəb, yapon dillərində) və digər materialları qeyd etmək olar.

M.Mehdizadə milli-regional dairədə deyil, keçmiş Sovet İttifaqı və dünya miqyasında tanınan, sayılan və fəaliyyəti olan pedaqoq-alim, təhsil mütəxəssisi idi. Onun uzaq və yaxın xarici nəşriyyatlarda nəşr olunan əsərləri Azərbaycan təhsil təcrübəsini dünyaya yayırdı. Sağlığında hazırlanıb, ölümündən sonra ingilis və fransız dillərində kütləvi tirajla nəşr olunub, xarici ölkələrdə yayılmış "Xalq maarifinin inkişafında Sovet Azərbaycanının təcrübəsi" əsəri bu baxımdan əhəmiyyətli yer tutur...

M.Mehdizadə 1980-ci ildə, 77 yaşında maarif naziri vəzifəsindən fərdi təqaüdə çıxdı, amma ömrünün son gününə, 1984-cü ilin may ayına qədər tədqiqatlarını davam etdirdi. Onun 1982-ci ildə nəşr olunmuş "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı fundamental monoqrafiyası nəzəri və təcrübi məsələləri üzvü şəkildə əlaqələndirən

dəyərli əsər kimi pedaqogika elminin qızıl fonduna daxil olmuşdur.

M.Mehdizadə elmi-pedaqoji və təşkilatçılıq xidmətlərinə görə yüksək qiymətləndirilmişdir. O, 3-9-cu çağırış Azərbaycan SSR Ali Sovetinə deputat, Azərbaycan KP-nın XIX-XXVIII qurultaylarında MK-ya üzv seçilmişdir; Lenin ordeni (1960), üç dəfə Qırmızı Əmək Bayrağı Ordeni (1966, 1971, 1976), "Əmək veteranı" (1981) və digər medallarla dəfələrlə mükafatlandırılmış, habelə "Krupskaya medalı" ilə (1973) təltif edilmişdir. Ona 1982-ci ildə Əməkdar elm xadimi fəxri adı verilmişdir.

M.Mehdizadə şəxsiyyəti təkcə elmi qüdrəti ilə deyil, mənəviyyat paklığı ilə şöhrətlidir. Onun müasirləri "Bənzəri olmayan insan", "Azərbaycan pedaqoji elminin zirvəsi", "Ülvilik, paklıq, müqəddəslik nümunəsi", "İdeal sayılan şəxs", "Özü böyük məktəb olan insan" adlandırmış, əsl parlaq şəxsiyyət, mənəvi keyfiyyətlər mücəssəməsi saymışlar... Məhz bu ali xidmətləri və keyfiyyətlərinə görə Mehdi Mehdizadə adı fərəhlə, iftixarla xatırlanır, sevilir və əziz tutulur.

**"Azərbaycan məktəbi" jurnalı,**
**2003, №1, səh.72-78**





# MEHDİ MEHDİZADƏ TƏHSİL SİSTEMİNİN ELMİ İDARƏETMƏ MƏSƏLƏLƏRİNƏ DAİR

*RAMİZ ƏLİYEV,*
*ADPU-nun müəllimi*

Məlumdur ki, son illərdə respublikamızda bütün sahələrdə olduğu kimi təhsildə də sözün həqiqi mənasında, böyük islahat proqramı həyata keçirilir və cəmiyyətdə baş verən köklü dəyişikliklər milli təhsil sistemində də öz əksini tapır. "Təhsil sahəsində islahat proqramı"nda qeyd edilir ki, movcud təhsil sistemində toplanmış təcrübənin mütərəqqi əsaslarını saxlamaqla müstəqil Azərbaycan Respublikasının strateji məqsədlərini həyata keçirməyə qadir olan intellektual potensialı formalaşdıran yeni təhsil sisteminin qurulması həyata keçirilməlidir.

Azərbaycan təhsil sisteminin getdikcə dünya təhsil sisteminə inteqrasiyası, elmi-texniki inqilab, kompüterlərin təhsil prosesinə daxil olması, ictimai tərəqqi müasir dövrün tələbatı kimi bir-birilə sıx bağlı olan ictimai inkişafın 3 amilinin – elm, təhsil və idarəetmənin intensiv yüksəlişini tələb edir.

Təhsil müəssisələrində təlim-tərbiyə prosesinin mürəkkəb, çoxparametrli bir sistem kimi intensiv inkişafı və onun kökündən yaxşılaşdırılması bir sıra amillərlə yanaşı, həm də bu sistemin idarəedilmə işini təkmilləşdirməkdən asılıdır.

Qeyd olunmalıdır ki, 60-70-ci illərdə təhsil sistemində elmi idarəetmə məsələləri ilə bağlı mütərəqqi əhəmiyyət daşıyan xeyli işlər görülmüş, səmərəli nəticələr əldə edilmişdir.

Akademik M.Mehdizadənin zəngin pedaqoji irsində onun təhsilin idarəedilməsinə dair fikirləri bu cəhətdən böyük maraq doğurur. O, istər nəzəri, istərsə də əməli olaraq (təbii ki, vəzifə funksiyasına görə) bu cəhətə fəal münasibət göstərmişdir. Hələ 1954-cü ildə məktəb inspektoru problemini qaldırmış, yoxlamaların metodik və nəzarət istiqamətinin əsas olaraq nəzərdə tutulmasını irəli sürmüşdür. O, tapşırıq, icra və nəzarət funksiyalarına rəhbərliyin işinin əsas xüsusiyyəti kimi nəzərə alaraq, bu prosesdə inzibati-amirlik üslubunun əleyhinə çıxmış, elmi-metodik əsaslarla idarəetməyə üstünlük vermişdir.

Onun Təhsil Nazirliyi arxivində saxlanılan kollegiya iclasları protokollarında əks olunan çıxışları, qərar və göstərişləri, məktəb direktorlarının və digər mütəxəssislərin onun haqqında kitablarda, jurnallarda dərc olunmuş xatirələri M.Mehdizadənin təhsili idarəetməyə aid nəzəri və əməli mövqeyini müəyyənləşdirməyə imkan verir. Problemlə əlaqədar şəxsi keyfiyyətləri, əməli nümunələri ön plana çəkilir. Qeyd edilir ki, M.Mehdizadə bir rəhbər (nažir) kimi səbrli, təmkinli, ədalətli, xeyirxah, obyektiv, prinsipial mövqeli, dərin bilikli, geniş dünyagörüşlü, güclü məntiqi, düzgün qərar verə bilmək qabiliyyəti olan halal bir şəxsiyyət – rəhbər olmuşdur. Bəlkə elə buna görə də əbədiyyətə qovuşmasından 30 ilə yaxın bir dövr keçməsinə baxmayaraq, onun iş üslubu və şəxsi keyfiyyətləri haqqında tez-tez söhbət açılır, şəxsiyyəti və fəaliyyəti örnək olaraq nümunə göstərilir.



M.Mehdizadənin təhsili idarəetmə məsələlərinə dair baxışları, fikirləri mükəmməlliyi, elmi-nəzəri və praktik dəyəri ilə öz dövründə yüksək qiymətlənidirilmiş, elmi məclislərdə, rəsmi müşavirələrdə təqdir edilmişdir. O, 1976-cı ildə bu problemlə əlaqədar xüsusi araşdırma apararaq təhsili idarəetmənin problem kimi qoyuluşu, mahiyyəti, prinsipləri, üsulları və s. barəsində faydalı bir əsər yazmışdır. Bu əsər elə həmin il rus dilində "Sovetskaya pedoqogika" jurnalının 10-cu nömrəsində, "Azərbaycan məktəbi" jurnalının isə (1976) 11 və 12-ci nömrələrində dərc edilmişdir.

Müəllif yaradıcılıq üslubuna (kredosuna) sadiq qalaraq əvvəlcə, ümumiyyətlə "idarəetmə" anlayışının şərhini verir və onun növlərini göstərir. İdarəetməyə nəzəri ədəbiyyatda verilən tərifləri saf-çürük edərək belə bir qənaətə gəlir ki, maarif sisteminin idarəedilməsi dedikdə təşkilati, metodiki, kadr, tərbiyə, plan, maliyyə, təchizat və s. sahələrə dair tədbirlərin məcmusu nəzərdə tutulur. Bu tədbirlərin yerinə yetirilməsi maarif sisteminə daxil olan müəssisələrin normal fəaliyyət göstərmələrini və sistemin inkişafını təmin edir. Qeyd edək ki, o zaman "təhsil sistemi" əvəzinə "maarif sistemi" işlənildiyindən M.Mehdizadənin işlətdiyi "maarif" istilahını "təhsil" istilahı kimi başa düşmək lazımdır. Alim idarəetməyə elm kimi yanaşaraq onun elm kimi qavranılmasında mahiyyət dolğunluğunu açmağa çalışaraq yazır: "Maarif sistemini idarəetmə elmi dedikdə, biz idarəetmənin məqsəd və məzmununu işıqlandıran və müəyyənləşdirən prinsip və metodların nəzəri əsaslarını nəzərdə tuturuq ki, onlar idarəetmənin səmərəli aparılmasını təmin edir".

M.Mehdizadə maarif sistemini idarəetmənin prinsiplərini müəyyənləşdirir və öz dövrünün siyasi-ideoloji tələblərinə müvafiq olaraq əsas prinsip kimi elmi idarəetmədə partiyanın siyasi işlər və əmək sahələri üzrə rəhbərliyinin vəhdətini nəzərdə tutur. Digər prinsiplər sırasında demokratik mərkəziyyət, elmilik, planlaşdırma, uçot və nəzarət prinsiplərini qeyd edir. Göründüyü kimi, kommunist partiyasının demokratik mərkəziyyət prinsipi demokratikliyi, humanist yanaşmanı, müstəqil yaradıcı yanaşmanı prinsip kimi elmi cəhətdən əsaslandırmağa imkan vermirdi. Çünki demokratik mərkəziyyət prinsipinin tələbinə görə mərkəzi simanın – başçının, partiyanın, baş qərargah qərarının icrası yuxarıdan aşağıyadək məcburi idi. Məhz elə bu prinsip fəaliyyətdə şablonçuluğu, diktatorluğu, məcburiliyi meydana gətirdiyindən, sərbəst, yaradıcı düşüncəyə və fəaliyyətə, idarəetməyə imkan vermirdi. Lakin elmilik, planlaşdırma, uçot və nəzarət kimi prinsiplər mühüm əhəmiyyət daşıyır, bu gün də öz aktuallığı ilə seçilir.

M.Mehdizadə elmilik prinsipinin əsasını maarifin idarəedilməsi üçün qərar və tədbirlərin qəbul edilməsində elmi qanunauyğunluğa arxalanmaqda görür. Ona görə də yazır ki, elmilik prinsipi maarif sisteminin idarə edilməsində elmi məlumatların, şərait və vəziyyətin hərtərəfli uçotunun zəruriyyətini tələb edir. İşə belə yanaşılmazsa, maarifin idarə edilməsi üçün qəbul olunmuş tədbirlərin həyata keçirilməsinin müsbət nəticəsi ola bilməz.

M.Mehdizadə maarif sistemini optimal idarəetməni sanki elmilik prinsipinin həyata keçirilməsi mexanizmi kimi təqdim edir. Ona görə də qeyd edirik ki, maarif



sistemini idarəetmədə həmin prinsipin tətbiq edilməsi yalnız idarə edilən obyektlərin hərtərəfli uçotunun xüsusiyyətlərini deyil, həm də başlıca olaraq iqtisadi-riyazi metodların, habelə tez həll edən hesablayıcı və idarəedici texnikanın geniş tətbiq olunması deməkdir.

Alim kollektiv rəhbərliklə təkbaşına rəhbərliyin əlaqələndirilməsinin təmin edilməsini də idarəetmənin prinsipi kimi qəbul edir və şərhində onun nəzərə alınmasının əhəmiyyətini əsaslandırır.

Akademik M.Mehdizadənin idarəetmə metodları ilə əlaqədar fikirləri və təsnifatı böyük maraq doğurur. O maarifi idarəetmə metodlarını dörd qrupa bölür: a) normativ sənədlərlə idarəetmə metodları; b) təşkilati-inzibati idarəetmə metodları; c) idarəetmənin pedaqoji meodları; ç) idarəetmənin sosioloji-psixoloji metodları.

Alim normativ sənədləri həm işin həyata keçirilməsinin hüquqi əsası, həm də görülən işlərin tənzimləyicisi hesab edir. O, təsdiq olunmuş məktəb Nizamnaməsini, tədris planını, hər növ tədris fənni üzrə proqram və dərslikləri, tərbiyə işlərinin nümunəvi proqramını, şagirdlər üçün davranış qaydalarını və s. normativ sənədlər kimi qəbul edərək, onları hər bir təhsil müəssisəsi üçün vacib sayır. Lakin məktəb müvafiq şəraitə - bina, şagird, müəllim kadrları, fənn kabinetləri, əyani vəsait və i.a. malik olduqdan sonra yuxarıda göstərilən normativ sənədlərə əsaslanaraq, zəruri maliyyə vəsaiti sərf etməklə üzərinə düşən vəzifəni – şagirdlərin təlim-tərbiyə vəzifəsini yerinə yetirə bilər.

M.Mehdizadə təşkilati-inzibati idarəetmə metodları adı altında idarə edilən obyektin bütün elementlərinin məqsədyönlü fəaliyyətinin təmin olunmasını, idarəedilən

müəssisədə işlərin fasiləsiz və ahəngdar getməsinə yönəldilən üsul və priyomların məzmununun nəzərdə tutulduğunu qeyd edir.

Görkəmli pedaqoq alim təşkilati-inzibati idarəetmə metodlarının məzmununu müəyyənləşdirir və buraya idarəetmənin qarşısında duran vəzifələri, onların quruluş prinsiplərini, ştat cədvəlini, zəruri şərait yaradılan və yuxarı təşkilatlar tərəfindən təsdiq olunan müəssisənin fəaliyyəti haqqında əsasnaməni və bu qəbilli sənədləri daxil edir.

Alim təşkilati-inzibati metodlar qrupuna yerlərdə (məktəb, uşaq bağçası və s.) işlə tanışlığı, inspektor yoxlamasını, yerli maarif orqanları nümayəndələrinin iştirakı ilə keçirilən və lazımi məsləhət və zəmanət qəbul edən müşavirələri, seminar-müşavirələrini, konfransları, müəllimlər qurultayını, idarə olunan obyektlərin fəaliyyəti ilə əlaqədar olan, həmçinin yerinə yetirilməsi məcburi xarakter daşıyan və nəticəsi barədə hesabat verilməsi zəruri sayılan müxtəlif yazılı sərəncamların, əmr və qərarların yerlərə göndərilməsini daxil edir. O, idarəetmə metodunun bu qrupuna rəhbər kadrların seçilməsi, tərbiyə edilməsi və yerləşdirilməsi, müəllim kadrları və uşaq müəssisəsi tərbiyəçilərindən düzgün və səmərəli istifadə edilməsi, onların hazırlanması və ixtisasının artırılması, həmçinin maarif təşkilatları və idarələrin maliyyələşdirilməsi və onların planlaşdırılmasını da daxil edir.

Yeni ictimai-siyasi quruluşa və iqtisadi münasibətlərə keçidlə əlaqədar olaraq bu metodlar qrupuna daxil edilən metodların müəyyən hissəsi öz



aktuallığını itirsə də, müəyyən hissəsi isə əksinə, daha da aktuallaşmışdır.

M.Mehdizadə idarəetmənin pedaqoji metodları sırasında müəyyən metodik tədbirlər vasitəsilə subyektin obyektə təsirinin təmin olunmasına xidmət edən üsul və priyomları nəzərdə tutur. Məsələn, avqust müşavirələrini, təlim-tərbiyə məsələlərinə dair qabaqcıl pedaqoji təcrübənin ümumiləşdirilib yayılmasına bu və ya digər pedaqoji problemlər üzrə görülən işlərin yekunlaşdırılıb qiymətləndirilməsinə həsr olunan müəllimlərin, metodist və elmi işçilərin elmi-praktik konfranslarının keçirilməsi, pedaqoji eksperimentlərin aparılması, disput və müzakirələrin təşkili, müəllim və məktəblərin müvafiq metodik ədəbiyyatla təmin olunması və s.

İdarəetmənin sosioloji-psixoloji metodlarından bəhs edən alim bu metodlar qrupuna işin gedişinin müzakirəsinə dair istehsalat müşavirələrini, işçilərin həvəsləndirilməsini və s. daxil edir. İnandırmanı isə rəhbər işçilərin tabe olanlarla apardığı işin əsas metodu kimi səciyyələndirir. Bunlarla yanaşı, o idarəetmə işində məcburiyyət və tənbeh metodlarının da tətbiq olunduğunu bildirir.

M.Mehdizadənin təhsilin idarəedilməsi ilə əlaqədar fikirlərində rəhbər kadrlara verilən tələblər haqqında irəli sürdüyü nöqteyi-nəzər maraq doğurur.

Onun ilk tələbi rəhbər kadrların düzgün seçilməsi, yerləşdirilməsi və tərbiyə edilməsi ilə əlaqədardır. Bu tələbin həqiqətən çox böyük əhəmiyyəti vardır. Rəhbər kadr ixtisasını dərindən bilən, ləyaqətli, metodik ustalığa malik, təcrübəli, təşkilatçılıq qabiliyyəti ilə seçilən şəxs olarsa, onun rəhbərliyi mütləq iş uğurları gətirir. Təəssüf

ki, hazırda ölkəmizdə idarəetmənin bu tələbinə riayət edilmir. Ona görə də rəhbər kadrlar işin öhdəsindən gələ bilmir, vəzifəsinə şəxsi qazanc mənbəyi kimi baxır, nəticədə işdən uzaqlaşdırılırlar.

Alim rəhbər işçinin psixoloji qabiliyyətləri ilə diqqəti cəlb etməsini xüsusi keyfiyyət kimi qeyd edir. Bu, ilk növbədə qayğıkeşlik, müşahidəçilik, təşəbbüskarlıq, qətiyyət, müstəqillik, təmkinlilik kimi insana xas olan ümumi xarakter əlamətlərdən ibarətdir.

Göründüyü kimi, M.Mehdizadə təhsilin idarə edilməsində gərəkli olan prinsip və metodlarla, vasitələrlə kifayətlənmir, rəhbər kadrın insani keyfiyyətlər daşıyıcısı kimi də seçilməsini, bundan sonra həmin prinsip və metodlara bələdliyi şərtini irəli sürür.

Beləliklə, qeyd edilənləri belə ümumiləşdirə bilərik ki, M.Mehdizadə təhsilin idarəedilməsinə elmi və metodik baxımdan yanaşaraq, onun nəzəri-konseptual mahiyyətini açmış və məzmununu şərh etmişdir. Diqqəti cəlb edən cəhət budur ki, o, təhsilin uğurlarını onun düzgün elmi əsaslarla idarə edilməsində görür. Bu nəticə bu gün də çox aktualdır.

**"Azərbaycan məktəbi" jurnalı,**
**2003, №3, səh.79-83**





# "BƏXTİYARSAN ƏGƏR ÇƏKDİYİN ƏMƏK, CAHAN SÜFRƏSİNƏ VERSƏ BİR ÇİÇƏK"

***YUSİF TALIBOV,***
*Pedaqoji elmlər doktoru,*
*professor, Əməkdar müəllim, akademik*
*M.Mehdizadə adına mükafat laureatı*

Xalqımızın görkəmli maarifçisi, tanınmış dövlət xadimi, beynəlxalq aləmdə tanınan pedaqoq, ləyaqətli maarif rəhbəri akademik Mehdi Mehdizadə belə bir ağlın sahibi, böyük aqillərdən biri, müəllimlər müəllimi, müdriklər müdriki idi.

Mehdi müəllimi xalqımızdan, Azərbaycan müəllimliyindən 30 ilə yaxın bir zaman kəsiyi ayırır. Bu zaman kəsiyi bizdən uzaqlaşdıqca o, bizə daha çox yaxınlaşır və biz onun böyüklüyünü daha dərindən dərk edir, Mehdi Mehdizadə fenomeni qarşısında baş əyirik. M.Mehdizadənin həyatı, ömrü çox zəngin bir tarixə, şəxsiyyəti müqəddəs tərbiyə məktəbinə çevrilmişdir. Belə bir ömür yaşamış, xalqının, millətinin maarifinə, pedaqoji fikrinə, məktəb tarixinə sədaqətlə xidmət göstərmiş Mehdi müəllim haqqında yazmaq, onunla ünsiyyətdə keçən ömrün günlərini, saatlarını, illərini geri qaytarmaq, yenidən yaşamaq, onun dərin kəlamlarını, məzmunlu söhbətlərini, elmi məruzə və çıxışlarını dinləmək, hər biri bir mənəviyyat, ləyaqət, böyüklük, vətənpərvərlik məktəbi

olan Maarif Nazirliyinin kollegiya iclaslarında iştirak etmək deməkdir. Hər biri bir universitet olan kollegiyada kiminsə çıxışından xoşu gəlməyəndə heç bir söz demədən sadəcə olaraq sağdakı pəncərəyə üz çevirdiyini xatırlamaq deməkdir.

Azərbaycan pedaqogika elmi kəhkəşanının ən işıqlı, ən parlaq ulduzlarından biri olan Mehdi müəllimlə tanışlığım 1952-ci ildən başlamış, Mehdi müəllimin ömrünün sonuna kimi davam etmişdir. Bir igidin ömrü olan 30 ildən artıq bir dövrü əhatə edən bu illər özünəməxsus şirinli-acılı xatirələrlə zəngin olmuş, bu illərdə aqil bir insanın qayğıları, tələbləri, tənqidləri, öyüd və nəsihətləri damla-damla qanıma hopmuş, qəlbimdə əbədi yer tutmuşdur. Mehdi müəllim mənim yaddaşımda çox səmimi, ləyaqətli, zərif qəlbli, qüdrətli təşkilatçı, maarif fədaisi, gözəl bir pedaqoq kimi qalmışdır. Mehdi müəllim işıqlı, müdrik bir ziyalı, dövlət xadimi idi. O, mütaliə etməkdən zövq alırdı. Mehdi müəllim Şərq fəlsəfəsini, ədəbiyyatını, Azərbaycan xalqının maarifçi və mütəfəkkirlərinin əsərlərini incəliklərinə qədər bilirdi. Mehdi müəllim Nizami Gəncəvinin təlim-tərbiyə haqqındakı fikirlərinə tez-tez müraciət edərdi. O, Nizamidən iqtibas gətirərək deyirdi ki, tərbiyə hökmü ilə su gövhər olar. Tərbiyə iksirini dəmirə vursan, o dönüb qızıl olar. Ağıllı, düzgün tərbiyə hünər və nəzakətdir. O ağıla nur, ürəyə qüvvət verər. İnsan yalnız tərbiyə vasitəsilə insan ola bilər. Tut yarpağı tədricən atlas olduğu kimi, düzgün təlim-tərbiyə sahəsində hər şəxs (məktəbli) get-gedə insana çevrilər. Məktəblilərə ünsiyyət, ülfət, məhəbbət, vətənpərvərlik, xeyirxahlıq, dostluq, böyüyə



hörmət, kiçiyə qayğı, yəni həyat üçün zəruri olan fəzilətləri öyrətmək lazımdır.

Mehdi müəllim hər bir kəsin, müəllimin zəhmətini yüksək qiymətləndirər, hər bir müəllimin yaradıcılığındakı yeni pedaqoji təklif və ideyanı məhz həmin adamın öz adına yazardı. Bu baxımdan onun çox sanballı əsərləri ("Azərbaycanda xalq maarifinin sürətli inkişafı", "Maarif", 1980; "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları", "Maarif", 1982) belə faktlarla zəngindir.

Mehdi müəllim heç vaxt başqasının yazdığı məruzə ilə çıxış etməzdi. O, ayrı-ayrı adamlara, maarif işçilərinə faktları toplamağı tapşırardı. Ən çox özü dərslərində iştirak etdiyi müəllimlərin dərsini təhlil edərdi. Toplanmış faktları təhlil-tərkib edər, müqayisələr, ümumiləşdirmələr aparardı.

1977-ci ildə "Məktəblilərin müstəqil işinin təşkili" mövzusunda respublika elmi-praktik konfransını keçirirdik. Aparıcı məruzə üçün materialları mən toplamışdım, məruzəni də mən yazmışdım. Elmi-praktik konfransın proqramına nazirliyin kollegiyasında baxıldı. Kollegiya üzvlərindən bir neçəsi məruzə ilə Mehdi müəllimin çıxış etməsini istədilər. Bu zaman Mehdi müəllim dedi ki, məruzəni kim yazıbsa, o da oxumalıdır. Gənc kadrları necə hazırlamalıyıq?

Həmin konfransda birinci əsas məruzə ilə mən çıxış etdim. Məruzəni Mehdi müəllim və digər rəsmi şəxslər yüksək qiymətləndirdilər. Mehdi müəllimin təklifi ilə həmin məruzənin mətni olduğu kimi, "Azərbaycan məktəbi" jurnalında çap edildi. Mehdi müəllim belə bir şəxsiyyət idi. Bir dəfə də "Azərbaycanfilm"

kinostudiyasından Mehdi müəllimə müraciət edib "İki məktəbin dostluğu" adlı qısametrajlı tədris filminə məsləhətçi istəyiblər. Bu zaman Mehdi müəllim proqram-metodika idarəsinin rəisi mərhum İmran müəllimə deyir ki, Y.Talıbovun mövzusuna aiddir. Odur ki, elmi məsləhətçi o olsa yaxşıdır. Ssenarinin mətnini, mənim fikrimi Yusifə çatdırın, rəyini də nəzərə alın. Budur Mehdi Mehdizadə ürəyinin genişliyi, paklığı, təvazökarlığı.

Mehdi müəllim əvəzsiz şəxsiyyət idi. O, hər bir çıxışında yeni fikir söyləyər, müəllimləri, dinləyiciləri öyrənməyə, yaradıcılıqla işləməyə çağırardı. O, Nasir Xosrovun, Nizami Gəncəvinin aşağıdakı kəlamlarını tez-tez işlədərdi:

***Ağıl könlün günəşi, ədalət isə onun ziyasıdır.***

***Qüvvət elmdədir, başqa cür heç kəs,***
***Heç kəsə üstünlük eyləyə bilməz.***

***İnsana arxadır onun kamalı,***
***Ağıldır hər kəsin dövləti, malı.***

Mehdi müəllim çox qayğıkeş bir insan idi. Maraqlı olan bu idi ki, o, etdiyi yaxşılığı heç kimin üzünə vurmazdı. Özünü elə göstərərdi ki, o, heç nə etməyib, heç kimə kömək göstərməyib. Şəxsiyyətin böyüklüyü bu idi. Adam var ki, (hətta atalar var ki) etdiyi yaxşılıqlar üçün minnət qoyur. Mehdi müəllim heç kimə etdiyi xeyirxahlıq üçün minnət qoymazdı. Bu baxımdan Mehdi müəllim əvəzsiz bir insan idi. O, qayaların sinəsində çağlayan dağ bulağı, dağ çeşməsi idi. Hamı istədiyi qədər o çeşmənin



suyundan içər, öz yanğısını söndürərdi. Mehdi müəllimin daxilində əzəmətli bir xeyirxahlıq günəşi vardı. O, xeyirxahlığı hamıya səxavətlə paylayardı.

Mehdi müəllim böyük hərflə yazılan Vətənpərvər nazir idi. O, dərsliklərin məzmununda vətənpərvərlik ideyalarına geniş yer verilməsinə xüsusi diqqət yetirirdi. Mehdi müəllim çıxışlarında, məruzələrində vətənpərvərliyə xüsusi əhəmiyyət verirdi.

Mehdi müəllim böyük Azərbaycan alimi N.Tusinin dediyi ilahi namus – ülvi, pak vicdan sahibi idi. O, vicdanı qanunlar qanunu sayır və deyirdi ki, vicdanı pak olan insanlar rahat yatırlar. Mehdi müəllim həmişə həll etməli olacağı bir məsələyə obyektiv, ədalətlə yanaşardı. Təmiz, ləkəsiz vicdan Mehdi müəllimin bəzəyi idi.

Akademik M.Mehdizadənin obrazı mənim yaddaşımda əlində sinif jurnalı, qara, gur saçlı bir müəllim, mənalı həyatını insanlığın ən çətin kəşfləri olan tərbiyə və idarəetmə sahəsində cilalayan bir rəhbər, ömrünü gilə-gilə Azərbaycan pedaqoji fikir və məktəb tarixinin zəngin salnaməsi səhifələrinə hopduran bir tədqiqatçı, şəvə saçlarını xalqın, millətin maarifi naminə bəyazlaşdıran bir nurani baba, pedaqogika elmində özünün dəst-xəttini yaradan, Azərbaycan pedaqogika elmi sarayının ucaldılmasında fəhlə, bənna, mühəndis və memar, qabaqcıl məktəb təcrübəsinin öyrənilib yayılmasına vətəndaşlıq hüququ verən bir novator pedaqoq, gözəl alim, zərif ürəkli bir müəllim, ülvilik, paklıq, ideallıq, müqəddəslik, mərdlik rəmzi kimi qalmışdır.

Filosof, kövrək qəlbli şairimiz H.Cavidin aşağıdakı sözləri Mehdi müəllimi çox gözəl səciyyələndirir:

***Bəxtiyarsan, əgər çəkdiyin əmək,***
***Cahan süfrəsinə versə bir çiçək.***

Mehdi müəllim pedaqogika, məktəb, maarif adlanan dünya süfrəsinə çox ətirli, rayihəli çiçəklər, güllər bəxş etmişdir. Gəlin xalqımızın tarixi kökləri olan böyük şəxsiyyətlərimizi unutmayaq; unutsaq unudularıq.

***"Azərbaycan müəllimi" qəzeti,***
***10-16 yanvar, 2003-cü il***





# TARİXDƏ VƏ XATİRƏLƏRDƏ YAŞAYAN İNSAN

***NƏCƏF NƏCƏFOV,***
*Təhsil Nazirliyinin Dərslik,*
*mətbuat və nəşriyyat şöbəsinin rəisi,*
*filologiya elmləri namizədi*

Azərbaycanın görkəmli pedaqoqu, mürəkkəb tarixi hadisələrlə dolu XX əsrin dörddə birini maarifimizin başında duran akademik Mehdi Mehdizadə ilə birgə işləmək mənə də nəsib olmuşdur. Pedaqoji elmlər doktoru, professor elmi adlara malik olan Mehdizadəyə hər cür tituldan əziz «Mehdi müəllim» sözü idi. Ona hamı belə müraciət edəndə çox xoş hal olurdu. Mən kənddə müəllim işlədiyim illərdə də Mehdi müəllim barədə çox eşitmişdim, bir neçə dəfə yığıncaqlarda görmüşdüm, ancaq onunla ilk üzbəüz görüşümüz 1970-ci il noyabrın 22-də olmuşdu. O zaman Azərbaycan Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutunda metodist işləyirdim. İnstitutun direktoru, gözəl təşkilatçılıq qabiliyyətinə malik olan, təhsilimiz tarixində böyük xidmətləri olan prof. Baləli Vəliyev - məni həmin gün nazirin qəbuluna apardı. Məni AMMTİ-də rəhbər pedaqoji kadrlar kabinetinə müdir vəzifəsinə namizəd göstərmişdilər. Bu vəzifə Nazirliyin nomenklaturasında olduğu üçün hökmən nazirlə görüşmək lazım gəlirdi. İş gününün sonunda nazirin qəbuluna düşdük. O bizmlə görüşüb dərhal söhbətə başladı. Baləli müəllimin təqdimatından sonra mənə baxdı və ilk sualı belə oldu:

«Kənd məktəbində neçə il işləmisən»; 10 il sözünü eşidəndə şad oldu. Təkmilləşdirmə kurslarından söhbət saldı və rəhbər pedaqoji kadrların diqqətinin kurslarda ən çox hansı məsələlərə cəlb olunduğunu soruşdu. Nazirlə görüşəcəyimi əvvəlcədən bildiyim üçün xeyli hazırlaşmışdım. «Sovetskya pedaqoqika», «Narodnoye obrazovanie»; «Azərbaycan məktəbi» jurnallarına baxmışdım. Mehdi müəllimin son kitablarını, məqalələrini diqqətlə oxumuşdum. Onun rəhbər pedaqoji kadrlarla işə, idarəetməyə dair yazıları ilə tanış idim. Ona görə də cavab verdim ki, kursda olan direktorlara elmi rəhbərlik məsələlərindən, pedaqoji kollektivə rəhbərlikdə əsas istiqamətlərin düzgün müəyyənləşdirilməsindən mühazirələr oxuyuram, onlara pedaqogika elminin son nailiyyətlərindən, görkəmli pedaqoqların əsərlərindən danışıram. O mənə qulaq asırdı. Hiss edirdim ki, mənim cavablarım Mehdi müəllimi razı salırdı. Birdən o, nədənsə söhbəti Makarenkonun üzərinə gətirdi və Makarenkonun əsərlərini oxumusanmı? – sualını verdi. Mən «Pedaqoji poema»nın adını çəkdim. Mehdi müəllim belə hallarda yerinə düşən məsələlərə əl atırdı. O sözünə davam edərək, Makarenko deyirmiş ki, mən «hə» sözünü 20 dəfə tələffüz etməyi öyrənənə qədər özümü müəllim saymırdım, – dedi. Sonra qələmini götürdü və əmrimə qol çəkdi. Bu anda gözüm onun sifətində idi. Uzun illər kadrların əmrinə qol çəkiləndə, müşahidə etmişdim ki, onun sifətindəki həmin təbəssüm razılıq ifadəsidir. Bizə öz tövsiyələrini, yaxın vaxtlarda «Müasir dərs və ona verilən tələblər» mövzusunda elmi-praktik konfransın keçiriləcəyi ni dedi və bunun Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutuna



tapşırılacağını da vurğuladı. Biz nazirdən xoş əhval ruhiyə ilə ayrıldıq.

Tezliklə adı çəkilən konfrans baş tutdu və onun nəticələrinə görə məruzəçi və təşkilatçılar, o cümlədən mən «Qabaqcıl maarif xadimi» döş nişanı ilə təltif olundum. Mehdi müəllimlə ikinci üzbəüz görüşüm 1971-ci ildə oldu. O illərdə Lerik rayonunda çoxlu yazışmalar vardı. Yoxlamaların nəticələri Mehdi müəllimi razı salmırdı. Oraya obyektiv bir komissiya göndərmək məsləhət bilindi. Belə qərara gəlmişdilər ki, Leriklə heç bir əlaqəsi olmayan adamlardan ibarət komissiya göndərilsin. Nazirliyin inspektorları A.Abdullayev və A.Əfəndiyevlə birlikdə mən də Lerikə gedəsi oldum. Komissiyanın sədrliyi mənə həvalə edilmişdi. Biz yola düşdük. Fevral ayı idi. Lerikə çatanda güclü qar yağırdı. Kənd yolları bağlanmışdı. Maşınla kəndlərə getmək mümkün deyildi. Onda biz rayonun Blabənd, Monidigah, Barzavu, Cəngəmiran kəndlərinə piyada getdik, məktəblərin vəziyyəti ilə tanış olduq. Nöqsan və çatışmazlıqların səbəbini araşdırdıq. Bir neçə günə Lerik rayonunda təlim-tərbiyə işlərinin vəziyyətinə dair arayış hazırlandı və Mehdi müəllimə təqdim olundu. Mehdi müəllim arayışdan razı qalmışdı. Materialların kollegiyaya hazırlanmasına dair göstəriş verdi. Bir neçə gündən sonra kollegiya çağrıldı. Müzakirə zamanı arayış haqqında müsbət fikir söylədi və inspeksiyanın rəisi N.Abdullayevə tapşırdı ki, imkan olan kimi mənim Nazirliyə dəyişdirilməyimi həll etsin. Az sonra məni Nazirliyin Baş inspeksiyasına inspektor vəzifəsinə köçürdülər. Naxsçıvan MR, İmişli, Füzuli, Beyləqan, Cəbrayıl, Zəngilan, Qubadlı rayonlarının kuratorluğu mənə həvalə

edildi. İnspeksiya Mehdi müəllimin özünün kurasiyasında idi. Ona görə də indi onunla tez-tez görüşürdük. O bizi dinləyir və tövsiyələr verirdi. Yerlərdə yoxlanmış ərizələrin nəticələri ilə özü şəxsən tanış olurdu. Lazım gələndə bizi yenidən işləməyə məcbur edirdi.

1975-ci ildə kollegiyada bir neçə rayonda ideoloji kadrların seçilməsi, yerləşdirilməsi və tərbiyə edilməsinə dair məsələ müzakirə olunurdu. Məruzəçi mən idim. Məlumat üçün mənə 7 dəqiqə vaxt verıldı. Mən həyəcanımdan vaxtın keçdiyini unutmuşdum, yerdən «reqlament» sözü eşidildi. Mehdi müəllim isə, «yaxşı danışır, qoyun danışsın», - dedi. Mən əlavə 3 dəqiqə də danışdım. O, bu arayışdan da razı qalmışdı. Səhəri gün məni yanına çağırdı. Nazirliyin partkomu C.Hüseynov da məni yenidən sorğu-suala tutdu. Füzuli, İsmayıllı rayonlarında apardığım yoxlamalarla maraqlandı. O zaman bu rayonlarda H.Hüseynov və İ.Həsənov kimi təcrübəli və nüfuzlu RMŞ müdirləri çalışırdı. Onların işinə özü şəxsən yaxşı bələd idi. Elə bil, mənim bu məlumatlarım da onu qane edirdi. O üzünü partkoma sarı çevirdi və «Nə deyirsən, təklifimizi deyəkmi?» Deyib mənə baxdı və «Səni kadrlar idarəsinə rəis təyin edirəm» sözlərini elan etdi. Mən yalnız «Çətin olmazmı» sözlərini dedim, O, isə «olmaz» dedi və əmrimin hazırlanmasına və saat 4-də keçiriləcək yığıncağa rəis kimi gəlməyimə dair göstəriş verdi. Mən özümü itirmişdim. Gözlənilməz təklif məni çaşdırmışdı. Yalnız onu əlavə edə bildim ki, «qorxuram işləyə bilməyəm». O isə amiranə tərzdə «Qorxu məsuliyyətdir, deməli, işləyəcəksən». Mənə uğurlar arzuladı və öz ağsaqqal müdrikliyi ilə məndən əvvəl olan nöqsan və çatışmazlıqlardan söz saldı. Onun



dediyi sözlər uzun illər qulaqlarımdan getmədi. Vəzifəmlə əlaqədar bundan sonra Mehdi müəllimlə hər gün görüşürdüm. Bir dəfə o məndən fizika, kimya, biologiya müəllimlərinin neçə faizinin ali təhsilli olmasını soruşdu. Mən icazə istədim ki, rəqəmlər olan kitabçamı gətirim. Onun sifətinin cizgiləri sərtləşdi, mənim sözüm onun üçün gözlənilməz oldu və hirslənməyin əlaməti kimi (hamımız buna adət etmişdik) pəncərədən bayıra baxdı «Nəcəf, sən onları əzbər bilmirsən, bəs sən nə ilə məşğulsan? Axı müəllimlərin təhsil səviyyəsi sənin gündəlik işin olmalıdır. Yadında saxla, mən böyük iclaslarda belə səni yerindən durğuzsam, sən pedaqoji kadrlara dair rəqəmləri mənə əzbər deməlisən». Mənim üçün ağır olsa da səhvimi anladım və ondan sonra yaddaşımı, hafizəmi işə saldım, rəqəmlərlə işlədim. O danlaq mənə çox şey öyrətdi. Anladım ki, yaddaş işləməklə bərkiyirmiş, həm də rəqəmlərlə işləyəndə onlar yadda qalırmış. Əzbərləməyə isə lüzum olmurdu.

Bəli, belə hallar çox olurdu. O öz iradları ilə də bizi tərbiyə edirdi. Yadımdadır, bir dəfə Şamaxıdan təsdiqə gəlmiş 5 direktoru onun yanına aparmışdım. Hava isti idi. Hamı qolu gödək köynəkdə idi. Mehdi müəllim isə kostyum geymişdi, boğazında qalstuk da öz yerində. O, direktorun birindən qalstuk taxmamağının səbəbini soruşdu. Direktor isə, «Bağışlayın, Mehdi müəllim, həmişə qalstuk taxıram, səhv eləmişəm, isti olduğu üçün buraya indi qalstuksuz gəlmişəm» Mehdi müəllim isə, «Səhv sənin deyil, səhv Nəcəf müəllimindir, nazirin yanına necə getməyi Sizə o öyrətməlidir». Bundan sonra kabinetimdə 4-5 ehtiyat qalstuk saxlayırdım. Nazirin yanına heç kəsi qalstuksuz aparmırdım. Direktorlar

mənimlə görüşəndə belə hadisələri indi də xatırlayırlar. O müəllimləri əsil ziyalı kimi görmək istəyirdi.

Bir dəfə mərhum bəstəkar Süleyman Ələsgərov nazirin adına məktub yazmışdı ki, Azərbaycan Pedaqoji İnstitutunda musiqi müəllimləri hazırlayan fakültə açılsın. Məktub mənə ünvanlanmışdı. Mən isə, saatların azlığına, musiqi müəllimlərini işlə təmin etməyin çətinliyinə görə bunun məqsədəuyğun olmadığı təklifini vermişdim. Mehdi müəllim məktubu diqqətlə oxudu və mənə sarı dönərək, «Bizə kim haqq verir ki, xalqımıza musiqi öyrətməyi qadağan edək, - hər şeyi geniş düşünmək, bir az irəliyə baxmaq lazımdır» - dedi. Bir müddət sonra onun məktubu əsasında APİ-də musiqi fakültəsi fəaliyyətə başladı. Onun məzunları məktəblərimizdə indi də öz yerlərini tutmuşlar.

Mehdi müəllim ümumtəhsil məktəblərinin proqram və dərslikləri̇lə müntəzəm maraqlanırdı. O deyirdi ki, «quş dənsiz yaşaya bilmədiyi kimi, məktəb də proqramsız, dərsliksiz yaşaya bilməz». İndiki kimi, o zaman proqram və dərsliklər diqqət mərkəzində idi. O da dərslik müəllifləri ilə tez-tez görüşər, onlarla saatlarla söhbət edərdi, işin gedişi ilə şəxsən maraqlanardı. Bu diqqətin nəticəsi idi ki, proqram və dərsliklər ildən ilə təkmilləşirdi. İlləri müqayisə ilə təhlil edirdi. Bir dəfə ona ali və orta ixtisas təhsilli pedaqoji kadrlara dair 60-70-ci illərin rəqəmləri lazım olmuşdu. Məni yanına çağırdı və illər üzrə bu rəqəmləri toplamağı tapşırdı. Mən tapşırığı alıb qapıya tərəf getdim. Birdən məni qaytardı və dedi: «Rəqəmləri özün öyrən, dəqiq yaz ver, heç kəsə ümid olma, bu rəqəmlərlə mən direktiv orqanlara təkliflər hazırlayacağam, bunlar Mərkəzi Komitəyə veriləcəkdir».



Artıq mənə hər şey aydın idi. Onun dediyi kimi də oldu. Uzun müddət məruzələrdə istifadə olundu. Mənim özümə də sonralar lazım olurdu. Qabaqcıl müəllimlər və məktəb rəhbərləri haqqında həmişə geniş söhbət açardı. Məqalə və çıxışlarında onların adını fəxrlə çəkərdi. Qabaqcıl müəllimlərlə işi kadrlar şöbəsinin əsas vəzifəsi sayırdı. Bəzilərini isə görüşə dəvət edirdi.

Bir dəfə Mehdi müəllim məndən 10 qabaqcıl məktəb direktorunun adını istədi. Mən siyahını tutub, ona təqdim etdim. Oxudu və hiss etdim ki, onu nəisə təmin etmədi. «Bəs, Sona xanam hanı? Axı, o bizim yeganə milli məktəbimizin direktorudur. Belə məsələləri həmişə nəzərə al». Sonradan bildim ki, xarici ölkələrdən gələn qonaqlar bu məktəbə nə məqsədlə göndərilirdi.

Mehdi müəllim pedaqoji sahədə uzun müddət rəhbər vəzifələrdə işləmiş adamlara da hörmətlə yanaşır, onları tez-tez yada salırdı. Belə bir əhvalat xatirimdədir. 70-ci illərin sonu idi. Mərkəzi Komitənin tapşırığı ilə İsmayıllı rayonunda yoxlama aparılmışdı və nəticədə RMŞ müdiri İsrail Həsənov tutduğu vəzifəsindən azad edilmişdi. Uzun illər şöbə müdiri işləmiş İsrail müəllim pedaqoji elmlər namizədi idi. O respublikada təcrübəli maarif işçisi kimi tanınırdı. Tez-tez müşavirələrdə çıxış edərdi. O zaman həmin rayonda PK-nin birinci katibi vəzifəsində görkəmli dövlət xadimi Qəşəm Aslanov işləyirdi. O mənim uşaqlıq və gənclik dostum idi. Xanlar Pedaqoji Məktəbində bərabər oxumuşduq. Bilmirəm, Mehdi müəllimin bundan xəbəri vardımı?! Yaxud elə belə təsadüfən, bir gün məni yanına çağırdı və dedi: «Nəcəf, sən kadrların taleyi ilə maraqlanırsanmı? İsrail müəllim neçə aydır ki, işsizdir. Sən sabah İsmayıllıya get, onun vəziyyətini öyrən və arzu

edirsə iş məsələsini də həll et». Mən İsmayıllıya getdim. Qəşəm Aslanovla, yeni təyin olunmuş şöbə müdiri ilə, İsrail müəllimlə görüşdüm. Hamımızın yekdil fikri bu oldu ki, İsrail müəllim qiyabi məktəbə direktor təyin edilsin. Biz bunu böyük iş hesab edirdik. Mehdi müəllim isə belə məsələlərə adi bir iş kimi baxırdı. Ona bu barədə məlumat verəndə: «Biz öz kadrlarımızın taleyi ilə həmişə maraqlanmalıyıq», – dedi. Mən onun məsələlərə belə münasibətini çox görmüşdüm.

Mehdi müəllim nə qədər mülayim idisə, o qədər də sərt idi. Bir müddət böyük şəhərlərdən birində Maarif Şöbəsinin müdiri vəzifəsi boş idi. Bu hamını narahat edirdi. Dəfələrlə yerli partiya orqanları ilə bu barədə söhbət aparılmışdı. Bir gün həmin şəhərdə hamının tanıdığı bir məktəb direktoru ŞMŞ müdiri vəzifəsinə namizəd göndərildi. Mənim də yaxşı tanıdığım, şəxsiyyətinə hörmət etdiyim bu adamın gəlişi məni lap çox sevindirdi. Sevincək halda bu barədə Mehdi müəllimə məlumat verdim. O da məmnun oldu. Namizədlə görüşmədən, sənədlərini ələk-vələk etmədən MK-ya təqdimat hazırlandı. Nazir sənədə imza atdı. Sənədlər MK-ya göndərildi. Ertəsi gün səhər saat 9–da Mehdi müəllim daxili telefonla məni təcili yanına çağırdı. İçəri girəndə onu narahat gördüm. O yenə də pəncərədən bayıra baxırdı, çox hirsli görünürdü. İlk sualı bu oldu: «Sən MK-ya göndərdiyimiz sənədləri, onun tərcümeyi-halını oxumusanmı?» Mən özümü itirdim və o dəqiqə «yox» dedim. «Bəs sənin vəzifən nədir? Axı kadrlar idarəsi sənədlərə cavabdehdir» Sən demə namizədin tərcümeyi-halında yazılıbmış ki, onun atası Böyük Vətən müharibəsində hərbi tribunala düşmüş, indiyədək də (yəni



o günə qədər) bəraət almamışdır. O illərdə belə məsələlərə çox pis baxırdılar. Belə işləri heç kəsə bağışlamırdılar. 37-ci illərin dəhşətli hadisələrində həlak olanlara belə bəraət verilmişdi. Bunların məsuliyyətini mən də başa düşürdüm. Ona görə də Mehdi müəllimin sözü məni lap sarsıtdı, hətta qorxuzdu. Başımı aşağı saldım, birdən: «get ərizəni yaz gətir, səni vəzifədən azad edirəm» sözlərini eşitdim. Mən səhvimi başa düşüb, quruyub qalmışdım. Bunun nə demək olduğunu elə bil indi dərk edirdim. Yerimdən durub qapıya tərəf getdim, ərizəmi necə yazacağımı düşünürdüm. Əlimi qapının dəstəyinə vuranda onun amiranə səsini eşitdim: «Qayıt geri». İndi başqa tonla: «Görürsənmi, adam heç nədən heç olar. Axı işinə niyə belə yanaşırsan. Bunu hələ yuxarılar bilmir, mənə instruktorlar məlumat veriblər, işi də qaytarıblar», ancaq yuxarıya da çata bilərdi. Sən də bu yaşında vəzifənlə vidalaşardın, cəza alardın. Otur, qulaq as, dedi. Öz tövsiyələrilə vəziyyətdən çıxış yolunu göstərdi. Sənədlər yenidən araşdırıldı və təqdimat olduğu kimi yazıldı. Mənim bu səhvimi, Mehdi müəllim bağışladı və qalıb onunla işləyəsi oldum. Lakin bu mənim məsuliyyətimi birə-on qat artırdı. Mehdi müəllim isə bunu bir dəfə də mənim üzümə vurmadı. Mən isə, hər sənədə baxanda o hadisə yadıma düşürdü. Onun bir sözünü hamımız əzbərləmişdik: «Səhv edən pis kadr deyil, pis kadr səhvi təkrar edəndir». Keçmiş SSRİ-nin Maarif Nazirləri arasında akademiklərin sayı az idi. Həm də ən uzun müddətli işləyən nazir Mehdi Mehdizadə idi. Ona görə də Mehdi müəllimə Moskvada böyük hörmətlə yanaşırdılar. Kollegiyada həmişə onun yeri ön sıralarda olurdu. 15 müttəfiq respublikanın nazirləri də bunu belə qəbul

edirdilər. Yaşının çoxluğuna və səhhətinə görə onun vəzifəsindən getməsi Moskvada təəssüflə qarşılanmışdı. Biz Moskvada olanda hamı onu soruşardı. Ona çoxlu təbrik teleqramları gələrdi. O isə işdən ayrılmamışdı, elmi məsləhətçi kimi işləyirdi.

Mehdi müəllim maarifi, məktəbi, müəllimləri, şagirdləri çox çevirdi, O yalnız onlarla nəfəs alırdı. Çox təəccüblüdür, yaşı 80-ni ötsə də son cünlərə qədər onun yaddaşı pozulmamışdı, yenə də öz müdrikliyini saxlamışdı. Lakin xəstəlik aman vermirdi. Yadımdadır, ağır xəstə olanda, ölümündən 3-4-gün əvvəl «Leçkomissiyada» onunla görüşdüm. O çox sərrast danışırdı. Gənc mütəxəssislər haqqında rəqəmlər gətirdi. Söhbətimiz 2-3 dəqiqə çəkdi. Gəlişimdən məmnun qaldı. Bu mənim Mehdi müəllimlə son görüşüm idi.

Bir neçə gün sonra görkəmli pedaqoq-alim, dahi şəxsiyyət, təcrübəli rəhbər, böyük hərflə yazılan «MÜƏLLİM» əbədiyyətə qovuşdu. Ondan bizə təhsilə sədaqətlə xidmət etmək nümunəsi qaldı.

**"Azərbaycan müəllimi" qəzeti,**
**24-30 yanvar, 2003-cü il.**





# YAŞADACAQ DÖVRAN SƏNİ

***VİDADİ XƏLİLOV,***
*Təhsil Problemləri İnstitutunun şöbə müdiri, pedaqoji elmlər doktoru, professor, akademik Mehdi Mehdizadə adına mükafat laureatı.*

***Pedaqogika elminin görkəmli nümayəndəsi, dünya şöhrətli alim, Azərbaycan Respublikasının əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor Mehdi Mehdizadənin anadan olmasının 100 illiyi elm və təhsil müəssisələrində, mətbuat səhifələrində geniş qeyd olunur.***

***SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, YUNESKO-nun Təhsil Komitəsinin üzvü (1961-1964) olmuş Mehdi Mehdizadə respublikamızda maarif quruculuğuna, pedaqogika elminin inkişafına, elmi-pedaqoji kadrların yetişməsinə gərgin əmək sərf etmişdir. O, sözün həqiqi mənasında ötən əsrin böyük maarif korifeyi, canlı tarixi olmuşdur.***

Elm-sənət, mədəniyyət aləminin başbilənlərindən bir çoxunun fikrincə, dahi Üzeyir Hacıbəyov musiqidə, Səməd Vurğun poeziyada, Səttar Bəhlulzadə təsviri sənətdə kimdirsə, Mehdi Mehdizadə də maarif-pedaqogika aləmində məhz həmin zirvəyə yüksəlmiş böyük alim, görkəmli şəxsiyyətdir. Yüksək humanizmi, bənzərsiz xarakteri və fərdi intellektual qabiliyyəti ilə tanıyanların qəlbini riqqətə gətirən, həmişə, hər yerdə heyranlıq yaradan müəllimlər-müəllimi M.Mehdizadə çox böyük

vətənpərvərlik hissi ilə çalışan elm-maarif fədaisi, xalqına qəlbən bağlı adam idi.

Mehdi Mehdizadə respublikamızda iki dəfə maarif naziri (1952-1954, 1960-1980) olub və öz faydalı, gərgin əməyi ilə böyük nüfuz qazanıb. O, Azərbaycan xalq təhsili tarixində xalq maarifinin gözəl təşkilatçısı, pedaqogika elminin görkəmli nümayəndəsi, ictimai-siyasi xadim, keçmiş SSRİ PEA-nın həqiqi üzvü, Azərbaycan Respublikasının Əməkdar Elm xadimi,pedaqogika elmləri doktoru, professor kimi tanınır.

Mehdi Məmməd oğlu Mehdizadə 1903-cü il yanvar ayının 5-də Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olmuşdur. Uşaqlıq,yeniyetməlik çağlarında müəllimlik sənətinə böyük maraq göstərən Mehdi atası Məmməd kişinin arzusunu gözündə qoymadı. O, ilk təhsilini başa vuranda 16 yaşı var idi. Məhz bundan sonra 1920-ci ilin noyabrında doğma Daşkəsən kəndində qiraət komasının müdiri kimi xalq maarifi, mədəni quruculuq işlərinə başlamışdır. Müəllim olmaq, balalarımıza elm-təhsil vermək arzusu ilə yaşayan Mehdi Mehdizadə o zaman 6 aylıq pedaqoji kursu bitirdikdən sonra 1921-ci ilin oktyabr ayında ilk dəfə müəllim kimi sinfə girmişdir. O, müdiri olduğu birinci dərəcəli məktəbdə təlim-tərbiyə işlərini yeni dövrün tələbləri səviyyəsinə qaldırmışdır. Həmin dövrdə Mehdi müəllim çox böyük ruh yüksəkliyi ilə həm öyrənmiş, həm də öyrətməyə geniş səy göstərmişdir. Əhali arasında savadsızlığın ləğv edilməsi işində də Mehdi müəllim böyük rol oynamışdır. Artıq müəyyən qədər pedaqoji təcrübəyə və nəzəri hazırlığa yiyələnmiş Mehdi Mehdizadə ali pedaqoji təhsil almağa çalışır, 1923-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun hazırlıq kursuna



daxil olur və imtahan verərək fizika-riyaziyyat fakültəsinə keçirilir. Ali təhsil illəri bacarıqlı pedaqoqun həyatında mühüm rol oynamışdır. O, fizika və riyaziyyat elmlərinin əsaslarını öyrənməklə yanaşı, ideya-siyasi səviyyə etibarilə də xeyli inkişaf etmişdir. Tələbəlik illərində institutun ictimai həyatında fəallıq göstərmiş, tələbə nümayəndəsi kimi elmi şuralarda iştirak etmiş, istedadlı pedaqoq kimi formalaşmışdır.

1926-cı ildən sonra Mehdi Mehdizadənin müəllimlik fəaliyyətinin ikinci mərhələsi başlamışdır. O, ali təhsilli fizika və riyaziyyat müəllimi kimi Cəbrayıl qəzasının Qaryagin (indiki Füzuli) şəhərində ikinci dərəcəli məktəbdə pedaqoji işini davam etdirmişdir. Həmin dövrdə Mehdi müəllim yalnız tədris-metodiki işlərlə deyil, ümumi pedaqoji problemlərlə də maraqlanmışdır. Buna görə də qəza metodbürosunun sədri vəzifəsi də rəsmi olaraq ona tapşırılmışdır. O, müəllimlərlə geniş yaradıcı iş aparmışdır. Həmin illərdə Respublika Xalq Maarif Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və xalq komissarının birinci müavini görkəmli dövlət xadimi Ayna Sultanovanın köməkçisi vəzifəsinə təyin edilmişdir. Lakin Mehdi Mehdizadə bu vəzifədə çox qalmamışdır. Elmi-pedaqoji işə olan böyük maraq onu Azərbaycan Dövlət Pedaqoji İnstitutunun aspiranturasına gətirmişdir.

Mehdi Mehdizadənin pedaqoji fəaliyyətinin üçüncü mərhələsi 1931-ci ilin sentyabr ayından başlayır. Onun elmi-pedaqoji fəaliyyətinin 30 ili respublikanın mühüm elmi-pedaqoji mərkəzi olan Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə bağlı olmuşdur. O, burada assisstent,

kafedra müdiri, dekan, elmi işlər üzrə direktor müavini, direktor vəzifələrində çalışmışdır.

1941-ci ildə namizədlik dissertasiyasını müdafiə edən Mehdi Mehdizadə bundan sonra 1942-1946-cı illərdə sovet ordusu sıralarında xidmətdə olmuşdur. 1956-cı ildə isə doktorluq dissertasiyası müfadiə edərək pedaqogika üzrə professor elmi adı almışdır.

1952-ci ildə Azərbaycan Respublikasının maarif naziri vəzifəsinə təyin olunan Mehdi Mehdizadə bir müddət sonra bu vəzifədən çıxsa da 1960-cı ildə yenidən həmin vəzifəyə bərpa edilmiş və 1980-ci ilədək bu mühüm dövlət əhəmiyyətli postda səmərəli fəaliyyət göstərmişdir. Ümumiyyətlə, o, üst-üstə 23 ildən artıq respublikanın xalq maarifinə bacarıqla rəhbərlik etmişdir.

Mehdi Mehdizadə 1961-1964-cü illərdən YUNESKO-nun təhsil üzrə komitələrindən birinin üzvü olmuşdur. Müxtəlif nümayəndə heyəti ilə birlikdə və ayrılıqda Polşa, Hollandiya, Fransa və Afrikanın digər ölkələrində pedaqoji elmin nailiyyətlərini təbliğ etmişdir. O, keçmiş SSRİ hökumətinin müşahidəçisi kimi ilk dəfə Afrika ölkələri maarif nazirləri konfransının iştirakçısı olmuşdur.

Mehdi Mehdizadə dövlət xadimi və ictimai xadim kimi geniş fəaliyyət göstərməsinə baxmayaraq, 1930-cu ildən başladığı pedaqoji tədqiqatlarını sistemlə davam etdirmiş və respublikamızda pedaqoji elmin formalaşmasına güclü təsir göstərmişdir. Onun respublikamızda məktəb quruculuğu, xalq maarifinin təşkili, təhsilin məzmununun, təlim metodlarının təkmilləşdirilməsi, tərbiyəvi işlərin səmərəliliyinin artırılması, xalq maarifini idarəetmənin yüksəldilməsi



sahəsində tədqiqatları pedaqoji ictimaiyyət arasında geniş yayılmış, əməli-tətbiqi nəticələri ilə fayda vermişdir.

Professor Mehdi Mehdizadə yaxşı bilirdi ki, ali pedaqoji məktəblərdə kadr hazırlığının elmi-pedaqoji təminatını verən vasitələrdən biri də pedaqogika fənni üzrə məzmunlu dərsliyin – dərs vəsaitinin olmasıdır. Buna görə də o, digər müəlliflər S.Xəlilov və D.Mustafayeva ilə birlikdə hələ 1941-ci ildə yazıb çap etdirdikləri "Pedaqogika" dərsliyi ilə bu sahədəki boşluğu aradan qaldırdı.

Professor Mehdi Mehdizadənin rəhbərliyi ilə "Pedaqogika" dərsliklərinin daha da təkmilləşdirilməsi üzrə sistemli iş aparıldı. O dövrdə digər istedadlı, tanınmış pedaqoq alimlər də bu işə cəlb olundular. 1958-1959-cu illərdə professor Mərdan Muradxanov, dosentlər Tələt Əfəndiyev, İsfəndiyar Vəlixanlı ilə birlikdə ali pedaqoji məktəb tələbələri üçün yazdıqları iki cildlik "Pedaqogika" tədris vəsaiti çap olundu. Bu dəyərli vəsait həmin illərdə hazırlanan pedaqoji kadrların ixtisas mədəniyyətinin yüksəlməsində mühüm rol oynadı.

Professor Mehdi Mehdizadə bütün həyatı boyu məktəbi, maarif sistemini, onun daha da təkmilləşdirilməsi məsələlərini düşünür və uzun axtarışların məhsulu kimi meydana çıxan bir-birindən dəyərli əsərlərilə xalq maarifinin inkişafı yollarını göstərirdi. Bu baxımdan onun "Azərbaycanda xalq maarifinin sürətli inkişafı", "Azərbaycanda məktəb təhsili yeni yüksəlişdə", "Məktəbdə təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" və digər əsərləri mühüm əhəmiyyət kəsb edir. Azərbaycan və rus dillərində çap olunan həmin əsərlərdən mütəxəssislər indi də faydalanırlar.

Akademik Mehdi Mehdizadə yüzdən çox monoqrafiya, kitabça və jurnal məqalələrinin müəllifidir. Onun tədqiqatlarının nəticələri ali məktəb tələbələri, müəllimlər, tərbiyəçilər, alimlər tərəfindən öyrənilir, praktik fəaliyyətdə tətbiq olunur. O, elmi-pedaqoji kadrların hazırlanması işinə də böyük diqqət və qayğı ilə yanaşmış, onlarla yüksək ixtisaslı alimin yetişməsində böyük əmək sərf etmişdir.

Akademik Mehdi Mehdizadənin çıxışları keçmiş SSRİ PEA-nın müşavirə və yığıncaqlarında, elmi şuralarında, respublikada keçirilən elmi-praktik konfranslarda, xalq maarifi işçilərinin müşavirələrində dərin məzmunu, elmiliyi, istiqamətvericiliyi ilə həmişə diqqəti cəlb etmiş, "Sovetskaya pedaqoqika", "Narodnoe obrazovanie", "Azərbaycan məktəbi" jurnallarında, müxtəlif toplularda dərc edilmiş məqalələri dəyərliliyi, faydalılığı ilə seçilmişdir. Onun əsərləri YUNESKO-nun xətti ilə bir neçə dillərdə çap olunmuşdur.

Mehdi Mehdizadə yüksək ixtisaslı elmi-pedaqoji kadrların hazırlanmasında da gərgin əmək sərf etmişdir. O, 1967-ci ildən keçmiş SSRİ PEA-nın həqiqi üzvü idi. Təqaüdə çıxdıqdan sonra da elmi-pedaqoji fəaliyyətini bir an belə dayandırmamış, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun elmi məsləhətçisi kimi mühüm elmi-tədqiqat problemlərinin seçilməsi və planlaşdırılmasında yaxından iştirak etmiş, gənc alimlərə faydalı məsləhətlər vermişdir.

O, xalq maarifinin və pedaqoji elmin aktual məsələləri ilə əlaqədar ümumittifaq və respublika tədbirlərinin təşkilində və keçirilməsində fəal iştirak



etmiş, məzmunlu mühazirələr oxumuş, PEA-nın müxtəlif komissiyalarına bacarıqla rəhbərlik etmişdir.

Görkəmli pedaqoq–alim, ictimai xadim Mehdi Mehdizadənin əməyi yüksək qiymətləndirilmişdir. O, beş dəfə (II, V, VI, VII, VIII çağırışlar) Azərbaycan SSR Ali Sovetinin deputatı seçilmişdir. Mehdi Mehdizadə Lenin ordeni, 3 dəfə Qırmızı Əmək Bayrağı ordeni, 4 dəfə Azərbaycan SSR Ali Sovetinin Fəxri Fərmanı və medallarla, o cümlədən N.K.Krupskaya adına medalla təltif olunmuş, bunlarla yanaşı, Azərbaycan Respublikasının Əməkdar Elm Xadimi fəxri adına layiq görülmüşdür.

Akademik Mehdi Mehdizadə YUNESKO xətti ilə inkişaf etməkdə olan ölkələrdə SSRİ-də xalq maarifi quruculuğu təcrübəsinin yayılması işində fəal iştirak etmişdir. Pedaqogika elminin korifeylərindən, xalq maarifi işinin fədakar təşkilatçılarından olan akademik Mehdi Mehdizadə 1984-cü ilin mayın 1-də vəfat etmişdir. Lakin onsuz keçən illərdə mənən həmişə Mehdi müəllimlə bir yerdə olmuşuq. Hər addımda onu dönə-dönə məhəbbətlə xatırlayır, nurani simasını görür, səsini eşidir, müdrik nəsihətlərini dinləyirik. Onun zəngin pedaqoji irsi, bir-birindən dəyərli fundamental əsərləri, xalq maarifinin, pedaqogika elminin ən müasir problemlərinin tədqiqi və həlli yolunda karımıza gəlir, ziyası tükənməyən bir mayak kimi bizə doğru-düzgün yol göstərir, əməli fəaliyyətə ruhlandırır.

Böyük vətənpərvər, akademik Mehdi Mehdizadənin həyatı və geniş ictimai, elmi-pedaqoji fəaliyyəti xalqa, Vətənə vicdanla xidmət etmək nümunəsidir. Məhz buna görə də dünya şöhrətli alim, gözəl insan akademik Mehdi

Mehdizadənin anadan olmasının 100 illiyi ilə əlaqədar həyata keçirilən tədbirlərdə, müxtəlif mətbuat səhifələrində dərc olunan silsilə yazılarda yetirmələri onu dərin ehtiramla xatırlayır, ruhuna qəni-qəni rəhmət diləyirlər.

***"Təhsil" qəzeti, 3 fevral 2003-cü il***





# ELMİ TƏDQİQATLARIN BÖYÜKTƏŞKİLATÇISI, QAYĞIKEŞ İNSAN

***YƏHYA KƏRİMOV,***
*Pedaqoji elmlər doktoru, professor, Beynəlxalq Pedaqoji Akademiyasının həqiqi üzvü, Azərbaycan Respublikasının Əməkdar müəllimi .*

Atalar sözüdür: "Dağ yaxından alçaq görünər", lakin dağ dağdır, diqqətlə müşahidə aparanda, təxəyyülü işə salanda yaxından da dağın nə qədər uca, əzəmətli olmasını görmək mümkündür. Akademik Mehdi Mehdizadə məhz belə dağ idi, təhsilin dağı, pedaqogika elminin dağı, mənim üçün isə öz arzusuna uyğun olaraq sözün əsl mənasında iri hərflərlə yazılan sadəcə Mehdi müəllim! Ona həmişə belə müraciət edərdim.

Mən Mehdi müəllimi 1946-cı ildən – tələbəlik illərindən tanıyırdım. Bizə pedaqogika nəzəriyyəsindən mühazirə oxuyurdu. Məni sehrləyən ilk növbədə onun şərh üslubu, müəllimlik taktı oldu. Onun yüksək mədəniyyəti, tələbələrə münasibəti, təmkini, özünə inamı, qüruru məni valeh etdi. Müəllimliyə məhəbbətim birə on qat artdı. Pillə-pillə həmin peşənin zirvəsinə can atmağa çalışırdım.

1948-ci ildə Mehdi müəllim direktorun elmi işlər üzrə müavini idi. II kursda oxuyurdum. Ermənistandan departasiya olunmuş azərbaycanlıları mehribanlıqla qarşıladıq. Yerevan Pedaqoji İnstitutundan bizim institutumuza gələnlərin söhbətlərini dinləyir, xalqımızın

başına gələn bügünki bəlaların bünövrəsinin o zaman qoyulduğunu təsəvvür etmirdik. Mehdi müəllimin institutun partiya təşkilatının katibi Abramova, dekan müavini Zorabyan, professor Antonyan və başqaları ilə münasibətlərində soyuqluğun səbəbini sonralar başa düşdük. Mehdi müəllimin məsləhəti ilə Yerevandan gələn tələbələrə kömək göstərir, icmallarımızı, kitablarımızı onlara verirdik. Kim düşünə bilərdi ki, departasiya olunanalrın içərisindən akademik Budaq Budaqov, Zərifə Budaqova, professor Bağır Bağırov, jurnalist Bahadur Xanməmmədov, pedaqoq-jurnalist Zəhra Əliyeva, maarif şöbəsinin müdiri Kamil Həsənov və başqaları kimi mütəxəssislər çıxacaq. Görünür Mehdi müəllimin arzusu elə bu imiş.

1949-cu ildə Mehdi müəllim tələbə yataqxanasında 10 nəfəri ayırıb, Cənubi Azərbaycandan gəlmiş tələbə gənclərin yaşadıqları kiçik, qapalı yataqxanaya göndərdi. Orada siyasi atmosferin gözlənməsi, mehriban münasibətin, normal ünsiyyətin yaranmasını, təlim sahəsində onlara kömək göstərilməsini tapşırdı. Özü də tez-tez yataqxanaya baş çəkərdi. Orada dostlaşdığımız qan qardaşlarımız pedaqoji, tibb, sənaye institutlarını bitirib, xalq təsərrüfatının müxtəlif sahələrində fəaliyyətə başladılar.

Bir dəfə Mehdi müəllim yaxşı oxuyan tələbələrdən 8 nəfərini yanına çağırdı. Ali məktəblərdə yüksək ixtisaslı müəllim kadrları çatışmadığından bizi bu sahə üçün hazırlamaq fikrində olduğunu bildirdi. O, bizim hər bir addımımızı izləyir, elmi məclislərə, müzakirələrə cəlb edir, konfranslarda çıxış etməyimizə şərait yaradırdı. 1949-cu ildə o, bizi Sabir adına pedaqoji məktəbdə



üçaylıq təcrübə keçməyə göndərdi. Müəllimimiz Zaman Vəliyevin rəhbərliyi altında pedaqoji təcrübə keçdik. Öz arzumla daha üç ay sonralar görkəmli şair kimi şöhrət tapmış xalq şairi Cabir Novruzun oxuduğu sinifdə ədəbiyyatdan dərs dedim. Təyinat zamanı Mehdi müəllim mənə Quba Müəllimlər İnstitutunda pedaqogika üzrə baş müəllim vəzifəsində işləməyi təklif etdi. Növbəti illərdə Qazax, Şəki Müəllimlər İnstitutu və Pedaqoji məktəbində məhz Mehdi müəllimdən öyrəndiklərimə əsasən pedaqogikadan mühazirə oxudum.

1955-ci ildən başlayaraq aspiranturada oxuduğum illərdə Mehdi müəllimlə tez-tez görüşər, ondan faydalı məsləhətlər alardım. Aspiranturaya metodika sahəsi üzrə daxil olduğumu bildikdə üzümə mənalı-mənalı baxdı. 5 il pedaqogikadan mühazirə oxumağıma baxmayaraq, aspiranturada pedaqogikanı deyil, ibtidai təlim metodikası sahəsini seçdiyimdən sıxıldığımı hiss edən Mehdi müəllim könlümü aldı: "İbtidai təlim bütövlükdə pedaqogikadır".

O, gənclərə böyük diqqət və qayğı ilə yanaşar, onları cəsarətlə irəli çəkərdi. Nazir olduğu ilk illərdən dəfələrlə respublika səviyyəli müşavirə və konfranslarda ibtidai təlim üzrə məruzənin mənə verilməsini məsləhət görmüşdü.

SSRİ Pedaqoji Elmlər Akademiyasının yaradılmasının iştirakçısı, rəyasət heyətinin üzvü, professor Mehdi Mehdizadə çox böyük nüfuz sahibi idi. Mübahisəli məsələlərin, xüsusilə milli respublikalarda elmi-tədqiqatın təşkili, milli dəyərlərə istinad olunması ideyasını Mehdi müəllim elə ehtiyatla, müdrikliklə və əsaslandırılmış şəkildə qoyurdu ki, hamı onunla razılaşırdı.

**Mehdi müəllimi özünəqədərki və keçən əsrin axırlarınadək olan nazirlərdən fərqləndirən cəhət onun maarif sistemini elmi əsaslar üzrə idarə etməsi idi.** Maarif sahəsində hər hansı addımı atarkən akademik Mirzə Feyzulla, Əşrəf Hüseynov, Əbdüləzəl Dəmirçizadə, professor Maqsud Cavadov kimi məşhur alimlərlə, təhsil işçiləri və müəllimlərlə məsləhətləşər, hər şeyi ölçüb-biçər, elmə əsaslanardı. Onun səyi ilə institutumuzda bir-birinin ardınca yeni şöbələr yaradıldı. Bu şöbələrin hər biri, demək olar ki, SSRİ Pedaqoji Elmlər Akademiyasının bir institutunun adını daşıyırdı. Təsadüfi deyildi ki, o zamanlar ittifaqın hər yerindəki belə institutları "Kiçik Akademiya" adlandırırdılar. Mehdi müəllim yenilikçi nazir kimi Azərbaycan Pedaqoji Elmlər Akademiyasını yaratmaq fikrində idi. O, daim respublikamızın təhsil sisteminə elmi yeniliklərin gətirilməsi qayğısına qalırdı. Lipetsk, Rostov vilayəti, Tatarıstan müəllimlərinin iş təcrübəsinin öyrənilib, yerli şəraitə uyğun şəkildə tətbiq olunması, təlimin intensivləşdirilməsi, təlimin texniki vasitələrindən istifadə, təlimdə proqramlaşdırma elementlərindən istifadə problemli təlim, təlim prosesinin optimallaşdırılması və başqa ideyaların pillə-pillə məktəblərimizə gətirilməsi, təbliği və müvəffəqiyyətlə tətbiqi bilavasitə Mehdi müəllimin adı ilə bağlıdır. Adları çəkilən və çəkilməyən problemlərin hər biri ilin (illərin) mövzusu kimi tətbiq edilər, nəticəsi yoxlanılıb qiymətləndirilər, elmi-praktik konfransda yekunlaşdırılardı.

1961-ci ildə institutumuzda ibtidai məktəb və məktəbəqədər tərbiyə şöbəsi Mehdi müəllimin təşəbbüsü ilə yaradıldı. Onun göstərişi ilə məni şöbə müdiri təyin



etdilər. İlk görüşümüzdə məktəbəqədər tərbiyə və ibtidai təlim üzrə Rusiyanın təcrübəsini öyrənməyi, bir qədər sonra ibtidai təlim sahəsində eksperimental tədqiqata başlamağı məsləhət gördü.

Mehdi müəllim ittifaq miqyasında başlanan yeniliyin respublikamızda carçısı və təşkilatçısı idi. Üçillik ibtidai təlimə keçilməsi ilə əlaqədar eksperimental tədqiqata başlamağı mənə tapşıranda doktorluq dissertasiyası üzərində işlədiyimi, tədqiqat aparmağa imkanımın olmayacağını bildirməyə cəsarət tapdım. O gülümsəyərək dedi:

- "Belə de, böyük alim olmaq fikrinə düşübsən. Məgər ibtidai siniflər üçün proqram, dərslik, metodik vəsait yazmaq alimlik deyil? Bu,' doktorluqdan daha üstündür".

Deməyə sözüm qalmadı. Ürək-dirək verib, həm eksperimentin təşkili, həm də doktorluq dissertasiyasının müdafiəsi üçün hər cür şərait yaradacağını və kömək göstərəcəyini bildirdi.

1965-1966-cı dərs ilində 20 şəhər və rayonun hər birinin bir məktəbində eksperimentə başladım. İldə üç-dörd dəfə Moskvaya ezam olundum. Mehdi müəllim akademik L.V.Zankov, D.B.Elkonin, V.V.Davıdov, M.Skatkin, M.Maxmutovla əlaqələrin yaranmasına kömək göstərdi. O, məktəb tariximizdə ilk dəfə ibtidai siniflər üçün bütün fənlər üzrə yeni dərsliklərin, dərs vəsaitlərinin yaradılması və tərcüməsi prosesinə bilavasitə nəzarət etdi. İbtidai təlimə elmilik ayaq açdı. İlk dəfə hər bir dərsliyə irihəcmli metodik rəhbərliyin yazılması və çap olunmasına şərait yaratdı. Eksperimentlə əlaqədar vaxtaşırı seminar, müşavirə və konfransların keçirilməsi haqqında göstəriş

verdi. Respublika səviyyəsində konfranslarda bilavasitə iştirak etdi. Dəfələrlə institutun 31 nömrəli baza məktəbində eksperimentin nəticələri ilə maraqlandı. Respublika üzrə alınan nəticələrin uğurlu olduğuna inandı. Mehdi müəllim 20 eskperimental məktəbdə III sinfi başa vuran bütün şagirdlərin V sinfə keçirilməsi haqqında kollegiyanın qərarını verdi. Beləliklə, təlim müvəffəqiyyətləri 5 balla deyil, şifahi, sözlə qiymətləndirilən yüzlərlə uşaq orta təhsili doqquz ildə müvəffəqiyyətlə başa vurdu.

Eksperimental tədqiqatın nəticələrinə görə Elmi Tədqiqat Pedaqoji Elmlər İnstitutunun tarixində ilk dəfə mən o zamanlar ən böyük mükafat sayılan Qırmızı Əmək Bayrağı Ordeni ilə təltif edildim.

Mehdi müəllim elə bil təhsilimizin bugünkü inkişafını görürdü. 1966-cı ildə məni yanına çağırdı. Söhbətimiz didaktika sahəsində oldu. Hələ mənim inteqrasiya haqqında lazımınca təsəvvürüm olmadığı zaman söhbəti həmin problemin üzərinə gətirdi. "Ana dili" dərsliklərinin əvvəllər olduğu kimi, əsasən, ədəbi materialları əsasında deyil, dilimizi, ədəbiyyatımızı, ətraf aləmimizi, təbiətimizi, coğrafiyamızı, tariximizi əhatə edən, qismən də olsa, təsviri sənət və musiqi ilə əlaqə yaradan bir dərslik kimi tərtib olunmasını tələb etdi. Mehdi müəllimin məsləhəti ilə bu gün də elementləri saxlanan inteqrativ Azərbaycan dili "Ana dili" dərsliyində ədəbi materiallarla birlikdə verildi. Şagirdlər dilimizi ədəbi materiallar üzərində müşahidə prosesində öyrənirdilər. Mehdi müəllim bu sistemi bəyəndi və təkmilləşdirməyi tələb etdi. Mən təkmilləşdirdim, lakin



sonralar müxtəlif səbəblərlə əlaqədar ayrıca "Azərbaycan dili" dərslikləri yaradıldı.

Mehdi müəllim bir nəzəriyyəçi pedaqoq, bir didakt kimi ibtidai təlimə, onun nəzəriyyəsinə, təhsil sistemində onun yerinə yüksək qiymət verirdi. Təhsilin, oxumağa, öyrənməyə həvəsin, ümumpedaqoji bacarıq və vərdişlərə yiyələnməyin məhz ibtidai siniflərdən başlandığını qeyd edirdi. O vaxtlar pedaqoji institutda ibtidai siniflər üçün müəllim hazırlığına görkəmli professor-müəllim heyətinin cəlb olunmasını təmin etmişdi.

Üçillik ibtidai təlimlə əlaqədar eksperimental tədqiqat dövründə mən "Azərbaycan müəllimi" qəzetində tez-tez çıxış edib, sinif müəllimləri üçün pedaqoji mətbu orqanının yaradılması tələbini irəli sürürdüm. Bu məsələni alqışlayan müəllimlərin məqalələri də dərc olunurdu. 1969-cu ildə "Azərbaycan məktəbi" jurnalının redaksiya heyətinin fəaliyyətini yoxlamaq üçün komissiya yaradıldı. Komissiyaya mən də daxil edilmişdim. Komissiyanın işinin nəticəsi Mərkəzi Komitədə müzakirə olundu. Mehdi müəllim də müzakirədə iştirak edirdi. Jurnalın fəaliyyəti haqqında məlumat vermək mənə həvalə edilmişdi. Mən bir daha sinif müəllimləri və məktəbəqədər müəssisələrin tərbiyəçiləri üçün pedoqoji mətbu orqanın yaradılmasından söz açdım. Mərkəzi Komitənin şöbə müdirinin müavini Kəmalə Abdullayeva razılığını bildirdi və redaktorun kim olacağını Mehdi müəllimdən xəbər aldı. Mehdi müəllim tərəddüd etmədən mənim adımı çəkdi.

Mehdi müəllim qəlbimdə çox obyektiv şəxsiyyət kimi yaşayır. Gənclik illərim idi. Pedaqoji ictimaiyyət məni yenicə qəbul edirdi. Həmin dövrdə istedadlı pedaqoq

Yusif Talıbov "Azərbaycan müəllimi" qəzetində dərc etdirdiyi məqaləsində məni "görkəmli alim" ifadəsi ilə təqdim etmişdi. Mehdi müəllim nazirliyin idarə rəisi İmran Məmmədova demişdi: "Yusif müəllimə çatdırın ki, Yəhya haqqında indi belə yazır, bir neçə ildən sonra hansı ifadələri işlədəcək?" Təəssüf ki, bu gün də həmin ölçü gözlənilmir. Təhsil sistemində azacıq xidməti olan şəxslər özləri üçün də Mehdizadə fenomeni haqqında deyilənlərin söylənməsini gözləyirlər.

1969-cu ildə "Azərbaycan müəllimi" qəzetində Mehdi müəllimin qardaşı Zəkəriyyə Mehdizadənin "Əlifba" dərsliyi haqqında tənqidi məqaləsi çıxmışdı. O zamanlar hər bir dərslikdə bir psixoloqun, praktik müəllimin iştirakını vacib hesab edirdilər. Z.Mehdizadənin məqaləsindən bəhrələndiyim üçün nazirliyin proqram və dərslik şöbəsinin məsləhəti ilə onun adını da dərsliyin müəllifliyinə qoşdum. Bu işdən xəbər tutan Mehdi müəllim məni yanına çağırıb dedi: "Nə olsun Zəkəriyyə məqalə yazıb, axı o, riyaziyyatçıdır. Bir də ki, hər məqalə yazanın adını müəllifliyə daxil etmək olmaz". "Əlifba" məzmunca yeniləşəndə Z.Mehdizadənin adı müəlliflikdən çıxarıldı.

1976-cı ildə gözəl təşkilatçı, istedadlı alim Zahid Qaralov institutumuza direktor təyin edildi. O, direktor müavini seçmək haqqında Mehdi müəllimlə məsləhətləşərkən mənim namizədliyimi irəli sürmüşdü. Mehdi müəllim bir an fikirləşib demişdi: "Yəhya ipə-sapa yatan deyil". Bununla belə Zahid müəllimin namizədini rədd etməmişdi.

Bir dəfə nazirlikdən zəng vurub, Mehdi müəllimin qəbuluna getməli olduğumu bildirdilər. İki gün ərzində bir



neçə dəfə nazirliklə əlaqə saxladım. Mehdi müəllimin "yuxarıda" olduğunu söylədilər. Üçüncü gün yenə katibəsi bildirdi ki, Mehdi müəllim kabinetdədir, lakin ciddi işi olduğundan heç kəsi qəbul etmir. Geriyə döndüm. Daha bir gün beləcə keçdi. Günün axırında proqram-metodika idarəsindən zəng vurub, nazirin bərk əsəbləşdiyini bildirdilər. Tələsik nazirliyə getdim. Katibə məni dərhal içəri buraxdı. Mehdi müəllim narazı halda dedi: "Nə cəld gəlmisən?" Mən səbəbini aydınlaşdırmağa çalışdım. Katibənin məni buraxmadığını dedikdə çöhrəsi açıldı, gülümsədi və dedi: "Elə hər yetən istədiyi vaxt içəri girəcəksə, daha mən nə nazirəm?" Sözünü qurtarmamış zəngin düyməsini basaraq katibəni çağırdı. Ciddi görkəm alıb dedi:

- "Mən sizə demişəm ki, işim çox olduğundan kənar adamları yanıma buraxmayın. Axı Yəhya müəllim bizim əməkdaşımızdır".

"Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" Mehdi müəllimin son əsəri oldu. Həmin əsərin pedaqoji ictimaiyyət arasında müzakirəsi keçirilərkən məruzəçi mən idim. "Azərbaycan müəllimi" qəzetində böyük məqalə ilə çıxış etdim. Məqalə xoşuna gəlmişdi, lakin öz aramızda söhbət zamanı bildirdiyim bəzi iradları, arzu və təkliflərimi nə üçün vermədiyimi xəbər aldı. Mehdi müəllim belə insan idi.

Mehdi müəllim çox diqqətli, qayğıkeş adam idi. 1972-ci ildə yanına çağırıb, SSRİ Pedaqoji Elmlər Akademiyasının ibtidai təlim üzrə problem şurasının üzvlüyünə namizədliyimi təqdim etdiyini bildirdi və orada fəaliyyətimin xarakterindən danışdı. Maarif Nazirliyi nəzdində ibtidai təlim üzrə elmi-metodik şuraya sədr təyin

etdiyimi də xəbər xerdi. Sonra doktorluq mövzumun nə yerdə olduğunu xəbər aldı. Hiss etdim ki, mənim orfoqrafiya təlimi ilə əlaqədar mövzudan əl çəkdiyimi bilir (Mən eksperimental tədqiqat aparanda həmin problem üzrə Muxtar Həmzəyev psixoloji, Əziz Əfəndizadə linqivistik aspektdə xeyli iş görmüşdü). Yeni mövzu üzrə işə ciddi şəkildə girişdiyimi bildirdim.

Fürsət tapıb 1975-ci ildə doktorluq dissertasiyasını başa çatdırdım. Ali Attestasiya Komissiyası müfadiəyə icazə vermirdi. Mənim məktəbə xidmətlərim haqqında məlumatların nə dərəcədə həqiqətə uyğun olduğunu öyrənmək məqsədilə nazirliyə müraciət ediblərmiş. Eşitdim ki, Mehdi müəllim SSRİ təhsil naziri Yelyutinə mənim tədris prosesi üçün faydalı xidmətlərim haqqında tutarlı bir məktub yazıb. Görünür, bir neçə il əvvəl verdiyi vədinə sadiq qalan Mehdi müəllim mənim haqqımda düşünürmüş. Vaxtilə dediyi kimi, ideyalarımı eskperimental tədqiqatda, dərslik və dərs vəsaitlərində tətbiq etməyim dissertasiyamın həyatiliyini sübuta yetirdi və ona görə də təsdiq asanlaşdı.

Mehdi müəllim altıyaşlıların hazırlıq siniflərində təhsilə cəlb edilmələri ilə əlaqədar işə başladığımı da alqışladı, işi davam etdirməyi məsləhət gördü. 40 sinifdə əlverişli şərait (dərs otağı, yataq otağı, oyun otağının təchizatı, gündə üç dəfə yemək) yaratdı. Respublikamızın bu sahədəki iş təcrübəsi ittifaqda diqqəti cəlb etdi. Məhz ona görə də 1978-ci ildə ittifaq üzrə elmi konfrans Bakıda keçirildi.

Mehdi müəllim qabaqcıl təcrübənin öyrənilib yayılmasına xüsusi diqqət verər, özü də bilavasitə onlarla təmasda olardı. 70-ci illərin axırları idi. Mehdi müəllim



Xaldana getməyimi, sinif müəllimlərinə kömək göstərməyimi tapşırdı. İki gündən sonra özü də gəldi. Biz müəllimlərlə görüşdük, məktəbin direktoru SSRİ Xalq Müəllimi Zahid Şöyübovla dərslərdə olduq. Siniflərdən birində fizikanın tədrisi prosesində texniki vasitələrdən istifadə olunarkən elektrik mənbəyindən qidalanma sistemi pozuldu. Mehdi müəllim özü mövzu ətrafında şagirdlərlə çox maraqlı söhbət apardı.

Mehdi müəllim 18 və 31 nömrəli, məktəblərdəki eksperimental siniflərdə müəllimlərin dərslərini dinləyər, onlara məsləhət verərdi. Onun ən çox xoşladığı müəllim 31 nömrəli məktəbdə işləyən Hökumə Həsənova və 18 nömrəli məktəbdə çalışan Səyyarə Quliyeva idi. Hər dəfə onların dərsindən çıxarkən pıçıldayardı: “Bax bu dərsə oxşayır”, “Bu dərsdə yenilik hiss olunur”. Bir dəfə Səyyarə Quliyevanın yazısını bəyənmiş və şəxsi məktubu ilə mənim üstümə göndərmişdi. Bu gün də saxladığım məktubda yazmışdı: “Səyyarə xanımın informasiyası təkmilləşdirilməlidir. Bu məqsədlə məsləhətim:

1.İbtidai siniflərdə müstəqil işləmənin əhəmiyyəti haqqında bir qədər müfəssəl danışmaq lazımdır (Zankovun kitabına bax).

2.Müstəqil işlər sinifdən-sinfə (I-III) mürəkkəbləşdirilməlidir.

3.Müstəqil işlərin növləri: kitabdan mətn oxumaq, müstəqil yazı işləri; suallara cavab yazmaq, verilən mövzu haqqında yazmaq və s.; riyaziyyat, əmək dərslərində müstəqil işlər; mühakimələr, müqayisələr, nəticə çıxarmaq və s.

4.Müstəqil işləməkdə çətinlik çəkənlərə nə kimi köməklik göstərilir.

5.Evə verilən tapşırıqların icrası zamanı müstəqil işlər. Ata-analarla iş aparmaq. Onlar çox zaman tapşırığı özləri hazırlayırlar.

6.Müstəqil işləmədə yoldaşın köməyi nə cür ola bilər?

7.Müstəqil iş haqqında şagirdin hesabatı."

Bu qeydləri etməkdə məqsədim bir tərəfdən nazirin vaxt tapıb ibtidai sinif müəlliminə necə qayğı və diqqətlə yanaşmasını, digər tərəfdən onun şagirdlərin dərsdə inkişafına necə istiqamət verməsini, didaktik tələblərə necə diqqətlə yanaşmasını oxucuya çatdırmaqdır.

Mehdi müəllim millətini sevən, onun gələcəyinə inamla, ümidlə baxan şəxsiyyət idi. Bu gün hamımızın ürəyimizi göynədən Cənub həsrəti Mehdi müəllimi bir an tərk etmirdi. Yaxşı yadımdadır, İranda Rza şah hakimiyyəti devrilmiş, o, xaricə qaçmışdı. Belə bir ümid yaranmışdı ki, Cənubi Azərbaycanda ana dilində məktəblər açılacaq, xalq öz arzusuna çatacaqdır. Bir gün məni Mehdi müəllimin yanına çağırdılar. Mən kabinetə daxil olanda Mərkəzi Komitənin məsul işçisi Əlimirzə Əhmədovu və Cənubi Azərbaycan Demokratik Partiyasının katibi Qulam Yəhyanı orada gördüm. Xeyli söhbətdən sonra Cənubi Azərbaycanda ana dilində məktəblərin fəaliyyət göstərəcəyi ehtimalı meydana çıxdı. Ora üçün müəllim kadrları və dərsliklərin hazırlanması lazım bilindi. Bu işin müvəffəqiyyətlə təşkilində yaxından iştirak etməyim tələb olundu. Mən Mehdi müəllimə bir məsələni xatırlatdım. Mehdi müəllimin və Mərkəzi Komitənin zəmanəti ilə SSRİ Təhsil Nazirliyi məni Əfqanıstana Taraki hakimiyyətində orta məktəb



quruculuğu sahəsində dövlət məsləhətçisi vəzifəsinə göndərirdi. Sənədlərim hazır idi.

Mehdi müəllim bir qədər düşündükdən sonra dedi:

- "Bu gün söhbət açdığımız tədbir ondan daha mühümdür".

O, Mərkəzi Komitə və SSRİ Təhsil Nazirliyi ilə danışıb, problemi həll etdi. Əfqanıstana Türkmənistandan bir nəfər mütəxəssis göndərdilər.

Mənə isə tapşırıq verildi ki, I-X siniflər üçün dil və ədəbiyyat dərsliklərini hazırlaya biləcək müəllimlərin siyahısını tərtib edim. İki gündən sonra siyahını Mehdi müəllimə verdim. O, siyahını götürüb dedi:

- "Siyahını seyfə qoyuram. Bunu hələlik biz bilməliyik".

Mən ilk addımı atmalı oldum. 1985-ci ildə əslən Cənubi Azərbaycandan olan pedaqoji institutun müəllimi Əsəd Yaqubi ilə "Əlifba" dərsliyini tərtib etdik. Onun nə məqsədlə çap edildiyindən bir də rəyçilər – məşhur dilçi alimlərimiz professorlar Mübariz Əlizadə, Əkrəm Cəfər və "Yazıçı" nəşriyyatının direktoru Əjdər Xanbabayevin xəbəri var idi.

Dərslik çap edilənədək İranda hakimiyyət başına Xomeyni gəlmişdi. O, bizim dərsliyimizi qəbul etmədi. Dərslik respublikamızda təhsil alan Cənubi Azərbaycanlı uşaqlara paylandı. Mehdi müəllimin arzusu bu gün qismən də olsa yerinə yetirilir.

Mehdi müəllim həyatının son illərində - institutumuzun məsləhətçisi kimi fəaliyyət göstərdiyi illərdə özünü əsl tədqiqatçı-alim kimi tanıtdı. Qəlbimdən belə bir hiss keçdi: "Görəsən Mehdi müəllim həyatı boyu yalnız tədqiqatla məşğul olsa idi, nə qədər yazıb-

yaradardı, pedaqogika nəzəriyyəsinə nə qədər töhfə verərdi?

Bir daha yazının əvvəlindəki fikrə qayıdıram: Mehdi müəllim pərəstişkarlarının nəzərində bu gün də təhsilin, pedaqogikanın, insanlığın möhtəşəm dağı, cismani yoxluğu isə onu sevənlərin qəlbini yandıran göynədici dağdır.

***"Azərbaycan müəllimi" qəzeti,***
***14-20 fevral 2003-cü il***





# AZƏRBAYCAN MÜƏLLİMLƏR İNSTİTUTUNDA YUBİLEY KONFANSI

*Toplantıda akademik Mehdi Mehdizadə adına mükafatın builki laureatlarına diplomlar təqdim olundu.*

Azərbaycan pedaqoji elminin və təhsil quruculuğunun nəhəng simalarından biri, respublika pedaqoqlarının böyük bir dəstəsinin müəllimi olmuş, həm alimliyi, həm idarəetmə sahəsindəki yüksək səriştəsi, həm də insanlığı ilə nəsillərə örnək sayılan akademik Mehdi Mehdizadənin anadan olmasından 100 il keçir. Böyük pedaqoqun unudulmaz xatirəsinə ehtiram əlaməti olaraq artıq neçə müddətdir ki, ölkəmizin təhsil ocaqlarında, pedaqoji kollektivlərdə rəngarəng, bir-birindən maraqlı yubiley tədbirləri keçirilir. Azərbaycan Müəllimləri Yaradıcı İttifaqının bu yöndəki fəaliyyəti xüsusilə təqdirəlayiqdir. Razılıq hissi ilə qeyd edək ki, yaradıcı müəllimlərin böyük bir dəstəsini ətrafında birləşdirən İttifaq böyük alimin xatirəsini əbədiləşdirmək üçün hələ 10 il bundan əvvəl çox dəyərli bir təşəbbüs irəli sürüb reallaşdıraraq akademik M.Mehdizadə adına mükafat təsis etmişdir. Təhsil sahəsində elmi-nəzəri və təcrübi fəaliyyətləri ilə fərqlənən alim-pedaqoqlara, təhsil işçilərinə verilən bu nüfuzlu mükafatın indiyədək 37 laureatı olmuşdur. Bu il onların sırasına daha 5 nəfər əlavə olunmuşdur.

Hər il Beynəlxalq Müəllimlər Günü ərəfəsində təqdim olunan mükafatın builki laureatları adına Təhsil

Nazirliyinin dərslik, mətbuat və nəşriyyat şöbəsinin rəisi, filologiya elmləri namizədi Nəcəf Nəcəfov, AMİ-nin dosentləri Malik Mirzəyev və Bilal Həsənli, Naxçıvan şəhərindəki hərbi liseyin fizika müəllimi Fatma Şahmərdanova, Cəlilabad şəhər 8 saylı orta məktəbin ibtidai sinif müəllimi İltifat Bağırov layiq görülmüşlər.

Noyabrın 28-də Azərbaycan Müəllimlər İnstitutunda bu tədris müəssisəsi ilə Azərbaycan Müəllimləri Yaradıcı İttifaqı akademik M.Mehdizadənin anadan olmasının 100 illiyinə həsr olunmuş elmi-praktik konfrans keçirmişdi.

Təhsil nazirinin müavini İ,İsgəndərovun, Təhsil Problemləri İnstitutunun direktoru A.Mehrabovun, akademik H.Əhmədovun, digər mötəbər qonaqların, pedaqoq alimlərin, AMİ-nin müəllim və tələbə kollektivlərinin nümayəndələrinin, yaradıcı müəllimlərin iştirak etdiyi konfransı AMİ-nin rektoru M.Musayev açaraq M.Mehdizadə nuruna toplaşanları salamladı. Giriş sözündə akademik M.Mehdizadəni böyük insan, böyük alim, böyük təhsil təşkilatçısı kimi səciyyələndirən M.Musayev məhz bu keyfiyyətlərinə görə onu tanıyanların hamısının, istisnasız olaraq, Mehdi müəllimə hörmət bəsləyib, onu sevdiyini söylədi.

"Akademik M.Mehdizadənin həyat və yaradıcılığı" mövzusunda məruzə etmək üçün söz Rusiya Təhsil Akademiyasının həqiqi üzvü Hüseyn Əhmədova verildi. Məruzəsinə M.Mehdizadə şəxsiyyətinə, onun elmi-pedaqoji fəaliyyətinə və irsinə qiymət verməklə başlayan akademik göstərdi ki, M.Mehdizadənin adı təkcə Azərbaycan məktəb tarixinə deyil, dünya xalqlarının məktəb və təhsil tarixinə də əbədi daxil olmuşdur. O, Azərbaycanın 3 ən görkəmli pedaqoqlarından biri idi.



Mənim üçün xoşdur ki, onların hər üçü ilə - Mərdan Muradxanovla, Əhməd Seyidovla, Mehdi Mehdizadə ilə işləyib uzun müddət onlardan dərs almışam. Onlar bugünkü pedaqoqların çoxunun müəllimi olmuşlar. Mehdi müəllimin fəaliyyətini 3 yerə bölən natiq bunlardan **birinin respublikamıza həsr olunduğunu**, onun uzun müddət Azərbaycan Dövlət Pedaqoji Universitetində çalışdığını, 24 il ərzində Təhsil Nazirliyinə rəhbərlik etdiyini söylədi. H.Əhmədov M.Mehdizadənin pedaqoji elmimiz və təhsilimiz qarşısındakı xidmətlərini xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyevin siyasi, dövlət quruculuğu sahəsindəki xidmətləri ilə müqayisə edərək onun təhsilimizin inkişafında mühüm rol oynadığını bildirdi. Göstərdi ki, M.Mehdizadə öz fəaliyyətində nəzəriyyə ilə təcrübəni birləşdirən, onların hər ikisinin inkişafına böyük töhfələr vermiş pedaqoq alimdir. Natiq akademik M.Mehdizadənin milli pedaqoji elmimizi və təcrübəmizi zənginləşdirmiş əsərlərinin adlarını sadalayaraq onların hər birinin dərin mühakimə, güclü ümumiləşdirmə bacarığının məhsulu olduğunu vurğuladı. H.Əhmədov Mehdi müəllimin fəaliyyətinin **ikinci istiqamətinə** onun İttifaq miqyasındakı fəaliyyətini aid edərək göstərdi ki, o, SSRİ Pedaqoji Elmlər Akademiyasının yaradıcılarından biri, İttifaq alimləri sırasında böyük nüfuz sahibi olmuşdur. Görkəmli akademiklər, SSRİ Təhsil Nazirliyinin yüksək rütbəli məmurları ona xüsusi hörmət göstərir, bir çox məsələlərdə onunla hesablaşır, onun fikrini əsas götürürdülər.

Mehdi müəllim SSRİ miqyasında təkcə təşkilatçılığı ilə deyil, həm də alimliyi ilə fərqlənirdi. O, SSRİ

xalqlarının məktəb və pedaqoji fikir tarixinə dair 11 cildliyin əsas müəlliflərindən biri olmuşdur.

Natiq M.Mehdizadənin fəaliyyətinin **üçüncü istiqaməti** kimi onun YUNESKO-dakı fəaliyyətini, çoxsaylı beynəlxalq məclislərdəki iştirak və çıxışlarını qeyd etdi.

Akademik H.Əhmədov çıxışının sonunda özünün inkişafında M.Mehdizadənin böyük rolu olduğunu, məhz onun rəhbərliyi altında doktorluq dissertasiyası müdafiə etdiyini, M.Mehdizadədən həmişə qayğı və diqqət gördüyünü, onun şəxsiyyətini özü üçün örnək saydığını bildirdi.

Konfransda çoxsaylı çıxışlar oldu.

Təhsil nazirinin müavini İsgəndər İsgəndərov çıxış edərək konfrans iştirakçılarını nazir Misir Mərdanovun və özünün adından salamladı, M.Mehdizadə ilə bir yerdə işləməsə də, özünü onun yetirməsi hesab etdiyini bildirdi. İsgəndər müəllim H.Əhmədovun M.Mehdizadənin yubileyinin geniş səviyyədə qeyd olunmaması ilə bağlı iradına cavab olaraq söylədi ki, Təhsil Nazirliyi akademik M.Mehdizadənin 100 illik yubileyinin qeyd olunması barədə əmr verib, yubiley komissiyası yaradılıb ki, yerlərdə bu məqsədlə tədbirlər keçirilsin. Görkəmli alimin yubileyi respublika miqyasında qeyd olunacaq. Nazir müavini dedi: Mən bəzi sənədləri araşdırmışam. M.Mehdizadə haqqında yazılan məqalələrlə tanış olmuşam və Mehdi müəllimdə bir neçə cəhətin birləşdiyini görmüşəm. O, böyük alim, böyük müəllim, böyül təhsil işçisi, böyük insan idi.

Sonra natiq M.Mehdizadənin müəllimlərin 1978-ci ildə keçirilmiş qurultayındakı məruzəsini misal gətirərək



onun çox dərin, təhsilimizin o dövrdəki durumunu, inkişaf meyllərini ətraflı təhlil edən, bu gün də əhəmiyyətini itirməyən bir sənəd olduğunu göstərdi. Çıxışının sonunda əmin olduğunu bildirdi ki, indiki konfransda iştirak edən tələbələr, gənc tədqiqatçılar Mehdi müəllimin yaradıcılığını daha dərindən öyrənəcəklər.

Sonra söz Azərbaycan Müəllimləri Yaradıcı İttifaqının sədri, professor Ramiz Məmmədzadəyə verildi. Ramiz müəllim böyük alimin, təhsil təşkilatçısının təhsilimizin inkişafına, onun maddi-texniki bazasının, o cümlədən indiki Azərbaycan Müəllimlər İnstitutunun maddi bazasının möhkəmləndirilməsinə göstərdiyi qayğı ilə bağlı xatirələrini danışdı. Onun pedaqoji fikrimizin inkişafındakı rolunu yüksək qiymətləndirdi. Sonra R.Məmmədzadə rəhbərlik etdiyi MYİ-nin akademik M.Mehdizadənin xatirəsini əbədiləşdirmək üçün gördüyü işlərdən, xüsusən İttifaqın təsis etdiyi M.Mehdizadə adına mükafatdan danışıb, konfrans iştirakçılarını mükafatın builki qalibləri ilə tanış etdi. Onların alqışları altında laureat diplomlarını mükafatçılara təqdim etdi, yüksək mükafat almaları münasibətilə onları təbrik etdi.

Pedaqoji elmlər doktorları, professorlar Yəhya Kərimov, Əjdər Ağayev, AMİ-nin prorektoru Atəş Abdullayev çıxış edərək M.Mehdizadə şəxsiyyətinin böyüklüyündən, bütövlüyündən, Mehdizadə elminin dərinliyindən, Mehdizadə təcrübəsinin zənginliyindən danışdılar, böyük alimlə bağlı xatirələrini söylədilər. Onun həyat və yaradıcılığının öyrənilməsi ilə bağlı görülmüş və görüləsi işləri sadaladılar. Konfransın sonunda söz alan akademik M.Mehdizadənin qızı, ADNA-nın dosenti Nailə Mehdizadə atasının fəaliyyətinə verdikləri yüksək qiymətə

və xatirəsinə göstərdikləri ehtirama görə çıxış edənlərə və konfransın təşkilatçılarına minnətdarlığını bildirdi.

***Y. HƏSƏNƏLİOĞLU,***
***"Azərbaycan müəllimi" qəzeti,***
***5-11 dekabr, 2003-cü il***





# GÖRKƏMLI PEDAQOQ, BÖYÜK ALİM, GÖZƏL İNSAN

Qədirbilən xalqımız akademik Mehdi Mehdizadənin anadan olmasından 100 illik yubileyini təntənə ilə qeyd edir.

Azərbaycan pedaqoji elminin ən parlaq şəxsiyyətlərindən biri olan Mehdi Mehdizadə zəngin və şərəfli həyat yolu keçmişdir. SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycan Respublikasının əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor Mehdi-Mehdizadə XX əsrin dörddə birini Azərbaycanın xalq maarifinə başçılıq etmişdir. Adi kənd müəllimliyindən başlayan pedaqoci fəaliyyət yolu onu nazir vəzifəsinə, akademik zirvəsinə yüksəltmişdir. O, Azərbaycan Pedaqoji İnstitutunda dekan, direktor müavini, kafedra müdiri, direktor (rektor), Ali və Orta İxtisas Təhsilli Komitəsi sədrinin birinci müavini , Maarif naziri vəzifəsində çalışmış, Azərbaycan SSR Ali Sovetinin deputatı olmuşdur.

Mehdi Mehdizadə bacarıqlı təhsil təşkilatçısı, ölkədə bu işə məharətlə rəhbərlik edən görkəmli dövlət xadimi olmaqla yanaşı, həm də Azərbaycanda XX əsrin 30-80-cı illərində inkişaf edən, təkmilləşən, formalaşan pedaqogika elminin aparıcı nümayəndəsi olmuş, təhsilin tarixi, nəzəri və təcrübi problemləri barədə dəyərli fikir və mülahizələri ilə pedaqoji elmlərin inkişafına güclü təsir göstərmişdir.

Elmi maraq dairəsi çox geniş olan Mehdizadə təhsilin bütün məsələlərinə dair eyni dərəcədə

araşdırmalar aparmış, gənc yaşlarından dərs vəsaiti və proqramlar tərtib etməyə başlamış, dərslik çatışmazlğının aradan qaldırılmasına səylə çalışmışdır. O 1941-ci ildə çap olunan «Pedaqogika» adlı ilk dərs vəsaitinin müəlliflərindən biridir, 1958-1959-cu illərdə isə həmin dərs vəsaitini təkmilləşdirib, onun rəhbərliyi ilə yenidən çap olunmuşdur. Böyük alim uzun illər Azərbaycan sovet məktəbinin inkişaf tarixi, ayrı-ayrı pedaqoqların fəaliyyət və görüşləri, təhsil quruculuğunun intensiv inkişaf mərhələləri və digər problemlər barədə elmi-tədqiqat işi aparmış, təhsilin elmi-nəzəri sahələrinə dair sanballı əsərlər yazmışdır.

Təhsilin məzmununun əsas komponentləri sayılan proqram və dərslik problemi həmişə aktual olmuşdur. Bu baxımdan M.Mehdizadə tədris planlarının, fənn proqramları və dərsliklərin elmi-pedaqoji əsaslarla yaradılmasına böyük əhəmiyyət verirdi. Mehdi müəllim məktəbi proqramsız və dərsliksiz təsəvvür edə bilmirdi. O deyirdi ki, quş dənsiz yaşaya bilmədiyi kimi, məktəb də proqramsız, dərsliksiz mövcud ola bilməz.

Məlumdur ki, Sovet dövründə yalnız ana dili və ədəbiyyat dərslikləri hər respublikanın özündə hazırlanırdı. Bunlar milli, orijinal dərsliklərimizin ilk nümunələri idi. Lakin bu fənlər üzrə proqram və dərsliklər özü də o zamanın hakim ideologiyasının buxovlarından azad ola bilmirdi. Dərsliklərə daxil edilən əsərlər marksist ideologiyanın daşıyıcıları rolunu oynayırdı. Ona görə də bunların seçilməsində ciddi çətinliklər yaranırdı. Bir tərəfdən milli dəyərlərimiz kənarda qalmamalı, digər tərəfdən buna uyaraq həddi aşmaq, «cızıqdan çıxmaq» halları olmamalı idi. Ona görə də Mehdi müəllim



əvvəlcədən müəlliflərlə söhbət aparar, işin bu istiqamətdə qurulmasını məsləhət görərdi. Milli mədəniyyətin, ədəbiyyatın öyrənilməsi, təbliği, elə formada aparılmalı idi ki, o, totalitar rejimin qanunlarına zidd olmasın. Bir nazir kimi, o, belə mürəkkəb situasiyaları çox məharətlə idarə edirdi.

Məhz bu gərgin əməyin nəticəsi idi ki, M.Mehdizadənin xalq maarifinə başçılıq etdiyi illərdə Azərbaycan dili və ədəbiyyat dərsliklərinin yaradılmasında gözəl təcrübə qazanılmışdı. Onun «Azərbaycan məktəbi» jurnalında (1965, №2) dərc olunan «Azərbaycan dili və ədəbiyyat tədrisini əsaslı surətdə yaxşılaşdırmaq» adlı məqaləsi bu cəhətdən daha maraqlıdır. Burada məktəblərimizdəki mövcud vəziyyət təhlil olunmuş, qarşıda duran vəzifələr müəyyənləşdirilmişdir.

Doğma dilimizin yaşaması və təkmilləşdirilməsində başlıca vasitə rolunu oynayan Azərbaycan dili və ədəbiyyat dərsliklərinin yazılmasına o zamanın görkəmli dilçi alimləri Ə.Dəmirçizadə, M.Hüseynzadə, M.Şirəliyev, S.Cəfərov, Ə.Əfəndizadə ədəbiyyatçı alimlər M.Arif, H.Araslı, F.Qasımzadə, M.C.Cəfərov, C.Xəndan, P.Xəlilov və başqaları cəlb olunmuşdu.

Azərbaycan Respublikası Prezidentinin rəhbərliyi ilə «Azərbaycan Respublikasında Dövlət dili haqqında» Qanunun tətbiq olunduğu indiki dövrdə dilimizin, ədəbiyyatımızın öyrənilməsi dövlət əhəmiyyətli məsələyə çevrildi. Təhsil Nazirliyində bu qanunun icrası ilə əlaqədar Yazıçılar Birliyi, dil qurumları ilə razılaşdırılmış tədbirlər planı hazırlandı və onun həyata keçirilməsinə başlandı. Artıq Azərbaycan dilinin dövlət dili kimi istifadəsi

problemi demək olar ki, həll edilmişdir. Məlumdur ki, görkəmli dövlət xadimi, Heydər Əliyevin səyi ilə 1978-ci ilə Azərbaycan Konstitusiyasına əsasən Azərbaycan dili dövlət dili elan olunmüşdü. Məhz onun sayəsində ölkədə rus dilinin tüğyan etdiyi bir şəraitdə Azərbaycan dili tədris dili kimi qorunub saxlanmışdı. Azərbaycan xalqı, Azərbaycan ziyalıları bu dildə danışır, yazır, ona əsas ünsiyyət vasitəsi kimi baxırdılar.

SSRİ dövründə türk-müsəlman respublikaları içərisində öz dilini qoruyub saxlamaq ən çox Azərbaycana nəsib olmuşdur. Qazaxıstanda, Özbəkistanda, Türkmənistanda, Qırğızıstanda doğma dildə olan məktəblərin sayı ildən-ilə azalsa da, bu hal Azərbaycana xas deyildi. Bunun səbəblərindən biri də o idi ki, nazirlik tərəfindən Azərbaycan dili və ədəbiyyatının tədrisinə ciddi əhəmiyyət verilir və onun sıradan çıxmasına yol verilmirdi. Uzun müddət Mehdi müəllimin rəhbərliyi altında işləyənlər Z.Əliyeva, bu sətirlərin müəllifi A.Muradov yaxşı xatırlayır ki, Mehdi müəllim Məmməd Arif, Cəfər Xəndan, Feyzulla Qasımzadə, Məmmədcəfər Cəfərov, Əziz Mirəhmədov və başqa alimlərlə tez-tez görüşür, ədəbiyyat dərsliklərinin yazılmasına verilən tələblər barədə onlarla fikir mübadiləsi aparardı. Sevindirici haldır ki, bu ənənə indi də davam edir. Lakin əvvəlki dərsliklərimiz o qədər mükəmməl işlənmiş, sınaqlardan keçmişdir ki, onlardan tamamilə imtina etmək mümkün olmur. Vaxtilə Cəfər Cabbarlı deyirdi ki, poeziyamız 400 il Füzuli tilsimindən kənara çıxa bilməmişdir. Mehdizadə dövründəki dərsliklərdən o qədər də fərqlənməyən 90-cı illərdə hazırlanmış «Ədəbiyyat» dərslikləri hələ də istifadədən çıxmamışdır. Yalnız Təhsil



naziri Misir Mərdanovun göstərişi ilə onların yeniləşdirilməsinə bu ildən başlamışdır.

Artıq V-XI siniflər üçün Ədəbiyyat proqramı 2003-cü ildə tsdiq edilmişdir və onun əsasında dərsliklərin yazılması üçün prof. Pənah Xəlilovun başçılığı ilə işçi qrupu yaradılmışdır. Prof. P.Xəlilovla birlikdə XI sinfin «Ədəbiyyat» dərsliyi üzərində akademik İsa Həbibbəyli işləyir. X sinfin dərsliyi P.Xəlilovla birlikdə prof. X.Məmmədov, Z.Əskərli, X.Yusifova tapşırılmışdır. Artıq V-VI siniflərin «Ədəbiyyat» dərslikləri çap prosesindədir. VII, VIII, IX siniflərin dərslikləri də hazırlanmaqdadır. Ümid etmək olar ki, qarşıdakı yeni dərs ilində məktəblərimiz dərsliklərdən istifadə edə biləcəklər. Bax, bu, Mehdizadənin xatirəsini əbədiləşdirməyə ən gözəl tövhə olardı. Xatırladıram ki, yeni yazılan dərsliklərimizdə də o zamankı mövzular və mətnlərin bəziləri daha doğrusu, aktuallığını itirməmişlər yenə də saxalanılmışdır.

Mehdi müəllim proqram və dərsliklərlə əlaqədar başqa respublikalarda aparılan işləri mətbuat vasitəsilə öyrənir və onun respublikamızda təbliqinə rəvac verirdi. SSRİ Pedaqoji Elmlər Akademiyasının yaradılmasının iştirakçılarından və ilk həqiqi üzvlərindən biri olan M.Mehdizadə o zaman SSRİ PEA-nın ən nüfuzlu üzvü kimi hər yerdə pedaqogika elmimizi təmsil etmiş, İttifaq miqyaslı elmi tədbirlərdə həlledici söz, fikir sahibi kimi dəyərləndirilmişdir. O 1961-1964-cü illərdə YUNESKO-nun təhsil üzrə komitəsinin üzvü olmuş, inkişaf etməkdə olan dünya ölkələrində xalq maarifinin inkişaf təcrübəsinin yayılmasında fəal iştirak etmişdir. Polşada, Hollandiyada, Fransada, Afrika ölkələrində və digər yerlərdə pedaqoji elmin nailiyyətlərindən danışmışdır.

Parisdə iki dəfə Afrika ölkələri maarif nazirləri qarşısında məruzə oxumuşdur.

Akademik Mehdizadənin nitqləri və çıxışları dərin məzmunu, elmiliyi, istiqamətvericiliyi ilə həmişə diqqəti cəlb etmiş, «Azərbaycan məktəbi», «Sovetskaya pedaqoqika», «Narodnoe obrazovanie» və digər jurnallarda və toplularda çap edilmişdir. Bütün bunlar isə, görkəmli pedaqoqların nəzərindən qaçmırdı. O zamankı Mərkəzi mətbuatda onun özü haqqında da dəyərli materiallar çap edilmişdir. Akademik M.A.Prokofyev (o bir müddət SSRİ maarif naziri işləmişdir) yazmışdır ki, Mehdizadə pedaqogika elminin korifeylərindən biri, maarif quruculuğunun görkəmli təşkilatçısı kimi tanınmışdır. Akademik A.G.Xripkova yazırdı ki, Mehdizadə çox nadir istedada malik alim, müdrik el ağsaqqalıdır. Belə hörmətin sahibi olan Mehdizadə həqiqətən respublikamızda maarifçiliyin qarantı, dayağı idi. Bütün bunlar bu gün də tez-tez yad olunmaqdadır.

Azərbaycan Pedaqoji mətbuatında 2003-cü ildə Mehdi müəllim haqqında dəyərli yazılar dərc edilmiş, onun hərtərəfli fəaliyyəti geniş təhlil edilmişdir. Son illərdə ölkəmizdə dərsliklərin təkmilləşdirilməsi ilə əlaqədar apardığınız qlobal siyasət prosesində bir daha Mehdi müəllim yad olunur. M.Mehdizadə bir nazir kimi ana dili və ədəbiyyat dərsliklərinin yazılmasına ciddi tələblər qoyduğu kimi digər fənlər üzrə dərsliklərin tərcümə keyfiyyətinə də ciddi tələblərlə yanaşmışdır. O dərsliklərin məzmunu ilə yanaşı onların poliqrafik səviyyəsinə də xüsusi fikir verirdi. Etiraf etmək lazımdır ki, o dövrun imkanları dairəsində bəzi uğurlar da



qazanılmışdı. Yeni çıxan, yeni tərcümə olunan dərslik haqqında ilk fikri də o söyləyirdi.

Mehdi müəllim dərsliyə tədris prosesinin əsas tərkib hissəsi kimi baxırdı. Dərslik onun üçün məktəb işinin məzmunu olmaqdan başqa, onun aparıcısı idi. O həmişə proqram-metodika idarəsinin kuratorluğunu özündə saxlamışdır. O vaxtlar proqram-metodika idarəsində respublikanın əməkdar müəllimləri İmran Məmmədov, Zəhra Əliyeva kimi təcrübəli işçilər çalışırdı. Onlar ilk növbədə Azərbaycan dili, ədəbiyyat, xarici dil, rus dili dərsliklərinin milli ruhda işlənməsinə diqqət yetirirdilər. Mehdi müəllim dərslik müəllifləri ilə tez-tez görüşər, onları dinləyər, öz tövsiyələrini verərdi. Belə hallar dərslik yaradıcılığında bu gün də vardır.

Bir daha, dönə-dönə qeyd etməyi lazım bilirəm ki, Mehdi müəllim doğma dildə səlis danışması, savadlı yazması, dilimizin gözəlliyinə ardıcıl riayət etməsi ilə ana dilimizin tədris prosesində özünəməxsus yer tutmasına müsbət təsir göstərmişdir.

Mehdizadənin nazir olduğu illərdə bu məsələ xüsusilə diqqət mərkəzində saxlanılırdı. Nazirlikdə ümumtəhsil məktəbləri ilə bağlı bütün sənədlər Azərbaycan dilində tərtib olunurdu. Heç kəsi məcbur etmirdilər ki, qərarlar, göstərişlər yalnız rus dilində yazılsın. Məlumdur ki, rus təhsilli rəhbər işçilər rus dilinə daha çox üstünlük verirdilər. Mehdizadə ilə uzun müddət işləyənlər təsdiq edirlər ki, Mehdi müəllimin qol çəkdiyi qərar və təlimati məktublar, o cümlədən dilin və ədəbiyyatın tədrisi ilə bağlı göstərişlərin hamısı doğma dilimizdə yazılmışdı. Bu sənədlər arxivlərdə indi də saxlanılır. O da məlumdur ki, keçmiş SSRİ məkanında,

xüsusən Orta Asiyanın türk respublikalarının heç birində milli məktəblərin inkişafına və ana dilinin tədrisinə Azərbaycandakı qədər əhəmiyyət verilmirdi. O illərdə Alma-Atada qazax dilində bir dənə də məktəbəqədər tərbiyə müəssisəsi yox idi. Anadilli məktəblərin də sayı çox cuzi idi. Qırğızıstanda da vəziyyət elə idi. Azərbaycanda isə doğma dilin inkişafı üçün məhdudiyyət qoyulmamışdı. Milli ruhlu alimlərimizin, müəllimlərimizin səyi ilə ilk növbədə təlim Azərbaycan dilində olan məktəblərdə ana dili və ədəbiyyatın tədrisinə ardıcıl fikir verilirdi. Dərsliklərimiz isə hər il təkmilləşdirilirdi. Düzdür, onlarda keçmiş ideologiyanı tərənnün edən nümunələr çox idi. Əlbəttə, bunsuz keçinmək də mümkün deyildi. Bununla yanaşı S.Vurğunun, S.Rüstəmin, R.Rzanın şerləri, M.İbrahimov, S.Rəhimov, M.Hüseyn, İ.Əfəndiyev, İ.Şıxlının nəsr əsərləri məktəblərimizdə doğma dilin tədrisinə təkan verən əsas amillərdən idi. Dərsliyə salınan ədəbi əsərlər öz zamanına xidmət etsə də, bu əsərlərin dili, üslubu dilimizin zənginlləşməsində əhəmiyyətli rol oynayırdı. Başqa xalqların şairləri, nasirləri o illərdə rus dilində yazmağa üstünlük verdikləri halda, bizim klassiklər xalqımıza doğma dildə yeni-yeni töhfələr bəxş edirdilər. Azərbaycan dili və ədəbiyyat dərsliklərində dilimizin axıcı üslubu ona məhəbbəti daha da artırırdı. 50-ci illərin sonunda bu sahədəki işlər mübahisə doğurduğu vaxtlarda belə dilimizin saflığının qorunmasına qayğı azalmamışdı.

Bütün bunlar ilk növbədə məktəblərdə aparılan təlim-tərbiyə prosesi ilə bağlı idi. Başqa sahədə çalışan vəzifəli adamların da stolunun üstündə yeni çapdan çıxan bədii əsərləri görmək olardı. Təsadüfi deyildir ki,



yığıncaqlarda Mehdi müəllim müasir ədəbiyyatdan tez-tez misallar gətirirdi. Ədəbiyyatımıza bələd olduğu üçün dərsliklərimizə daxil edilən bədii əsərlər barədə görkəmli yazıçı, şair və alimlərlə apardığı məsləhətləşmələrdə çox dəyərli fikirlər söyləyirdi. Hətta onlarla bu mövzuda mübahisə də edirdi. Ən qlobal problemlərlə əlaqədar o, akademik Məmməd Ariflə görüşərdü. Cəfər Xandan, M.Cəfər, F.Qasımzadə, H.Araslını tez-tez Mehdi müəllimin yanında görmək olardı. Uzun müddət ədəbiyyat dərslitklərində C.Cabbarlı, H.Cavid, M.Müşviq S.Vurğun, S.Rüstəm, R.Rza, S.Rəhimov, M.İbrahimov, M.Hüseyn kimi klassiklərin ayrıca portret şəklində öyrənilməsi artıq sınaqdan çıxmışdı. Bir nazir kimi o, proqram və dərsliklər barədə həmişə Yazıçılar Birliyinin və Nizami adına Əlyazmalar İnstitutunun rəylərini öyrənməyi vacib sayırdı. Onlar da Mehdi müəllimin dəvətini səbirsizliklə gözləyirdilər.

O zaman keçmiş SSRİ respublikalarının proqram və dərslikləri ilə tanış olanlar yaxşı bilir ki, dərsliklərdə rus ədəbiyyatına ayrıca yer verilirdi. Bizim X sinif «Ədəbiyyat» dərsliyində isə rus ədəbiyyatı bölməsi əvəzinə 1986-cı il proqramına uyğun «SSRİ xalqları ədəbiyyatı» bölməsi verilmişdi ki, orada da yalnız M.Qorki öyrədilirdi. Göründüyü kimi, Azərbaycanda milli ruh öz aparıcılıq sükanını əldən verməmişdi. Proqramın sonrakı, 1994-cü il çapında da bu cəhətlər gözlənilmiş, əvvəlki illərdə proqrama daxil edilən yazıçılar əsasən saxlanmış, lakin dövrün tələblərinə cavab verməyən əsərlər başqası ilə əvəz edilmiş, daha aktual mövzular da əlavə olunmuşdur. İndiki ədəbiyyat proqramında bir sıra ciddi struktur dəyişikliyi edildiyindən, mövcud proqramda

3 sinif üçün nəzərdə tutulan (IX, X və XI s.) proqramın 2 ildə (X və XI s.) öyrənilməsi məqsədəuyğun sayılmışdır. Ona görə də bəzi mövzular bir qədər aşağı siniflərə paylanılmışdır. Nəzərə alınmışdır ki, mövcud proqramda qədim və orta əsrlər ədəbiyyatı IX sinifdə keçirilir. Ona görə də yeni proqramda IX sinifdə bir boşluq yaranmışdır. X-XI siniflərdəki bəzi mövzular hesabına IX sinifdəki bu boşluğun doldurulması sonrakı siniflərdəki ağırlığın da qarşısını alır.

İndi Azərbaycan dili və ədəbiyyatının tədrisində daha geniş məqsəd güdülür. Müstəqilliyimizin nailiyyəti olan dilimizin, ədəbiyyatımızın inkişafına yaradılan şərait, həmçinin Dövlət dilinin hüquqi statusunun nizamlanması proqram və dərsliklərimiz vasitəsilə dövlət dilinin işlənməsi, qorunması və inkişaf etdirilməsi sahəsində geniş miqyaslı işlərin aparılmasına öz müsbət təsirini göstərmişdir. Dil və ədəbiyyatın tədrisində bir həmahənglik yaranmışdır. Xüsusən X-XI siniflərdə bu iki fənn bir-birinə inteqrasiya edilmişdir.

«Azərbaycan müəllimi» və «Ədəbiyyat qəzeti»ndə çap olunmuş Ədəbiyyat proqramının ilk layihələri də çap olunmuşdur. Ədəbiyyat proqramının geniş müzakirəsi keçdi. Həmişə olduğu kimi, Ədəbiyyat proqramı indi də diqqət mərkəzindədir. Ədəbiyyat proqramı 70-ci illərdə də belə geniş müzakirə edilmişdi.

Məhz, belə yanaşmanın nəticəsidir ki, ötən il Təhsil naziri Misir Mərdanov Yazıçılar Birliyinin sədri Anarın dəvəti ilə Yazıçılar Birliyində oldu və çox faydalı bir görüş keçirildi. F.Qoca, A.Əmrahoğlu, Y.Kərimov, Ayaz Vəfalı, Bahar Bərdəli və başqa yazıçıların iştirakı ilə proqramlar haqqında geniş fikir mübadiləsi aparıldı. O



görüşün iştirakçısı kimi məndə belə bir qənat hasil oldu ki, dilimizin, ədəbiyyatımızın öyrənilməsi və təbliği sahəsində illərdən bəri qazanılmış ənənələr yaşayır və davam edir.

Bəzən Ədəbiyyat proqramını hərtərəfli təhlil edə bilməyənlər belə irad tuturlar ki, görkəmli yazıçı və şairlərimizdən bəziləri proqramdan çıxarılmışdır. Onlar bunu deyəndə X-XI siniflərdə ən görkəmli yazıçı və şairlərimizin həyat və yaradıcılıqlarına ayrıca saat verilməsini nəzərdə tuturlar. Halbuki ən tanınmış ədib və şairlərimiz digər siniflərdə də tədris olunur. Ümumiyyətlə, orta məktəbin ədəbiyyat kursunun əsas məqsədi ədəbiyyatımızın ən yaxşı nümunələrinin öyrədilməsidir. Əlbəttə bu, ilk növbədə onun necə tədris olunmasından asılıdır.

Qeyd etmək lazımdır ki, bu gün ədəbiyyat proqramının tərtibində də indiyədək sınaqdan çıxmış metodlar unudulmamalıdır. Proqrama daha kütləvi, daha çox tanınan yazıçı və şairlərin əsərlərinin daxil edilməsi ənənəsi saxlanmalıdır.

Orta məktəblərimizdə ədəbiyyat proqramına, dərsliyə və onun tədrisinə məsul olan müəlliflər, müəllimlər, təhsil işçiləri bizə qədər gəlib çatan ənənələrə hörmətlə yanışmalı, görkəmli pedaqoqların tövsiyələrini nəzərə almalı, ədəbi irsi göz bəbəyi kimi qorumalıdırlar. Bunlar isə pedaqoji fikir tariximizə, maarif fədailərinə, onların önündə gedən Mehdizadə kimi şəxsiyyətlərə ən yaxşı ehtiram olardı.

O, bir nazir kimi təhsil sisteminin bütün mərhələlərində Azərbaycan dilinin tətbiqi məsələsinə də böyük diqqət yetirirdi. O zamanlar tək-tək nazirliklər

olardı ki, orada kollegiya iclasları doğma dildə aparılsın. Mehdizadə bu daxili-mənəvi tələbə həmişə müsbət reaksiya vermişdir. O dövr üçün xüsusi bir hal kimi qeyd edilməlidir ki, nazirlikdən yerlərə gedən bütün sənədlər əsasən Azərbaycan dilində olurdu.

SSRİ miqyasında rus dilinin öyrədilməsinə ciddi fikir verildiyi zaman yuxarıların göstərişi ilə Bakı şəhərindəki bütün məktəblərin beynəlmiləl məktəblərə çevrilməsi prosesi başlanmışdır. Lakin Mehdi müəllim milli məktəblərin qorunub saxlanmasını da yaddan çıxarmırdı. Məsələn, o zaman Sona Tağıyevanın başçılıq etdiyi 190 nömrəli məktəb sırf milli məktəb olmuşdur. Mehdi müəllimin səyi ilə həmin məktəbdə rus bölməsinin açılmasına imkan verilməmişdir. Maraqlıdır ki, respublikada yalnız bu məktəb Qırmızı Əmək Bayrağı ordeni ilə təltif edilmişdir. Onun direktoru Sona müəllimə isə yeganə direktor kimi Azərbaycan KP MK-nın üzvü idi. Ona görə də o, respublikada ən adlı-sanlı direktor sayılırdı. Təsadüfi deyildir ki, ümummilli liderimiz Heydər Əliyevin fərmanı ilə o, 1999-cu ildə məktəbin 50 illiyi yubileyində «Şöhrət» ordeni ilə təltif edilmişdir.

Mehdi müəllim ayrı-ayrı müəllimlərlə görüşlərə, söhbətlərə, onları dinləməyə həmişə maraq göstərimşdir. O, ədəbiyyat müəllimi Zərbəli Səmədovu tez-tez qəbula çağırardı. Respublikanın əməkdar müəllimi, 132 nömrəli məktəbin direktoru Aliyə Təhmasibi öz işinin ustası – sənətkarı sayardı. 132 nömrəli məktəbin ədəbiyyat müəllimi Bilqeyis Məmmədovanın adı dilindən düşməzdi. Dəfələrlə onun bir-birindən maraqlı keçən dərslərini dinləmişdi.



O, müəllimlərlə ardıcıl iş aparmağı da hamıya tövsiyə edirdi. Özü də buna riayət edərək tez-tez məktəblərə gedər, dəyirmi masalar keçirərdi. İnzibati binaların tikintisinə məhdudiyyət qoyulduğu halda o Azərbaycan Müəllimləri İnstitutunun yerləşdiyi binanın tikilməsi təklifini qaldırmış və ona nail olmuşdur. Çünki O müəllimlərin ixtisasartırmasına aktual məsələ kimi baxırdı. Onların kurs müddətində məişət şəraiti də həmişə onu narahat edirdi.

Onun hərtərəfli fəaliyyətinə misal olaraq qeyd etmək yerinə düşər ki, Azərbaycan Ensiklopediyasının bütün cildlərinin hazırlanmasında da Mehdi müəllimin xidmətləri böyükdür. O, ensiklopediyanın baş redaksiya heyətinin üzvü idi. Pedaqogikaya, məktəb təliminə, maarifin tarixinə və nəzəriyyəsinə aid məqalələrin bir çoxunu o özü yazmışdır. Onun buradakı məqalələrində Azərbaycan dilinə, ədəbiyyatına bələdliyi özünü aydın göstərirdi.

Böyük pedaqoqun xatirəsi həmişə xalqımız tərəfindən əziz tutulmuşdur. Bakı Ali Pedaqoji Qızlar Seminariyasında 1993-cü ildə Akademik Mehdi Mehdizadə adına mükafat təsis edilmişdir. Mükafat əla təlim müvəffəqiyyəti, nümunəvi davranış və seminariyanın ictimai həyatında fəal iştirakında fərqlənən tələbələrə verilir.

Beyləqan rayonundakı 3 saylı şəhər orta məktəbinə akad. Mehdi Mehdizadənin adı verilmiş və orada onun büstü qoyulmuşdur. Həmçinin görkəmli pedaqoq alim Azərbaycan müəllimlərinin Yaradıcı İttifaqı tərəfindən 1995-ci ildən akademik Mehdizadə adına mükafat da təsis

edilmişdir. Bu mükafat onun yolunu davam etdirənlərə pedaqoji sahədə fəal xidmətlərə görə verilir.

Pedaqoji elmlər sahəsində sözün həqiqi mənasında ensiklopedik bilik sahibi olan M.Mehdizadə həmişə öz hərəkətlərində, fəaliyyətində adamlara münasibətində də fərqlənmişdir. Onun böyüklüyü bir də onda idi ki, o həmişə müəllim adını yüksək tutmuş, hər yerdə onun müdafiəçisi kimi çıxış etmişdir. Mehdi müəllim tariximizə istedadlı pedaqoq alim və nüfuzlu rəhbər işçi kimi daxil olmuşdur. Onun ənənələri bu gün də davam edir, yaşayır.

Mehdizadənin təhsil sahəsində xidmətləri böyükdür və xalqımız bunları heç zaman unutmayacaqdır.

***NƏCƏF NƏCƏFOV***
***Təhsil Nazirliyinin Dərslik, mətbuat və nəşriyyat şöbəsinin müdiri,***
***filologiya elmləri namizədi,***
***Akademik M.Mehdizadə adına mükafat laureatı,***
***"Azərbaycan dili və ədəbiyyatı" jurnalı,***
***2004, №1, səh. 61–66***





# O, ƏSL İNSAN İDİ

***ARİF MURADOV,***
*Azərbaycan Respublikasının əməkdar müəllimi*

***Keçmiş Azərbaycan SSR maarif naziri, akademik Mehdi Mehdizadəni dövri mətbuatdan, televiziya ekranlarından, onun haqqında oxuduğum bir sıra yazılardan və maarifçilərin yaşlı nəslinin nümayəndələrinin söhbətlərindən, necə deyərlər, qiyabi tanıyırdım. Nəhayət, 1969-cu il aprelin əvvəllərində Mehdi müəllimlə görüşmək mənə nəsib oldu. 1968-1969-cu dərs ilinin ikinci yarısı gedirdi. Qaradağ rayonunun 228 nömrəli orta məktəbində təlim-tərbiyə işləri üzrə direktor müavini işləyirdim.***

1969-cu il aprelin biri, dördüncü rübün ilk dərs günü idi. İkinci növbənin dərsləri yenicə başlanmışdı. Məktəbimizin direktoru Xanım müəllimə mənə bildirdi ki, Maarif Nazirliyindən zəng etmişdilər, sabah saat 10-da Proqram-Metodika İdarəsi rəisinin yanında olarsan.

Deyilən kimi də etdim. Səhərisi gün Hökumət evinə - Maarif Nazirliyinə gəldim. Proqram-Metodika idarəsinin rəisi, respublikanın əməkdar müəllimi İmran Məmmədov məni qəbul etdi, məktəbdə təlim-tərbiyə işinin təşkili vəziyyəti ilə maraqlandı. Söhbəti qurtaran kimi telefon dəstəyini qaldırıb:

- Mehdi müəllim, söhbətə dəvət etdiyimiz Arif müəllim burdadır, - dedi. Dəstəyi yerinə qoyandan sonra bildirdi ki, beş dəqiqədən sonra nazirin yanına gedəcəyik.

Daxilən həyəcan keçirməyə başladım. İlk dəfə akademiklə, nazirlə görüşəcəkdim. Fikirləşirdim ki, görəsən nazir nə soruşacaq, hansı sualları verəcək?..

Deyilən vaxtda İmran müəllimlə birlikdə nazirin kabinetinə daxil olduq, salamlaşdıq, ayağa durdu, əl verdi, yer göstərdi, "əyləşin" – dedi.

- Arif müəllim, necəsiniz? – deyə Mehdi müəllim söhbətə başladı. Müdrik pedaqoq, həssas psixoloq olan nazir mənim həyəcanlı olduğumu o saat hiss etmişdi və çox güman ki, məni vəziyyətdən çıxarmaq üçün söhbətinə belə başlamışdı.

- Cox sag olun – deyə cavab verdim və Mehdi müəllimin üzünə baxdım. Ciddi, lakin sadə və səmimi sima gördüm, mənalı bir baxış hiss etdim və tədricən narahatlıq məni tərk etdi.

Nazir məktəb həyatının bir çox məsələləri: məktəbin bütün ixtisaslar üzrə müəllimlərlə təmin olunması, onların ixtisasartırmasının gedişi, fənn kabinetlərinin vəziyyəti, məktəbli iaişəsinin təşkili, məktəbdən yayınma, vaxtında VIII sinfə çatdırma, IX sinfə qəbul, şagirdlərlə aparılan peşə yönümlü işi və s. məsələlərlə maraqlandı. Hiss edirdim ki, suallarına verdiyim cavablar onu qane edir. Bəlkə də ona görə mənimlə xeyli söhbət etdi. Axırda məndən soruşdu:

- Arif müəllim, nə oxuyursunuz?

Mən son vaxtlar oxuduğum bir neçə kitabın və müəlliflərin adını çəkdim.

- Çox yaxşı, mütaliəni heç vaxt unutmaq olmaz, – dedi.

Nazir söhbəti yekunlaşdıraraq razı qaldığını bildirdi və təklif etdi ki, bir referat hazırlayım. O, mənim yazı



bacarığım, ümumiləşdirmə qabiliyyətimlə tanış olmaq istədiyini söylədi. Mən referatı hansı mövzuda yazmağı soruşdum. Mehdi müəllim heç fikirləşmədən:

- Direktor müavinisiniz, təlim-tərbiyə işinə rəhbərlik edirsiniz, özünüz də tarix müəllimisiniz. Məktəbinizdə tarixin tədrisi vəziyyətini ümumiləşdirin.

Refaratı hazırladım, aprelin 7-də İmran müəllimə təqdim etdim. Aprelin 8-də işin axırına yaxın məktəbin direktoru mənə çatdırdı ki, Nazirlikdən zəng etmişdilər, dedilər ki, nazir əmrinə qol çəkib. Sabahdan ora işə çıxarsan.

Beləcə Proqram-Metodika idarəsində sadəliyi və abır-həyalılığı ilə seçilən əməkdar müəllim, məktəb təlimi məzmununun gözəl bilicisi İmran Məmmədov, ədəbiyyatşünas alim, mehriban insan, sonradan əməkdar müəllim Zəhra Əliyeva, qayğıkeş, səmimi, sonradan uzun müddət APİ-nin xarici dillər kafedrasının müdiri olmuş, professor Arif Tahirovla və digərləri ilə birlikdə işləməyə başladım.

İdarənin əməkdaşları arasında iş bölgüsünə əsasən mənə tarix, coğrafiya və ictimaiyyət fənlərinə dair proqramların, dərsliklərin, elmi-metodik ədəbiyyatın hazırlanmasını, Elmi-metodik şuranın bu fənlər üzrə bölmələrinin işinin təşkili və digər məsələlər tapşırılmışdı.

O illərdə mənə tapşırılan sahə ilə bağlı respublikamızın bir sıra görkəmli alimləri, tarixçilərdən Əlövsət Quliyev, Elman Məmmədov, İosif Striqunov, Şamil Məmmədbəyli, coğrafiyaçılardan Qasım Gül, Həsən Əliyev, Nurəddin Kərəmov, Budaq Budaqov, Nizaməddin Allahverdiyev və başqaları ilə əməkdaşlıq etmək və yaxından tanış olmaq nəsib oldu.

Sovet İttifaqı dövründə müttəfiq respublikaların tarixi və coğrafiyası müstəqil fənn kimi tədris edilmirdi. Ona görə də Azərbaycan tarixi SSRİ tarixi, coğrafiyası isə SSRİ coğrafiyasının tərkibində öyrədilirdi. Respublikanın tarixi və coğrafiyasının tədrisinə az miqdarda (VII-X siniflərdə 75 saat) vaxtın ayrılmasına baxmayaraq, alimlərimiz şagirdlərə çatdırılmalı olan ən vacib məsələləri müəyyənləşdirərək, pedaqoji prinsiplərin tələblərinə cavab verən sanballı dərsliklər yarada bilmişdilər.

Mən işimlə əlaqədar tez-tez Elmlər Akademiyasının Tarix və Coğrafiya İnstitutularında, Dövlət Universitetinin və Pedaqoji İnstitutun müvafiq kafedralarında olur, alimlərlə görüşür, şagirdlər və müəllimlər üçün elmi-metodik, elmi-populyar ədəbiyyatın, əyani vasitələrin, xüsusən tədris xəritələrinin hazırlanması və nəşri ilə bağlı məsləhətləşmələr aparırdım.

Əməkdaşı olduğum Proqram-Metodika idarəsi elmi-metodik qrum olduğundan ona Mehdi müəllim özü kuratorluq edirdi. Mehdi müəllim işin çoxluğuna və gərginliyinə baxmayaraq, imkan tapıb vaxtaşırı idarənin əməkdaşlarını yanına toplayır, onlarla görülmüş və görüləcək işlər barədə söhbət aparırdı. Mehdi müəllim öz sadəliyi və səmimiliyi ilə elə şərait yaradırdı ki, bir anlığa onun nazir olduğunu belə unudur, adama elə gəlirdi ki, o, idarəmizin ağsaqqal əməkdaşı, yaxın iş yoldaşımızdır. O, səbrlə hamını bir-bir dinləyir, bəzən bu və ya digər məsələni daha da dəqiqləşdirmək üçün suallarla müraciət edir, müdrik məsləhətlərini verirdi. O, hər bir fənn üzrə elmi-metodik bazanın yaradılması ilə, hər şeylə



maraqlanır, əməkdaşların öz üzərində necə işləmələrini də yaddan çıxarmırdı.

Belə görüşlərin birində Mehdi müəllim mənə müraciət edərək:

- Arif müəllim, tarix, coğrafiya və ictimaiyyət fənləri üzrə nə işlər görülür, xüsusilə Azərbaycan tarixi və coğrafiyasının tədrisi ilə bağlı nələr edilir? – deyə soruşdu.

Mən ayağa durdum, məlumat vermək istəyirdim ki, Mehdi müəllim:

- Arif müəllim, əyləşin, belə rəsmiyyət lazım deyil. Məsləhətləşirik, fikir mübadiləsi edirik.

Mən söhbət iştirakçılarının içində hamıdan cavan olduğumdan oturmağa utandım, ayaq üstə məlumat vermək üçün izn istədim. Məlumat verməyə başladım.

Tarix, coğrafiya və ictimaiyyətdən tədris proqramları, dərsliklərin hazırlanıb nəşr edilməsi, yerlərə çatdırılması, çap edilən metodik vəsaitlər, "Tarix, coğrafiya və ictimaiyyət" jurnalı, Elmi-metodik Şuranın qeyd edilən fənlər üzrə bölmələrinin fəaliyyəti haqqında ətraflı məlumat verdim. O zaman tarix və coğrafiyadan hazırlanmış yeni proqramlarda ölkəşünaslıq materiallarından tədris prosesində istifadəyə geniş yer ayrıldığını bildirdim, respublika və ittifaq pedaqoji mətbuatında bu məsələ ilə bağlı dərc edilən yazılar və mütəxəssislərin fikirləri barədə danışdım.

- Bəs Sizin fikriniz necədir? – deyə Mehdi müəllim mənə müraciət etdi. Mən məsələyə öz münasibətimi bildirdikdən sonra, o bir sıra məsləhətlər verdi, əldə edib tanış olmadığım bir neçə əsərlə, qəzet və jurnal məqalələri ilə də tanış olmağı tövsiyə etdi.

Beləcə digər fənlər üzrə də mütəxəssisləri dinləyir, məsləhətlərini verir, daha hansı əsərləri, yazıları oxumağı tövsiyə edirdi.

Mehdi müəllimi dinlədikcə adam heyrətə gəlirdi ki, gərgin dövlət və ictimai işlə məşğul olduğu halda, o, bu qədər geniş mütaliəyə necə vaxt tapır?!

Mehdi müəllim söhbəti yekunlaşdırarkən daha bir məsələyə diqqətimizi cəlb etdi:

- Mətbuatda imzanızı az-az görürəm. Maarifimizin müxtəlif məsələləri ilə əlaqədar mütəmadi çıxış etmək lazımdır. Bu həm maarif orqanları və müəssisələri işçilərinə kömək, həm də ictimaiyyətin maarifləndirilməsinə əməli yardım deməkdir.

Beləliklə, Mehdi müəllim işçiləri düşünməyə, axtarışlar aparmağa, işə daha məsuliyyətlə yanaşmağa, öz üzərində daim çalışmağa sövq edirdi.

Mehdi müəllim Maarif Nazirliyinin mərkəzi aparatında çalışan gəncləri, o cümlədən məni də vaxtaşırı Mərkəzi Komitədə, Nazirlər Kabinetində maarif məsələlərinin araşdırılması, öyrənilməsi ilə bağlı yaradılan komissiyaların tərkibinə daxil etdirirdi. İllər keçəndən sonra mən başa düşdüm ki, bundan o, gənc kadrların bir mütəxəssis kimi yetişdirilməsi metodu kimi istifadə edirmiş. Mehdi müəllim sadə, səmimi, təvazökar, qayğıkeş, intizamlı, yüksək mədəniyyətə və mənəviyyata malik, eyni zamanda ciddi adam idi. Nazirin qəbul və iş otaqları Proqram-Metodika idarəsi ilə üzbəüz idi. Ona görə də bu idarənin işçilərinin onu "müşahidə etməyə" daha çox imkanı vardı. O, həmişə işə vaxtında gələr, vaxtında fasiləyə gedib, vaxtında da qayıdardı. Müəyyənləşdirdiyi müşavirələri, görüşləri, vətəndaşların



qəbulunu və s. vaxtında başlayar və vaxtında da qurtarardı.

Mehdi müəllimin məişəti də özü kimi sadə idi, adi insanların yaşayışından seçilmirdi.

1970-ci ilin mart ayının ortaları idi. İmran müəllim mənə makinada çap olunmuş bir material verdi və dedi ki, Mehdi müəllim xəstələnib, evdədir. Bu material MK-ya göndəriləcək, Mehdi müəllim özü materiala baxmalıdır, bunu ona çatdır. Hara necə gedəcəyimi də izah etdi. İçəri şəhərdə, Qız Qalasının arxasında yerləşən ikimərtəbəli köhnə bir evin taxta pilləkanları ilə ikinci mərtəbəyə qalxdım, zəngi çaldım, nurani bir xanım qapını açdı. Sonradan bildim ki, o, Mehdi müəllimin həyat yoldaşı Lətifə xanım imiş. Mən əlimdəki materialı ona vermək istəyərək, "Mehdi müəllimə çatacaq", dedim. O isə:

- Buyurun, içəri, Mehdi müəllim gözləyir, - dedi.

Mən aralıq (keçid) otağa daxil oldum. Giriş qapısı ilə üzbəüz otağın yuxarı başında divan üzərində, başında təs, çiynində əba, əlində kitab Mehdi müəllimin oturduğunu gördüm. Otağın döşəməsi rənglənmiş adi taxtadan idi, ortada balaca bir xalçanın üstündə dördkünc stol, ətrafında dörd stul, solda paltarasan şkaf, sağda rəfləri kitablarla dolu kitab şkafı vardı. Keçid otağından sağ və sol tərəfə qapı açılırdı. Salamlaşdım, gətirdiyim materialı ona verdim. Mehdi müəllim təşəkkürünü bildirdi və oturub bir stəkan çay içməyi təklif etdi. Mən ilk dəfə idi ki, nazir mənzilinə qədəm basırdım, utanırdım, sıxılırdım, təşəkkür etdim və oradan çıxıb işə qayıtdım. Yol boyu gördüklərim məni təəccübləndirirdi: nazir,

akademik, MK-nın üzvü, Ali Sovetin deputatı... nə qədər adi, nə qədər sadə yaşayır.

1970-ci il avqustun axırları idi. Mehdi müəllim məni yanına çağırıb, hal-əhval tutduqdan sonra:

- Nazirlər Sovetində işləmək üçün məndən bir namizədin təqdim edilməsini xahiş ediblər. sabah səhər saat 10-da Nazirlər Sovetinin sədr müavini Kamran Hüseynovun yanında olarsan – dedi və bir neçə məsləhətlər də verdi. Səhərisi Nazirlər Sovetinə gəldim, məni sədr müavini, tarix elmləri doktoru Kamran Hüseynovun yanına apardılar. Mən qapını açıb kabinetə daxil olmaq istəyirdim ki, iş stolunun arxasından pəhləvan cüssəli Kamran müəllim ayağa qalxıb "Buyurun, buyurun" – deyərək mənim qarşıma gəlib əl verdi və oturmağa yer göstərdi. Mənimlə qısa və konkret söhbətdən sonra, hansı şöbələrdə söhbətdən keçəcəyimi bildirdi və bu işin təşkilini köməkçisinə tapşırdı. Sağollaşdıq. O, ayağa durub məni iş otağının astanasına qədər ötürdü. İki gün ərzində bir neçə şöbədə söhbətdə oldum, üçüncü gün yenə Kamran müəllim məni qəbul etdi:

- Mən bilirdim ki, Mehdi müəllim mənə təsadüfi adamı təqdim etməz. Şöbələrin hamısının rəyi müsbətdir. İndi sədrimiz yoldaş Ə.İbrahimov xaricdə ezamiyyətdədir, bir həftədən sonra qayıdacaq. O, qəbul etdikdən sonra sərəncam veriləcəkdir. Sağollaşdıq, əlimi sıxdı və məni yenə də astanaya qədər ötürdü.

Kamran müəllimin yüksək mədəniyyət sahibi olduğunun şahidi oldum.

Aradan bir neçə gün keçmişdi. Mehdi müəllim məni yanına dəvət etdi:



- Bakının Nəsimi rayonunda maarif şöbəsinin müdiri yeri vakantdır. Səni ora müdir göndərməyi qərara almışam. Birinci katiblə danışaram, sonra gedərsən onun qəbuluna.

Mən narahatlıq hissi keçirərək:

- Mehdi müəllim, bəs Kamran müəllim, axı Nazirlər Sovetində söhbətdən keçmişəm.

- O mənim işimdir, Kamranla danışaram, o məni başa düşər.

Mən Mehdi müəllimə müraciət edərək, rayonun yeri və çox böyük olduğunu, idarəçilikdə kifayət qədər təcrübəmin olmadığı üzündən mənə çətin olacağını söylədim. Heç hara getmək istəmədiyimi, onun yanında qalıb işləmək istədiyimi bildirdim. Məni səbrlə dinlədikdən sonra:

- Arif, mən sənin şəxsi işinlə tanış olmuşam, İmranla da söhbət etmişəm, ailənin vəziyyətindən xəbərim var, atan da müəllim olub, Vətən müharibəsində həlak olub, kirayədə yaşayırsan, mənzil növbəsində durduğunu da bilirəm. Lakin burada tezliklə mənzil almaq mümkün olmayacaq. Rayon İcraiyyə Komitəsi 2-3 ildən bir Nazirliyə bir mənzil ayırır, növbədə olanlar isə çoxdur. Maarif şöbəsi rayon icraiyyə komitəsinin ən böyük şöbəsidir. Güman edirəm ki, Nəsimi RİK-də elə də böyük növbə olmaz və tezliklə mənzil ala bilərsən. Digər tərəfdən cavansan, energiyanı yerlərdə maarifimizin inkişafına sərf etsən daha faydalı olar.

Mehdi müəllimi dinləyə-dinləyə fikirləşir və təəccüb edirdim ki, heç adamın doğmaları onun haqqında belə xeyirxahlıqla düşünmür, nəinki nəsə etmək olsun.

Mehdi müəllimin diqqəti, qayğıkeşliyi qarşısında tərksilah olub:

- Ağsaqqalımsınız, Mehdi müəllim, necə deyirsiniz, elə də olsun, – dedim.

Nəsimi rayon və Bakı şəhər partiya komitələrində söhbətdən keçdikdən sonra nazir əmr verdi və 20 oktyabr 1970-ci ildə Nəsimi Rayon Xalq Maarif Şöbəsinin müdiri kimi fəaliyyətə başladım. Təxminən iki aya yaxın bir vaxtda məktəblər, məktəbəqədər və məktəbdənkənar müəssisələrin vəziyyəti ilə tanışlıq zamanı bir çox problemlərlə üzləşdim. Onları aradan qaldırmaq üçün müvafiq tədbirlər görmək lazım idi. Bu tədbirləri daha dürüst və mükəmməl hazırlayıb həyata keçirmək üçün Ağsaqqalın müdrik məsləhətlərinə ehtiyac duydum. Zəng etdim, məni qəbul etməsini xahiş etdim. Vaxt təyin etdi. Qəbula gələrkən əsəbləşir, hansı məsələdən başlamağı götür-qoy edirdim. Kabinetə daxil oldum, salamlaşmışdıq ki, Mehdi müəllim:

- Niyə belə təlaş keçirirsən, Arif!
- Rayon böyük, müəssisələr çox, problemlər isə həddindən artıqdır – dedim. Mehdi müəllim gülümsündü:
- Nə qədər bəşəriyyət mövcuddur, o qədər də onun problemləri olacaq. Bizim vəzifəmiz ondan ibarətdir ki, hərə öz səlahiyyətləri çərçivəsində onları vaxtında aşkar edib həllinə nail olsun, ölkəmizin inkişafına köməklik göstərsin.

Nazir məsləhət bildi ki, problemləri sistemə salım, maarif şöbəsinin, rayon icraiyyə və partiya komitələrinin, şəhər və respublika orqanları səviyyəsində həll olunası məsələləri dəqiqləşdirim, həlli yollarını müəyyənləşdirim.



Əvvəlcə nisbətən yüngül problemlərdən başlayım, tədricən təcrübə toplayım, sonradan digər problemlərin də həllinə nail olum.

- Birdən-birə ağır, həlli çətin olan problemlərdən başlama, büdrəyərsən, ruhdan düşərsən – dedi.

Mehdi müəllim pedaqoji kollektivlərlə, ictimaiyyətlə, rayon, şəhər, respublikanın müvafiq orqanları ilə işin təşkilinə dair xeyli məsləhətlər verdi, öz üzərimdə daha ciddi çalışmağımı tövsiyə etdi. Sağollaşdıq. Özümdə daxili bir rahatlıq hiss etdim, sanki mənə yeni bir qüvvə verilmişdi. Bu tövsiyələr bütün sonrakı fəaliyyətimdə mənə istiqamətverici, yolgöstərici bir mayaka çevrildi. Maarif müdiri işlədiyim dövrdə rayonumuzun iki dəfə respublikamızın keçmiş ən yüksək partiya və dövlət orqanlarının keçici qırmızı bayrağına layiq görülməyində, SSRİ Xalq Təsərrüfatının Nailiyyətləri sərgisinin iştirakçısı olmasında, rayonun 23 və 174 nömrəli məktəblərinin sərginin gümüş medalı ilə təltif olunmasında bu tövsiyələrin xüsusi əhəmiyyəti olmuşdur.

Mehdi müəllim əsl müəllim idi. Sadəliyi, səmimiliyi, təvazökarlığı, vicdanlığı, intizamlığı, təmizliyi, məğrurluğu, ciddiliyi ilə. "Müəllim" kəlməsi onun üçün ən müqəddəs kəlmə idi. Ona görə də hamı ona "Mehdi müəllim" deyə müraciət edirdi. "Professor", "Akademik", "Yoldaş" müraciətləri onu heç açmırdı. Yaxşı yadımdadır, 1976-cı il avqustun ilk günləri idi. Kollegiyada yeni dərs ilinə hazırlığın vəziyyəti müzakirə edilirdi. Çıxış etmək üçün söz alan maarif şöbə müdirlərdən biri çıxışını "Hörmətli akademik, hörmətli

kollegiya üzvləri!" – müraciəti ilə başladı. Mehdi müəllim dərhal çıxışçıya sakit, lakin ciddi iradını bildirdi, ona adı ilə müraciət etdi, "İşdən danış" – dedi. Çıxış əsnasında bir də "hörmətli professor!" deyərək müraciət edəndə, Mehdi müəllim sakitcə yerindən qalxıb, pəncərəyə tərəf baxmağa başladı.

Mehdi müəllim yüksək mədəniyyət və mənəviyyat təcəssümü idi. O, insan şəxsiyyətinə böyük hörmətlə yanaşırdı. Çünki özü əsl mənada şəxsiyyət idi. Onun bilavasitə və bilvasitə rəhbərliyi altında işlədiyim illərdə, ən gərgin hallarda belə səsini qaldırmasını, hətta günahkarın özünə də nəsə ağır bir söz deməsini görmədim, eşitmədim. Ən çətin hallarda belə o, təmkinini pozmazdı. Mehdi müəllim əsl insan, əsl alim-pedaqoq, gözəl rəhbər, müdrik ağsaqqal idi. V.Şekspirin sözləri və qəhrəmanı Hamletin dili ilə desək:

"O əsl insan idi,
Elə bir şəxsi,
Bir daha yəqin,
Heç görməyəcəm".

**"Təhsil və zaman" qəzeti,**
**14 yanvar, 2006-cı il**





# ƏSRƏ BƏRABƏR ÖMÜR

***FƏRRUX RÜSTƏMOV,***
*Pedaqogika üzrə elmlər doktoru,*
*professor, Beynəlxalq Pedaqoji Akademiyasının*
*həqiqi üzvü*

Azərbaycan xalq maarifinin təşkilatçılarından biri, ictimai-siyasi xadim, görkəmli pedaqogika nəzəriyyəçisi və tarixçisi, SSRİ PEA-nın həqiqi üzvü, Azərbaycan Respublikasının əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor ***Mehdi Məmməd oğlu Mehdizadə*** 1903-cü ildə yanvarın 5-də Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olmuşdur.

O, 1920-ci ilin noyabrında pedaqoji fəaliyyətə başlamış, doğma kəndlərində qiraət komasının müdiri vəzifəsində çalışaraq müxtəlif tədbirlər həyata keçirmiş, böyük həvəslə mədəni quruculuq işlərinə girişmişdir. 6 aylıq pedaqoji kursu bitirdikdən sonra birinci dərəcəli məktəbə müdir təyin olunmuş, 1923-cü ildə Bakıda üç aylıq ali pedaqoji kursda təhsil almış, sonra qəza xalq maarifi şöbəsinin icazəsi ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun hazırlıq kursunda oxumuş, imtahan verərək fizika-riyaziyyat fakültəsinə keçirilmişdir.

1930-cu ilin martında Azərbaycan Xalq Maarifi Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və xalq komissarının birinci müavini A.Sultanovanın köməkçisi vəzifəsində çalışmışdır.

O, 1931-ci ildən APİ-də pedaqoji fəaliyyətə başlamış, aspiranturada oxumaqla yanaşı, pedaqogika

tarixi, təlim və tərbiyə məsələlərinə aid məqalələrlə dövrü mətbuatda çıxış etmişdir.

Mehdi Məmmədzadə 1941-ci ildə ***"Azərbaycan məktəblərində ana dilində savad təliminin inkişafı tarixi"*** mövzusunda namizədlik, 1956-cı ildə isə ***"Azərbaycan sovet məktəbinin tarixi"*** mövzusunda doktorluq dissertasiyaları müdafiə edərək Azərbaycanda təkcə pedaqoji fikrin deyil, maarifin, ümumtəhsil məktəblərinin inkişaf tarixini tədqiq etmişdir. "XX əsrin böyük maarif korifeyi, canlı tarixi akademik Mehdi Mehdizadə Azərbaycanda pedaqogika elminin bünövrə daşını qoyanlardan biri olmaqla, həmin elm sarayının ucaldılmasında fəhlə, bənna, mühəndis kimi tər tökmüşdü" (prof. Yusif Talıbov).

Onun elmi-pedaqoji fəaliyyətinin 30 ili Azərbaycan Pedaqoji İnstitutu ilə bağlı olmuş, o, burada assisstent, dosent, professor, kafedra müdiri, dekan, elmi işlər üzrə direktor müavini, direktor (rektor) vəzifələrində çalışmışdır. 1952-54 və 1960-1980-ci illərdə maarif naziri olmuş, 1961-65-ci illərdə YUNESKO-nun Yaşlıların Təhsil İşləri üzrə Məsləhət Komitəsinin daimi üzvü olarkən sovet nümayəndə heyətinin tərkibində xarici ölkələrə getmiş, həmin dövrlərdə mədəni əlaqələr üzrə tədbirlərdə, YUNESKO konfranslarında iştirak etmişdir.

30-cu illərdən başlayaraq pedaqoji tədqiqatlarını sistemli davam etdirmiş, məktəb və pedaqoji fikir tarixinin, təlim-tərbiyə nəzəriyyəsinin koordinal problemləri ilə bağlı fundamental araşdırmalar aparmış, Moskvada hazırlanmış "Pedaqoji ensiklopediya"nın, "SSRİ xalqlarının məktəb və pedaqoji fikir tarixi oçerkləri" çoxcildlik əsərlərin əsas müəlliflərindən biri



olmuşdur. Onun yaxından iştirakı və müəllifliyi ilə hazırlanmış iki hissədən ibarət "Pedaqogika" kitabından (1941, 1958-59-cu illər) ali pedaqoji məktəblərdə və pedaqoji texnikumlarda uzun illər istifadə edilmişdir.

***"Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr"*** (Bakı, 1959; Moskva, 1962), ***"Məktəb quruculuğu sahəsində nailiyyətlərimiz"*** (1957), ***"Məktəbdə təlim-tərbiyə işlərinin yenidən qurulmasının bəzi məsələləri"*** (1961), ***"Orta məktəbdə şagirdlərin əmək tərbiyəsi haqqında"*** (1959), ***"Azərbaycan xalq maarifi yeni yüksəlişdə"*** (1967), ***"Müasir dərsə verilən tələblər"*** (1970), ***"Azərbaycan xalq maarifinin sürətli inkişafı"*** (T.Allahverdiyev və Q.Əliyevlə birgə, 1980), ***"Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları"*** (1982) adlı monoqrafiya və kitabları pedaqoji elm tarixində layiqli yer tutan əsərlər kimi tanınmışdır.

Alimin elmi-pedaqoji fəaliyyətində iki mühüm istiqamət başlıca yer tutur: *1) keçmişin pedaqoji irsinin öyrənilməsinə yaradıcı münasibət; 2) pedaqoji elmin nəzəri və metodoloji problemlərinin tədqiqi.*

Mehdi Mehdizadə tədqiqatlarında keçmişin tərəqqipərvər pedaqoji ideyaları ilə müasir pedaqoji elm arasındakı varislik əlaqəsini özünəməxsus şəkildə işləmiş, təlim və təhsil məsələləri ilə bağlı klassik pedaqoqların görüşlərini geniş tədqiq etmişdir.

O, monoqrafik əsərlərində Azərbaycan pedaqoji elmində təlim və tərbiyə nəzəriyyəsinin inkişafını diqqət mərkəzində saxlamış, Azərbaycan məktəblərinin əldə etdiyi qabaqcıl təcrübəni ümumiləşdirmiş, təlim prosesinin optimallaşdırılmasını və müasir şəraitdə onun

təşkilinin sistemini işləyib hazırlamışdır. Bundan əlavə, nəzəriyyə ilə təcrübəni üzvü şəkildə, dialektik vəhdətdə götürmüş, elmi-pedaqoji tədqiqatlarında ona bir prinsip kimi istinad etmişdir. Alimin təlim nəzəriyyəsinin inkişafı ilə bağlı (xüsusilə, dərs probleminin) özünəməxsus fikirləri, orijinal ideyaları vardır.

Onun ***"Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları"*** (Bakı, "Maarif", 1982) monoqrafiyası bu baxımdan yüksək qiymətləndirilən əsərlərdəndir. Orada məktəblilərin fəal həyat, idrak fəallığı, ictimai-siyasi və əmək fəallığı mövqelərinin formalaşdırılması, təlim metodlarının yeniləşdirilməsi yolları, təlim prosesinin tipləri, şagirdlərin müstəqil işi geniş şəkildə və yüksək elmi səviyyədə şərh olunmuş, həmin sahələr üzrə respublika məktəblərinin qabaqcıl iş təcrübəsi ümumiləşdirilmişdir.

Mehdi Mehdizadə elmi-pedaqoji kadrlar hazırlanması sahəsində də böyük fəaliyyət göstərmiş, onlarla aspirant və dissertanta rəhbərlik etmiş, opponent olmuş, yaxud da rəy yazmaqla xeyir-dua vermişdir.

Akademik Mehdi Mehdizadə 23 il Azərbaycan maarifinə rəhbərlik etmişdir.

Akademik Mehdi Mehdizadənin zəngin və çoxşaxəli elmi-pedaqoji fəaliyyəti ADPU-nun İbtidai təhsilin pedaqogikası kafedrasının baş müəllimi Ramiz Əliyev tərəfindən namizədlik dissertasiyası səviyyəsində araşdırılmışdır. 1998-ci ildə nəşr olunmuş ***"Akademik Mehdi Mehdizadə ömrünün işığı"*** (tərtibçilər: V.Xəlilov, H.Musayev) kitabı Mehdi Mehdizadə elmi ideyalarının şərhinə, bu böyük insanın həyatının bəzi məqamlarının açıqlanmasına, heyrətamiz cəhətlərinin üzə çıxarılmasına



həsr olunan bir əsər kimi maraq doğurur. Xoş məramlı, diqqətəlayiq bir işin başlanmasından xəbər verir.

Bütün bunlar dəryadan damlanı xatırladır...Bu sahədə hələ çox iş görülməlidir.

***"Qarabağa aparan yol" qəzeti,***
***12 sentyabr, 2009***



## AZƏRBAYCAN MAARİFİNİN BAYRAQDARI

***"Günay" qəzetinin 13 aprel 2002-ci il tarixli nömrəsində Azərbaycan və rus dillərində verilmiş xüsusi səhifə***

*Açığını deyək ki, "Bizim yaddaş" rubrikasında haqqında söhbət açmaq istədiyimiz növbəti tanınmış şəxsiyyətin – akademik Mehdi Mehdizadənin anket məlumatlarını olduğu kimi dərc etməyə imkan tapmadıq. Çünki XX əsr Azərbaycan maarifinin canlı salnaməsi sayılan bu böyük alimin, əvəzsiz pedaqoqun, gözəl insanın həyat və fəaliyyəti barədə təkcə statistik məlumatların özünü bu rubrika üçün ayrılmış bir səhifəyə yerləşdirmək mümkün deyil. Əslinə qalanda onu yaşlı və orta nəslə ətraflı təqdim etməyə heç ehtiyac da yoxdur. Mehdi müəllimin yüzlərlə yetirmələrindən biri, professor Zahid Qaralovun təbirincə desək, Azərbaycan təhsil sisteminin bayraqdarı və ilk qurucularından olan M.Mehdizadə XX əsrin maarif korifeyi kimi yaddaşlara əbədi həkk olunub. Bu mənada onu geniş təqdim etməyə ehtiyac olmasa da, hər halda ənənəmizə sadiq qalaraq, eyni zamanda indiki nəslin bu böyük şəxsiyyət haqqında məlumat əldə etməsinə kömək etmək məqsədilə mərhum Mehdi müəllimin həyatı və fəaliyyəti haqqında bir neçə kəlmə yazmağa lüzum görürük.*

*Mehdi Məmməd oğlu Mehdizadə 1903-cü il yanvar ayının 5-də o vaxtkı Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olmuşdur. 1919-cu ildə kənd ibtidai məktəbini bitirən Mehdi Mehdizadənin doğma kənddə*



*1921-ci ildə başlanan pedaqoji fəaliyyəti maarif sahəsində vəzifələrin ilk pilləsi sayılan müəllimlikdən tutmuş ən uca pilləyə kimi – nazir vəzifəsinə qədər gedib çıxmışdır. Təxminən 63 illik dövrü əhatə edən elmi və pedaqoji fəaliyyətinə xalq arasında savad, xeyirxahlıq toxumu səpən sıravi müəllim kimi başlasa da, sonralar elmlər doktoru, professor, daha sonra akademik elmi titullarına sahib olmuş, 25 ilə yaxın bir müddətdə Azərbaycanın Maarif naziri vəzifəsini vicdanla, çox güman ki, bundan sonra heç kəsin təkrar edə bilməyəcəyi yüksək professionallıqla yerinə yetirmişdir. O, 1967-ci ildə müttəfiq respublikaların maarif nazirləri arasında birinci olaraq SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü seçilmiş, uzun müddət YUNESKO-nun təhsil üzrə komitələrindən birinin üzvü kimi inkişaf etməkdə olan dünya ölkələrində xalq, təhsil quruculuğu təcrübəsinin yayılmasında fəal iştirak etmişdir. Günü bu gün də təhsil sistemi işçilərinin ən qiymətli stolüstü kitabına çevrilmiş 20-dən çox kitabın, 200-dən çox monoqrafiyanın, 500-dən artıq məqalənin müəllifi olan M.Mehdizadənin əsərləri dəfələrlə rus, ingilis, fransız, ispan, ərəb və digər dünya xalqlarının dillərində çap olunmuşdur. O, dəfələrlə BMT və YUNESKO-nun birgə təşkil etdikləri elmi məclislərdə SSRİ pedaqoqlarının müxtəlif səviyyəli tədbirlərində elmi-metodik məruzələrlə çıxış etmiş, çoxşaxəli elmi və pedaqoji fikirləri, təklifləri ilə dünyanın aparıcı ölkələrinin, o cümlədən keçmiş SSRİ-nin tədqiqatçı alimlərini heyran qoymuşdur. Bəlkə də bu günün prizmasından baxdıqda həmin uğurlar kiməsə asan görünə bilər. Lakin Mehdi müəllimin həyat və fəaliyyətinə o dövrün prizmasından baxsaq, çox şey etiraf etməli olarıq. Etiraf etməli olarıq ki,*

*aşağıdan, xüsusilə, milli azlıqlardan gələn təşəbbüslərin saya salınmadığı "qırmızı imperiya" zamanında elmi və pedaqoji fəaliyyətin belə bir əlçatmaz zirvəsinə qalxmaq akademik M.Mehdizadədən başqa heç kəsə nəsib olası uğur deyildi. Onun haqqında XX əsrin nəhəng simalarının, tanınmış alim və ictimai xadimlərin xatirələrini dinlədikcə, oxuduqca (ona görə oxuduqca deyirik ki, onların bəziləri artıq həyatda yoxdur) gözlərimiz önündə yeni dövr Azərbaycan maarifinin qurucusu, su kimi saf, büllur şəxsiyyətin, böyük alimin, görkəmli pedaqoqun parlaq və unudulmaz siması canlanır. Bu gün də aktuallığını itirməyən, şübhəsiz sabah da itirməyəcək bu xatirələrin müəllifləri peşə və ixtisasca başqa-başqa qütblərdə dayansalar da, onların hamısı bir məktəbin - əsasını Mehdi müəllimin qoyub inkişaf etdirdiyi Azərbaycan təhsil sisteminin bulağından su içib pərvazlanmış insanlardır. Bu xatirələr içərisində başqa millətlərin nümayəndələrindən olan alimlərin, ictimai xadimlərin fikirləri olduqca maraqlıdır. Onun haqqında xatirələr o qədər çox, o qədər rəngarəngdir ki, adam eşitdikcə eşitmək, oxuduqca oxumaq istəyir.*

**"Akademik Mehdi Məmməd oğlu Mehdizadə pedaqogika elminin korifeylərindən biri, maarif quruculuğunun görkəmli təşkilatçısı kimi tanınmışdır".**

Yazıya M.Mehdizadənin birbaşa rəhbəri sayılan, akademik, keçmiş SSRİ Maarif Naziri M.A.Prokofyevin bu fikirləri ilə başlamağımız təsadüfi deyil. Sovet idarəetmə sisteminə az-çox bələd olanlar yaxşı bilirlər ki, o dövrdə SSRİ miqyaslı bir nazirin öz tabeliyində olan



"əyalət səviyyəli" nazir haqqında belə yüksək fikir söyləməsi nadir hadisə sayılırdı. Əksinə o dövrün yazılmamış qanunlarına əsasən, aşağı çinli məmurlar yeri gəldi-gəlmədi, layiq oldu-olmadı özlərindən yuxarıda duranları mədh edərdilər. Mehdi müəllim bəlkə də yeganə nazir, yeganə ictimai xadim idi ki, onun haqqında milliyətindən, titulundan asılı olmayaraq, hamı hörmətlə, məhəbbətlə, ehtiramla danışar, layiq olduğu qiyməti vermək üçün sovet leksikonuna daxil olan bütün epitetləri işlətməkdən çəkinməzdilər.

Onun həyat və fəaliyyətinə yaxından bələd olanlar yaxşı bilirlər ki, M.Mehdizadə sıravi müəllimlikdən nazir vəzifəsinədək bütün pillələri səbrlə, dözümlə, böyük əzimkarlıqla keçmişdir. Şahidlərin söylədiklərinə görə, o, yüksək mədəniyyəti, nəzakətli davranışı, dərin biliyi, incə yumoru, cazibədar ciddiliyi ilə müttəfiq respublikaların maarif nazirlərini sanki ovsunlayırmış. Onun yetirməsi pedaqoji elmlər namizədi, dosent Gülmirzə Əliyev bununla bağlı belə bir epizod xatırlayır:

**- Moskvada ezamiyyətdə olan Qırğızıstan Elmi-Tədqiqat Pedaqogika İnstitutunun direktoru, akademik Əziz İzmaylovla qonşu otaqda qalırdım. Axşamlar oturub müxtəlif mövzularda söhbət edərdik. Bir dəfə akademik belə dedi: - Azərbaycanlılarla ona görə ünsiyyət maraqlı və xoşdur ki, sizin Mehdi müəllim kimi ağsaqqal aliminiz, naziriniz var. Bu fikrə yaxın və oxşar fikirləri mən dəfələrlə professor İ.V.Barannikov, V.V.İvanov, akademik V.Q.Kostamarov, A.Azimov və başqalarından eşitmişəm.**

Azərbaycan Respublikası Pedaqoji Cəmiyyətinin sədri Nurəddin Kazımovun da onun keçmiş SSRİ məkanında böyük hörmət və nüfuz sahibi olması haqqında maraqlı xatirələri var. Nurəddin müəllim belə nəql edir:

**- Moskvada iştirakçı olduğum bir müşavirədən sonra banket verilirdi. Masabəyi seçmək məqamı gələndə iştirakçılar bir səslə "Mexti!", "Mexti!" deyə təkid edəndə qəlbim iftixar hissi ilə döyündü.**

*"Akademik M.Mehdizadə çox nadir istedada malik alim, müdrik el ağsaqqalı kimi SSRİ Pedaqoji Elmlər Akademiyası Rəyasət Heyətində, Akademiyanın həqiqi və müxbir üzvləri arasında böyük nüfuza malik idi."*

Bu fikirlər isə akademik, keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyasının vitse-prezidenti A.G.Xripkovaya məxsusdur. Təbii ki, nüfuz asanlıqla qazanılmır. Professor Nurəddin Kazımov xatırlayır:

**- Mən onun rəhbərliyi altında keçən kollegiya iclaslarında, müşavirələrdə çox olmuşam. Xeyli mübahisə və münaqişələrin şahidiyəm. Lakin belə hallarda bir dəfə də olsun əsəbi danışdığını, səsini qaldırdığını, artıq hərəkətə və yersiz sözlərə yol verdiyini görməmişəm. Onun daxilən narazı qaldığını və əsəbilik keçirdiyini zahirən bircə əlamətdən seçmək olurdu: eynəyini gözlərinin üstündən götürər, dəsmalı cibindən çıxarıb onu ehmalca silər və daha astadan danışardı. Təhsillə əlaqədar qaldırılan məsələlər haqqında bütün fikirləri axıradək diqqətlə dinləmək, öz münasibətini bildirmək, ən başlıcası onların həllini axıra çatdırmaq bir rəhbər kimi M.Mehdizadənin şəxsiyyətini səciyyələndirən başlıca xüsusiyyət idi. Mən bu keyfiyyəti Mehdizadədən sonra gələn heç bir nazirdə görməmişəm.**



Onu tanıyanların dediklərinə görə M.Mehdizadənin yalnız özünə xas olan keyfiyyətlərindən biri də insanlara əsl psixoloq kimi yanaşması, onlarda olan müsbət cəhətləri aşkar edib qiymətləndirməsi idi. O, pedaqoji fəaliyyət sahəsini seçən gənclərə xüsusi qayğı və diqqət göstərər, onların ilk addımlarında büdrəməmələri üçün əlindən gələni əsirgəməzmiş. Akademikin bu keyfiyyətlərini özünə münasibətdə daim hiss etmiş təcrübəli pedaqoq-alim, professor, respublikanın əməkdar müəllimi, Milli Məclisin regional məsələlər daimi, komissiyasının sədri Zahid Qaralov onu belə xatırlayır:

**- İlk dəfə Mehdi müəllimi 1952-1956-cı illərdə APİ-də təhsil alarkən görmüşdüm. Sonradan tale elə gətirdi ki, onunla bir sahədə çalışmalı oldum. Mehdi müəllim həqiqətən gözəl insan, böyük alim, mislibərabəri olmayan maarif naziri idi. Bir-birinin ardınca verdiyi 6 ərizədən sonra özünün təkidli istəyi ilə nazir vəzifəsindən istefaya çıxdıqdan sonra da milli pedaqogika elmimizin inkişafı naminə daha həvəslə, daha səylə çalışmaqda davam edirdi. Pensiyaya çıxdıqdan sonra rəhbər təşkilatlardan ona mənim başçılıq etdiyim Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun direktoru vəzifəsi təklif olunmuşdu. Lakin o, bu təklifi qəbul etməmiş, "mən yaradıcılıq planlarımı daha sərbəst həyata keçirmək niyyətindəyəm. Bir də ki, biz Zahid müəllimi bu vəzifəyə təzə təyin etmişik. İşin öhdəsindən layiqincə gəlir. Mən o institutda heç bir əmək haqqı almadan ictimai əsaslarla elmi məsləhətçi olmağı daha**

məqsədəmüvafiq sayıram", demişdi. Mən istər o zamanlar, istərsə də indi Azərbaycan cəmiyyətində ikinci belə bir geniş qəlbli insana rast gəlməyin mümkünlüyünü təsəvvür edə bilmirəm. Mehdi müəllim sözün əsl mənasında Azərbaycan maarifinin bayraqdarı idi.

Bu məsələ ilə bağlı o zamanlar Azərbaycan KP MK-nın katibi işləmiş, professor Ramiz Məmmədzadənin də fikirləri maraqlıdır:

- 1976-cı ildə Moskvadan Bakıya qayıdıb Mərkəzi Komitəyə ideoloji işlər üzrə katib seçilmişdim. Üçüncü gün idi ki, işləyirdim. Mehdi müəllim mənə zəng vurub qəbuluma gəlmək istədiyini bildirdi. Dərhal razılıq verdim. Görüşüb salamlaşdıqdan sonra o, işdən getmək arzusunda olmduğunu bildirdi və ərizəsini təqdim etdi. Mən cavabında dedim ki, katib seçilməyimi gözləyirdiniz? Bilmirsinizmi ki, nazirləri ərizə ilə təyin və azad etmirlər?

Yadımdadır, M.Mehdizadənin sifətində bir nigarançılıq hissi duyulurdu. Mənə elə gəldi ki, onun utanaraq demədiyi sözlər mənim cavanlığıma, çox şeyləri bilməməyimə işarə idi. Cavabı isə belə oldu: "Hələ çox şey biləcək, eşidəcəksiniz". Bu hadisədən sonra mən işlədiyim dövrdə, həqiqətən, onu əvəz edə biləcək maarifi onun qədər bilən, müəllim şəxsiyyətinə hörmət edən, ancaq ondan cavan, onu əvəz edəcək şəxsi tanımadığım üçün onun əvəz olunmasının əleyhinə oldum və şöbə tərəfindən verilən namizədləri geri qaytardım. Həmin namizədlərin bəziləri məndən sonra təyin olundular, ancaq özlərini doğrultmadılar. O zaman dərk etdim ki, M.Mehdizadənin böyüklüyü,



maarifi dərindən bilməsi, məktəbin, müəllimin mənafeyini müdafiə etməsi bəzilərinin xoşuna gəlmir. Onu sıradan çıxarmağa, yeni fikirli, müasir bir naziri aradan götürməyə çalışırdılar. Sonralar onlar istədiklərinə nail oldular. Maarifimiz isə bundan çox şey itirdi.

Biz isə o fikirdəyik ki, Mehdi müəllimdən sonra itirən təkcə maarifimiz olmadı. Ondan sonra çox şeyi – insanlara qayğını da, himayəni də, arxa-dayaq olmağı da itirdik. Əgər Mehdi müəllimin o vaxtkı alicənablığı, qayğıkeşliyi olmasaydı, yəqin ki, sonralar Azərbaycan siyasətində və ictimai fikrində Şıxəli Qurbanov kimi şəxsiyyət parlamazdı. Şıxəli Qurbanovla bağlı hadisəni Cəbrayıl rayon Təhsil Şöbəsinin inspektoru, Azərbaycanın qabaqcıl maarif xadimi Bahadır Mehdiyev belə xatırlayır:

- 50-ci illərdə V.İ.Lenin adına APİ-də baş vermiş bir əhvalatı indi də həyəcanla yada salıram. O vaxt Azərbaycan gənclərinin fəxri, öz istedadı və qabiliyyəti ilə hamını heyran qoyan, milli müstəqilliyimizin ilk qaranquşu olan Şıxəli Qurbanov (o, APİ-də komsomol komitəsinin katibi idi) "Molodej Azerbaydjana" qəzetində milli özünüdərk səpkisində bir məqalə ilə çıxış etmişdi. Bu, o vaxt üçün çox böyük risq, millətçilik sayılırdı. Söhbət böyüdü. İnstitutun açıq partiya iclasında məsləyə baxmalı oldular. O vaxt M.Mehdizadə maarif naziri vəzifəsinə irəli çəkilmişdi. Ancaq institutun partiya uçotundan çıxmadığı üçün heç kəsin gözləmədiyi halda iclas salonuna gəlib ilk sırada oturdu. "Natiqlər" bir-birini əvəz etdi. Ş.Qurbanov institut komsomol komitəsi katibliyindən, partiya bürosu üzvlüyündən azad edildi. Stalin adına

**təqaüddən məhrum olunması və partiyadan xaric edilməsi məsələləri də qaldırıldı. Bu zaman Mehdi müəllim gözlənilmədən ayağa qalxdı və sonuncu həlledici sözü dedi:**

**- Yoldaşlar, xahiş edirəm ki, bu cavan oğlana münasibətdə bir qədər xeyirxah olun, onu partiyadan xaric etməyin (o vaxt bu çox ağır cəza idi), mən respublikanın gələcəyini bu oğlanda görürəm – deyərək çıxıb getdi. Nə yaxşı ki, iclas Mehdi Mehdizadənin səsini-sözünü eşitdi. Sonralar Ş.Qurbanov məsul vəzifələrdə işlədi. Azərbaycan xalqının milli müstəqilliyinin ilk nəzəriyyəçisi - praktiki oldu.**

Məlum olduğu kimi, başqa sahələrdən fərqli olaraq təhsil sistemi daha çoxşaxəlidir. Elə bir şəhər, kənd, qəsəbə yoxdur ki, orda təhsil sistemində fəaliyyətin nəticələri güzgü kimi əsk olunmasın. Konkret desək, əgər maarif nazirliyində, şəhər və rayon maarif şöbələrində hər hansı əməkdaş qohumbazlıq, yerlibazlıq edirsə, rüşvət alırsa və digər sui-istifadə hallarına yol verirsə, onun əks-sədası təkcə ayrı-ayrı orqanlara deyil, sinif otaqlarındakı hər bir şagirdə də gəlib çatır. Bunun son nəticədə hansı fəsadlar verdiyini, cəmiyyətdə hansı əhval-ruhiyyə yaratdığını bu günkü acı təcrübəmizdən yaxşı bilirik. Təbii ki, rüşvətxorluq və digər neqativ hallar bu günün bəlası deyil. M.Mehdizadənin nazir olduğu dövrlərdə də belə hallar maarif sisteminə sirayət etmişdi. Lakin indikindən fərqli olaraq, o vaxtlar belə "əməliyyatlar" pərdə arxasında aparılırdı və Mehdizadənin təmiz adına heç bir kölgə salmaq gücündə deyildi. Professor Nurəddin Kazımov xatırlayır:



**- Söhbət gəzirdi ki, maarif şöbə müdiri vəzifəsi və digər vəzifələr satılır... İşin sonunda nazirin yanına getdim. O, məni görən kimi maraqla soruşdu:**

**- Xeyir ola, Nurəddin, belə bivaxt niyə gəlmisən?**

**Mən birbaşa mətkəbə keçdim:**

**- Mehdi müəllim, mən sizi yaxşı tanımasaydım, bəlkə də bu məsələ ürəyimdə qalardı... Mehdi müəllim, bir deyil, bir neçə dəfə eşitmişəm ki, rəhbər vəzifələrə adamlar irəli çəkiləndə nazirlikdə rüşvət alırlar.**

**O, bir müddət dinmədi, fikrə getdi. Və nəhayət dilləndi:**

**- Qəribədir Nurəddin, əmrə qol çəkən mən, bəs görəsən rüşvət alan kimdir?**

**Bir az fikrə gedəndən sonra əlavə etdi:**

**- Çalışaram ki, son dərəcə diqqətli olum.**

O, ömrü boyu bu məsələdə diqqətli idi və kiminsə yanında gözükölgəli olmadı və belə alçaldıcı hərəkətləri özünə yaxın buraxmadı. Pedaqoji elmlər doktoru, professor, respublikanın əməkdar müəllimi, mərhum Əziz Əfəndizadənin dili ilə desək, **"Mehdi müəllimin ən böyük silahı büllur kimi saflığı, təmizliyi idi".** Elə bu təmizlik, saflıq ömrü boyu haram tikə yeməmək onun hamının gözünün içinə dik baxmasına, vəzifəsindən, mövqeyindən asılı olmayaraq hər kəsin üzünə sözü şax deməsinə şərait yaradırdı. Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü Budaq Budaqov Mehdi müəllimin bu xarakterini belə xatırlayır:

**- Orta məktəblərdə təhsilin keyfiyyətinin get-gedə aşağı düşməsi onu məyus edirdi. Bir dəfə müşavirələrin birində Ali və orta ixtisas təhsili naziri Qurban Əliyev dedi ki, "bu il ali məktəblərə qəbul**

**olunan abituriyentlərin bilik səviyyəsi çox aşağı olub". Maarif naziri, akademik M.Mehdizadə isə ona cavabında belə dedi: "Aşağı biliyə malik olan həmin abituriyentlərə Sizin hazırladığınız ali təhsilli müəllimlər dərs deyiblər".**

Mehdi müəllim sözü üzə deməklə yanaşı bəzən nadan rəhbər işçilərin yersiz iradlarına, atmacalarına elə cavablar verərmiş ki, başa düşən üçün bu, ölümdən betər olarmış. Anlamayan üçün isə... Pedaqoji elmlər doktoru, mərhum professor Əliheydər Həşimovun xatirələrində oxuyuruq:

**- Bir dəfə rəhbər maarif işçiləri və orta məktəb müəllimlərinin iclası keçirildi. Əsas məruzə və çıxışlar qurtarandan sonra Azərbaycan KP MK-nın elm və məktəblər şöbəsinin müdirinə söz verildi. O, son dərəcə nəzakətsiz çıxışı ilə bütün müəllimləri təhqir etdi, onları qoyun, savadsız çoban və s. adlandırdı, yerdən cavab vermək istəyənlərin isə sözünü ağzında kəsdi.**

**Hamı pərt olmuşdu. Mehdi müəllimin də sifəti ağarmışdı. O, ayağa qalxıb zala müraciətlə bircə cümlə işlətdi: "Eşitdiklərinizi Mərkəzi Komitənin fikri kimi qəbul edin". Şöbə müdiri bu cümlənin sətiraltı mənasını başa düşmədiyi üçün elə bildi ki, nazir də ona haqq qazandırır. Müəllimlər isə düzgün dərk etdikləri üçün nazirdən razı qaldılar. Sətiraltı məna isə beləydi: "Buyurun, bu da MK işçilərinin səviyyəsi, mədəniyyəti və müəllimlərə verdiyi qiymət! Özünüz nəticə çıxarın".**

Amma nə qədər acınacaqlı olsa da, son məqamda nəticəni adi insanlar deyil, əllərində hüdudsuz səlahiyyət olan vəzifə sahibləri çıxarırdılar. Təbii ki, Mehdi müəllim



kimi təmizlik, paklıq mücəssəməsi olan mübariz insanlar belə o zamanlar Sovetlər İttifaqında, o cümlədən Azərbaycanda tüğyan edən rüşvətxorluğun, əliəyriliyin qarşısını almaqda aciz idilər. Bir vaxtlar maarif sahəsində rüşvətin olması ilə bağlı ona xəbərdarlıq edən dostu Nurəddin Kazımova **"çalışaram ki, son dərəcə diqqətli olum" demişdi.** Çox-çox sonralar – pensiyada olanda da orta məktəbdə oxuyan nəvəsinin məktəblərdə alış-verişin mövcudluğu barədə dediklərinə əvvəlcə inanmaq istəməmiş, şagird fikirlərini faktlarla əsaslandırdıqda isə dərindən köks ötürərək həmin axşam işdən qayıdan qızı Zemfira xanıma etiraf etmişdi: **"Mən həmişə məktəbin giriş qapısını görüb izləmişəm, sənin qızın isə məktəbin arxa qapısını mənə göstərdi".** Amma təəssüflənməyə dəyməzdi. Çünki ara-sıra təsadüf olunan bu kimi hadisələr Mehdi müəllimin Azərbaycan təhsilinə gətirdiyi yeniliklərlə müqayisədə elə bir əhəmiyyət kəsb edə bilməzdi.

*"Akademik Mehdi Mehdizadənin pedaqogika elminin, pedaqoq alimlərin inkişafında, formalaşmasında böyük zəhməti, mühüm rolu olmuşdur".*

Keçmiş SSRİ Elmlər Akademiyasının prezidenti, akademik M.İ.Kondakov bu fikri söyləyərkən həmkarının o vaxtlar pedaqoji ictimaiyyət tərəfindən rəğbətlə qarşılanan və ittifaq miqyasında çoxlarının stolüstü kitabına çevrilən "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" (1958), "Məktəbdə təlim-tərbiyə işinin yenidən qurulmasının bəzi məsələləri" (1961), "Azərbaycan xalq maarifi yeni yüksəlişdə" (1967), "Azərbaycanda xalq maarifinin sürətli inkişafı" (1980), "Ümumtəhsil məktəblərində təlim-tərbiyə proseslərinin

təkmilləşdirilməsi yolları" (1982-ci il) kimi və digər qiymətli tədqiqatlarını, Azərbaycan maarifində həyata keçirdiyi genişmiqyaslı islahatları nəzərdə tuturdu. Pedaqoji elmlər doktoru, professor Yəhya Kərimov xatırlayır:

**- M.Mehdizadə maarif naziri olduğu dövrdə yeni məktəblərin açılması, onların müasir avadanlıqlarla təchizi, təlim-tərbiyə prosesinin elmi əsaslar üzərində təşkili sahəsində böyük işlər görmüşdü. Partokratiyanın, amirliyin hökm sürdüyü şəraitdə belə məsul vəzifəyə Mehdi müəllim kimi layiqli kadrın seçilməsi onun pedaqogika elmini, təhsil sistemini nə qədər yaxşı bildiyini bir daha sübut edir. Mehdi müəllim rəsmi dövlət xadimi, məmur deyil, alim-nazir idi. Mən yalnız sonralar başqa nazirlərlə ünsiyyət zamanı Mehdizadəni düzgün qiymətləndirə bilmədiyimiz üçün xəcalət hissi keçirirdim.**

Belə fikirlər keçmiş ittifaq səviyyəsində tanınan məşhur Xaldan kənd orta məktəbinin direktoru, Azərbaycanın əməkdar müəllimi Zahid Şöyübovun da xatirələrində yer alır. Zahid müəllim Xaldan məktəbinin uğurlarını Mehdizadənin maarifə diqqət və qayğısının bariz nümunəsi kimi qiymətləndirirdi.

*"Akademik M.Mehdizadə müdrik insan, çox böyük nəzəriyyəçi, pedaqoq-alim və etibarlı məsləkdaş idi".*

Akademik, Gürcüstan Respublikasının əməkdar elm xadimi D.O.Lordkipanidzenin bu fikirlərinə mübaliğəsiz aşağıdakıları da əlavə etmək olar: Mehdi müəllim əsl vətənpərvər, gözəl ailə başçısı, sözün əsl mənasında vətəndaş idi. Bu kimi keyfiyyətlərini bizimlə söhbətində Mehdi müəllimin sədaqətli tələbələrindən olan



Azərbaycan Təhsil Problemləri İnstitutunun şöbə müdiri, pedaqoji elmlər doktoru, professor Vidadi Xəlilov belə səciyyələndirdi:

**- Elm, sənət-mədəniyyət aləminin başbilənlərindən bir çoxunun fikrincə, Üzeyir Hacıbəyov musiqidə, Səməd Vurğun poeziyada, Səttar Bəhlulzadə təsviri sənətdə kimdirsə, M.Mehdizadə də maarif-pedaqogika aləmində məhz həmin zirvəyə yüksəlmiş böyük alim, görkəmli şəxsiyyətdir.**

Mehdi müəllim elmi-pedaqoji fəaliyyətin, nazir kimi məsuliyyətli vəzifənin öhdəsindən layiqincə gəlməklə yanaşı, ailə qayğıları ilə daimi məşğul olmağa da vaxt tapırdı. Onun ocağında üç qız, bir oğlan böyüyüb. Hamısı da sonralar Mehdi müəllimə layiqli övlad olduqlarını elmi fəaliyyətləri, davranışları ilə sübut ediblər. Oğlu Rafiq texnika elmləri doktoru, professordur. Hazırda Rusiyada elmi fəaliyyətlə məşğuldur. Qızları – Elmira xanım riyaziyyat elmləri namizədi, Azərbaycan Neft Akademiyasının dosenti, Nailə xanım isə həmin təhsil ocağının baş müəllimidir. Pedaqoji elmlər namizədi Zemfira xanım isə Azərbaycanda qadın hərəkatının fəallarından sayılır. Hazırda o, Azərbaycan Qadın və İnkişaf Mərkəzinin vitse-prezidentidir.

Ailədə sonbeşiyin ata-ananın daha çox sevimlisi olduğunu hamı yaxşı bilir. Mehdizadə ailəsinin sonbeşiyi Zemfira xanımı da atası ilə təkcə övlad-valideyn münasibətləri deyil, həm də yoldaşlıq telləri birləşdirirdi. Biz onunla görüşüb bir-birindən maraqlı, bir-birindən təsirli xatirələrinə qulaq asdıqca buna bir daha əmin olduq. O, göz yaşlarını içində boğa-boğa danışırdı:

**- Atam çox mehriban, çox qayğıkeş bir insan idi. Ailədə heç kəs, heç vaxt onun dilindən acı söz eşitməmiş, səsini qaldırmasının şahidi olmamışdıq. Bu o demək deyildi ki, o bizim hansısa nöqsanımızı bağışlayırdı. Hər hansı bir problemlə bağlı fikrini o qədər təmkinlə, ciddiyyətlə çatdırırdı ki, adam istər-istəməz özünü yığışdırırdı. Şəxsən bir sonbeşik övlad kimi mənim xoşbəxtliyim onda idi ki, istər atamla, istərsə də anam Lətifə xanımla hər mövzunu sərbəst müzakirə edə bilirdim. Atam məni tez-tez özü ilə rəsmi görüşlərə, mədəni-kütləvi tədbirlərə, hətta futbol yarışlarına aparırdı. Artıq neçə illərdir ki, o, həyatda yoxdur. Ancaq inanın indinin özündə də atamın ruhu ilə bərabər adı da, nüfuzu da bizimlədir. Taleyin hökmünə bax ki, atam qışda dünyaya gəlmişdi ömrünün 82-ci baharının başlanğıcında – 1984-cü il may ayının 1-də əbədiyyətə qovuşdu. Mən işimlə əlaqədar tez-tez çadır şəhərciklərinə gedirəm. Açığını deyim ki, orada şəhərdən gələnləri o qədər də mehribanlıqla qarşılamırlar, hətta suallara belə cavab vermək istəmirlər. Amma elə ki, mənim soyadımı eşidir, Mehdizadənin qızı olduğumu bilirlər, bu zaman hər şey dəyişir. Hətta keçmiş müəllimlər gedib səliqəli geyinib geri qayıdırlar, atamla bağlı xatirələrini danışırlar. Mən bunu atamın ruhuna böyük ehtiram kimi qiymətləndirir, Mehdizadənin qızı olduğum üçün qürur hissi duyuram.**

Xoşbəxt o kəsdir ki, həyatda özündən sonra izi, sözü qalır. Azərbaycan maarifinin korifeyi Mehdi Mehdizadə məhz belə xoşbəxtlik zirvəsinə yüksələn nadir insanlardandır. Amma bir məsələ də var ki, tarix öz nadir





Sovet İttifaqı Kommunist Partiyası Mərkəzi Komitəsinin Baş katibi Leonid İliç Brejnevin Bakıya səfəri zamanı Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyevlə, Azərbaycan maarif naziri Mehdi Mehdizadə ilə birlikdə təhsil sərgisinə baxarkən (1970)



Sovet İttifaqı Kommunist Partiyası Mərkəzi Komitəsinin Baş katibi Leonid İliç Brejnevin Bakıya səfəri zamanı Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyevlə Respublikanın maarif naziri Mehdi Mehdizadə ilə birlikdə təhsil nailiyyətlərini əks etdirən sərgiyə baxarkən (1970)




Xalq maarifi naziri Mehdi Mehdizadə YUNESKO-nun iclasında (1960)




Xalq maarifi naziri Mehdi Mehdizadə YUNESKO-nun iclasında (1961)



Xalq maarifi naziri Mehdi Mehdizadə SSRİ nümayəndə heyətinin tərkibində YUNESKO-nun iclasında (1962)



Böyük Vətən müharibəsi veteranlarının Polşa Respublikasında qəbulu.
Soldan: Sovet İttifaqı Qəhrəmanı Aslan Vəzirov, sağda Mehdi Mehdizadə (1969)



Xalq maarifi naziri, akademik Mehdi Mehdizadə SSRİ PEdaqoji Elmlər Akademiyasının sessiyasının iştirakçıları arasında (1972)



Xalq maarifi naziri Mehdi Mehdizadə SSRİ Pedaqoji Elmlər Akademiyasının müxbir üzvü f.r.e.d. professor Abbasqulu Abbaszadənin anadan olmasının 60 illik yubiley təntənəsində (1967)



Pedaqoji elmlər doktoru, professor, Azərbaycanın əməkdar ali məktəb işçisi Hüseyn Əhmədov yubilyarı təbrik edərkən (yanvar, 1983)



Akademik Mehdi Mehdizadənin anadan olmasının 80, elmi-pedaqoji fəaliyyətinin 60 illiyinə həsr olunan yubiley yığıncağında. Soldan: pofessor Aben Kərimoa, p.e.n. Vidadi Xəlilov, professor Qulam Məmmədov, professor Nurəddin Kazımov, maarif naziri Elmira Qafarova, nazirliyin şöbə müdiri Elmira Əliyeva, professor Sabir Şəfiyev və başqaları (1983)



Akademik Mehdi Mehdizadənin anadan olmasının 80, elmi-pedaqoji fəaliyyətinin 60 illiyinə həsr olunan yubiley yığıncağı. Soldan: Maarif nazirinin müavini Əfsun Əfəndiyev, Respublika Nazirlər Sovetinin məsul işçisi Hasil Əliyev, Azərbaycan KP MK-nın təlimatçısı Əlimirzə Əhmədov, SSRİ Ali Sovetinin deputatı Aliyə Təhmasib, «Azərbaycan məktəbi» jurnalının baş redaktoru Zəhra Əliyeva



Akademik Mehdi Mehdizadənin anadan olmasının 80, elmi-pedaqoji fəaliyyətinin 60 illiyi münasibətilə keçirilən yubiley yığıncağının keçirildiyi salondan görünüş (yanvar, 1983)



Azərbaycan Respublikası Pedaqoji Cəmiyyətinin sədri, pedaqoji elmlər doktoru, professor, əməkdar elm xadimi Nurəddin Kazımov akademik Mehdi Mehdizadənin anadan olmasının 90 illiyinə həsr olunan və Azərbaycan Dövlət Pedaqoji Universitetində keçirilən yubiley yığıncağını açarkən. Soldan: Pedaqoji Universitetin rektoru, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü Sərvər Aslanov, xalq təhsili naziri Firudin Cəlilov, universitetin prorektoru Nizami Xudiyev, «Azərbaycan məktəbi» jurnalının baş redaktoru Zəhra Əliyeva, professor Vidadi Xəlilov, M.Mehdizadənin həyat yoldaşı Lətifə Mehdizadə, akademik, Sosialist Əməyi Qəhrəmanı İsmayıl İbrahimov



Yubiley yığıncağının keçirildiyi salondan görünüş (yanvar, 1993). Soldan: Akademik Fuad Qasımzadə, dosent Mələk Qasımzadə, professor Ramiz Məmmədzadə, dosentlər Azər Hüseynov, Tağı Xalisbəyli, professor Sabir Fətiyev, professor Xəlil Fətəliyev, akademik Budaq Budaqov, professor Yəhya Kərimov və başqaları.




Akademik Mehdi Mehdizadənin Beyləqan şəhərində qoyulmuş abidəsi. Müəllif Azərbaycanın xalq rəssamı İbrahim Zeynalovdur.



Mehdi Mehdizadə ailə üzvləri arasında (1954)



Xalq maarifi naziri Mehdi Mehdizadə Bolqarıstan Xalq Respublikası maarif nazirliyi nümayəndələrini qəbul edərkən (Bakı, 1972)



Xalq maarifi naziri Mehdi Mehdizadə Qazax rayonu Baş Salahlı kənd orta məktəbinin 100 illik yubiley mərasimində (1975)



Xalq maarifi naziri Mehdi Mehdizadə Ümumittifaq ali məktəb, elmi idarə və maarif işçiləri Həmkarlar İttifaqı 8-ci qurultayının Azərbaycandan olan nümayəndələri arasında (Moskva. 1977)



Azərbaycan Elmi Tədqiqat Pedaqoji Elmlər İnstitutunun direktoru Zahid Qaralov estetik tərbiyə probleminə həsr olunan respublika elmi-praktik konfransını açarkən.

Soldan: estetik tərbiyə şöbəsinin müdiri Vidadi Xəlilov və akademik Mehdi Mehdizadə (1982)



Akademik Mehdi Mehdizadə estetik tərbiyə probleminə həsr olunmuş respublika elmi-praktik konfransının iştirakçıları arasında (1982)



Azərbaycan Elmi Tədqiqat Pedaqoji Elmlər İnstitutunun direktoru Zahid Qaralov SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycanın əməkdar elm xadimi Mehdi Mehdizadənin anadan olmasının 80, elmi pedaqoji fəaliyyətinin 60 illiyinə həsr olunan yubiley yığıncağını açarkən (yanvar, 1983)



Azərbaycan Respublikasının maarif naziri Elmira Qafarova yubilyarı təbrik edərkən (yanvar, 1983)



«Azərbaycan məktəbi» jurnalının baş redaktoru Zəhra Əliyeva yubilyarı təbrik edərkən (yanvar,1983)

övladlarının qiymətini verməkdə həmişə gecikir. Öz xalqına, dövlətinə ömrü boyu sədaqətlə xidmət edən nəhəng elm xadimi, istedadlı pedaqoq, obyektiv düşüncəli, xeyirxah qayəli, yüksək keyfiyyətlərə malik nazir kimi tanınıb sevilən Mehdi Mehdizadənin müqəddəs ruhu bu gün daha çox hörmət və ehtirama layiqdir. Doğrudur, M.Mehdizadənin xatirəsini əbədiləşdirmək üçün bir sıra tədbirlər həyata keçirilmişdir. Bakı şəhərində onun adına küçə vardır. Beyləqan şəhərindəki 3 saylı məktəbə onun adı verilmiş və büstü qoyulmuşdur. Azərbaycan Uşaq Fondu Akademik Mehdizadə adına istedad təqaüdü təsis etmişdir. Hesab edirik ki, müasir Azərbaycan təhsilinin ilk qurucularından biri olan akademik Mehdi Mehdizadənin xalqımıza göstərdiyi nəhəng xidmətlərin müqabilində bütün bunlar qənaətbəxş sayıla bilməz. Qarşıdan Mehdi Mehdizadənin anadan olmasının 100 illik yubileyi gəlir. Heç olmasa bu tarixi hadisəni Mehdi müəllimin adına, ruhuna layiq qeyd etməklə onun misilsiz xidmətləri qarşısında öz borcumuzu az da olsa yerinə yetirmiş olarıq...

**P.S.** Bu yazının ərsəyə gəlməsində bizə yaxından köməklik göstərmiş M.Mehdizadə irsinin yorulmaz tədqiqatçısı, gözəl insan və alim, professor Vidadi Cəmil oğlu Xəlilova dərin təşəkkürümüzü bildiririk.

***Əhməd Qurbanoğlu,***
***Ə.Əmiraslan.***
***"Günay", "Гюнай" qəzetləri,***
***13-19 aprel, 2002-ci il***

# AKADEMİK M.MEHDİZADƏ XATİRƏLƏRDƏ

*HƏMKARLARININ, SƏNƏT ADAMLARININ, YETİRMƏLƏRİNİN XATİRƏLƏRİ*



## LƏYAQƏTLİ NÜMUNƏ

***NURƏDDİN KAZIMOV,***
*Azərbaycan Respublikası*
*Pedaqoji Cəmiyyətinin sədri,*
*pedaqogika üzrə elmlər*
*doktoru, professor,*
*əməkdar elm xadimi,*
*prezident təqaüdçüsü*

Tanıyanların qəlbində yaşayan, xatirəsi həmişə əziz olan gözəl insan, akademik Mehdi Məmməd oğlu Mehdizadənin fəaliyyətində, onun şəxsiyyətində elə xüsusiyyətlər olmuşdur ki, onları bilməyimiz və işdə nəzərə almağımız yeni dövlət quruculuğuna xeyli fayda verə bilər.

M.Mehdizadə respublikamızın təkcə pedaqoji ictimaiyyəti arasında deyil, ümumiyyətlə, geniş ictimaiyyət arasında layiqli nüfuz qazanmışdı.

Respublikamızın tarixində ikinci elə bir şəxs olmamışdır ki, o, M.Mehdizadə kimi iyirmi ildən artıq nazir olsun, bu vəzifədən götürülsün və bir müddətdən sonra yenidən həmin vəzifəyə qaytarılsın. Özü də sovet imperiyası şəraitində!

Bunu təsadüfi hal hesab etmək olmaz. Burada ibrətamiz qanunauyğunluqlar vardır.

M.M.Mehdizadə maarif sahəsinə vəzifələrin ilk pilləsi sayılan adi müəllimlikdən tutmuş ən uca pilləsinə - nazir vəzifəsinə qədər bütün pillələri səbrlə, böyük

əzmkarlıqla keçmişdir və buna görə maarifin hər bir incəliklərinə bələd olan mahir bir maarif xadimi kimi yetişə bilmişdir, onun əmək fəaliyyəti başdan-başa maariflə sıx bağlı olmuşdur.

M.M.Mehdizadə çoxcəhətli maarifin əməli iş qayğıları çərçivəsində qapanıb qalmamışdır. O, gündəlik xırda görünən pedaqoji məsələlərdən geniş pedaqoji problemlər səviyyəsinə yüksələ bilmiş, pedaqoji sahədə əməli fəaliyyətini gərgin elmi tədqiqat işi ilə, nəzəri fəaliyyətlə bacarıqla uzlaşdırmışdır. Maarifin, təlim və tərbiyənin köklü problemlərinə aid yüzə qədər əsərin; monoqrafiyaların, kitab və kitabçaların, məqalələrin müəllifi kimi pedaqoji elmimizi zənginləşdirmiş, oxucularımızı sevindirmişdir. Nəticədə o, elmin zirvəsini də fəth edə bilmişdir. Əvvəlcə pedaqoji elmlər namizədi, sonra isə pedaqoji elmlər doktoru alimlik dərəcəsinə, nəhayət, professor və akademik elmi adlarına layiq görülmüşdür.

M.M.Mehdizadə gözəl bəşəri xüsusiyyətləri özündə cəmləşdirmişdir. El arasında məsəl var, deyərlər: “Alim olmaq asandır, insan olmaq çətin”. Mehdizadə bu çətinliyin öhdəsindən gəlmişdir. “Ağac bar gətirdikcə başını aşağı dikər” atalar sözləri Mehdizadənin şəxsiyyətində qabarıq ifadə olunmuşdur. O, həm vəzifədə və həm də elmdə yüksəldikcə, nüfuzu artdıqca sadəliyi və təvazökarlığı da bir o qədər güclənmişdir. Mən onun rəhbərliyi altında keçən kollegiya iclaslarında, müşavirələrdə çox olmuşam. Xeyli mübahisə və münaqişələrin şahidiyəm. Mehdizadənin əsəbi danışdığını, səsini qaldırdığını, artıq hərəkətlərə və yersiz sözlərə yol verdiyini görməmişəm. Daxilən narazı qaldığını və



əsəbilik keçirdiyini zahirən bircə əlamətdən sezmək olurdu; eynəyini gözlərinin üstündən götürər, yaylığı cibindən çıxarıb onu ehmalca silərdi və daha astadan danışardı. Onun qəbuluna əsəbi girən şikayətçinin narazı və əsəbi çıxdığını görməmişəm.

M.M.Mehdizadə işgüzar rəhbər idi. O, boş danışıqları, vəd verməyi, vaxtı hədər keçirməyi, məsələnin həllini uzatmağı sevməzdi. İşdə və sözdə dəqiq idi, intizamına söz olmazdı. Onunla təmasda olan şəxslər həmin keyfiyyətləri Mehdizadədə görür və zəruri nəticələr çıxarmalı olurdular.

Təhsillə əlaqədar qaldırılan məsələlər haqqında bütün fikirləri axıradək, səbrlə dinləmək, öz münasibətini bildirmək və ən başlıcası, onların həllini axıra çatdırmaq bir rəhbər kimi M.M.Mehdizadənin şəxsiyyətini səciyyələndirən başlıca xüsusiyyətlərə aid edilməlidir. Mən bu keyfiyyəti Mehdizadədən sonra gələn heç bir nazirdə görməmişəm.

Qohumbazlıq və yerlibazlıq M.M.Mehdizadənin xarakterinə yad olmuşdu. Qohumları ilə, yerliləri ilə əlaqədar məsələlərin yalnız qanun çərçivəsində həllini tələb edirdi. M.M.Mehdizadəni Azərbaycan xalqının gözündə ucaldan cəhətlərdən biri də onun vicdanlı, namuslu olmadı, rüşvətxorluğa qarşı barışmaz mövqe tutmasıdır. Onun halal zəhmətlə dolandığı hamının gözü qabağında idi. O, heç vaxt vəzifəsindən sui-istifadə etməmişdir: nazir olana qədər hansı mənzildə yaşamışdısa, nazir olanda da həmin namünasib mənzildə ömür sürmüşdür. Otaqlarında təmtəraqdan, bərbəzəkdən əsər-əlamət yox idi. Geniş yayılmış əşya xəstəliyi ondan uzaq

olmuşdur. Mən Mehdizadənin bağında da olmuşam. Orada da hər şey halal zəhmətdən xəbər verirdi.

M.M.Mehdizadə ilə açıq və səmimi yoldaşlıq söhbəti etmək, keçirdiyin hissləri, düşündüyün fikirləri onunla sərbəst bölüşmək mümkün idi. Yaxşı yadımdadır. Onun nazir olduğu son illər cəmiyyətimizdə baş alıb gedən rüşvətxorluq maarifə də sirayət etmişdi. Söhbət gəzirdi ki, maarif şöbə müdiri vəzifəsi və digər vəzifələr satılır... İşin sonunda nazirin yanına getdim. Məni qəbul etdi və maraqla soruşdu:

– Xeyir ola, Nurəddin, belə bivaxt?

O, elə bil mənim qeyri-adi sualımı duymuşdu. Bir baş mətləbə keçdim.

– Mehdi müəllim, məni bir məsələ çox narahat edir. Sizi kifayət qədər yaxşı tanımasaydım, bəlkə də, bu məsələ ürəyimdə qalardı. Sizinlə söhbət etməzdim... Mehdi müəllim, bir deyil, bir neçə dəfə eşitmişəm ki, rəhbər vəzifələrə adamlar irəli çəkiləndə nazirlikdə rüşvət alırlar.

O bir müddət dinmədi, fikrə getdi. Və nəhayət, dilləndi:

– Qəribədir, Nurəddin, əmrə qol çəkən mən, bəs, görəsən, rüşvəti alan kimdir?

O, yenə susdu, xəyala daldı və sonra məsələni açıq-aşkar dediyimə görə mənə minnətdarlığını bildirib fikrini belə yekunlaşdırdı:

– Çalışaram ki, son dərəcə diqqətli olum.

Bu söhbətdən çox keçmədi. Təəssüf ki, yaşına görə M.M.Mehdizadə təqaüdə göndərildi. O, çox gümrah idi, məncə, hələ səmərəli fəaliyyətini nazir kimi davam etdirərdi.



M.M.Mehdizadə bir şəxsiyyət kimi, bir nazir kimi təkcə Azərbaycanda deyil, keçmiş SSRİ-nin digər müttəfiq respublikalarında da sayılıb seçilirdi. O, öz yüksək mədəniyyəti, nəzakətli davranışı, dərin biliyi, incə yumoru, cazibədar ciddiliyi ilə, müttəfiq respublikaların maarif nazirlərini elə bil ovsunlamışdı. Hamısı onun fikri ilə hesablaşırdı. İştirakçısı olduğum bir müşavirədən sonra banket verildi. Masabəyi seçmək məqamı gələndə iştirakçılar bir səslə “Mexti, Mexti!” deyəndə mənim qəlbimdə baş qaldıran iftixar hissini təsəvvürə gətirmək çətin deyil.

M.M.Mehdizadə xarici ölkələrdə Azərbaycanı, hətta keçmiş SSRİ-ni dönə-dönə ləyaqətlə təmsil etmişdir. Onun Azərbaycanda təhsil məsələlərinə aid müxtəlif mövzularda məruzələri dinlənilmişdir. M.M.Mehdizadə hər dəfə xaricdə olarkən gözütoxluğu ilə fərqlənmiş, göz qamaşdıran əşyalara qətiyyən meyl göstərməmiş, Azərbaycan adını hər şeydən üstün tutmuşdur.

M.M.Mehdizadə nümunəvi ailə başçısı olmuşdur. O, işdə olduğu kimi, ailədə də öz tələbkarlığını şəxsiyyətə hörmətlə uzlaşdırmışdır. Öz uşaqlarını da Azərbaycan xalqına layiq olan övladlar kimi böyütmüşdür.

M.M.Mehdizadənin fəaliyyətində daha bir cəhət diqqəti cəlb edirdi. Rəsmi yığıncaqlarda, mətbuatda maarifin bu və ya digər cəhətləri tənqid edilirdi. Lakin Mehdizadənin şəxsiyyətində hansısa nöqsana, hansısa çatışmazlığa, hətta, işarə belə edildiyini görməmişəm, onun hansısa şəxsi keyfiyyətindən şikayət eşitməmişəm.

M.M.Mehdizadənin fəaliyyəti, onun şəxsiyyəti, ayrı-ayrı mənəvi keyfiyyətləri bizdən ötrü, xüsusən müasir rəhbər işçilər üçün örnək olmalıdır.

# BÖYÜK AĞSAQQALIMIZ – PEDAQOGİKA ELMİMİZİN GÜNƏŞİ İDİ

***ƏZİZ İZMAYLOV,***
*SSRİ PEA-nın və Qırğızıstan Elmlər Akademiyasının akademiki,*
*əməkdar elm xadimi*

Çox dəyərli, ləyaqətli ömür sürmüş SSRİ PEA-nın həqiqi üzvü Mehdi Məmməd oğlu Mehdizadə həmişə xatırlanan, sevilən insan idi. Doğma Azərbaycanda, habelə keçmiş SSRİ məkanında onu hədsiz məhəbbətlə sevir, böyük ehtiram göstərirdilər. Axı, başqa cür də ola bilməz. 60 ildən çox bir müddətdə maarifimizin, pedaqoji elmimizin inkişafı naminə yorulmadan böyük əzmkarlıqla çalışmaq hər insana müyəssər olmur. Akademik Mehdi Mehdizadə ilə davam edən dostluğumuz, yaradıcılıq əməkdaşlığı nəticəsində mənə bir daha aydın oldu ki, o, çox şərəfli bir ömür yolu keçmişdir. Xoşbəxtəm ki, bu böyük insanın sağlığında anadan olmasının 80, elmi-pedaqoji fəaliyyətinin 60 illiyi təntənəli qeyd olunarkən onun mənalı ömür yolunu əks etdirən "Alimin yubileyi" adlı məqalə ilə "Azərbaycan məktəbi" jurnalının 1983-cü il, 4-cü nömrəsində çıxış etdim. Söhbətlərimizdən aydın oldu ki, məqalə çox xoşuna gəlmişdi. Təşəkkürünü bildirdi. Ancaq onu da əlavə etdi ki, deyəsən mənim əməyimi çox şişirtmisən. Axı özünəməxsus sözü, deyim tərzi olan pedaqoq alimlərin bir çoxu həmin işləri görə bilər və görməlidirlər.



Mən yaxşı bilirdim ki, sadəlik, təvazökarlıq əziz dostum, məsləhətdaşım, Mehdi müəllimin qanındadır, canındadır. O, həmişə çalışırdı ki, nəzərə çarpmasın. "Mənəmlik" iddiası olanlardan çox zaman kənar gəzirdi. Mümkün qədər daha çox işləməyi, özü də lazımlı iş görməyi vacib sayırdı. Məhz buna görədir ki, onun şərəfli ömür yolunun əsas mərhələləri xalq maarifinin inkişafına həsr olunmuşdu.

Akademik, görkəmli elm-maarif xadimi M.Mehdizadə 20-ci illərdən başlayaraq savadsızlığın ləğvi, ümumi icbari ibtidai yeddillik, səkkizillik, orta təhsilin həyata keçirilməsi, təhsildə yeni məzmuna keçid, elmi-texniki tərəqqinin tələblərinə uyğun olaraq orijinal tədris proqramlarının yaradılması, məktəblərin, məktəbəqədər və məktəbdənkənar tərbiyə ocaqları şəbəkəsinin genişləndirilməsi, onların tədris-maddi bazasının müasir tələblər səviyyəsində möhkəmləndirilməsində geniş rol oynamışdır.

M.Mehdizadə müəllimlərlə aparılan metodik işi yaxşılaşdırmaq, müasir pedaqogika elminin və məktəb praktikasının nailiyyətlərinə cavab verən fəal təlim metodlarının məktəblərdə tətbiqi üçün orijinal tədbirlər həyata keçirmiş, bir çox qiymətli əsərlər yaratmışdır.

Bu gözəl insanda xalq maarifinin böyük təşkilatçısı məharəti ilə böyük alimin tükənməz, yaradıcı axtarışları son dərəcə uğurla uzlaşmışdı. Keçmiş Sovet İttifaqında milli respublikaların məktəb və pedaqoji fikir tarixinə aid ilk fundamental tədqiqatlar M.Mehdizadənin qələminə məxsusdur. O, 1959-cu ildə Azərbaycan dilində, 1962-ci ildə isə Moskvada rus dilində çap olunmuş "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" adlı

monoqrafiyası ilə pedaqogika elmini ilk zənginləşdirənlərdən biri olmuşdur. Hər bir respublika məktəbinin tarixi respublikanın, xalqın təkrarolunmaz tarixinin hissəsidir. M.Mehdizadə öz əsəri ilə hər şeydən əvvəl Azərbaycan Respublikası tarixinə böyük töhfə vermişdir. Bu fundamental əsərin ötəri icmalı müəllifin elmi axtarışlarının nə qədər geniş miqyasa malik olduğunu yaxşı göstərir. O, zəngin fakrik material əsasında respublikada xalq maarifinin inkişafının əsas mərhələlərini parlaq şəkildə şərh edir, xalq maarifi orqanlarının təşkilati cəhətdən möhkəmlənməsini, məktəbə ictimai yardımı, məktəb sisteminin xarakterini izləyir, proqramların, dərsliklərin məzmununu, təlim-tərbiyə işlərinin qoyuluşunu aydınlıqla açıb göstərir. O, habelə məktəb pioner, komsomol, şagird təşkilatlarının, Azərbaycanda ilk maarif müəssisələrinin fəaliyyətini xarakterizə etmişdir.

M.Mehdizadənin daha bir əsəri – "Azərbaycan xalq maarifinin çiçəklənməsi" adlı monoqrafiyası (Bakı, "Maarif" nəşriyyatı, 1980) haqqında da danışmaya bilmərəm, hər şeydən əvvəl müəllifin elmi axtarışlarının geniş diapazonu adamı heyran edir. Bu əsərdə o, müasir şəraitdə çox mühüm əhəmiyyətə malik geniş didaktik problemlər irəli sürür. Təhsilin yeni məzmununun dərin elmi pedaqoji təhlili, milli məktəblərdə rus dilinin tədrisi, dərsin təkmilləşdirilməsi və təlim metodlarının modernləşdirilməsi, məktəblilərin fəal həyat mövqeyinin formalaşdırılması, şagirdlərin əmək təlimi və tərbiyəsi, pedaqoji kadrlarının hazırlanması və ixtisasının artırılması – müəllifin bu əsərdə toxunduğu mühüm pedaqoji problemlərdir. Maraqlı cəhət budur ki, həmin problemlərin əksəriyyəti bilavasitə müəllifin rəhbərliyi altında və



yaxından iştirakı ilə aparılan pedaqoji eksperimentlərin, müşahidələrin, şagirdlərin bilik, bacarıq və vərdişlərini aşkara çıxarmaq məqsədilə yerinə yetirilmiş böyük miqdarda yoxlama və tədqiqat materiallarının təhlili əsasında şərh edilmişdir. Xüsusi qeyd etmək lazımdır ki, M.Mehdizadə heç bir pedaqoji yeniliyi mexaniki surətdə qəbul etməmişdir. Biz onun əsərlərində həmişə zehni fəaliyyətin mərhələlərlə formalaşdırılması nəzəriyyəsinə, problemli və proqramlaşdırılmış təlimə dair məhz onun özünəməxsus mülahizələrinə rast gəlirik.

Pedaqogikanın tarixi və nəzəriyyəsi sahəsində böyük alim kimi M.Mehdizadənin şöhrəti Azərbaycanın hüdudlarından çox-çox kənara yayılmışdır. O çox məhsuldar alim-pedaqoq kimi pedaqogika elminin inkişafına dəyərli töhfələr vermişdir. Təsadüfi deyildir ki, onun xidmətləri keçmiş SSRİ xalq maarifi sistemi rəhbərlərinin çıxışlarında xüsusi qeyd edilmişdir.

Akademik M.Mehdizadə haqlı olaraq Azərbaycan pedaqoji elminin ağsaqqalı hesab olunurdu. Onun rəhbərliyi və köməkliyi ilə bir çox alimlər doktorluq və namizədlik dissertasiyaları müdafiə etmişdir.

M.Mehdizadənin elmi-pedaqoji fəaliyyəti, onun böyük miqyaslı, ictimai-siyasi fəaliyyəti ilə sıx bağlı olmuşdur. O, respublikanın, habelə dünyanın bir çox ölkələrinin zəhmətkeşləri qarşısında geniş və müntəzəm sürətdə pedaqoji bilikləri təbliğ edən alim və ictimai xadim kimi tanınmışdır.

Maarif sahəsində beynəlxalq əlaqələrin inkişaf etdirilməsi işində geniş fəaliyyət göstərmiş M.Mehdizadə dörd il ərzində (1961-1964) YUNESKO-nun təhsil üzrə komitələrindən birinin üzvü olmuşdur. O zaman ittifaq və

respublika hökumətinin tapşırıqlarını yerinə yetirməklə əlaqədar sovet nümayəndə heyətinin tərkibində və təklikdə 14 dəfə xarici ölkələrdə (Polşa, Afrika ölkələri, Hollandiya, Fransa və s.) xidməti ezamiyyətdə olmuş, pedaqogika elmini və maarifi ləyaqətlə təmsil etmiş, pedaqoji ictimaiyyəti xalq maarifinin nailiyyətləri ilə ətraflı tanış etmişdir. SSRİ hökumətinin müşahidəçisi kimi iki dəfə Afrika ölkələri maarif nazirlərinin konfransında iştirak etmişdir. O, ittifaq əhəmiyyətli fərdi təqaüdə çıxandan sonra elmi-pedaqoji fəaliyyətini bir an belə dayandırmırdı. Mehdi müəllim böyük həvəslə, səylə işləyirdi. Arzuları, planları böyük idi. "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı iri həcmli monoqrafiyasını (Bakı, "Maarif" nəşriyyatı, 1982) çap etdirərək pedaqoji ictimaiyyətə töhfə vermişdir. "Məktəb və şagird şəxsiyyətinin hərtərəfli inkişaf etdirilməsi" monoqrafiyasını Azərbaycan və rus dillərində çapa hazırlamışdı.

Akademik Mehdi Mehdizadə sözün həqiqi mənasında pedaqogika elmimizin günəşi idi. Xatirələrimi məşhur Azərbaycan atalar sözü – "Hər oxuyan Molla Pənah Vaqif olmaz" – ilə bitirərək deyirəm:

– Əziz, unudulmaz Mehdi müəllim! Sən həmişə bizimləsən! Xatirən səni qəlbən sevən dostlarının, yetirmələrinin, qədirbilən xalqının qəlbində əbədi yaşayacaq. Ruhun şad olsun, böyük ustad! Qəbrin nurla dolsun!





# BƏNZƏRİ OLMAYAN BÖYÜK İNSAN

***ZAHİD QARALOV,***

*Pedaqogika üzrə elmlər doktoru, professor, Pedaqoji və Sosial Elmlər Akademiyasının akademiki, Azərbaycan Respublikasının əməkdar müəllimi*

Hər dəfə əziz müəllimimiz akademik Mehdi Məmməd oğlu Mehdizadənin xatirlayanda, istər-istəməz düşünürəm: Görünür təbiət, ilahi varlıq xalqa, Vətənə belə böyük, əvəzi olmayan insanları, nadir istedad sahiblərini, dühaları bəxş edərkən həmişə səxavətli olmur. Biz insanları ayıq-sayıq olmağa çağırır ki, belə şəxsiyyətləri sağlığında və dünyasını dəyişəndən sonra layiqincə qiymətləndirək, qədrini bilək.

İndiki və gələcək nəsillərə çox gözəl nümunə olan akademik M.M.Mehdizadə də belə şəxsiyyətlərdəndir. İlk dəfə Mehdi müəllimi 1952-1956-cı illərdə V.İ.Lenin adına APİ-də təhsil alarkən görmüşdüm. Elə o zaman qəti əmin olmuşdum ki, o qeyri-adi insan, əsl xalq adamıdır. Onunla ünsiyyətim hər an dəyərli və mənalı idi. Nuranilik, ağır-ağayanalılıq, yüksək dərəcədə mədənilik, hərtərəfli bilik, düşüncə tərzi onun yüksək mənəviyyatı ilə aşılanmışdı.

Mehdi müəllimi tələbəlik illərindən tanısam da, 1964-cü ildə V.İ.Lenin adına APİ-nin aspiranturasını bitirib, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər institutunda elmi fəaliyyətə başlayandan sonra onun maarifin, pedaqogika elmimizin inkişafındakı rolunu daha yaxından hiss etdim. İnstitutda əvvəl kiçik, baş elmi işçi,

şöbə müdiri, 1974-cü ildən elmi işlər üzrə direktor müavini, 1977-ci ildən isə direktor vəzifələrində çalışdığım və 1974-cü ildən ömrünün sonunadək ildə iki dəfə Moskvaya ezamiyyət zamanı yol yoldaşı olduğum illərdə tam qətiyyətlə əmin oldum ki, bu böyük insan ancaq bir amal, bir əqidə ilə yaşayır: respublikada bütün uğurlarımızın əsası üçün fundament rolunu oynayan xalq maarifini, xalq təhsili sistemini hər vasitə ilə işkişaf etdirmək, ən müasir tələblərə cavab verən elmi-pedaqoji təminat kompleksini yaratmaq.

Akademik M.Mehdizadə keçmiç SSRİ Maarif Nazirliyində və SSRİ Pedaqoji Elmlər Akademiyasında çox böyük nüfuza malik idi. Buna görə də əksər hallarda ən çətin, mübahisəli məsələləri həll etmək üçün onu yaradılan komissiyaya sədr təyin edir, onun sözünü, məsləhətini əsas götürürdülər.

Yaxşı yadımdadır, 1974-cü ildə SSRİ PEA-nın yekun iclasında iştirak etmək üçün Moskvaya ezam olunmuşduq. Bir gün həyəcanlı gəldi və dedi ki, məni pedaqoji fikir tarixi komissiyasının sədrliyindən psixologiya və defektologiya komissiyasının sədrliyinə keçirmək istəyirlər. Səbəbini soruşdum. Məlum oldu ki, həmin ixtisas üzrə akademiyaya 2 nəfər həqiqi üzv seçilməlidir. Buna baxmayaraq 11 nəfər ərizə verib. Buna görə də tam obyektivliyi təmin etmək üçün belə məsləhət görüblər. Yaxud başqa bir misal. SSRİ Maarif Nazirinin birinci müavini M.İ.Kondakovu SSRİ PEA-na prezident seçmək istəyirdilər. Lakin o hələ elmlər doktoru deyildi. Buna görə də məsləhət bildilər ki, doktorluq dissertasiyasının müdafiəsini sürətləndirsin. Bu ərəfədə o ancaq akademik M.Mehdizadənin opponentliyi ilə akademiyanın hər hansı



sahə institutunda deyil, özündə müdafiə etməyə razılıq verdi. Onu da əlavə etdi ki, Mehdi müəllim qədər ikinci obyektiv, ədalətli adam tanımır.

Bəli, Mehdi müəllim həqiqətən böyük insan, böyük alim, misli-bərabəri olmayan maarif naziri idi. Təsəvvür edin, onun nazir olduğu 25 ilə yaxın bir müddətdə elə bir hal olmayıb ki, verdiyi əmr, qəbul etdiyi qərar ləğv olunsun. Məncə öz işini mükəmməl bilən, böyük nüfuzu olan ikinci belə nazir olmayıb. M.Mehdizadə nazir kimi heç vaxt kabinet naziri olmayıb. Buna hamımız şahidik. Onun kabinetinin qapısı hər zaman açıq idi, xüsusilə, müəllimlər, alimlər üçün. İstənilən vaxt söhbət etmək olardı, özü də saatlarla. Yalnız Mərkəzi Komitədə, Nazirlər Sovetində olan iclaslar onu müəllimlərdən, məktəblərdən ayırardı. Əgər biz akademik M.Mehdizadənin xatirəsini əbədiləşdirmək, onun iş üslubu, elmi-nəzəri irsi əsasında pedaqogika elmimizi, maarifimizi inkişaf etdirmək istəyiriksə, onun zərrə-zərrə qurduğunu tələm-tələsik dağıda bilmərik. Buna bizim ixtiyarımız yoxdur.

Nazir-müəllim münasibətləri Mehdi müəllimin münasibətləri əsasında qurulmalıdır. Təhsil quruculuğu və müxtəlif səviyyəli münasibətlər – müəllim-müəllim, müəllim-məktəb rəhbəri münasibəti və s. diqqətlə araşdırılmalıdır. Mehdi müəllimin qoyub getdiyi irsi heç bir kitabdan öyrənə bilmərik. Onun klassik irsi nəzəriyyə ilə təcrübənin sıx vəhdətindən yaranıb. Biz bu irsi yaşatmağa, nəsillərdən-nəsillərə ötürməyə borcluyuq.

Mehdi müəllim öz ərizəsinə əsasən (bu onun 6-cı ərizəsi idi) 1980-ci ildə respublikanın Maarif Naziri vəzifəsindən təqaüdə çıxdıqdan sonra milli pedaqogika

elmimizin inkişafı naminə çox böyük həvəslə, daha səylə, var qüvvəsilə işləməyi qarşısına məqsəd qoymuşdu. Bu arada rəhbər təşkilatlarda ona Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Emlər İnstitutunun direktoru vəzifəsini icra etmək də təklif olunmuşdu. Lakin o hər dəfə belə təkliflərə əhəmiyyət verməmiş, "Mən yaradıcılıq planlarını daha sərbəst olaraq həyata keçirmək niyyətindəyəm. Bir də ki, biz Zahid müəllimi bu vəzifəyə təzə təyin etmişik, işin öhdəsindən layiqincə gəlir. Mən o institutda heç bir əmək haqqı almadan ictimai əsaslarla elmi məsləhətçi olmağı daha məqsədəmüvafiq sayıram" – demişdi.

Mehdi müəllim təqaüdə çıxdığı ilk aylardan institutla əlaqəni daha da qüvvətləndirdi. "Mühüm pedaqoji problemlər" üzrə Elmi-nəzəri seminara rəhbərlik etməyə başladı. Ayda bir dəfə keçirilən sistemli məşğələlər əslində respublikanın bütün pedaqoq alimləri, metodistləri və praktik müəllimləri üçün nəzərdə tutulmuşdu. Məşğələlərdə pedaqogika elminin ən aktual problemləri diqqət mərkəzinə gətirilirdi. Çox böyük fəallıq və işgüzar müzakirə şəraitində keçən həmin seminarın məşğələlərinə maraq günbəgün artırdı. Bu sahədə çalışan tədqiqatçılara lazımi istiqamət verilir, əməli kömək göstərilirdi. Böyüməkdə olan nəslin tərbiyəsi və təlimi ilə əlaqədar qarşısa duran vəzifələrin həlli yolları göstərilirdi.

Akademik M.Mehdizadə institutda elmi məsləhətçi işlədiyi illərdə qeyri-adi səmimiliyi, geniş biliyi, dünyagörüşü ilə əməkdaşların çox böyük rəğbətini qazanmışdı. O carı və perspektiv elmi-tədqiqat işləri mövzularının seçilməsində, problem dairəsində nəzəriyyə ilə təcrübənin üzvi şəkildə əlaqələndirilməsində, mövcud iş təcrübəsinin öyrənilib ümumiləşdirilməsində alimlərin-



elmi işçilərin yaxın köməkçisinə çevrilmişdi. Hər bir şöbə müdiri, elmi işçi ilə ayrı-ayrılıqda söhbət edir, çox dəyərli elmi istiqamət verirdi. Hamı bu müdrik insanın məsləhətlərindən razı qalırdı. Mehdi müəllim mənimlə də əlaqəni kəsmirdi. O, institutda olmadığı günlərdə də mənimlə telefon vasitəsilə hal-əhval tutur, bu və ya digər məsələlər barəsində çox dəyərli mülahizələrini söyləyirdi. O hər dəfə "Zahid, mən istəyirəm ki, filan məsələdə filan cəhəti də nəzərə alasınız... Zahid, filan problemə başlayarkən filan istiqamətlər də əsas götürülməlidir" və s. şəkildə müraciətində mənə olan böyük səmimiyyəti görürdüm. Nə qədər işləmək, yaratmaq həvəsi vardı bu insanda, ilahi!

2000-ci ilədək özünün və institutun ayrı-ayrı şöbələrində çalışan əməkdaşların aparacağı elmi-tədqiqat işlərinin əsas istiqamətlərini müəyyənləşdirmişdi. Arzuları çox böyük idi. Lakin amansız ölüm onların bir çoxunu həyata keçirməyə imkan vermədi. Hamımızın əzizi Mehdi müəllim 1984-cü il mayın 1-də dünyasını dəyişdi. Təskinliyimiz budur ki, o, bütün həyatı boyu öyrənilməyə layiq gözəl nümunə, klassik irs qoyub getdi. O, Vətənə, xalqa, onun maarifinə, qurub yaradan adamlarına dərin məhəbbət hissi ilə yaşayıb, geniş fəaliyyət göstərirdi. 60 ildən çox bir müddətdə tükənməz enerji, həmişə gənclik həvəsi ilə yorulmadan elmi-pedaqoji fəaliyyət göstərən Mehdi müəllim tutduğu işə məsuliyyəti, adamlara həssas münasibəti, qayğısı sayəsində ucalmış, onu tanıyanların qəlbində özünə möhkəm yer tutmuş, unudulmaz xatirə, şəxsi nümunə qoyub getmişdir.

M.Mehdizadə xalq maarifinin ilhamlı təşkilatçısı, pedaqogika elminin görkəmli nümayəndəsi, ictimai-siyasi

xadim, SSRİ PEA-nın təsisçilərindən biri və həqiqi üzvü, Əməkdar Elm Xadimi, pedaqoji elmlər doktoru, professor kimi tarixə düşmüşdür.

Görkəmli pedaqoq dərin biliyi, zəngin irsi, peşə səriştəliyi ilə keçmiş SSRİ və dünya miqyasında tanınmışdı. O, maarif üzrə beynəlxalq əlaqələrin inkişafında böyük işlər aparmışdır. 1961-1964-cü illərdə YUNESKO-nun təhsil komitələrindən birinin üzvü olmuşdur. O zaman ittifaq və respublika hökumətinin maarif məsələləri üzrə tapşırıqlarını yerinə yetirmək üçün sovet nümayəndə heyətinin tərkibində Polşada, Hollandiyada, Fransada, Afrikada və digər ölkələrdə olmuş, sovet pedaqoji elminin nailiyyətlərini məharətlə təbliğ etmiş və böyük nüfuz qazanmışdır.

Dövlət xadimi və ictimai xadim kimi geniş fəaliyyət göstərən M.Mehdizadə həm də 1930-cu ildən başladığı pedaqoji tədqiqatlardan bir an belə ayrılmamış, həmin işləri sistemlə davam etdirmiş, məhz bu cür aydın məqsəd, ardıcıl səyin, fəaliyyətin nəticəsində respublikamızda pedaqogika elminin formalaşmasına güclü təsir göstərmişdir. Onun respublikamızda məktəb quruculuğu, xalq maarifinin təşkili, təhsilin məzmunu, təlim metodlarının təkmilləşdirilməsi, tərbiyəvi işlərin səmərəliliyinin artırılması, xalq maarifini idarəetmə işinin yüksəldilməsi sahəsindəki tədqiqatları pedaqoji ictimaiyyət arasında geniş yayılmış, onların nəticələrinin tətbiqi isə məktəblərimizə böyük fayda vermişdir.

Mən dəfələrlə şahidi olmuşam ki, akademik M.Mehdizadənin çıxışları keçmiş SSRİ PEA-nın müşavirə və yığıncaqlarında, elmi şuralarında, respublika elmi praktik konfranslarında, xalq maarifi işçilərinin



müşavirələrində dərin məzmunu, elmiliyi, istiqamətvericiliyi ilə həmişə diqqəti cəlb etmişdir. Onun "Sovetskaya pedaqoqika", "Narodnoe obrazovanie", "Azərbaycan məktəbi" jurnallarında, müxtəlif toplularda dərc edilmiş məqalələri dəyəri, faydalılığı və müasirliyi ilə seçilmişdir.

M.Mehdizadənin son illərdə tamamladığı "Məktəb və məktəbli şəxsiyyətinin hərətərəfli inkişafı", "Azərbaycanda məktəb təhsilinin və pedaqoji fikrin inkişafı" adlı əsərləri də görkəmli pedaqoq alimlər tərəfindən yüksək qiymətləndirilmişdir.

Akademik M.Mehdizadənin həyatına, ömür yoluna, geniş pedaqoji fəaliyyətinə diqqətlə nəzər yetirdikdə görürük ki, o, həmişə, hər an səmərəli nəticə verən işlər görmüşdür. O, pedaqoji fəaliyyətin bütün sahələrində öz dəsti-xətti, səyi və təşəbbüskarlığı ilə diqqəti cəlb etmiş, xoş təəssürat oyatmışdır.

Müəllimliklə-alimlik onun şəxsiyyətində parlaq şəkildə nəzərə çarpmış, müntəzəm olaraq bir-birini çox gözəl tamamlamışdır.

Mehdi müəllimin elmi üslubu da çox aydın və cəlbedici idi. O, təlim və ümumtərbiyə prosesinin hər hansı sahəsinə müraciət edirdisə, orijinal fikir, mühakimə yürüdür, nəzəri və praktik cəhətdən çox böyük əhəmiyyət kəsb edən ümumiləşdirmələr aparırdı. Qələmə aldığı mövzunun, tədqiq etdiyi problemin tam mahiyyətini açmaq, özündən əvvəlki tədqiqatçıların bu məsələyə münasibətini aydın şəkildə ifadə etmək bacarığı Mehdi müəllimdə çox güclü idi.

Nəzəriyyənin-nəzəri fikirlərin təcrübə ilə üzvü şəkildə dialektik vəhdətdə verilməsi Mehdi müəllimin

elmi pedaqoji yaradıcılığına xas olan cəhətlərdəndir. Ancaq, quru, nəzəri müddəalar əsasında yazılan əsərlərin pedaqoji aləmdə çalışan praktik işçilərə gec çatdığını dönə-dönə qeyd edir, imkan daxilində bütün nəzəri məsələləri konkret iş təcrübəsi nümunələri ilə əlaqələndirməyi vacib sayırdı. Görünür, bu əqidə, bu mövqe ona, əsrin dörddə birinə qədər olan müddətdə respublikanın xalq maarifinə inamla rəhbərlik etməyə, onun beşiyi başında durmağa əsas vermişdir. O, respublikanın maarif naziri kimi çox mühüm dövlət əhəmiyyətli bir vəzifədə çalışarkən bir an belə qələmini yerə qoymamış, xalq maarifi quruculuğunun müxtəlif mərhələlərində təlim-tərbiyə prosesinin ən vacib problemlərini görkəmli alim, dövlət xadimi təfəkkürü ilə işıqlandırmış, konkret əməli yollar göstərmişdir. Maarif təşkilatçılığı ilə elmi yaradıcılıq onun ictimai-pedaqoji fəaliyyətində qoşa qanad, paralel istiqamət, inkişaf xəttləri kimi parlaq şəkildə nəzərə çarpmışdır.

Respublika xalq maarifinin müxtəlif pillələrində uzun müddət Mehdi müəllimlə bir yerdə çalışanlar, onu yaxından tanıyanlar yaxşı bilirlər və bu gün daha səmimi şəkildə etiraf edirlər ki, o, çox böyük şəxsiyyət, gözəl insan idi. Adamları – xüsusilə - dövləti idarə vəzifələri üzrə tabeçiliyində olan insanları, onların arzu və hisslərini tezcə duyub qiymətləndirməkdə, ağıllı nəticə çıxarıb, buna uyğun tədbir görməkdə Mehdi müəllimin tayı-bərabəri yox idi. Bəlkə də onun geniş ümumxalq məhəbbəti qazanmasının əsas səbəbi elə göstərdiyimiz cəhətlər, şəxsiyyət keyfiyyətləridir.

Akademik M.Mehdizadə alimliyi, insanlığı, müəllimliyi, inzibati işləri bir birilə çox məharətlə



əlaqələndirirdi. Respublikanın çoxsaylı müəllim ordusunun üzvləri bu böyük insanın, əvəzsiz maarif nazirinin xatirəsini indi də əziz tuturlar.

M.Mehdizadə yüksək ixtisaslı elmi pedaqoji kadrların hazırlanmasında da gərgin əmək sərf etmiş, əlindən gələni əsirgəməmişdir. Onun rəhbərliyi ilə neçə-neçə doktorluq və namizədlik dissertasiyaları müdafiə edilmişdir. Moskva, Tbilisi, Bakı və digər şəhərlərin elmi şuralarında müdafiə edilən onlarca namizədlik və doktorluq dissertasiyalarına rəsmi opponent olmuşdur.

Gənc, orta və yaşlı nəslə mənsub olan alimlərimiz onun ancaq özünəməxsus alimlik etikasını, məsləhətvermə qabiliyyətinin yüksək səviyyəsini indi də xatırlayır, elmi fəaliyyətlərində nəzərə alırlar. Hörmətli alim xalq maarifinin və pedaqoji elminin aktual məsələləri ilə əlaqədar çox mühüm əhəmiyyət kəsb edən tədbirlərin təşkilində və keçirilməsində fəal iştirak etmiş, məzmunlu mühazirələr oxumuş, SSRİ PEA-nın müxtəlif komissiyalarına bacarıqla rəhbərlik etmişdir.

Akademik M.Mehdizadə maarifimizin, elmimizin tarixində zəngin irs qoymuşdur. Məktəbşünaslıq, xalq maarifinin elmi əsaslarla idarə olunması sahəsində Mehdi müəllimin iş sistemini, respublikada xalq maarifinin inkişafı sahəsindəki geniş fəaliyyətini diqqətlə öyrənmək indiki şəraitdə çox zəruridir.

Didaktika-təlim nəzəriyyəsini zənginləşdirməkdə, xüsusilə dərs problemi – bütövlükdə təlimin təkmilləşdirilməsi ilə bağlı M.Mehdizadənin özünəməxsus fikirləri, orijinal ideyaları vardır. Onları diqqətlə öyrənib, ümumiləşdirmək, tədqiq etmək vacibdir.

Görkəmli alimin məktəblilərin şəxsiyyətinin hərtərəfli inkişafı, ideya-siyasi, ictimai-siyasi, fəallıq mövqeyinin formalaşdırılması ilə bağlı fikirlərinin, pedaqoji görüşlərinin sistemlə, ayrı-ayrı istiqamət sahələri üzrə tədqiqi, bunların kitab, kitabça və monoqrafiya şəklində çap olunub geniş pedaqoji ictimaiyyətə çatdırılması, pedaqoji elmimizin, maarifimizin inkişadı baxımından mühüm əhəmiyyət kəsb edər. Bir sözlə, akademik M.Mehdizadənin külli miqdarda əlyazmaları, əsərləri külliyyatı bütövlükdə nəşr olunaraq elmi-pedaqoji ictimaiyyətə çatdırılmalıdır.

Akademik M.Mehdizadənin həyatı və yaradıcılığı "Görkəmli elm adamları" silsiləsindən olan radio və televiziya verilişlərində, mətbuat səhifələrində, sənədli filmlərdə vətəndaşlıq hünəri, vətəndaşlıq borcu ilə geniş işıqlandırılmalıdır.

Həyatı, geniş elmi-pedaqoji fəaliyyəti, parlaq şəxsi nümunəsi ilə böyük bir məktəb yaradan gözəl, həssas insan Azərbaycan maarifinin bayraqdarlarından olan Mehdi müəllim buna çox layiqdir. Gərək unutmayaq ki, akademik M.Mehdizadə başa çatmaqda olan XX əsrin canlı maarif tarixi, maarif korifeyi kimi yaddaşlara ədəbi həkk olunmuşdur. Bu gözəl, bənzəri olmayan insana – pedaqoq alimə, böyük hörmət və ehtiramımızı bildirərək ruhu şad olsun, deyirik!..





# BÖYÜK İNSAN HAQQINDA KİÇİK XATİRƏ

*MİKAYIL ABDULLAYEV,*
*SSRİ Xalq rəssamı,*
*SSRİ Rəssamlıq Akademiyasının həqiqi üzvü,*
*C.Nehru adına Beynəlxalq Mükafat Laureatı*

Milli maarif və mədəniyyətimiz tarixinə adı böyük hərflərlə həkk olunanlardan biri də Mehdi Mehdizadədir. Bu gözəl insan harada görünərdisə, elə bil özüylə oraya nur gətirərdi... Mehriban, söhbətcil, yumşaq və prinsipial, görkəmli və mənalı.

Mehdi müəllimlə tez-tez görüşərdik – sessiyalarda, plenumlarda, ensiklopediyamızın baş redaksiya heyətinin iclaslarında, mötəbər məclis və konfranslarda. Əgər həmin məclislərdə Mehdi müəllim çıxış edərdisə mütləq yeni bir söz deyər, maraqlı təklifləri ilə hamımızın rəğbətini qazanardı. Ensiklopediyamızın baş redaksiya heyətinin iclaslarında Mehdi müəllimin əməli təklifləri, sözlüklərin müzakirəsində unudulmuş sözləri, coğrafi adları yada salması həmişə minnətdarlıqla qarşılanırdı.

Mehdi müəllimlə söhbətlərimizdən hiss edərdim ki, o, Azərbaycan diyarının gözəl bilicisi və eyni zamanda, bələdçisidir. Bu cəhət onun vətən torpağına məhəbbətindən irəli gəlirdi.

Bakı metropoliteninin "Nizami" stansiyasının bədii mozaik tərtibatı üzərində bu sətirlərin müəllifi 1973-1979-cu illərdə işləmişdir. Kiçik ölçülü eskizlərlə 18 ədəd "Xəmsə" motivlərini və böyük şairin boyaboy portretinin

rəsmlərini tamamlayandan sonra onların hər birini 6 kvadratmetr sahə üçün böyütmək lazım gəlirdi. Emalatxana şəraitində bu işin öhdəsindən yalnız o zaman gəlmək olardı ki, kiçik ölçülü eskizlər epidiaskop vasitəsilə böyüdülsün və 6 kvadratmetrlik kartona köçürülsün.

Adətən, hər kiçik rəsmi - əl işini damaların vasitəsilə də böyütmək olar. Lakin 18 ədəd mürəkkəb, çoxfiqurlu müxtəlif detallarla tamamlanan kompozisiyaları 6 kvadratmetrə böyütmək çox müşkül işdir. Epidiaskop isə qaranlıq otaqda, işığın gücü ilə lupa vasitəsilə rəsmi böyüdür. Onsuz da hər bir rəsmin üzərində olduqca çox işləmək lazım gəlir. Məsələn: hər bir mozaik panno rəsminə - kartona azı üç ay vaxt tələb olunurdu... Bütün bu tərtibata düz 6 il (1973-1979) vaxt sərf etdim.

O vaxt heç yerdən epidiaskop tapmaq mümkün deyildi. Dedilər ki, bu işdə ancaq və ancaq Maarif Naziri Mehdizadənin köməyi dəyə bilər. Hörmətli Mehdi müəllimin qəbuluna getdim. Bu bayaqdan sadaladıqlarımı Mehdi müəllimə danışdım, xahişimin sonunda bir mətləbi də dedim.

– Mehdi müəllim! Əgər mənim bu niyyətim baş tutsa, yəni bu şərəfli vəzifənin öhdəsindən gələ bilsəm, onda nəinki özümüzünkülər, hətta respublikamıza xaricdən gələnlər də şahid olarlar ki, Azərbaycanda dahi Nizamiyə təkcə yerin üstündə, meydanlarda, muzeylərdə hörmət və məhəbbət naminə abidələr qoyulmur, hətta yerin altında belə Nizamiyə sonsuz məhəbbət və dərin hörmət bəslənir.

Unudulmaz dostum gülə-gülə əlini çiynimə vuraraq dedi:



– Aydındır. Məndən asılı nə varsa bu işə sərf ediləcək. Arxayınam, uğur olsun!

Mehdi müəllim sözünə əməl etdi. Az vaxt içərisində həmin texniki ekran vasitələri mənə çatdırıldı. Layihələrimi həyata keçirməkdə mənə çox kömək etdi. Bu məsələdən agah olanlar hər dəfə “Nizami” stansiyasının bədii tərtibatına baxarkən unudulmaz Mehdi müəllimi də böyük məhəbbətlə xatırlayırlar!..



# O SƏNƏTİ, SƏNƏTKARI YÜKSƏK QİYMƏTLƏNDİRİRDİ

***SÜLEYMAN ƏLƏSGƏROV,***

*Bəstəkar, Azərbaycan Respublikasının xalq artisti, Respublika Dövlət Mükafatı laureatı, professor*

Azərbaycanın görkəmli elm, maarif, ictimai xadimləri arasında xüsusi mövqeyi və dəst-xətti olan Mehdi Məmməd oğlu Mehdizadə eyni zamanda təbiətən yüksək ziyalılıq mədəniyyəti ilə daha çox diqqəti cəlb edirdi. Onu tanıyanlar, hər hansı münasibətlə ünsiyyətdə olanlar ona Mehdi müəllim, – deyə müraciət edirdilər. Ayrı-ayrı respublikalarda, xarici dövlətlərdə yaxşı tanınan görkəmli alim, keçmiş SSRİ PEA-nın həqiqi üzvü, akademiki olmasına baxmayaraq, o, müəllim adı, müəllim titulu ilə fəxr edirdi.

Mehdi müəllimin görkəmli pedaqoq alim, maarif xadimi kimi böyük nüfuz qazandığını hələ 50-ci illərin əvvəllərində hiss etmişdim. 1952-ci ildə o, Respublikanın Maarif Naziri vəzifəsinə irəli çəkilərkən gənc nəslin bədii-estetik tərbiyəsi işini daha da yaxşılaşdırmaq üçün mədəniyyət nazirliyi ilə birgə müxtəlif məzmunlu tədbirlərin həyata keçirilməsinin zəruriliyini dönə-dönə xatırladırdı. O zaman mən Mədəniyyət Nazirliyində idarə rəisi vəzifəsində işlədiyim üçün onun arzuları, təşəbbüsləri ilə daha yaxından tanış olurdum. Lakin Mehdi müəllimlə daha yaxın əlaqəm 60-cı illərdə başladı.

M.Mehdizadə 1960-cı ildə Respublika Maarif Naziri vəzifəsinə bərpa olunandan sonra məktəblilərin estetik



tərbiyəsi sahəsində əsaslı dönüş yaratmaq məqsədilə bir sıra mühüm tədbirlər həyata keçirmək zərurətini irəli sürdü. O, dönə-dönə qeyd edirdi ki, məktəbəqədər yaşlı uşaqların, məktəblilərin incəsənət vasitəsilə bədii-estetik tərbiyəsinə xüsusi fikir vermək lazımdır. Əvvəla ona görə ki, musiqi də, təsviri sənər əsərləri də ətraf aləmi, həyatı düzgün başa düşməkdə uşaqlara, məktəblilərə çox kömək edə bilər. Çünki incəsənət də, müxtəlif elm sahələri kimi təfəkkürün inkişafına, yüksək şüurluluğa, mədəniyyətə çox qüvvətli təsir göstərir. Ən yüksək insani hisslər oyadır.

Akademik M.M.Mehdizadə 1960-1980-ci illərdə Respublika Maarif Naziri vəzifəsində can-başla çalışarkən öz fikrinə, ideya inamına həmişə sadiq qaldı. Respublikamızın ümumtəhsil məktəbləri üçün ilk musiqi, rəsm, təsviri incəsənət dərslikləri məhz onun nazir olduğu vaxtlarda yaradıldı. Musiqi, təsviri incəsənət fənləri üzrə yeni təkmilləşdirilmiş tədris proqramları ortaya çıxarıldı.

Mehdi müəllimin səyi və qayğısı sayəsində respublikamızın məktəbəqədər tərbiyə ocaqları və ümumtəhsil məktəblərinin I-VI sinifləri üçün ilk dəfə olaraq musiqidən tədris valları dəstləri hazırlanaraq musiqi təlimi-tərbiyəsi prosesinə tətbiq edildi. Məktəbəqədər yaşlı uşaqların mahnı oxumalarını, oyun və rəqslərini müşayiət etmək məqsədilə hazırlanan, habelə ümumtəhsil məktəblərinin I-VI siniflərində tədris olunan yüzlərlə mahnının val yazılarından ibarət olan çox qiymətli tədris vasitələrinə nazirlik hələ o dövrdə xeyli maliyyə vəsaiti sərf etdi.

Akademik M.M.Mehdizadə nazir olduğu illərdə uşaq bağçalarında, ümumtəhsil məktəblərində böyüyən

balalarımızın bədii-estetik tərbiyəsi ilə müntəzəm olaraq maraqlanır, yaradıcı sənətkarları, xüsusilə bəstəkarları, rəssamları, şair və yazıçıları problemin həllinə imkan verən tədbirlərə cəlb etməyə böyük əhəmiyyət verirdi. Mən bunu 1970-ci ildən Maarif Nazirliyində bədii-estetik tərbiyə üzrə tədris-metodika şurasına rəhbərlik etməyə başladığım vaxtdan hiss etdim. O, ümumtəhsil məktəblərimizdə musiqi, rəsm–təsviri incəsənət fənlərinin tədrisi sahəsində uzun müddət müəyyən boşluq yaranmasından çox narahat idi. Hər görüşümüzdə deyərdi:

– Süleyman, mən yaxşı bilirəm ki, bəstəkarlar, rəssamlar, digər sənətçilər xətrini çox istəyirlər. Sənin sözündən çıxmazlar. Onlardan xahiş etmək lazımdır ki, məktəblərimiz üçün yeni-yeni dərslik, dərs vəsaiti hazırlasınlar. Qonorarını da artıqlaması ilə verdirərəm, təki yazsınlar, məktəbə, bağçaya kömək edən bir şey hazırlasınlar...

Ötən illərə nəzər salarkən görürəm ki, dostum, həmkarım professor Sabir Quliyevlə ümumtəhsil məktəblərimizin IV-VI sinifləri üçün ilk "Musiqi" dərsliklərini də Mehdi müəllimin maarif naziri olduğu illərdə yazmış və onun diqqəti, qayğısı sayəsində çap etdirmişik. Sonralar məktəb islahatı ilə əlaqədar aparılan dəyişikliklərlə bağlı həmin dərslikləri müvafiq olaraq V, VII siniflər üçün hazırladıq və yenidən çap etdirdik.

Yeri gəlmişkən deyim ki, ümumtəhsil məktəblərimiz üçün ilk "Rəsm" dərsliklərinin hazırlanmasında da Mehdi müəllimin bir nazir kimi böyük rolu oldu.

Çox böyük alim, pedaqoq, gözəl insan olan M.Mehdizadə respublikada uşaq bədii özfəaliyyətinin hər vasitə ilə inkişafına, genişlənməsinə də müntəzəm diqqət



yetirirdi. Təsadüfi deyildir ki, 1970-ci ildə məktəblilərin I respublika mahnı bayramının mütəşəkkil keçirilməsində də Mehdi müəllimin əməyi az olmadı. Yüz minlərlə uşağı, məktəblini əhatə edən həmin tədbiri açaraq musiqi-sənət həvəskarlarını təbrik etdi. Bədii özfəaliyyətin inkişafı sahəsində onlara böyük uğurlar arzuladı. Mehdi müəllimin diqqət və qayğısı sayəsində sonrakı illərdə məktəblilərin II, III mahnı bayramları respublikanın bütün şəhər və kəndlərini əhatə edərək mahnı və rəqs - əsl incəsənət bayramı kimi geniş vüsət aldı. Ümumiyyətlə, o, maarif naziri kimi uşaqların, məktəblilərin asudə vaxtlarında musiqi, incəsənətlə daha çox məşğul olmalarına çalışır, bunun üçün hər cür şərait yaradırdı.

Mehdi müəllimlə həmişə söhbətimizin tutmasının, əsl yaradıcı səmtə istiqamətlənməsinin mühüm bir səbəbi də onun Şuşaya – Qarabağın dilbər guşəsinə vurğunluğu idi. O istəyirdi ki, Şuşanın təlim-tərbiyə ocaqlarında uşaqlar, məktəblilər ata-babalarının musiqi-sənət ənənələrinə də sadiq qalsınlar. İncəsənətin müəyyən bir sahəsi üzrə mükəmməl bacarıq və qabiliyyətə yiyələnsinlər. Bu məqsədlə Şuşanın ümumtəhsil məktəblərində bədii təmayüllü siniflərin, habelə müstəqil incəsənət məktəbləri şəbəkəsinin genişlənməsinə çalışırdı. O, həm nazir işlədiyi vaxtlarda, həm də təqüdə çıxandan sonra çox istəyirdi ki, bir neçə günlüyə Şuşada mənim qonağım olsun. Onu da deyim ki, Mehdi müəllimin Şuşada yaxın qohumları da yaşayırdı. İşinin çoxluğundan onlarla da vaxtaşırı görüşə bilmirdi. Həmişə deyirdi ki, Şuşaya qısa müddətə getmək düz deyil. Ora getdin, gərək bir neçə gün qalasan. Təəssüf ki, amansız ölüm Mehdi müəllimə bu arzusunu həyata keçirməyə imkan vermədi...

1984-cü ilin may ayında dünyasını dəyişən bu böyük alimi, gözəl insanı dərin minnətdarlıq hissi ilə xatırlayıb ötən anlara nəzər salarkən bir daha belə qənaətə gəlirəm ki, o, sənəti, sənətkarı yüksək qiymətləndirməyi bacarırdı.





# O BÖYÜK ALİM, BÖYÜK İNSAN İDİ...

*HÜSEYN ƏHMƏDOV,*
*Pedaqogika üzrə elmlər doktoru, professor,*
*Rusiya Dövlət Təhsil Akademiyasının akademiki,*
*Azərbaycan Respublikasının əməkdar ali məktəb işçisi,*
*prezident təqaüdçüsü*

Akademik Mehdi Mehdizadə çox gözəl insan, pedaqoji elmimizin görkəmli nümayəndəsi idi. Fəxr edirəm ki, mən də Mehdi müəllimin yetirməsi kimi onunla 40-ilə yaxın bir müddətdə ünsiyyətdə olmuş, faydalı məsləhətlərindən bəhrələnmişəm. Mən Mehdi müəllimi 50-ci illərdən tanıyıram. O vaxtlar mərhum professorlar Əhməd Seyidov, Mərdan Muradxanov, Mehdi Mehdizadə V.İ.Lenin adına APİ-nin ümumi pedaqogika kafedrasında çalışırdılar. Mehdi müəllim özünün sadəliyi və təvazökarlığı ilə fərqlənirdi. Həmin illərdə "İbtidai məktəb şagirdlərinin kommunist əxlaqi tərbiyəsində nümunənin rolu və ondan istifadə etmək yolları" adlı namizədlik dissertasiyasını tamamlayıb müdafiəyə təqdim etdim. Lakin o vaxtın qanunlarına görə əsər çap olunandan sonra müdafiə etmək mümkün idi. Həmin əsər 1958-ci ildə Mehdi müəllimin redaktəsi və qayğıkeşliyi sayəsində çap olundu.

Mehdi müəllimin insani keyfiyyətlərini saymaqla qurtaran deyil. O, respublikada iki dəfə Maarif Naziri vəzifəsində işləyərkən dəfələrlə yanında olmuşam. Xarakterik cəhət bu idi ki, o məni təkcə qəbul günlərində

deyil, adi günlərdə də qəbul edərdi. Hər dəfə də mehriban, səmimi söhbətlərindən doymaq olmazdı. Bu yaxınlıq onunla nəticələndi ki, Mehdi müəllim mənim doktorluq dissertasiyama elmi məsləhətçi olmağa razılıq verdi. Onun xeyirxah məsləhətləri bəhrəsiz qalmadı. 1972-ci ildə Azərbaycan Dövlət Universitetinin elmi şurasında həmin doktorluq dissertasiyasını müdafiə etdim. Müdafiə prosesində verilən suallarla tutarlı cavablarımı dinləyən Mehdi müəllim məmnun qaldı, öz razılığını bildirdi.

Mehdi müəllim o vaxtlar həm nazir kimi, həm də alim kimi keçmiş SSRİ miqyasında böyük hörmətə və nüfuza malik idi. Məhz elə buna görə də 60-cı illərdə RSFSR Pedaqoji Elmlər Akademiyasına çevrilərkən o, akademiyanın təsis komissiyasının tərkibinə daxil edildi və birbaşa akademiyanın həqiqi üzvü seçildi.

Mən son vaxtlar SSRİ PEA-nın ümumi iclaslarında iştirak edərkən akademiyanın ağsaqqal üzvlərinin Mehdi müəllim haqqında xoş təəssüratlarının, ürəkdən xoş sözlər dediklərinin dəfələrlə şahidi olmuşam. Akademiklərdən Prokofyev, Qonçarov, Piskunov və başqaları onun xidmətlərini daima yüksək qiymətləndirirdilər.

Mehdi müəllim 1980-ci ildə nazir vəzifəsindən təqaüdə çıxandan sonra çox böyük həvəs, gənclik enerjisi ilə səmərəli elmi fəaliyyət göstərirdi. "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" (Bakı, "Maarif" nəşriyyatı, 1982) adlı məşhur monoqrafiyası həmin dövrün məhsuludur. Biz həmin əsəri kafedrada müzakirə etdik və haqqında xoş sözlər dedik. Yeri gəlmişkən qeyd edim ki, "Azərbaycan məktəbi" jurnalının 1983-cü il 5-ci nömrəsində professor Əbdül Əlizadə ilə birlikdə həmin əsərin elmi məziyyətlərindən



bəhs edən "Dəyərli tədqiqat əsəri" adlı geniş məqalənin çapına nail olduq. Mehdi müəllimin aydın elmi üslubu, özündən əvvəlki tədqiqatçıların əsərlərini öyrənib onları təhlil süzgəcindən keçirərək öz münasibətini məharətlə bildirməsi həmin kitabda özünəməxsus orijinallıqla diqqət mərkəzinə gətirilir.

Akademik M.Mehdizadə bütün məruzə və çıxışlarında, elmi işlərində toxunduğu problemin ədəbiyyatda qoyuluşunu diqqətlə nəzərdən keçirir, bir qism müəlliflərlə elmi mübahisəyə girişir, tutarlı dəlillər gətirirdi. O, pedaqoji problemlərin şərhində tədqiqi və təbliği xarakterin aparıcılığına, vəhdət təşkil edilməsinə xüsusi fikir verirdi.

Görkəmli alimi həmkarlarından fərqləndirən cəhətlərdən biri də az tədqiq olunan, pedaqogika elmində dumanlı olan məsələləri tədqiqat obyektinə gətirməsi, onların əsas mahiyyətini özünəməxsus orijinal deyim tərzi ilə nəzərə çatdırması idi. O, pedaqogika nəzəriyyəsi ilə əlaqədar bir sıra məsələlərin təcrübəyə tətbiqi imkanlarını və yollarını da araşdırırdı. Nəzəri mülahizələrin, tövsiyyələrin məktəblərimizdə təbliği–tətbiqi ilə əlaqədar yaranmış qabaqcıl pedaqoji təcrübənin ümumiləşdirilib işıqlandırılmasına çalışır, bu istiqamətdə tədqiqat aparmağı dönə-dönə tövsiyə edirdi.

Əgər desək ki, akademik M.Mehdizadənin Azərbaycan maarifinin, pedaqogika elminin inkişafına həsr etdiyi hər bir əsəri öz dəyəri istiqamətvericiliyi ilə çox böyük təsir dairəsinə, nəzəri-praktik əhəmiyyətə malik olurdu, əlbəttə, səhv etmərik. O, sağlığında nəşrini gördüyü son fundamental əsəri olan "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi

yolları" əsərində də fərdi yaradıcılıq ənənəsinə sadiq qalmış, bu sahədə çalışan həmkarlarının nəzər-diqqətini cəlb etmişdir. Mehdi müəllim həmin əsərin giriş hissəsində çox vacib bir məsələni – qabaqcıl pedaqoji təcrübənin mahiyyəti və məqsədi məsələsini şərh etməyi qarşıya qoyur. Bu sahədə söylənilmiş mövcud pedaqoji fikirlərə münasibətini bildirərək belə bir qənaətə gəlir ki, qabaqcıl təcrübə dedikdə heç də həmişə novatorluq nəzərdə tutulmur. Belə ki, məlum pedaqoji həqiqətlərin məharətlə tətbiqi və qabarıq nəticələr əldə edilməsi də qabaqcıl təcrübədir. Uşağa yüyürməyi öyrətməyin ilk mərhələsi ona yeriməyi öyrətmək olduğu kimi, novatorluğun ilk mərhələsi də məlum pedaqoji həqiqətlərin məharətlə yerinə yetirilməsindən ibarətdir.

Yeri gəlmişkən böyük fərəhlə qeyd edim ki, ustadımız M.Mehdizadənin həmin əsəri təkcə Azərbaycan Pedaqoji elminə deyil, keçmiş SSRİ-də inkişaf edən, formalaşan pedaqogika elminə dəyərli bir töhfə kimi qiymətləndirilmişdir.

Akademik Mehdi Mehdizadə öz şəxsiyyəti – şəxsi nümünəsi ilə hər yerdə, hər zaman yüksək pedaqoji etikanı nümayiş etdirirdi. Yüksək dərəcədə mədənililik, düzlük, paklıq, ədalət, qayğıkeşlik, səmimiyyət, təvazökarlıq onun şəxsiyyətinin heyrətamiz cəhətləri idi. Xoşbəxtəm ki, hələ özünün sağlığında keçmiş SSRİ məkanında ən mötəbər mətbuat orqanı olan "Sovetskaya pedaqoqika" jurnalının 1983-cü il, 12-ci nömrəsində akademik M.Mehdizadənin – bu böyük insanın, görkəmli alimin anadan olmasının 80, elmi-pedaqoji fəaliyyətinin 60 iiliyi münasibəti ilə məqalə dərc etdirdim. Onun mənalı ömür yolunu, elmi-pedaqoji fəaliyyətinin əsas istiqamətlərini işıqlandırıb ümumittifaq



oxucularına çatdıra bildim. Mən həmin məqalədə Mehdi müəllimə sonsuz ehtiramımı ifadə etməyə çalışmışam.

Mehdi müəllimin xatirəsi onun yetirmələrinin qəlbində də yaşayır. Onun portreti kafedramızda əziz bir xatirə kimi saxlanılır. Ümumi pedaqogika kafedrasının girəcəyində əks etdirilən xatirə lövhəsi əziz, unudulmaz Mehdi müəllimin həmişə bizimlə olmasını, qəlbimizdə yaşamasını ən parlaq nümunə kimi gələcək nəsillərə çatdırır.



# ƏSL MAARİF FƏDAİSİ

*ŞƏMİSTAN MİKAYILOV,*
*Pedaqogika üzrə elmlər doktoru, professor,*
*Prezident təqaüdçüsü*

Adətən, xatirə daha çox yaxın adamlar tərəfindən yazılır. Mən akademik Mehdi Mehdizadəni demək olar ki, həmişə maarif naziri kimi tanımışam. Aramızda həmişə xoş ünsiyyət, böyük-kiçik münasibəti olub. Adi vaxtlarda tez-tez görüşməsək də rəsmi yığıncaqlarda, Mehdi müəllimin apardığı kollegiya iclaslarında onu çox dinləmişəm, təhsil problemləri barədə onunla məsləhətləşmişəm və istiqamət almışam. Ən başlıcası, əsərlərini diqqətlə oxuyub, faydalanmışam.

Mehdi müəllimi mən, hər şeydən əvvəl, nəcib və görkəmli alim kimi xatırlayıram. Onun şəxsində insan nəcibliyi ilə alimlik vəhdət təşkil edirdi. Bu isə hər adama nəsib olmayan keyfiyyətdir. Mehdi müəllim (ona "Mehdi müəllim" – deyə müraciət etmək daha xoş gəlirdi) özünün təmkinliyi, müsahibini səbirlə dinləməsi ilə diqqəti daha çox cəlb edirdi. O, səbirli, təmkinli olduğu qədər də prinsipial və hərtərəfli biliyə malik bir pedaqoq alim idi. Hər hansı məsələnin müzakirəsi zamanı hamını təmkinlə dinləmək, söylənən fikirlərdən düzgün nəticə çıxarıb ümumiləşdirmək bacarığına malik idi. Baza təhsili etibarilə riyaziyyatçısı idi. Lakin hansı ixtisasın sahibi ilə söhbət edirdisə elə bilirdin ki, o sahənin mütəxəssisidir.

Yaxşı yadımdadır, 40-45 il bundan əvvəl Mehdi müəllim nazir kimi mənə respublika məktəblərində ədəbiyyat tədrisinin vəziyyətini təhlil etməyi tapşırdı. Mən



geniş bir material hazırladım. Materialın hazır olduğu barədə məlumat verdikdən sonra professor Zahid Qaralovu və məni (o zaman Zahid müəllim ETPEİ-nin direktoru idi, mən isə ədəbiyyatın tədrisi metodikası şöbəsinin müdiri vəzifəsində işləyirdim) qəbul etdi, materialı mən oxudum, onlar dinlədilər. həmin yazının oxusu üç saatdan artıq çəkdi. Bu müddət ərzində Mehdi müəllim diqqətlə qulaq asaraq heç oturma vəziyyətini də dəyişmədi. Oxuyub qurtardıqdan sonra faydalı məsləhətlərini verdi. Mən onun məsləhətlərini heyranlıqla dinlədim. Riyaziyyatçı pedaqoqun ədəbiyyat tədrisinin incəliyinə bu qədər bələd olması məndə qibtə hissi doğururdu. İrəli sürülən hər təklifə həssaslıqla yanaşmaq Mehdi müəllim şəxsiyyətinin əsas cəhətlərindən idi. Fikir söyləyənin kimliyindən asılı olmayaraq, onu səbrlə axıra qədər dinləmək, ümumi iş üçün faydalılığını götür-qoy etmək, müvafiq nəticə çıxarmaq onun iş üsulunun əsasını təşkil edirdi.

Kollegiyada ədəbiyyat proqramı müzakirə olunurdu. Proqramın məzmunu və tərtibi prinsipləri barədə məlumat verirdim. Müzakirə prosesində görkəmli sənətkar "H.Cavidin yaradıcılığı, xüsusilə dil-üslub xüsusiyyəti orta məktəb şagirdləri tərəfindən çətin başa düşülür" fikri səsləndi və onun yeni proqramdan çıxarılması təklifi irəli sürüldü. Bu fikrə tərəfdar çıxanlar da az deyildi. Mehdi müəllim həmin fikri söyləyənlərin hər birini diqqətlə dinlədi. Sonra "Sənin özünün fikrin nədir?", – deyə mənə müraciət etdi. Mən H.Cavid yaradıcılığının orta məktəbdə öyrədilməsinin zəruri olduğunu göstərdim və öz arqumentlərimi bildirdim.

Mehdi müəllim deyilən fikirləri özünəməxsus bir ustalıqla, məharətlə, əsaslandırılmış şəkildə ümumiləşdirərək dedi:

"Bir vaxt var idi ki, Azərbaycan Dövlət Dram Teatrı iki görkəmli sənətkarın yaradıcılığı əsasında fəaliyyət göstərirdi. Bir axşam Cəfər Cabbarlının əsəri oynanılırdı, digər bir axşam isə H.Cavidin.

Azərbaycan ədəbiyyatının, eləcə də mədəniyyətimizin inkişafında H.Cavidin diqqətəlayiq xidməti var. Buna görə də belə bir şəxsiyyətin yaradıcılıq nümunələrini orta məktəb proqramına daxil etməmək düzgün olmaz", – deyə mübahisəyə son qoydu və özünün ədalətli mövqeyi ilə ümumtəhsil məktəblərinin ədəbiyyat proqramında Hüseyn Cavidin yerini möhkəmləndirdi. Bu mövqe eyni zamanda Mehdi müəllimin Azərbaycan ədəbiyyatına, Azərbaycan mədəniyyətinə qayğısının parlaq ifadəsi idi.

Mehdi müəllim sözün geniş mənasında maarif fədaisi idi. Təcrübəli, işgüzar, ixtisasını dərindən bilən və onu lazımi tələblər səviyyəsində tədris edən müəllimlərə ehtiram göstərirdi. Əsərlərində belə müəllimlərin adını hörmətlə çəkir, iş təcrübələrini işıqlandırır və təhlil edirdi.

Əlbəttə, akademik M.Mehdizadə haqqında istənilən qədər xoş söz demək olar. Ümumiləşmiş şəkildə desək, M.Mehdizadə şəxsiyyəti aydın zəkası, adamlara münasibəti, danışıq mədəniyyəti, səliqəsi etibarı ilə gözəl bir məktəb idi. Xaqaninin sözləri ilə desək, onun könlü müəllim idi. Allah ona rəhmət eləsin! Mehdi müəllimin parlaq xatirəsi qəlbimizdə həmişə yaşayacaqdır!



# AZƏRBAYCAN PEDAQOJİ ELMİNİN ZİRVƏSİ

***BUDAQ BUDAQOV,***
*Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, Əməkdar elm xadimi, coğrafiya elmləri doktoru, professor*

Hər hansı bir əsr mütəfəkkiri və ya mütəfəkkirləri yetirir. Mütəfəkkirlər isə mənsub olduğu əsri xüsusi bir platforma üzərinə çıxararaq tarixdə yaşadırlar. X əsr deyəndə İbn Sina – Avisenna, XI əsr deyəndə Nizami Gəncəvi, XVI əsr deyəndə Füzuli və ya Şah İsmayıl Xətai yada düşür.

Hər hansı bir görkəmli mütəfəkkir doğulub boya-başa çatdığı dövrün ictimai-siyasi quruluşunun yaratdığı abu-hava mühitində formalaşır, yetişir və s. Belə şəxsiyyətlər öz dövrünün ən yaxşı, ən ali cəhətlərini götürərək onlara yeni forma, orijinal məzmun verirsə, deməli gələcəkdə də xatirələrdə yaşamaq hüququ qazanırlar. Bəşəriyyət tarixində özlərinə əbədi yer qazanmışların estafetini əsrlərin özləri çox asanlıqla bir-birinə ötürür və vaxt baxımından onlar öz təfəkkür şəfəqlərini sonsuzluğa doğru yönəldirlər.

Yer üzündə mövcud olan müxtəlif millətlərin içərisindən çıxmış mütəfəkkirlər dünya xalqlarının mənafeyinə xidmət etdiyindən onlar bəşəriyyətin övladlarına çevrilirlər.

Belə bəşəri övladlardan biri də xalqımızın fəxri, keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi

üzvü, pedaqoji elmlər doktoru, professor Mehdi Məmməd oğlu Mehdizadə idi.

XX əsrin birinci yarısında Azərbaycanda pedaqogikanın elmiləşmə dövrü başlanırdı. İstər orta və istərsə də ali məktəblərin yaranması tədris metodikası və xüsusilə pedaqogika elmi üzrə kadrların yetişməsini tələb edirdi. Xalqın pedaqoji təlimə olan aclıq ehtiyacını ödəmək üçün bu sahəyə bir neçə cavan alimlər gəldi. Onlardan biri də Azərbaycan maarifində əvəzsiz xidməti olan Mehdi Mehdizadə idi.

Orta boylu, sakit təbiətli, ağır çəkili, qiymətli fikirlər sərrafı, yüksək insani keyfiyyətli, məqsədyönlü təşkilatçı qabiliyyətli, saf, təmiz – yəni, ancaq öz əlinin çörəyini yeyən Mehdi müəllim Azərbaycan pedaqogika elminin parlaq nümayəndəsi idi. Mehdi müəllim özünün elmi-təşkilati qabiliyyəti və yüksək insani keyfiyyətləri ilə Azərbaycan maarifi tarixində şərəfli bir yer tutmuşdur. M.Mehdizadə Azərbaycan maarifinin zirvəsidir. Mehdi müəllimin elmi-pedaqoji görüşləri maarifçilərimizə düzgün yol göstərən mayakdır.

1947-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun coğrafiya fakultəsinə daxil olmuşdu. O vaxtlar APİ respublikanın ən dəyərli, ən layiqli institutlarından biri idi. İnstitutun daxilində olan şüurlu, əsaslı dəmir intizam, yüksək ixtisaslı müəllim heyəti, mükəmməl səviyyədə keçilən dərslər Azərbaycan məktəblərinə sözün həqiqi mənasında yüksək ixtisaslı kadrlar verirdi.

İnstitutda faəl, ictimaiyyətçi tələbələr dəstəsində Şıxəli Qurbanov, Tələt Əfəndiyev, Sərxan Verdiyev və başqaları xüsusilə tanınır, parlaq nümunə göstərirdilər.



Əlbəttə, bütün bu nailiyyətlərimizdə - yüksək səviyyədə təhsil almağımızda, mükəmməl təşkilati iş aparmağımızda institutun rəhbərlərinə - professorlar Əhməd Seyidova və Mehdi Mehdizadəyə minnətdar idik.

1947-ci ildə Ə.Seyidov institutun rektoru, M.Mehdizadə isə prorektoru idi. Qısa bir müddətdən sonra M.Mehdizadə institutun rektoru vəzifəsinə təyin olundu. Mən isə institutun Komsomol Komitəsinin birinci katibi idim. Bu vəzifəm imkan verirdi ki, rektorla tez-tez ünsiyyətdə olum. M.Mehdizadə ilə hər bir görüşüm mənim daxili dünyamın zənginləşməsinə, təşkilati işimin daha məqsədyönlü aparılmasına kömək edirdi.

Professor M.Mehdizadə az danışan idi. İşində, əməllərində olan konkretlilik, işlə söz, sözlə-iş arasında olan vəhdət onun təsir dairəsində olan bütün müəllim və tələbə heyətini də hərəkət və əməllərində dəqiq olmağa sövq edirdi. Odur ki, rektor Mehdizadənin qəbuluna hazırlaşan hər hansı bir şəxs, o cümlədən də kafedra müdirləri və ya dekanlar yüz ölçməsələr, bir biçmirdilər. Mən bunu sərt xarakterli dekan Osman Osmanovun, ötkəm sözlü dosent Manaf Zahirinin danışıq və hərəkətlərindən duyur və hiss edirdim.

M.Mehdizadənin şəxsiyyətinə olan hörmət institutun yaxşı səliqədə saxlanmasına, intizamın daima yüksəlməsinə, dərs keyfiyyətinin artmasına çox ciddi, müsbət təsir göstərirdi.

1948-ci ilin sentyabr ayı idi. Stalin təqaüdünə təqdim olunacaq əlaçı tələbələri institutun pedaqoji şurasına çağırır, onlarla söhbət edirdilər. Heç yadımdan çıxmaz. O zaman şurada yerlibazlıqla bağlı suallar ortaya çıxdı. Həmişə olduğu kimi, orada da böyük müəllimim

M.Mehdizadə yerlibazlıq məsələsinin üstünə sərin su çiləməklə, yol verilə biləcək lazımsız halların qarşısını ustalıqla aldı. Mən həmin təqaüdü almağa layiq bilindim.

... 1951-ci ilin axırlarıydı. İnstitutu Stalin adına təqaüdlə bitirənlərin ali təhsil almaq diplomunu şəxsən rektor M.Mehdizadənin özü təqdim edirdi. Bu xoşbəxtlik mənə də nəsib oldu. O zaman bizim şəklimizi çəkmişdilər. Mən həmin şəkli əziz bir xatirə kimi saxlayırdım. Sevimli rektorumuz M.Mehdizadənin anadan olmasının 80 illik yubileyində həmin şəkli və təbrik məktubunu ona göndərdim. Məktubda onun yüksək insani keyfiyyətlərindən və əvəzsiz xidmətlərindən, təşkilatçılıq qabiliyyətlərindən söhbət açmışdım. Bizim mehriban Mehdi müəllimin şəkillə və məktubla əlaqədar öz razılığını, təşəkkürünü bildirməsi mənim üçün çox qiymətli idi.

Mehdi müəllim ömrünün son günlərinədək haqqa, ədalətə sadiq qaldı. Haqqın, ədalətin carçısı oldu. Bu ali insani keyfiyyətlər onun canına, qanına hopmuşdu. O, institutda prorektor, rektor olduğu illərdə hər cür ədalətsizliyə, hətta onu doğura biləcək ünsürlərə belə yol vermirdi.

Professor M.Mehdizadənin rektor olduğu dövrdə ali məktəblərdə təhsilin səviyyəsini müəyyən etmək üçün tələbələrin aldığı qiymətlərin orta həddini meyar götürməyə başladılar. Hansı ali məktəbdə orta qiymət həddi beş və ya dörd idisə, deməli, həmin institutlarda rəhbərlik tərəfindən tədris işlərinin yaxşı təşkil olunduğu qeyd edilirdi. Təəssüf ki, bu cəhət bir azdan zərərli təsirini göstərdi. Ayrı-ayrı təhsil müəssisələrində tədrisin keyfiyyətinə ciddi zərbə vuran ziyanlı yarış başlanıldı.



Həqiqi qiymətlər bir bal da artırıldı, beləliklə tədrisin keyfiyyəti get-gedə yüksəlmək əvəzinə, bir az da aşağı düşdü.

Ali təhsil prosesinə ciddi ziyan vuran belə qərarların meydana çıxması Mehdi müəllimə də pis təsir edirdi. Lakin o, müəllim heyətinə tapşırırdı ki, belə xətalardan, qiymət yarışından uzaq olsunlar və tələbələrin fərdi biliyini real qiymətləndirsinlər. Onun bu cür ədalətli tapşırığına görə yuxarılardan töhmətlənməsinin mən də şahidi olmuşam. Lakin haqq-ədalət də öz yerini tuturdu. 1960-cı ildə Respublikada Maarif Nazirliyinə rəhbərlik üçün kadr müəyyənləşdiriləndə, tərəddüd etmədən M.Mehdizadənin – təhsil sisteminin mahir bilicisini ikinci dəfə bu vəzifəyə təyin etdilər. Bundan sonra Mehdi müəllim 20 il müddətində fasiləsiz olaraq Respublikanın Maarif Naziri oldu, bu vəzifədə can-başla çalışdı. O dövrdə mən də Mehdi müəllimlə dəfələrlə görüşürdüm. Bütün fənlərin tədrisinə, o cümlədən coğrafiya fənninin tədrisi səviyyəsinin yüksəlməsinə xüsusi diqqət yetirirdi. Onun təkidi və qayğısı sayəsində müxtəlif təyinatlı xəritələr çap olundu, özü də Azərbaycan dilində.

O, bir nazir kimi orta məktəb üçün olan dərsliklərin tərcümə keyfiyyətinə, Azərbaycan coğrafiyası fənni üzrə dərsliyin yüksək səviyyədə yazılışına ciddi tələblə yanaşırdı. Əslində Mehdi müəllim bütün dərsliklərin məzmununa, onların poliqrafiya səviyyəsinə xüsusi fikir verirdi.

Orta məktəblərdə təhsilin keyfiyyətinin get-gedə aşağı düşməsi onu məyus edirdi. Bir dəfə müşavirələrin birində Azərbaycan Respublikası Ali və Orta İxtisas Təhsil Naziri Qurban Əliyev deyib ki, "bu il ali

məktəblərə qəbul olan abituriyentlərin bilik səviyyəsi çox aşağı olub". Maarif Naziri, akademik Mehdi Mehdizadə isə ona cavabında deyib ki, "aşağı biliyə malik olan həmin abituriyentlərə Sizin hazırladığınız ali təhsilli müəllimlər dərs deyiblər".

XX əsrin ortalarında pedaqogika elminə gəlmiş bir qrup alim müəllimlər yada düşəndə biz tələbələrin qəlbinə nur çilənir! Mehdi Mehdizadə, Əhməd Seyidov, Mərdan Muradxanov, İsfəndiyar Vəlixanlı, Qafarzadə... Bu nəhənglər və onlarla çiyin-çiyinə işləyən alim pedaqoqlar qoşalaşıb Azərbaycanın həm elm pedaqogikasının, həm də təhsil metodikasının, xüsusilə tədris üsullarının elmi əsaslarda müəyyənləşdirilməsinə nail oldular. Bütün bunlara görə biz Azərbaycanın işgüzar, cəfakeş, alim-pedaqoq oğullarına minnətdarıq. Əgər Mehdizadələrdən, Seyidovlardan, Muradxanovlardan qabaq yaşayıb-yaratmış pedaqoq alim və mütəfəkkirlər ayrı-ayrılıqda, pedaqogika elminin özülünə qızıl kərpiclər qoymuşlarsa, əsrimizin əllinci illərinin pedaqoqları isə vahid proqramla kollektivdə birləşərək yeni – Azərbaycan pedaqogikası elminin qəsrini tikdilər. Çox etibarlı zəmin isə "Azərbaycan məktəbi" adlı elmi-nəzəri jurnalın yaranmasına səbəb oldu. Bu jurnala sonradan qoşulan yeddi metodik məcmuə ayrı-ayrı ümumtəhsil fənlərini əhatə etməklə Azərbaycan pedaqoji elminin səmasında yeddi ulduz – Ülkər kompleksi yaratdı.

Yeri gəlmişkən qeyd edim ki, Yerevan Pedaqoji Məktəbində (1947) və APİ-də (1951) aldığım pedaqoji təhsilin qüvvətli təsiri nəticəsində məktəb coğrafiyasından bu günə kimi ayrıla bilməmişəm. 1955-ci ildən sonra coğrafiya fənlərinin tədrisi keyfiyyətinin daha da



yaxşılaşdırılması üçün dövrü mətbuatda müntəzəm çıxış etmiş, elmi-praktik konfranslar keçirmiş, Respublika Maarif Nazirliyində coğrafiya fənni üzrə Elmi-Metodik Şuranın sədri kimi bu sahədə geniş fəaliyyət göstərməyə çalışmışam. Son illər nəşr olunan və müstəqilliyimizlə ahəng yaradan Azərbaycan Respublikası Coğrafiyası dərsliyinin müəlliflərindən biri olmuşam. Bu sahədə proqram və dərsliklərin təkmilləşdirilməsi, yeni dərsliklərin hazırlanması naminə var qüvvəmlə çalışıram. Əlbəttə, elmi-pedaqoji sahədə əldə etdiyim bütün uğurlarıma, həmişə lazımlı elm üzrə məndə yaranmış dərin məhəbbətə görə pedaqoq müəllimlərimə və ilk növbədə akademik Mehdi Mehdizadəyə minnətdaram. O, Azərbaycan pedaqoji elmi tarixində qazandığı böyük uğurları, fədalar əməyilə dünya durduqca mənən yaşamaq hüququ qazanmışdır.



# PEDAQOQ ADINA LAYİQ

***YƏHYA KƏRİMOV,***

*Pedaqogika üzrə elmlər doktoru, professor,*
*Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü,*
*Azərbaycan Respublikasının əməkdar müəllimi,*
*prezident təqaüdçüsü*

İlk əmək fəaliyyətinə Böyük Vətən Müharibəsinin ağır illərində oxuduğum orta məktəbin pedaqoji kollektivində başladım. Az vaxt içərisində bu səmimi və işgüzar kollektiv məndə müəllimliyə dərin məhəbbət oyatdı. Ali təhsil almaq, ədəbiyyat müəllimi olmaq arzusu məni Azərbaycan Dövlət Pedaqoji İnstitutuna gətirib çıxardı.

İnstitutda yeni bir aləmə düşdüm. Cəbhədən qələbə ilə qayıtmış, respublikanın müxtəlif guşələrindən müəllim olmaq arzusu ilə gəlmiş gənclərlə tanış oldum. Qaynar institut həyatı bir yana, məni daha çox maraqlandıran geniş koridoru olan ikinci mərtəbədəki professorlar otağı idi. Hər gün bir neçə dəfə onun qarşısına baş çəkər, nəinki öz müəllimlərimizi, həmçinin digər fakültələrdə dərs deyən alimləri də görməyə cəhd edirdim.

Direktorumuz Qori seminariyasının məzunu, Zaqafqaziyada ilk pedaqoji elmlər namizədi və doktoru, pedaqogika tarixi müəllimimiz Əhməd Seyidov, akademik Mirzə Feyzulla, Əbdüləzəl Dəmirçizadə, Əlisöhbət Sumbatzadə, Xudaverdi Kələntərli, Maqsud Cavadov, Əli Sultanlı, İbiş İbrahimov və başqaları ilə yanaşı, pedaqogika müəllimimiz Mehdi Mehdizadə də tənəffüsü



bu otaqda keçirərdi. Biz bu müəllimlərin simasında müəllimliyin müəllimlərini görürdük. Belə bir elmi mühitdə fəaliyyət göstərən M.Mehdizadə çox keçmədi ki, institutun elmi işlər üzrə direktor müavini oldu.

Mehdi müəllim yüksək mədəniyyət sahibi, geyimi, nitqi, hərəkətləri, ətrafındakılara münasibəti ilə seçilirdi. O, müharibənin təsirinin güclü hiss olunduğu həmin dövrdə tələbələrə atalıq qayğısı ilə yanaşırdı. 1947-ci ildə tələbələrə talonla paltar verilirdi. O bu işi öz öhdəsinə götürdü və hamını razı saldı. Həmin dövrdə yoldaşlardan biri ayın əvvəlində çörək talonunu itirmişdi. Mehdi müəllim ailə üzvlərindən birinin talonunu həmin tələbəyə verdi.

Mehdi müəllim dərin məntiqi olan müəllim idi. Bəzilərinin quru, hamıya məlum fənn hesab etdiyi pedaqogikanı o, maraqlı və məzmunlu elm kimi təqdim etməklə, bizi həmin elmə bağlaya bilmişdi. O, pedaqogika nəzəriyyəsini həyatla, gənc nəslin təlimi və tərbiyəsi ilə elə bağlayırdı ki, biz bu fəndə balalarımızın gələcəyini, millətimizin gələcəyini görürdük.

Elə bu dövrdən mənim ədəbiyyat müəllimi olmaq arzumu başqa bir arzu üstələdi: pedaqoq olmaq, təlimin təşkili probleminin sirlərini öyrənmək.

Bir gün mühazirələrindən birində Mehdi müəllim respublikada müəllim kadrlarına böyük ehtiyac olduğunu, lakin pedaqogika, psixologiya elmi sahəsində yüksək ixtisaslı mütəxəssislərin çatışmadığını qeyd etdi. Mən də daxil olmaqla pedaqogikaya dərin maraq göstərən 8 nəfər seçdi. Mehdi müəllim bizim hər birimizin hazırlığımızla ayrıca maraqlanır, tədqiqata qoşurdu. Həmin qrup axırıncı kursda Sabir adına pedaqoji məktəbdə üç aylıq pedaqoji

təcrübə keçdi. Bu təcrübə və xüsusi mühazirələr bizə çox şey verdi.

Tələbəlik illəri başa çatdı. Bizə təyinat verildi. Direktorumuz Cəfər Xəndan idi. Bölgüdə hər kəsin, əsasən, öz doğma kəndinə göndərilməsi nəzərdə tutulurdu ki, müharibədə canlarını qurban vermiş müəllimlərini əvəz etsinlər. Mənim növbəm gələndə Mehdi müəllim Quba Müəllimlər İnstitutuna göndərilməyimi tələb etdi.

Beləcə 8 nəfərin ikisi aspirantura üçün saxlandı, qalanları müəllimlər institutları və pedaqoji məktəblərə müəllimliyə göndərildi. Belə bir tədbirin həyata keçirilməsi həm də Mehdi müəllimin öz ixtisasını yüksək qiymətləndirə bilməsindən, onun nüfuzunu qaldırmaq istəməsindən irəli gəlirdi.

Mehdi müəllim maarif naziri olduğu dövrdə məktəblərin açılması, məktəb binalarının tikilməsi, onların müasir avadanlıqla təchizi, təlim-tərbiyə prosesinin elmi əsaslar üzrə təşkili sahəsində böyük işlər görmüşdü. Partokratiyanın, amirliyin hökm sürdüyü şəraitdə belə məsul vəzifə üçün Mehdi müəllim kimi layiqli kadrın seçilməsi onun pedaqogika elmini, təhsil sistemini nə qədər yaxşı bildiyini bir daha sübut edir.

Mehdi müəllim rəsmi dövlət xadimi, məmur deyil, alim-nazir idi. Onun nazirlik vəzifəsi öz qiymətini alimlik fondunda tapırdı. Bütün enerjisi və gərgin əməyi ilə o, çoxcəhətli və çətin işin öhdəsindən gəlir, həm də axtarışlara, tədqiqata vaxt tapırdı. Pedaqogika elminin müxtəlif sahələri üzrə yazıb-yaradırdı.

Mehdi müəllimin tədqiqatlarının özünəməxsus cəhəti nəzəri problemləri həyatla, məktəb təcrübəsi ilə məharətlə əlaqələndirə bilməsi idi. O vaxtlar kollegiyanın



iclaslarında qabaqcıl müəllim və məktəblərin təcrübəsi geniş müzakirə olunar və qiymətləndirilərdi.

Mehdi müəllim kollegiyadan bir-iki gün əvvəl həmin müəllim və məktəbin direktoru ilə saatlarla söhbət edərdi. Onların iş təcrübəsilə yaxından bələd olmağa çalışardı. Qabaqcıl müəllimlərlə belə ünsiyyəti onun “Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları” (1982) adlı kitabında özünü aydın göstərir.

Onun nazir olduğu 20 ildən artıq bir dövrdə məktəb haqqında üç mühüm qərar verildi və hər dəfə, demək olar ki, təhsil sistemi yenidən qurulmağa məruz qaldı,

1958-ci ildə məktəbin həyatla əlaqəsi ilə əlaqədar islahata başlayanda Mehdi müəllim mənə ibtidai təlimin məzmununu işləməyi tapşırdı. Bir müddətdən sonra hazırlayıb təqdim etdim. Mehdi müəllim tanış olub məni dəvət etdi, hal-əhval tutub dedi:

– Yaxşı hazırlamısan, gülüm, belə davam etdirmək lazımdır.

“Gülüm” sözü bir qədər əcayib səslənsə də, kiçik elmi işçi olan mənim üçün elə bil təhsil quruculuğuna, elm aləminə vəsiqə idi.

Yeri gəlmişkən qeyd edim ki, o vaxtlar respublikada ayrı-ayrı fənlərin tədrisi vəziyyətini yoxlayıb, müzakirə etmək və yaxşılaşdırılması üçün tədbirlər görmək dəb idi. Bunun vasitəsi ilə Mehdi müəllim təlimin məzmunu və vəziyyəti haqqında həmişə aydın təsəvvürə malik olurdu. Mehdi müəllim bu çətin prosesdə elmə söykənirdi.

Respublikada bir neçə ümumittifaq konfransı, onlarla respublika konfransı, bütün şəhər və rayonlarda elmi-praktik konfranslar, sessiyalar, seminarlar və pedaqoji mühazirələr təşkil edilirdi. Nəzəriyyə ilə təcrübənin,

elmlə-məktəbin belə əməkdaşlığı geniş müəllim ordusunun pedaqoji-psixoloji hazırlığını artırır, onları axtarışlara qoşur, şüurlu fəaliyyətə yönəldir və təlim-tərbiyə işlərinin keyfiyyətinin yüksəldilməsinə təsir göstərirdi.

M.Mehdizadə eksperimental tədqiqatın mahiyyətini dərk edən və ona şərait yaradan nazir olub desəm, səhv etmərəm. Onun nazir olduğu dövrdə yalnız ibtidai təhsil sahəsində dördillik ibtidai təlimdən üçillik təlim sisteminə keçilməsi, 6 yaşdan məktəbə hazırlıq siniflərinin açılması, 6 yaşdan təlimə başlanması, beşgünlük tədris həftəsi ilə işin təşkili və digər problemlər üzrə eksperimental tədqiqatlar aparılırdı. O, həmin tədqiqatların hər biri ilə maraqlanar, işin gedişi haqqında arayış tələb edər, göstəriş verər, həm də bilavasitə dərslərdə iştirak etməyə vaxt tapardı.

Yaxşı yadımdadır, 1968-ci ildə kollegiyada mənim hesabatımı dinlədikdən sonra məsələni yekunlaşdırarkən dərslərdə iştirak etmək istədiyini bildirdi. Bir neçə gündən sonra 18 nömrəli məktəbdə Səyyarə Quliyevanın, 31 nömrəli məktəbdə Hökumə Həsənovanın dərsində iştirak etdi.

Maraqlı burasıdır ki, o, həmin məktəbə görkəmli alimləri, maarif işçilərini, müəllimləri, pedaqoji mətbuatın rəhbərlərini də dəvət etmişdi.

Bir müddət müxtəlif məktəblərdə eksperimentin nəticələrini öyrəndikdən, müəllim və maarif işçiləri ilə razılaşdıqdan, həm də I sinif üçün mükəmməl tədris komplekti yaradıldıqdan sonra 1969-1970-ci dərs ilindən üçillik ibtidai təlim sisteminə keçilməsinə razılıq verdi.



Maarif sisteminin elmi idarəsi onun institutumuza münasibətində özünü aydın göstərirdi. Belə ki, hər ilin başlanğıcında institutumzda elmi işlərin istiqamətini bilavasitə özü ilə birlikdə müəyyənləşdirirdik. Tematik plan hazır olduqda nazirliyin bütün idarə müdirləri bir sifarişçi kimi onu nəzərdən keçirir, düzəlişlər verir, əlavələr edirdilər. Plan hamı tərəfindən bəyənildikdən sonra kollegiyanın təsdiqinə verilirdi.

İl ərzində institutun fəaliyyəti ilə əlaqədar bir neçə dəfə müzakirələr təşkil olunur, ilin axırında institutun hesabatı müzakirə edilirdi. Məhz belə nəzarət, qayğıkeşlik və köməyin nəticəsində hər il 20-25 adda təxminən 150 çap vərəqi həcmində pedaqoji ədəbiyyat nəşr olunub məktəblərə çatdırılırdı. O dövrdə ibtidai siniflər üçün 10 adda əyani vəsait və didaktik material buraxa bildik. Sonralar ehtiyacın artmasına baxmayaraq buna məhəl qoyan olmadı.

Əməyin elmi təşkili özünü onda göstərdi ki, Lipetsk, Rostov vilayətləri, Tatarıstan müəllimlərinin iş təcrübələrinin yayılması, intensivləşdirmə, proqramlaşdırılmış təlim, təlimin texniki vasitələrindən istifadə, problemli təlim və s. məktəblərimizə ayaq açmışdı. Həm də kor-koranə yox. O zamanlar həyatla əlaqə prinsipini nəzərə almaqla hər bir məktəb bir-iki problem üzərində işləyirdi. Bir sözlə, maarif aparatı elmi axtarışlar yolunda idi.

Mehdi müəllim nə qədər hazırlıqlı olsa da, başqaları ilə məsləhətləşməyi qəbahət hesab etmirdi. Akademik Əşrəf Hüseynov, Maqsud Cavadov, Əlisöhbət Sumbatzadə, Əbdüləzəl Dəmirçizadə, Feyzulla

Qasımzadə, Mirəli Axundov və başqaları ilə tez-tez görüşər, məsləhətləşər, kollegiya iclaslarına dəvət edərdi.

Mehdi müəllim nə qədər mehriban, mülayim idisə, o qədər də tələbkar idi. Elmdə, mətbuatda hər bir sözü ölçüb-biçməyi tələb edirdi. Yaxşı yadımdadır: 60-cı illərin əvvəllərində professor Yusif Talıbov məqalələrinin birində "görkəmli alim Yəhya Kərimov" sözlərini işlətmişdi. Məqaləni oxuyan Mehdi müəllim proqram-metodika idarəsinin rəisi İmran Məmmədovu çağırıb demişdi: "Yusif müəllimə çatdırın ki, Yəhya haqqında indi belə yazır, bir neçə ildən sonra hansı ifadələri işlədəcək?". O, özünə qarşı da tələbkar idi.

Mehdi müəllim məktəbin elmi idarəsini təmin etmək üçün pedaqoji mətbuatın gücləndirilməsinə ciddi fikir verirdi. O, "Azərbaycan məktəbi" jurnalına 8 əlavənin yaradılmasına nail oldu.

60-cı illərdə mən mətbuatda tez-tez çıxış edir, ibtidai məktəb müəllimləri üçün metodik məcmuənin çap olunmasının zəruriliyini əsaslandırmağa çalışırdım. 1969-cu ildə "Azərbaycan məktəbi" jurnalı mərkəzi komitə tərəfindən yoxlanırdı. Komissiyanın üzvlərindən biri də mən idim. Yoxlamanın nəticələri mərkəzi komitədə müzakirə olunanda Mehdi müəllim də iştirak edirdi. Mən çıxışımda üçillik ibtidai təlimə başladığımız dövrdə müəllimlərə kömək edə biləcək məcmuənin vacibliyini əsaslandırdım. Mehdi müəllim bu fikri müdafiə etdi. Elə oradaca "İbtidai məktəb və məktəbəqədər tərbiyə" məcmuəsinin nəşrinə dair qərar verildi və onun redaktorluğu mənə tapşırıldı. İki aydan bir 6 çap vərəqi həcmində nəşr olunan bu jurnal məktəb haqqında neçə qanun və islahatla əlaqədar müəllim və tərbiyəçilərə



istiqamət verdi, neçə-neçə maarifçi nəsillərin fəaliyyətinə kömək göstərdi.

Mehdi müəllim yüksək mənəvi keyfiyyətlərə malik olan, diqqətli, xeyirxah adam idi.

70-ci illərin əvvəllərində nazirliyin bəzi tapşırıqlarından imtina edib, doktorluq dissertasiyası müdafiə etməyə hazırlaşırdım. Proqram-metodika idarəsi isə məni tədris kompleksinin hazırlanması üzrə gərgin işə cəlb etmişdi. Mənim arzumu İmran Məmmədov nazirə çatdıranda o məni çağırıb dedi: "Məgər ibtidai siniflər üçün proqram, dərslik, metodik vəsait yazmaq alimlik deyil? Bu, doktorluqdan üstündür". Mənim deməyə sözüm olmadı. Sən demə, həmin sözlər Mehdi müəllimin yadından çıxmayıb.

1974-cü ildə işlərimiz başa çatandan sonra məni yanına çağırıb müdafiə işimin vəziyyətini xəbər aldı, çətinlik çəkdiyimi bilib, Moskvaya – Ali Attestasiya Komissiyasının sədri V.P.Yelyutinə məktub yazdı. Yalnız ondan sonra Bakı Universitetində ixtisasla bağlı müdafiə şurası təşkil etməyə icazə ala bildim.

Mehdi müəllim bir alim kimi əvəzsiz işlər görmüşdür. Onun rəhbərliyi və opponentliyi ilə onlarla gənc alim yetişdirilmişdir. O, Maarif Naziri kimi çoxcəhətli və ağır vəzifəni elmi axtarışlarla növbələşdirməyi bacarırdı.

Onun "Müasir dərsə verilən tələblər haqqında" kitabı 70-ci illərdə məktəblərimizdə təlim prosesinin təşkili sahəsindəki yeniliklərin təbliği və tətbiqi sahəsində mühüm rol oynadı.

"Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" əsəri (1982) daha böyük əks-

sәda verdi. Hәrtәrәfli inkişaf problemінә hәsr etdiyi kitab isә Moskvaya göndәrildi, tәәssüf ki, onun nәşrini görә bilmәdi.

Mehdi müәllim bir alim kimi keçmiş ittifaqın alimlәri tәrәfindәn sayılırdı. Bir neçә dәfә Moskvada Pedaqoji Elmlәr Akademiyasının yığıncaqlarında çıxışını dinlәmişәm. 70-ci illәrin axırlarında pedaqogika elminin inkişafının istiqamәtlәri geniş müzakirә obyektinә çevrilmişdi.

Bir dәfә akademiyanın geniş iclasında Mehdi müәllim Şәrq pedaqogikasında tәrbiyә problemlәri üzәrindә dayandı. O, Zәrdüştdәn üzü bәri Azәrbaycan vә ümumiyyәtlә, Şәrqin pedaqoji fikrindәn tutarlı misallar gәtirdi. Akademiyada isә bütün tәdqiqatların Qәrblә bağlı olduğunu qeyd etdi. Mehdi müәllimin çıxışı zaldakıların ağlına batdığından hamı heyrәtlә qulaq asırdı. Sonra çıxış edәn akademik Әziz İzmaylov Mehdi müәllimin ideyalarını tәsdiq edәn vә genişlәndirәn faktlarla dinlәyicilәrә müsbәt tәsir göstәrdi.

Hәlә o zaman bizim milli mәnliyimiz, islam dәyәrlәrindәn istifadә mövqeyindә dayanan Mehdi müәllim tәqaüdә çıxdıqdan sonra institutumuzda elmi mәslәhәtçi kimi fәaliyyәt göstәrәndә hәmin ideyaları inkişaf etdirdi. İnstitutumuzun hazırladığı vә Moskvada çap etdirdiyi "Azәrbaycan pedaqoji fikir antologiyası" kitabına qәdim dövrdә pedaqoji fikirlәr üzrә xeyli material verdi.

O, milli pedaqogikanın yaradılması sahәsindә fәaliyyәtimizi bәyәndi vә bu prosesdә fәal iştirak edәcәyini bildirdi. Tәәssüf ki, ömür buna macal vermәdi.



Mehdi müәllim ömrünün axırınadәk institutumuzda fәaliyyәt göstәrәn vә özünün rәhbәr olduğu elmi seminarda vaxtaşırı çıxış edәr, gәnc alimlәrә mәslәhәr verәrdi.

Mehdi müәllim hamıya mәslәhәt verdiyi kimi, başqalarını dinlәmәyi, onların fikirlәrini qiymәtlәndirmәyi dә xoşlayırdı. 1966-1967-ci dәrs ilindә üçillik ibtidai tәlim sistemi üzrә eksperiment başa çatdıqda Mehdi müәllim mәni mәslәhәtә çağırdı. O, xüsusilә şagirdlәrin biliyinin qiymәtlәndirilmәsi vә III sinifdә tarix fәnninin tәdrisi haqqında fikrimi öyrәnmәk istәyirdi. Mәn belә fәnnin üçüncülәrin tәfәkkürünә uyğun olmadığını, eksperimentin yaxşı nәticә vermәdiyini vә qiymәtlәndirmәdә dәyişikliyin uğursuzluğunu, kütlәvi tәtbiqinin zәrәrini әsaslandırdım. Kollegiyanın qәrarı ilә 20 mәktәbdә III sinfi bitirәnlәr V sinfә keçirildilәr. İbtidai siniflәrdә biliyi qiymәtlәndirilmәyәn bu uşaqlar tәhsili 9 ildә başa vurdular. Lakin kütlәvi şәkildә üçillik tәlimә başlananda tarix fәnni lәvğ edildi vә şagirdlәrin biliyinin әnәnәvi qaydada qiymәtlәndirilmәsi mәslәhәt görüldü.

Nazir Mehdizadә ilә ünsiyyәtdә olmaq ona görә xoş idi ki, o, hәr şeyi bilirdi. Bu vә ya digәr problemlә әlaqәdar irәli sürdüyün ideyanı dәrhal tutur, dәrin elmi diskusiyaya girişir vә onu inkişaf etdirirdi. O öz ideyaları, faktları ilә qarşısındakının dedikәrini zәnginlәşdirir, problemin elmi әsaslarla hәlli üçün zәmin yaradırdı. Mәn yalnız sonralar başqa nazirlәrlә ünsiyyәt zamanı Mehdi müәllimi bәzәn düzgün qiymәtlәndirә bilmәdiyimiz üçün xәcalәt hissi keçirirdim.

Mehdi müәllimin alimlәrә, bizim institutumuza münasibәti çox yaxşı idi. Onun qapısında saatlarla

gözlədiyimiz vaxt olmazdı. 70-ci illərdə bir dəfə xəbər verdilər ki, nazir məni görmək istəyir. İki gün ərzində nazirliyə bir neçə dəfə getdim, lakin hər dəfə Mehdi müəllimin "yuxarıda" olduğunu söylədilər. Bir dəfə də yeni katibəsi bildirdi ki, ciddi işlə məşğuldur. Deyib ki, heç kəsi qəbul etməyəcəyəm. Mən geriyə döndüm. Daha bir gün belə keçdi.

Üçüncü gün proqram və metodika idarəsindən zəng edib, gəldiyimi bildirdim. Katibəyə yaxınlaşan kimi məni dərhal içəri buraxdı. Mehdi müəllim çox narazı halda dedi: "Nə cəld gəlmisən?". Mən iki gün özünün nazirlikdə olmadığını, iki gün isə katibənin məni buraxmadığını bildirəndə elə bil dolmuş bulud birdən-birə boşaldı. Çöhrəsindəki narazılıq yoxa çıxdı, gülümsədi və dedi: "Elə hər yetən istədiyi vaxt içəri girəcəksə, daha mən nə nazirəm?". Bu sözləri deyib qurtarmamış barmağını zəngin düyməsinə basıb katibəni çağırdı. Yenidən ciddi görkəm alıb dedi: "Mən sizə demişəm ki, işim çoxc olduğundan kənar adamları yanıma buraxmayın. Axı Yəhya müəllim bizim əməkdaşımızdır".

Təkcə mənə deyil, məktəbə az-çox fayda verən alimlərin hamısına münasibəti belə idi. O dövrdə mənim iş vaxtımın təxminən yarısı nazirlikdə keçərdi.

Öz ağılları ilə deyil, ətrafdakı əsabələrinin, təhsil sisteminə, millətə xəyanət edən çoxüzlülərin "köməyi" ilə idarə olunan, məktəbdən, təhsil sisteminin problemlərindən çox-çox uzaq olan sonrakı nazirlərin, xüsusilə təsadüfən nazir kreslosuna əyləşən Müslüm Məmmədovun və Rafiq Feyzullayevin qəbuluna düşmək isə müşkül məsələ idi.



M.Məmmədovun dövründə Zaqatala müəllimləri tərəfindən VII müəllimlər qurultayına nümayəndə seçilmişdim. Qurultay təxirə salındı və bir qədər sonra qurultaya bərabər konfrans keçirildi. Lakin məni nəinki konfransa nümayəndə seçmədilər, hətta adicə müşahidəçi kimi də dəvət etmədilər. Çağırılmamış qonaq kimi konfransda iştirak etdim, zaldan nazirlə dialoqa girdim və onun gülünc vəziyyətə düşməsinin şahidi oldum.

Bir dəfə mühüm elmi problemlə əlaqədar R.Feyzullayevin qəbuluna getdim. Özümü Məmməd adlı köməkçisinə təqdim etdim, gəlişimin məqsədini xəbər verdim. O bildirdi ki, yalnız institutun direktoru Z.Qaralov zəng vurandan sonra adımı qəbula gələnlərin siyahısına daxil edə bilər.

Həmin gün nazirlikdən üz döndərməli oldum və Feyzullayev nazirlik kreslosunu tərk edənədək (tam 3 il yarım) ayağımı oraya basmadım. Onun və ondan əvvəlki nazirlərin layiq olmadıqları halda əməkdar elm xadimi adı aldıqlarını eşidəndə bir daha Mehdi müəllimin ləyaqəti qarşısında baş əydim.

Mehdi müəllimin böyüklüyü onda idi ki, o sadə, təvazökar, xeyirxah və həssas idi.

Mehdi müəllimin böyüklüyü onun şəxsiyyəti yüksək qiymətləndirə bilməsində idi. Təhsil Naziri üçün birinci dərəcəli şərt məhz budur.

Mehdi müəllimi bir alim kimi yaddaşa həkk edən ömrünün axırınadək əqidəsini dəyişmədən yaradıcı fəaliyyət göstərməsi idi. Son günlərinədək nitqi, təfəkkürünün itiliyi, məntiqi, alimlik etikası onu tərk etmədi.

O, mehriban, diqqətli, qayğıkeş ailə başçısı kimi, yüksək insani keyfiyyətlərə malik ədalətli bir şəxs kimi, görkəmli dövlət xadimi kimi, müdrik alim kimi, təhsilə yanar qəlbli bir vətəndaş kimi yaşadı. Ruhu şad olsun, əziz müəllimimizin, əziz ustadımızın!





# O MÜDRİK ŞƏXSİYYƏT, XALQ MAARİFİNİN ƏSL FƏDAİSİ İDİ

*ƏZİZ ƏFƏNDİZADƏ,*

*Pedaqogika üzrə elmlər doktoru, professor, Azərbaycan Respublikasının əməkdar müəllimi*

Mehdi müəllimi ilk dəfə 1948-ci ilin yayında gözəl istirahət guşələrindən biri olan Altıağacda görmüşdüm. Ailələrimizin icarəyə götürdükləri evlər lap bir-birinin yaxınlığında idi. O zaman mən universitetin üçüncü kursunu bitirmişdim. Atamla dostluq əlaqələri olduğunu çox eşitmişdim. Tanışlığımızın ilk günlərindən çox ağır oturub-duran, mötəbər və əsl ziyalı mədəniyyəti ilə fərqlənən alim olduğunu hiss etmişdim. Hər gün səhərlər idmanla məşğul olardı. Sonra isə bütün gününü kitab, jurnal oxumağa, qeydlər götürməyə sərf edərdi. Yalnız axşam tərəfi hərdən gözə görünərdi. Təsadüf elə gətirdi ki, Mehdi müəllimdən iki gün sonra atam da ailəsinə baş çəkməyə gəldi. Həmin gündən bir-birinə həmsöhbət oldular.

Gün batandan sonra biz cavanlar, uşaqlar yaxındakı talaya toplaşıb şənlik edərdik. Mehdi müəllim və atam Rəcəb əfəndi də orada bir tərəfə çəkilib göy otların üstündə dirsəklənərək oturar, hey söhbət edərdilər. Axı atam da tanınmış pedaqoqlardan idi. Görünür, buna görə də söhbətləri tuturdu. Biz onlara mane olmamaq üçün yaxınlaşmazdıq. Lakin nə barədə danışdıqları məni çox maraqlandırırdı.

Bir dəfə axşam evə qayıdanda atamdan soruşdum: "Siz nə barədə bu qədər şirin söhbət edirsiniz?" Atam dedi: "Heç, dərdləşirik, maarifin dərdlərindən danışırıq". Sonra əlavə etdi: "Mehdi çox yaxşı alimdir. Elmi də yaxşı bilir, maarifin dərd-sərini də..."

Mehdi müəllim sürətlə yüksəldi. Maarif naziri oldu, akademik seçildi, şöhrəti respublikamızın sərhədlərindən çox-çox kənarlara yayıldı. O, xalq maarifinin elmi əsaslar üzərində idarə olunması və inkişafını başlıca məqsəd kimi qarşıya qoyub, bu böyük və çətin yolda dürlü müvəffəqiyyətlər qazanılmasına təkan verdi. Təəssüf ki, maneələr çox olurdu. Lakin "yuxarıdan" gələn diktələr onun iradəsini qıra bilmirdi. Çəkişmələr, mübarizərələr əsəblərini tarıma çəksə də, öz mövqeyində qranit bir qaya kimi möhkəm dayanırdı. Həmişə başını dik tutması Mehdi müəllimin ən güclü silahı olan büllur kimi təmizliyi idi. "Qızıl palçığa da düşsə, parıldar" – deyiblər. O dövrlərin çirkabında Mehdi müəllim öz hünəri və saflığı ilə xalq kütlələrinin böyük nüfuzunu qazanmışdı. Doğrusu, çoxları təəccüb edirdilər ki, nə əcəb Mehdi müəllim nazir ola-ola zəmanəyə uyğunlaşa bilmir. "Palaza bürünüb elnən sürünmək" istəmir. Bəli, "yuxarılarda" oturanların bir çoxuna bu, heç də xoş gəlmirdi.

Mehdi müəllimin böyüklüyünü, ideal bir şəxsiyyət olduğunu mən Elmi-Tədqiqar Pedaqoji Elmlər İnstitutunda elmi işçi vəzifəsində işlədiyim dövrlərdə daha aydın duyub hiss etmişdim.

Altıağacdakı tanışlığımdan xeyli illər keçmişdi. Bir gün mənə də xəbər çatdırdılar ki, Mehdi müəllimin çağırdığı bir müşavirədə iştirak etməliyəm. Çox sevindim, lakin həyəcan keçirirdim ki, görəsən məni tanıyacaqmı?



Müşavirə günü dəstə ilə nazirin kabinetinə daxil olduq. Mehdi müəllim kürsüsündən irəli çıxıb hamı ilə bir-bir görüşərdi. Mənim də əlimi sıxdı. Lakin tanıyıb-tanımadığını heç hiss etdirmədi. Qət etdim ki, çoxdan yadından çıxmışam. Onun bu "yaddaşsızlığı" məni təəccübləndirmiş və ürəyimdə iz salmışdı. Sonrakı illərdə dəfələrlə, özü də saysız-hesabsız görüşlərimiz, ünsiyyətimiz olmuşdu. Hətta məni təklikdə də qəbul etmişdi. Bir dəfə də olsun üstünü vurmamışdı ki, mən onun köhnə dostlarından birinin oğluyam. Yalnız ömrünün son illərində bizim institutda elmi məsləhətçi işlədiyi dövrdə ikilikdə söhbətimiz zamanı ona xatırlatmaq istədim ki, mənim atam da pedaqoq olub. Gülümsəyərək sözümü kəsdi: "Məgər mən bunu bilmirəm? Rəcəb əfəndi çox mahir bir müəllim və dərin bilikli pedaqoq alim idi", – dedi. Mehdi müəllimin xasiyyəti belə idi ki, heç kəsə xidməti vəzifəsində fərq qoymazdı. Hamıya bir gözlə baxardı. O, ömrü boyu bu prinsipə əsaslanıb ki, hər kəs öz qabiliyyətinə, bacarığına görə öz yerini tapmalıdır.

Mehdi müəllimin həyat tərzindən xəbəri olmayanlar təsəvvürlərinə gətirə bilməzdilər ki, o, dövlət xadimi olmasına, imkanlar dənizində üzməsinə baxmayaraq, çox sadə bir həyat sürüb. Təsadüf belə gətirmişdi ki, bir dəfə onun ünvanını öyrənib evlərinə getməli olmuşdum. Güman edirdim ki, "nazirlərə layiq" təmtəraqlı bir binada yaşayır. Öyrənəndə ki, evləri İçəri şəhərdəki köhnə binalardan birindədir, təəccüb etdim. Nə isə... Dolam-dolamac dəhlizlərdən keçib mənzillərini tapdım. Qapını açan həyat yoldaşı məni çox səmimi qarşılayıb içəri dəvət etdi. Otaqlarında nə parıldayan parket gördüm, nə də müasir tipli mebellər. Nuh əyyamından qalmış adi bir

bufet, köhnə şkaf, köhnə divan... Doğrusu, görüb eşitdiyim nazir təmtərağından heç bir nişanə gözümə dəymədi. Lakin Mehdi müəllim mənim gözlərimdə daha da böyüdü, daha da ideallaşdı...

Halallıqla yaşamaq onun həyat devizi idi. Heç vaxt heç yerdə ona təmtəraqlı hörmət göstərilməsinə yol verməzdi. Xatirimdədir ki, bir dəfə Vartaşenə (Oğuz) ezamiyytə getmişdim. Mehmanxanaya düşəndə dedilər ki, Mehdi müəllim də buradadır, bir azdan Qutqaşenə (Qəbələyə) gedəcək. Yerini öyrənib binanın həyətinə çıxdım. Gördüm ki, Mehdi müəllim skamyada əyləşib kimlərləsə söhbət edir. Qarşısındakı balaca stolun üstündə kəsilmiş qarpız dilimləri vardı. Görüşdüm, yer göstərdi, əyləşdim, gəlişimin məqsədini soruşdu. Konfransda iştirak etməyə gəldiyimi bildirdim. Bəzi məsləhətlər verdi, sonra o biri yoldaşlarla söhbətini davam etdirməyə başladı. Bu arada RXMŞ-nin müdiri Əbülfət Aslanov qulağıma pıçıldadı: "Mehdi müəllimi heç cür şama qonaq olmağa razı sala bilməmişik. Mehmanxananın bufetində özü şam yeməyini yeyib. Bir təhər icazəsini almışıq ki, heç olmazsa, bir qarpız kəsməyimizə razılıq versin. Sağ olsun ki, xahişimizi yerə salmayıb". Əbülfət müəllimin mənə nə dediyini hiss edən Mehdi müəllim qarpız dilimlərindən birini qabağıma çəkib yeməyimi təklif etdi. Razılığımı bildirib ayağa durdum və yanındakılarla rəsmi söhbətinə mane olmamaq üçün üzr istəyib ayrıldım.

Aqillər gözəl deyiblər ki, hər kəsin öz xalqına, torpağına olan məhəbbəti onun öz dilinə olan məhəbbətindən ayrılmazdır. Mehdi müəllimdə bu keyfiyyət yüksək bir zirvəyə qalxmışdı. Xalq maarifinə rəhbərlik etdiyi dövrlərdə o, təhsil sisteminin bütün



şəbəkələrində ana dili – Azərbaycan dili təliminin keyfiyyətini yüksəltmək işinə böyük diqqət yetirirdi. O, hər şeydən əvvəl, buna qəti şəkildə inanmışdı ki, ana dili təlim fənlərinin əsasında durur: şagirdlərin digər fənlərdən də müvəffəqiyyəti onların öz ana dilini nə dərəcədə bilmələrindən asılıdır. Buna görə də Azərbaycan dilinin təlimi problemləri ilə müntəzəm məşğul olurdu. Mehdi müəllim ixtisasca riyaziyyatçı olmasına baxmayaraq, Azərbaycan dilini, onun inkişaf xüsusiyyətlərini o dərəcədə dərindən bilirdi ki, buna qibtə etməmək olmazdı. Həmişə ona minnətdar olmuşam ki, Azərbaycan dilinin təlimi ilə əlaqədar bütün problemlərin həllində mənim fəal iştirakıma şərait yaradıb. Bəzən ciddi mübahisələrimiz də olurdu. Lakin sonralar həmişə bu qənaətə gəlirdim ki, Mehdi müəllimin mülahizələri həqiqətə daha yaxındır. O, metodist alimlərin aprior fikirləri ilə heç vaxt razılaşmazdı. Faktlara əsaslanmağı başlıca şərt hesab edərdi. Buna görədir ki, proqnozlaşdırmaya keçməzdən əvvəl, məktəblərdə ana dili təliminin vəziyyətini dərindən öyrənməyi tövsiyyə edirdi.

Xatirimdədir ki, 70-ci illərdə metodistlərdən bir qrupunu müxtəlif rayon məktəblərində Azərbaycan dili təliminin vəziyyətini öyrənmək işinə cəlb etmişdi. Bir neçə rayon məktəblərindən zəngin faktlar toplamışdım. Hamımızı bir-bir dinləyib yalnız faktlardan ümumiləşdirilmiş nəticələr çıxarmağa səy göstərirdi. Mən hesabat verərkən belə bir fakti onun nəzərinə çatdırıb əsaslandırmağa çalışdım ki, müəllimlərdən bir çoxu, hətta bəzi rayonların böyük əksəriyyəti şagirdlərin yazı işlərinə bəzən qeyri obyektiv olaraq aşağı qiymətlər verirlər. Mənim bu sözlərimdən təəccüblənib, adəti üzrə çeşməyini

gözündən çıxardı. Axı ona həmişə məlumat verilib ki, müəllimlər şişirdilmiş qiymətlər yazırlar. Mənim gətirdiyim fakt isə bunun tamamilə əksinə idi. Mehdi müəllimi fikir götürdü, gətirdiyim konkret faktları götür-qoy etdi və dedi: "Bu, çox maraqlı məsələdir. Gəl sən bu faktlarınla "Azərbaycan müəllimi" qəzetində bir neçə məqalə ilə çıxış elə". Telefonun dəstəyini götürüb oradaca qəzetin redaktoru ilə danışdı. Bir neçə gündən sonra qəzetin səhifələrində dalbadal iki geniş məqaləm dərc olundu.

Ümumiyyətlə, Mehdi müəllim təlim və onun idarə olunması problemlərinin həllində elmiliyə xüsusi diqqət yetirərdi. Bunun üçün mütəxəssis alimlərlə söhbət aparmağa, məsləhətləşməyə, demək olar ki, hər gün az-çox vaxt ayırmağa vacib bir ehtiyac kimi yanaşardı.

Mehdi müəllim haqqında düşünərkən onun hələ ömrünün yarı yolunda atamın dediyi "Mehdi çox yaxşı alimdir. Elmi də yaxşı bilir, maarifin dərd-sərini də" sözləri hər dəfə qulaqlarımda səslənir. Ötüb-keçən sonrakı illər isə bunu qətiyyətlə sübut etdi ki, akademik Mehdi Mehdizadə Azərbaycanda xalq təhsilinin inkişafına böyük töhfələr verən əvəzsiz bir alim, xalq maarifinin əsl fədaisi və sərkərdəsi kimi müdrik və unudulmaz şəxsiyyətlərdən biri olmuşdur.





# DƏDƏ PEDAQOQ, ULU ŞƏXSİYYƏT

*ƏLİHEYDƏR HƏŞİMOV,*
*Pedaqogika üzrə elmlər doktoru, professor, akademik Mehdi Mehdizadə adına mükafat laureatı*

Elə adamlar var ki, onların şəxsiyyəti günəş timsalıdır: günəş bütün aləmə nur saçır, amma heç kimdən təşəkkür istəmir. Akademik, pedaqoji elmlər doktoru, professor Mehdi Məmməd oğlu Mehdizadə də belə müqəddəs şəxsiyyətlərdən idi. O hamıya səxavətliydi, imkanı daxilində hamıya kömək göstərirdi, əvəzində isə heç kəsdən səvaxət, yardım ummazdı. Onun alimlik səriştəsini, şəxsi ləyaqətini, hüsni-əxlaqını, insaniyyətini, maarif və mədəniyyət yolundan xidmətlərini xatırlayanda Şəhriyarın aşağıdakı beyti yada düşür:

"Bir ömür nədir ki? – Bir əsim külək.
İnsana on ömür, yüz ömür gərək!"...

Doğrudan da, Mehdi müəllim on ömür, yüz ömür yaşamalı insan idi. Yaşaya da bilərdi, çünki çox gümrah, qıvraq, sağlam idi. Ancaq qoymadılar. Heyf, min heyf! Təsəlli verən budur ki, Mehdi müəllim elə "bir əsim küləyi" andıran bircə ömründən də xalqı üçün "on ömürlük, yüz ömürlük" iş gördü: bir alim kimi neçə-neçə fundanmental əsərlər yazdı, onlarla elmlər namizədi, elmlər doktoru yetişdirdi; bir nazir və ictimai xadim kimi respublikamızın müxtəlif bölgələrində məktəb və məktəbəqədər tərbiyə müəssisələri şəbəkəsinin genişləndirilməsinə, yeni-yeni təlim-tərbiyə ocaqlarının yaradılmasına nail oldu. Günəş qəlbli bir kişi kimi yüzlərlə adama əl uzatdı – yol göstərdi, ehtiyacı olanlara

yardımını əsirgəmədi, şəxsi keyfiyyətləri, qabiliyyəti, istedadı və bacarığı ilə ardıcıllarına örnək oldu; Azərbaycanda saysız-hesabsız pedaqoji məsələlərin həllində aparıcı rol oynadı... Bu xidmətləri saymaqla qurtarmaq olar? Çətin, çox çətin! Mehdi Mehdizadənin ictimai-siyasi və elmi-pedaqoji fəaliyyətini dolğun əks etdirmək üçün dərin araşdırmalar aparmaq, cild-cild kitablar yazmaq gərəkdir. Hazırda bu istiqamətdə müəyyən işlər görülür və görüləcək də. Buna zərrə qədər də şübhəm yoxdur. Odur ki, mən bu qısa xatirələrimdə mərhum professorun çoxşaxəli fəaliyyətini deyil, xarakterinin bəzi xüsusiyyətlərini, o cümlədən şəxsən mənimlə bağlı münasibətinin bir sıra cəhətlərini qeyd etməklə kifayətlənirəm. Öncə Mehdi müəllimlə ilk əyani tanışlığım barədə:

1953-cü ildə mən Nuxa (indiki Şəki) ikillik müəllimlər institutunda baş müəllim və kafedra müdiri vəzifəsində işləyirdim. Həmin il Azərbaycan ETPEİ pedaqogikanın nəzəriyyəsi və tarixi ixtisası üzrə aspiranturaya müsabiqə elan etmişdi. Mən də sənədlərimi göndərdim. Oktyabr ayında imtahana çağırılanda öyrəndim ki, cəmi bir yerə məndən başqa 10-12 nəfər də sənəd təqdim edib və onlardan biri Respublika Maarif Nazirliyində, qalanları isə Bakıda müxtəlif ali təhsil müəssisələrində çalışır.

İmtahanlar başladı. Sonuncu imtahana yüksək bal toplamış ikicə nəfər qaldı. N.M.Kazımov və mən. Bu imtahanda professorlar Ə.Y.Seyidov, professor B.B.Komarovski, dosent M.Ə.Muradxanov, bir də institutun direktoru və partiya təşkilatı katibi iştirak edirdilər. Hər ikimizi dərindən-dərinə yoxladılar. Çünki



ikimizdən biri qəbul olunmalıydı. Bu komissiya da hər ikimizin cavabını yüksək qiymətləndirdi və yaranmış vəziyyət barədə Maarif Naziri M.M.Mehdizadəyə məlumat verdi. Son sözü o deməliydi. Mehdi müəllim bizimlə çox səmimi şəkildə görüşdü, əyləşmək üçün yer göstərdi, sonra özünəməxsus ustalıqla bizi "yoxlamadan" keçirdi: "Son illərin pedaqoji mətbuatında hansı mövzularda müzakirələr aparılır? Kimlər bu müzakirələrdə iştirak edirlər və nə kimi fikirlər söyləyirlər? Həmin məsələlərə sizin mövqeyiniz necədir? Klassik və müasir görkəmli pedaqoqlardan kimlərin hansı əsərləri ilə tanışıq..." və s.

Yoxlama – söhbət bu qəlibli suallar ətrafında keçdi və bir saata qədər davam etdi. Axırda Mehdi müəllim razı halda ayağa qalxdı, ikimizin də qəbul olunacağını bildirərək əlimizi sıxdı – bizi səmimi təbrik etdi...

Nazirimizlə ilk əyani tanışlığımız belə başladı. Sonrakı illər ərzində o mənim fəaliyyətimi həmişə qayğıkeşliklə izlədi, məni daim çalışmağa, nailiyyətlər qazanmağa səslədi, uğurlarıma sevindi. Bu münasibəti mən bayramlar ərəfəsində yazdığım təbrik məktublarıma aldığım cavablardan da açıq-aydın sezirdim: "...Əliheydər müəllim, işin nə vəziyyətdədir? Nə zaman müdafiə etmək fikrindəsən?... Sizə dəyərli nailiyyətlər arzulayıram: Qoy qarşıdan gələn il işinizdə, o cümlədən dissertasiyanı tamamlamaqda yeni nailiyyətlər ili olsun!" və s. və i.a.

Mehdi müəllim mənim həm namizədlik, həm də doktorluq əsərlərimin müdafiəsində birinci rəsmi opponentim olubdur. Onun qayğıkeşliyini çətin günlərimdə daha bariz şəkildə hiss etmişəm. Çoxlarının bildiyi kimi, Böyük Vətən müharibəsi illərində mən

əsgərlikdə olarkən Sovet quruluşunun bəzi eybəcərliklərini söhbət əsnasında dilə gətirdiyim üçün ömrümün beş ilini həbsdə keçirməli oldum. Sonralar tam bəraət aldığımdan bu faciəni tərcümeyi-halımda yazmağa lüzum görmədim. Həmin “qəbahətimə” görə 1972-ci ildə məni Sov.İKP üzvlüyündən xaric etdilər, vəzifədən çıxartdılar, yazı-pozuma “veto” qoydular. O zamanlar çoxları mənimlə salamlaşmağa da cürət etmirdi. Həmin ağır illərdə mənimlə əlaqəni kəsməyən, əvvəlki səmimi münasibətini davam etdirən, bütün məktublarında “mənim yüksək mənalı arzuma çatmağımı”, yəni nüfuzumun bərpa edilməsini, fəaliyyət və yaradıcılığımın üzərindən “veto”nun götürülməsini ürəkdən diləyən, məni dözümlülüyə, təmkinli-səbirli olmağa çağıran dörd-beş nəfər mötəbər alimlərdən biri də məhz Mehdi müəllim olmuşdur. Qalanlarının (məsələn, professor Məmmədəli Məhərrəmovun, professor Nurəddin Kazımovun və b.) böyük vəzifələri olmadığı üçün itirəcəkləri bir şey yox idi. Mehdi müəllim isə nazir vəzifəsində çalışırdı. Partiyadan kənar edilmiş bir şəxslə (mənimlə) səmimi əlaqə saxladığına görə o, vəzifəsini itirər və rəsmi dairələrdə tənqid hədəfinə çevrilə bilərdi. Bunu özü də dərk etməsinə baxmayaraq, Mehdi müəllim həmin illərdə də məktublarının ardını-arasını kəsmədi. Hər dəfə xoş sözlərlə məni və ailəmi ovundurmağa çalışırdı. “Hörmətli Əliheydər müəllim! Əziz bayramlar münasibətilə Sizi və ailənizi səmimiyyətlə təbrik edir, Sizə möhkəm cansağlığı, yaradıcılıq nailiyyətləri, həmçinin məlum mənada ictimai-siyasi nailiyyət arzulayıram. Hər yeni ilin bir və ya bir neçə yeniliyi olur. Bu yeni ildə arzularımıza çatmağı, yeni



nailiyyətlər qazanmağı arzu edirəm! Hörmətlə Sizin Mehdi müəllim. 27.02.1981”.

“Əziz Əliheydər! ... Yeni 1983-cü ilin yaxınlaşması münasibətilə Sizi ürəkdən təbrik edirəm. Adamda çox arzu olar. Sizin arzularınız içərisində başlıcası mənə məlumdur. Arzu edirəm qarşıdakı yeni ildə bu arzuya – bərpa olmağa – nail olasınız. Elimizə çox xeyir vermisiniz, daha çoxunu gözləyirik. Hörmətlə Mehdi müəllim, 22 dekabr, 1982-ci il” və s. Hər Novruz bayramı və Yeni il ərəfəsində Mehdi müəllimdən aldığım xoş arzularla dolu belə məktublar bütün ailəmizin dərdinə məlhəm olar, bizə nikbin ovqat bəxş edərdi. Tək bircə dəfə Bahar bayramı münasibətilə göndərdiyim məktub ona vaxtında çatmadığı üçünmü, ya nədənsə cavabsız qalmışdı. Bunu mən növbəti bayram ərəfəsində göndərdiyim məktubda: “Olmaya Siz də məndən yan qaçırsınız?” şəklində eyhamla bildirdim. Həmin məktuba aldığım cavabda deyilirdi: “Möhtərəm Əliheydər müəllim! Təbrik məktubunuzu aldım, minnətdaram. Bayram münasibətilə Sizi təbrik edir, ailəlikcə Sizə xoşbəxtlik arzu edirəm. o ki, qaldı mənim “Sizdən yan qaçmağım”a, belə bir sifət ümumiyyətlə məndə yoxdur və olmamışdır. Əlimdən gələn köməyi, özünü mənə yaxın hesab etməyənlərə də göstərməkdən əsirgəməməyi üstün tutmuşam. Məktubunuzdan pessimistlik əhval-ruhiyyəsi duyulur. Onu məsləhət görmürəm. Hörmətlə Mehdi müəllim!”.

Mehdi müəllim təkcə mənim yox, başqalarının da dərdinə-qəminə şərik çıxan, yüksək vəzifəsini də itirməkdən çəkinməyən belə sədaqətli qənimət adamlardan idi. Sadiqlik onu daha da ucaldırdı.

Mehdi müəllimi yaxından tanıyan hər kəs yaxşı bilir ki, o, büllur kimi saf, peyğəmbər kimi pak və halal, özü doğru, sözü doğru, nəfsi təmiz, əməlləri düz, yalan sözlərdən uzaq bir şəxsiyyət idi. Bu sifətlərin çoxu onun ailə üzvləri üçün də səciyyəvi idi.

"Mehdizadələr" üçün "düzlük" anlayışının çoxlarına qəribə gələn bir çaları var. Fikrimi bir faktla açıqlayım: Gəncə Pedaqoji İnstitutunun prefossoru olduğum illərdə bir dəfə Bakıya gələrkən Mehdi müəllimin adına Gəncə nemətlərindən kiçik bir sovqat düzəldib gətirdim. Özü evdə yox idi. Qapını Lətifə xanım açdı. Salamlaşdıq, içəri dəvət etdi. Vaxtım məhdud olduğu üçün zənbili verib qayıtmaq istədim. Lətifə xanım amiranə səslə: "Görünür, siz Mehdi müəllimi yaxşı tanımırsınız. O belə şeyləri sevmir" – dedi. "Burada elə bir şey yoxdur, Lətifə xanım, – dedim, sadəcə olaraq professoru Gəncə qaymağına, Gəncə göy-göyərtisinə qonaq etmək istəyirəm". Lətifə xanım dediyindən dönmədi. Nə illah etdim bir şey alınmadı. Əlacım kəsildi, zənbili götürüb onlardan azca aralıda yaşayan Mərdan müəllimgilə getdim və əhvalatı ona da danışdım. Mərdan müəllim gülə-gülə: "Bu, bizim qismətimiz imiş, dedi: – sağlığına biz yeyərik". Həmin hadisədən illər keçdi. Mehdi müəllim 1 nömrəli xəstəxanada yatırdı. Bir qrup yoldaşla (Y.Kərimov, Ş.Mikayılov və V.Xəlilov) birlikdə ona baş çəkməyə getdik. Könlünü açmaq üçün ordan-burdan söz saldıq. Lətifə xanım da oradaydı. Mən bu əhvalatı olduğu kimi Mehdi müəlimə nəql etdim və "bax, Sizin bu hörmətli xanımınız o zaman məni beləcə qarşıladı", – dedim. Mehdi müəllim təsviri izaha gəlməyən bir tərzdə qəh-qəhə çəkib güldü. Sadəliyi, səmimiliyi bir daha nəzərə çarpdı.



Mehdi müəllim zəhmətsevərliyi, mütaliəçiliyi, təvazökarlığı, müəllimanəliyi, çox məsələlərdə həmkarlarını qabaqlaması baxımından da fərqlənirdi. "İş insanın cövhəridir" deyibdir atalar. Çox güman ki, onlar tarix boyu məhz Mehdi müəllim kimilərinin fəaliyyətini müşahidə etmək nəticəsində belə qənaətə gəliblər.

Xəmiri zəhmətdən yoğrulmuşdu Mehdi müəllimin! Sükunəti ölüm, çalışmağı, mütaliəni isə həyat mənbəyi kimi qiymətləndirirdi Mehdi müəllim! Nə qədər ki, ürəyi döyünürdü, nə qədər ki, nəfəsi var idi, "beş dəqiqə vaxt tapanda" da oxumaqla, yazmaqla məşğul olurdu o. Budur həmin həqiqəti təsdiqləyən sətirlər: "Əzizim Əliheydər, bayram günlərində şirin sözlər və xoş arzularla dolu məktublarınızı alıram, cavabını isə "simşiz teleqrafla" qeyd etməyi unutmuram. Sağ olun! Lakin həmişə cavab verməyə, inanırsınız ki, vaxt "çatmır". İndi buna imkan olmadığını bilirsiniz. Evdə isə beş dəqiqə tapanda başım ya oxumağa, ya da yazmağa qarışır.

Sağlıq olsun, necə deyərlər görək axırı necə olacaq. Xoş arzularla: Sizin Mehdi müəllim. I.II.1977-ci il"...

Vaxtının çox azlığına və işinin son dərəcə gərginliyinə baxmayaraq, Mehdi müəllim gənc nəslin təlim-tərbiyəsilə bağlı olan hər şeylə ciddi maraqlanır, vəziyyəti düzgün istiqamətləndirməyə çalışırdı. Əyani olmaq naminə bir əhvalatı dilə gətirmək istəyirəm: görüşlərimizin birində Mehdi müəllim fikirdən qaşları çatılmış vəziyyətdə: – Sənə çox mühüm bir məsələ ilə əlaqədar zəhmət vermək istəyirəm, – dedi.

– Buyurun, dedim, – Mehdi müəllim, Sizin zəhmətinizi çəkmək xoşdur.

– Neçə vaxtdır ki, axşamlar radioda uşaq verilişlərinə qulaq asıram. Əvvəla verilişin vaxtı münasib deyil. İkincisi də, hərdən elə əcayib şeylər, qorxulu nağıllar danışırlar ki, adamın zəhmi yarılır, tükləri biz-biz olur. Elə şeylər uşağa nə verər ki? Heç nə. Xahiş edirəm 4-5 həftə sən həmin verilişləri izlə, konkret faktlar götür, sonra öz fikrini yazılı şəkildə aidiyyatı şöbəyə bildir...

Mehdi müəllim eynəyini əlinə alıb səliqəylə qatlanmış cib dəsmalıyla silə-silə sözünə davam etdi:

– Əslinə qalsa, televiziya verilişlərində də qüsur çoxdur. Açıq-saçıq səhnələrlə dolu filmlərə geniş yer verirlər. Bəlkə bu barədə də bir şey yazasan?...

Mehdi müəllimə söz verdim və tapşırıqlarına əməl etdim. Radionun uşaq verilişləri şöbəsi məsləhətləri nəzərə aldı, Televiziya verilişlərinin rəhbərləri isə "bunun mümkün olmadığını" bildirdilər. Guya fimlər müqavilə ilə alınır və müqavilənin şərtləri onlara hansı hissənisə kəsməyə icazə vermir.

Sözümün canı budur ki, Mehdi müəllim hər şeyə beləcə diqqət yetirərdi. Görəsən, ondan sonrakı illərdə Təhsil Naziri vəzifəsində işləyənlərin ağlına bu cür şeylər gəlibmi? Onlar radio və televiziya verilişlərinin keyfiyyəti, uşaqların tərbiyəsinə təsiri barədə fikirləşiblərmi? İnanmıram. Çünki bununçün onlarda Mehdi düşüncəsi olmalıydı... Bir də əgər ağıllarına gəlsəydi, bizim də xəbərimiz olardı.

Yaşadığı dövrün nüfuzlu ictimai xadimlərindən biri deyib ki, "yaxşı müəllim olmaq üçün müəllim doğulmaq lazımdır". Mehdi elə bil doğrudan da anadan müəllim doğulmuşdu. Onun hər bir hərəkəti, danışığı, geyimi, səliqə-səhmanı, yerişi, duruşu müəllimanə idi.



Hünərməndliyini, cəsarətini, təşəbbüskarlığını, elmi fəhmini başqa millətlərdən olan görkəmli pedaqoqlar da etiraf edirdilər. Yaxşı yadımdadır: 1963-cü ildə "SSRİ xalqlarının məktəb və pedaqoji fikir tarixi" adlı yeddi cildli oçerkin müəlliflərini Moskvaya iclasa çağırmışdılar. Mən də Azərbaycandakı müəlliflərin nümayəndəsi kimi göndərilmişdim. Yığıncağı akademik F.Korolyov açdı. Təqdim olunmuş materiallara şəxsiyyətə pərəstiş haqqındakı direktiv göstərişlər nöqteyi-nəzərindən yenidən baxmağın zəruriliyindən danışdı, bir sıra müəllifləri, o cümlədən görkəmli Moskva alimlərinin çoxunu cəsarətsizlikdə məzəmmət etdi. Çıxışını bu sözlərlə bitirdi: "Təkcə Azərbaycanın Maarif Naziri Mehdi Mehdizadə həmişə olduğu kimi, bu məsələdə də bizi qabaqlamışdı: o rusca nəşr edilmiş monoqrafiyasında şəxsiyyətə pərəstişin pedaqogika elminə vurduğu zərbəni hamımızdan əvvəl elmi faktlarla əsaslandırmışdı, eşq olsun ona!" çəpik səsləri, alqışlar zalı titrətdi. Mən Bakıya qayıdarkən bunu Mehdi müəllimə xəbər verəndə o, sadəcə olaraq gülümsədi. Bircə kəlmə söz də demədi. Bax, Mehdi müəllim beləcə təvazökar alim idi, təvazökarlığın təcəssümüydü.

Bir dəfə Mehdi müəllim nazir vəzifəsində işlərkən kinostudiyanın rəhbərliyi rəsmi surətdə ona müraciət edib "Qərib cinlər ölkəsində" filminə elmi məsləhətçi olmasını xahiş etmişdi. Mehdi müəllim isə onlara belə deyib: "Bu filmin mövzusu Əliheydərin tədqiqat sahəsindəndir. Odur ki, elmi məsləhətçi o olsa, yaxşıdır. Ssenarinin mətnini, mənim də fikrimi Əliheydərə çatdırın, rəyini də nəzərə alın. Zənnimcə, pis olmaz"...

Görəsən, Mehdi müəllimin yerinə başqası olsaydı, belə hərəkət edərdimi? Adına şərəf gətirən bir işi özündən uzaqlaşdırıb həmkarına ünvanlaşdırardımı? İnanmıram. Bunun üçün adamda gərək Mehdi ürəyi, Mehdi səxavəti, Mehdi təvazökarlığı olsun. Sirr deyil ki, çoxumuz bu keyfiyyətdən uzağıq, çox uzağıq.

Başqa bir fakt: Mehdi müəllim ictimai əsaslarla ETPEİ-də elmi məsləhətçi işlərkən bir gün aspirant və dissertantlardan pedaqogika ixtisası üzrə namizədlik imtahanı götürməli olduq. Komissiyanın tərkibi – institutun direktoru Zahid Qaralovdan, Mehdi müəllimdən, Yəhya Kərimovdan və məndən ibarət idi. Sualları müəyyənləşdirmək üçün Zahid müəllim Mehdi müəllimə müraciət edəndə o dedi ki, "Zahid, mən ictimai əsaslarla işləyirəm, sən fiziksən, Yəhya da dilçidir. Sualları Əliheydər müəllim müəyyənləşdirməli, imtahanı da o götürməlidir, bizim iştirakımızla, əlbəttə, vərəqəni isə hamımız imzalamalıyıq". Belə də oldu.

Vərəqəni imzalama anı gələndə Zahid müəllim təklif etdi ki, komissiyanın sədri qrafasına Mehdi müəllim qol çəksin. O buna da etiraz edib "Bu düz olmaz, – dedi, – sədr elə sən özünsən. Biz isə üzvlərik".

Mehdi müəllimin şəxsiyyətini səciyyələndirən, sadəliyini, təvazökarlığını təsdiqləyən belə faktların sayını istənilən qədər artırmaq olar. O belə insan idi.

Mehdi müəllim həm də ehtiyatlı adam idi. Bir fikri söyləməzdən əvvəl ağıllı-başlı düşünər, daha sərfəli çıxış yolunu, daha məqbul deyim tərzini peyğəmbərcəsinə müəyyənləşdirərdi. Nəticədə onun sözündən, məsləhətindən heç kəs ziyan çəkməzdi, hamı fayda görərdi. Misal təriqi ilə doktorluq müdafiəsi ərəfəsində



(1970-ci ildə) onunla olan söhbətimi olduğu kimi nəzərə çatdırmağı lazım bildim:

– Mehdi müəllim, bilirsiniz ki, Azərbaycan xalq pedaqogikasında İslam dininin, Qurani-kərimin müsbət mənada böyük təsiri olubdur. İstəyirəm fikrimi faktlarla əsaslandırmaq şərtilə əsərdə bu məsələyə də toxunam. Sizin rəyinizi bilmək istərdim.

O bir qədər fikrə daldıqdan sonra soruşdu:

– Sən ərəb əlifbasını, ərəb dilini bilirsən? Quranı oxumusan?

– Özünü yox, rusca tərcüməsini oxumuşam, – dedim.

Mehdi müəllim yenə də xeyli fikirləşdi və təmkinlə dilləndi:

– İslam dəyərlərinin Azərbaycan xalq pedaqogikasına müsbət təsiri həqiqətdir. Amma mənə belə gəlir ki, indi sən bu həqiqəti söyləməklə bir şey qazanmazsan. Əksinə, başına iş açarsan. Hələlik toxunmasan yaxşıdır.

Hələlik sözünü Mehdi müəllim xüsusi vurğu ilə dedi. Həmin vurğunun mənasını mən o zaman belə təxmin etdim: "Əvvəlcə dissertasiyanı müdafiə et, təsdiqini al, elm aləmində özünü tanıt, sonra yazarsan. İndi yazsan, bir rəqib tapılıb əsgərlikdə başına gətirilən müsibəti də (yuxarıda xatırlatdığım həmin müsibətdən Mehdi müəllimin xəbəri var idi. Qohumum Süleyman Rəhimov ona danışmışdı) belə şeylərə bağlayaraq işini dolaşdıra bilər". Odur ki, mən Mehdi müəllimin məsləhətinə əməl edib fikrimdən daşındım. Faydasını da gördüm. Düzdür, onsuz da sonralar rəqib tapıldı, yazdılar, təsdiqimi dörd il yubatdılar. Lakin axırda qalib gəlib Mehdi müəllimin ululuğuna bir daha əmin oldum. Bu ululuq onun hər bir

sözü yerində və ustalıqla demək bacarığında özünü daha bariz şəkildə göstərirdi. Yenə də bir fakt: Respublika MMTİ-nin (o zaman həmin institut Vannikov küçəsindəki binada yerləşirdi) iclas salonunda rəhbər maarif işçilərinin və orta məktəb müəllimlərinin müşavirəsi keçirilirdi. Müşavirəni nazir özü (Mehdi müəllim) idarə edirdi. Əsas məruzə və çıxışlar qurtarandan sonra söz Azərbaycan KP MK-nın Elm və məktəblər şöbəsinin müdirinə verildi (Adını qəsdən yazmıram, çünki "ölənin arxasınca danışmazlar".) O, son dərəcə nəzakətsiz çıxışı ilə bütün müəllimləru təhqir etdi, onları qoyun, savadsız çoban və s. adlandırdı, yerdən cavab vermək istəyənlərin sözünü ağzında kəsdi. Hamı pərt olmuşdu. Mehdi müəllimin də sifəti ağarmışdı. O, ayağa qalxıb zala müraciətlə bircə cümlə işlətdi: "Eşitdiklərinizi Mərkəzi Komitənin fikri kimi qəbul edin". Şöbə müdiri bu cümlənin sətiraltı mənasını başa düşmədiyi üçün (elə bildi ki, nazir də ona haqq qazandırır), müəllimlər isə düzgün dərk etdikləri üçün nazirdən razı qaldılar. Sətiraltı məna isə beləydi: "Buyurun, bu da Mərkəzi Komitə işçilərinin səviyyəsi, mədəniyyəti və müəllimlərə verdikləri qiymət! Özünüz nəticə çıxarın". O cür məqamda bu cür risqə getmək, bir cümlə ilə iki tərəfi bu qayda ilə "razı salmaq" hər adama nəsib olan müdriklik deyil. Bu ancaq ulu və hünərmərd şəxsiyyətlərə xas bacarıqdır. Belə şəxsiyyətlərin adı salnamələrdə əbədiləşir, zaman keçdikcə daha da çox adamların qəlbində özünə yer tapır. Böyük şəxsiyyəti ilə şəxsiyyət zənginliyinin təməlini qoyan Mehdi müəllim də belələrindən idi.



# O, ÜLVİLİK, PAKLIQ, MÜQƏDDƏSLİK NÜMUNƏSİ İDİ

*YUSİF TALIBOV,*
*Pedaqogika üzrə elmlər doktoru, professor,*
*Azərbaycan Respublikasının əməkdar müəllimi,*
*akademikM. Mehdizadə adına mükafat laureatı*

Həyatı, fəaliyyəti, ömrü böyük bir tarixə, şəxsiyyəti müqəddəs tərbiyə məktəbinə çevrilmiş, örnəyə dönmüş Mehdi müəllim haqqında yazmaq bir daha onunla keçirdiyim günləri, ayları, illəri yenidən yaşamaq, onun müdrik kəlamlarını, səmimi söhbətlərini, elmi məruzə və çıxışlarını dinləmək, – deməkdir, hər biri bir mənəviyyat, ləyaqət, böyüklük və heysiyyət məktəbi olan maarif nazirliyi kollegiya iclaslarında iştirak etmək, – deməkdir. Kiminsə çıxışından xoşu gəlməyəndə heç bir söz demədən sadəcə olaraq sağındakı pəncərəyə üz çevirdiyini yada salmaq, – deməkdir.

Azərbaycan pedaqogika elminin sarayının nəhəng sütunlarından biri olan Mehdi müəllimlə tanışlığım 1952-ci ildən başlayıb ömrünün sonuna qədər davam etmişdir. Bir igidin ömrü olan 30 ildən artıq bir dövrü əhatə edən bu tanışlıq illəri özünəməxsus şirinli-acılı xatirələrlə zəngin olmuş, bu illərdə aqil bir insanın qayğıları, məhəbbəti, tələbləri, tənqidləri, öyüd və nəsihətləri damla-damla hopmuş, qəlbimdə əbədi yer tutmuşdur.

Mehdi müəllimin adı çəkiləndə qayaların bağrından çağlayan dumduru şirin və sərin bal kimi suyu olan bulaq yada düşür. Bu bulağın suyu abı həyat kimi qəlb

oxşayandır, içdikcə içiləndir. Mehdi müəllimlə bağlı bir neçə epizodları xatırlamaqla kifayətlənəcəyəm. Birinci dəfə Mehdi müəllimi Azərbaycan Dövlət Pedaqoji Xarici Dillər İnstitutunun ingilis dili fakültəsində oxuyarkən görmüşdüm. O vaxt, yəni 1952-ci ildə VI sinfin ingilis dili dərsliyinə tələbə dostum Oruc Musayevlə yazdığımız rəyin dərc olunması ilə əlaqədar Respublikanın Maarif Naziri Mehdi Mehdizadəyə müraciət etmişdik. O da diqqət və qayğısını əsirgəməmiş, bu sahəyə marağımızı artırmış, lazımi göstəriş vermişdi.

İkinci dəfə Mehdi müəllimlə 1953-cü ildə Dövlət imtahanları ərəfəsində institutda aparılan təyinat zamanı görüşdüm. Bu prosesdə o özü iştirak edirdi. Məzunlara diqqət və qayğısını sözlə ifadə etməkdə çətinlik çəkirəm. Yaxşı yadımdadır, təyinatdan sonra hər üç fakültənin alman, fransız və ingilis dili fakültəsinin son kurs tələbələri akt zalına toplaşmışdılar. Direktor Əfşan xanım Qədimbəyova nazir M.Mehdizadəyə söz verəndə salonu alqış bürüdü. O, bir anlığa salonu iti nəzərlə süzdükdən sonra üzünü gənc məzunlara tutub dedi:

– Bir azdan dövlət imtahanlarını verib müəllimlik kimi çətin və şərəfli peşəyə yiyələnəcəksiniz. Bu çox böyük işdi. Hələ vaxtı ilə böyük Yunan filosofu Diogenə belə bir sual vermişlər: Dövlətin əsasını nə təşkil edir? O, çox qısa və lakonik cavab verərək demişdi: Gəncliyin tərbiyəsi. Siz bir neçə aydan sonra müəllim kimi siniflərə girib, gənc nəslin – bizi əvəz edəcək nəslin təlim-tərbiyəsi ilə məşğul olacaqsınız. Məktəb xalqın mənəvi sərvəti, mənəvi beşiyidir. Azərbaycan maarifçiləri həmişə yaxşı müəllim olmuş, müəllimə, məktəbə yüksək qiymət vermişlər. Alman xalqının gözəl bir məsəli var. O xalq,



xoşbəxtdir ki, onun yaxşı müəllimi var. Müəllim yer üzünün qiymətli gövhəri olan insanı tərbiyə edir, onu kamillik dərəcəsinə çatdırır. İnsan müəllimin səyi sayəsində əlçatmaz zirvələri fəth edir. Çalışın, yaxşı müəllim olun, uşaqlarla işləməyi bacarın, onların qəlbinə yol tapın, xeyirxah əməllərlə yaşayın. Təyinat zamanı yoldaşlarınızdan biri öz növbəsini, yerini anası xəstə olan dostuna verdi. Hər hansı bir rayona gedib işləyəcəyini bildirdi. Yəqin ki, o sizin aranızdadır. Bu vaxt direktor Ə.Qədimbəyova replika verdi: O, institut komsomol komitəsinin ikinci katibidir, çox intizamlı, qabiliyyətlidir. Yaxşı müəllim olacağına şübhəm yoxdur, deyərkən məni nəzərdə tuturdu. Belə gənclərlə fəxr etmək olar. Elə hesab etməyin ki, ali təhsil aldınız, hər şey tamam oldu. Xeyir, əsl iş, təhsil bundan sonra başlanır. Ali təhsil almaq yiyələndiyiniz peşənin açarıdır. Təhsil sizə böyük və zəngin sarayı xatırladan müəllimlik fəaliyyətinə bir açardır. Siz həmin sarayda nələr olduğunu sonralar, işlədiyiniz zaman öyrənəcəksiniz. Məktəb çox zəngin, əvəzsiz bir laboratoriyadır. Bu laboratoriyada yaxşı tədqiqatçı olmaq üçün iş aparmaq, uşaqları sevmək, müəllim yoldaşlarından öyrənmək vacib şərtdir. Mən Sizin hər birinizin şəxsindən gələcəyin çox gözəl dilçi alimlərini, tədqiqatçılarını, mahir pedaqoqlarını görürəm. Elmin parlaq zirvələrini o kəs fəth edir ki, o yorulmaq bilmədən, çətinliklərə qatlaşaraq çalışır, zəhmət çəkir...

O, çıxışını tamamlayarkən məzunlara müvəffəqiyyətlər arzuladı. Bundan sonra hörmətli nazirə Şeksprin, Hötenin, Hüqonun, Balzakın əsərlərinin orijinaldan tərcümə edilməsi, aspirantura təhsili, gələcək həyat barəsində suallar verdilər.

Mehdi müəllim, biz gənclərə nə arzu edərdiniz?, – sualına cavab aşağıdakı kimi oldu:

– Əvvəla indiyə kimi dediklərimi. İkincisi, ağıllı, sağlam olmağı, üçüncüsü yaxşı ailə başçısı, ata, ana olmağı. Biz sizə bir çox sahədən biliklər verməyə nail olmuşuq. Amma nədənsə ailə səadəti haqqında bir şey öyrətməmişik. Yaxşı ailə cəmiyyətin hərəkətverici qüvvəsidir. Ailə olmasa, cəmiyyət olmaz. Ona görə də ailə qədri, ata-ana qədri bilən olun. Böyüklərə hörmət edən gəncin ömrü uzun, günü ağ, işi avand olar...

1953-cü ilin may ayında Mehdi müəllim mənim yaddaşıma belə həkk olundu. Onun sözləri nə qədər sadə, nə qədər inandırıcı, sabahkı günə böyük ümidlər verən idi. Biz gənclər onu dinlədikcə gələcək həyat proqramımızı, amalımızı müəyyən edir, gələcək günlərə sevinclə baxırdıq. Belə hesab edirdik ki, ucqar rayonlara, kəndlərə işləməyə getsək də, xalqımıza fayda verəcək, yaxşı, işgüzar, qabil, gözəl, savadlı gənclər yetişdirə biləcəyik. Bu o vaxt idi ki, Stalin yenicə vəfat etmişdi. Adamlarda, xüsusilə gənclərdə çox bədbin bir əhval-ruhiyyə yaranmışdı. Mehdi müəllimin söhbəti həmin bədbinliyə sanki son qoymuşdu. Gənclər gələcək haqqında danışır, həqiqətən də Bayronu tərcümə etmək işinə, nə vaxtsa elmlər namizədi, alim olacaqlarına ümidlə baxırdılar. Axı bu bir həqiqətdir ki, insanı yaşadan, onu qanadlandıran sabahkı günün sevincidir, ata və anaya göstərəcəyi qayğıdır, öz övladlarının nazını çəkməsi, onların əsl vətəndaş kimi yetişdirilməsidir. Məgər valideynlər özlərini övladlarında təkrar etmirlərmi? Bax, insanı ölümsüzləşdirən əsas cəhətlərdən biri də budur.



Üç il rayonda müəllim işləyib 1956-cı ildə aspiranturaya gəldim. Mehdi müəllimi pedaqogika kafedrasında gördüm. O, APİ-də müəllim işləyirdi. Həmin ildən Mehdi müəllimlə daha çox ünsiyyətdə olmaq imkanı əldə etdim. Kafedranın müəllimləri 1957-ci ildən Mehdi müəllimin rəhbərliyi altında "Pedaqogika" dərsliyini hazırlayırdı. Mehdi müəllim hər gün makinadan çıxmış fəsilləri çox diqqətlə oxuyur və yeri gəldikcə müəyyən sitatların mənbəyini yoxlamağı məndən xahiş edirdi. Mən çox ciddi məsuliyyət hissilə onun tapşırıqlarını yerinə yetirirdim. Pedaqogika (I hissə) çapdan çıxandan sonra 1958-ci ildə həmin dəslik haqqında "Qiymətli tədris vəsaiti" adlı məqalə yazdım. Məqaləmi kafedra üzvlərinin hamısı oxumuşdu. Mehdi müəllimin nə deyəcəyini onlar maraqla gözləyirdi. O, məni təbrik edib dedi ki, çox sağ ol oğlum, həmişə obyektivliyi gözlə, yaxşı yazmısan. Tənqidi qeydlərinlə razıyam.

Mehdi müəllim çox ağır təbiətli, samballı, müdrik bir alim, qayğıkeş bir insan kimi mənim həyatıma daxil olurdu.

1956-cı ildə Mehdi müəllim Moskvada doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərkən mərhum Tələt müəllimin məsləhəti ilə ona təbrik teleqarmı göndərdim. Bakıya gələndə təşəkkürünü bildirdi və bir kitabını avtoqrafla mənə bağışladı. Əlbəttə, bu qiymətli bir hədiyyə idi. 1958-ci ildə pedaqogika və pedaqogika tarixindən minimum imtahanları verərkən Mehdi müəllim komissiyanın üzvü kimi cavablarımdan çox razı qalmışdı. Ünsiyyət, qayğı məni ona yaxınlaşdırırdısa da, tələblərində güzəştə getmirdi.

Mehdi müəllimdə rəhbər işçi və pedaqoq alim üçün çox zəruri olan iki mürəkkəb qabiliyyət – idarə etmək və tərbiyə etmək qabiliyyəti sıx birləşmişdi. Tale elə gətirdi ki, 1959-cu ildən 1979-cu ilə qədər Mehdi müəllimlə birgə işləməli oldum. Mən Elmi Tədqiqat Pedaqogika İnstitutunda işimlə əlaqədar tez-tez keçmiş ittifaq şəhərlərində, Azərbaycanın rayonlarına ezamiyyətdə olurdum. Biz Mehdi müəllimlə tez-tez görüşür, onun söhbətlərini, məsləhətlərini dinləməli olurduq. O, çox səbirlə, aramla müəllim ləyaqətindən söz açır, qabaqcıl müəllimləri axtarıb tapmağı tövsiyə edirdi. Mehdi müəllim deyirdi ki, qabaqcıl təcrübəni zərrə-zərrə toplamaq lazımdır. Məktəb xalqın mənəvi ocağıdır. Məktəbə, müəllimə xüsusi qayğı lazımdır. Dilimizin saflığını qoruyun. Vətəndaşlıq ləyaqəti və heysiyyətini yüksək tutun.

1962-ci ilin iyun ayı idi. Namizədlik dissertasiyası müdafiə etməli idim. Mehdi müəllim də müdafiə şurasının üzvü idi. Mən avtoreferatımın üstünə xoş sözlər yazıb onun qəbuluna getdim. Görüşdük. Mənə xeyir-dua verib gələcəyini bildirdi. O, sözünə əməl edən şəxsiyyət idi. Müdafiəyə gəldi, məzmunlu da çıxış etdi. Onun müdafiə şurasına gəlməsi hamının sevincinə səbəb oldu. Bundan ən çox aspirantlar və müdafiə edənlər sevindilər. Sonrakı həyat uğurlarımda da Mehdi müəllimin – bu gözəl insanın diqqət və qayğılarını hər an hiss etdim. 1966-cı ildə ailəmin ehtiyacını ödəyə bilən üç otaqlı mənzil almağımda da, 1973-cü ildə Respublika Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutunda yeni yaranan Pedaqogika və psixologiya kafedrasına müdir təyin olunmağımda da, habelə 1976-cı ildə həmin instituta rəhbərlik etmək işi



mənə tapşırılanda da Mehdi müəllimin diqqət və qayğısını həmişə üzərimdə hiss etmişəm.

Uzun illər üzərində işlədiyim doktoruluq dissertasiyasının Azərbaycan Dövlət Universitetində müdafiəsinin təşkili ilə əlaqədar hələ o vaxt SSRİ Ali Orta İxtisas Təhsili naziri V.P.Yelyutinə yazdığı məktubu, verdiyi tövsiyələri heç zaman yadımdan çıxara bilmərəm.

Mehdi müəllim ali pedaqoji kadrların ixtisas səviyyələrinin yüksəlməsinə, pedaqogika elminin, maarif sisteminin hər vasitə ilə inkişafına bütün pillələrdə, bütün mərhələlərdə xüsusi qayğı göstərirdi. Mən bunu 1976-cı ilin avqust ayında Respublika MMTİ-na direktor vəzifəsini ifa etməyə başlayandan sonra daha aydın hiss etdim. Həmin vaxtdan Mehdi müəllimlə tez-tez görüşür, kollegiya iclaslarında iştirak edirdim. Həftədə bir dəfə institutun vəziyyəti ilə maraqlanır, mənə tövsiyələr verirdi. Onun birinci tələbi bütün ixtisas müəllimləri üçün kartoteka tərtib etdirmək oldu. Bundan sonra bütün kurslara dair tədris-tematik planların hazırlanmasını tapşırdı. Müəllimlərin özünütəhsil məsələsi diqqət mərkəzinə çəkildi. Kafedranın elmi işlərinə o xüsusi qayğı ilə yanaşır, MMTİ-da on kafedranın yaranmasını zəruri hesab edirdi. İndi həmin institutda fəaliyyət göstərən kafedralar onun zəhməti və səyinin məhsuludur. Direktor əvəzi işlədiyim iki il 8 ayda MMTİ-nin metodistlərinin “Azərbaycan müəllimi” qəzetində 400-ə yaxın, “Azərbaycan məktəbi” jurnalı və onun əlavələrində isə 20 məqaləsi dərc edilmiş, bütün tədris planları, habelə 24 adda kitabça nəşr edilmişdir. Bunların hamısı Mehdi müəllimin qayğısının parlaq nəticəsi idi. O, MMTİ-nin bütün həyatı ilə maraqlanır, işgüzar kadrların yetişdirilib

irəli çəkilməsinə xüsusi əhəmiyyət verirdi. İki il 8 ay müddətində 12 nəfər metodist maarif nazirliyinə metodist, inspektor, şöbə müdiri respublika təmayüllü internat məktəblərinə direktor vəzifəsinə irəli çəkildilər. Mehdi müəllim hər bir işçini yaxşı tanıyır, onların hər biri ilə öz işinə dair söhbət edir, onlara namizədlik dissertasiyaları üzrə mövzular üzərində işləməyi tövsiyə edirdi. Mehdi müəllim MMTİ-nin kollektivi ilə tez-tez görüşür, məktəb direktorlarının, müəllimlərin ixtisasartırma kurslarında xalq maarifinin idarə olunmasının aktual məsələlərinə dair mühazirələr oxuyardı.

Nazir M.Mehdizadə hələ o vaxtlar, dəfələrlə müəllimlərin, sinif rəhbərlərinin əmək haqqını artırmaq barədə yuxarı təşkilatlar qarşısında məsələ qaldırmışdı. O, bizim kafedraya sinif rəhbərlərinin həftəlik iş saatını müəyyənləşdirməyi tapşırmışdı. Kafedranın bir neçə üzvü ilə müəyyən araşdırmalardan sonra belə bir nəticəyə gəldim ki, həqiqətən sinif rəhbəri tələb olunan qaydada işləməli olsa, onun həftəlik iş vaxtı 14 saatdan çox olur.

Mehdi müəllimin yuxarı təşkilatlara yazdığı təkliflərə müvafiq olaraq sinif rəhbərliyi üçün əvvəlcə on, sonralar isə 30 manat verilməsi qərara alınmışdı.

1975-ci il idi. Məşhur Ukrayna pedaqoqu V.A.Suxomlinskinin "Vətəndaşın doğulması" əsərinin tərcüməsini mənə elmi redaktəyə vermişdilər. Maarif nəşriyyatında əsərin adı üstündə mübahisə oldu. Orada əsərin adının "Vətəndaşın formalaşması" kimi verilməsini təklif edirdilər. Bu barədə Mehdi müəllimə müraciət etməli oldum. O, əsərin həm ruscasını, həm də tərcüməsini diqqətlə nəzərdən keçirib, mənim haqlı olduğumu bildirdi. Adıgözəl müəllimə zəng vurub əsərin "Vətəndaşın



doğulması" kimi çap olunmasını məsləhət verdi. Bu kiçik faktı deməkdə məqsədim odur ki, Mehdi müəllim hər bir məsələyə diqqətli idi.

Mehdi müəllim çox həssas, dəqiq, qayğıkeş bir insan, tələbkar dövlət xadimi idi. O, həmişə hər hansı bir sənədi hazırlamağı tapşıranda deyirdi ki, nə qədər ki, hazırlanmış sənədə mən imza etməmişəm, məsuliyyət Sizin üzərinizə düşür. Elə ki, sənədi imzaladım, bütün ağırlıq mənim çiynimə düşür. Ona görə də tapşırılan işə çox böyük məsuliyyətlə yanaşmaq lazımdır. Mehdi müəllim vaxtın qədrini bilirdi – dəqiq idi. Əhatəsində olan idarə işçilərinin və vətəndaşların qəbulu qaydalarına ciddi riayət edirdi.

Mehdi müəllim heç vaxt başqasının yazdığı məruzə ilə çıxış etməzdi. O ayrı-ayrı adamlara faktlar toplamağı tapşırardı, ən çoxu isə özü dərslərində iştirak etdiyi müəllimlərin işini təhlil edərdi. Toplanmış faktları təhlil-tərkib, müqayisə edər, ümumiləşdirmələr aparardı. Yadımdadır, 1977-ci ildə "Məktəblilərin müstəqil işinin təşkili" mövzusunda respublika elmi-praktik konfransını keçirirdik. Aparıcı məruzə üçün materialları mən toplamışdım, məruzəni də mən yazmışdım. Elmi-praktik konfransın proqramına nazirliyin kollegiyasında baxılırdı. Kollegiya üzvlərindən bəziləri məruzəni Mehdi müəllimin oxumasını təklif etdilər. Bu zaman Mehdi müəllim dedi ki, məruzəni kim yazıbsa, o da oxumalıdır. Beləliklə, həmin konfransda birinci əsas məruzə ilə mən çıxış etdim. Məruzəni Mehdi müəllim, Azərbaycan KP MK-nın şöbə müdiri F.Əhmədov və digər rəsmi şəxslər yüksək qiymətləndirdilər. Mehdi müəllimin təklifilə həmin məruzə olduğu kimi "Azərbaycan məktəb"ində çap edildi.

Mehdi müəllim haqqında ürək sözlərimi 1983-cü ildə onun anadan olmasının 80 illiyi münasibətilə keçirilən yubiley gecəsində Mehdi müəllimə ünvanlanmış təbrik məktubunda əks etdirdim:

– Mehdi müəllim, Siz əlində sinif jurnalı qara gur saçlı bir müəllim kimi, mənalı həyatını bəşəriyyətin ən çətin kəşfləri olan tərbiyə və idarəetmə sahəsində cilalayan bir rəhbər kimi, ömrünü gilə-gilə Azərbaycan pedaqoji fikir və məktəb tarixinin zəngin salnaməsi səhifələrinə hopduran bir tədqiqatçı kimi, şəvə saçlarını xalq maarifi naminə bəyazlaşdıran aqil bir mütəfəkkir kimi göz önündə canlanmısınız. Azərbaycan pedaqogikası elmi yoluna qədəm qoyan hər bir tədqiqatçı Sizin pedaqogika elmində yaratdığınız M.Mehdizadə körpüsündən keçəcək, Sizin ideya irsinizlə tanış olacaq. Siz hamının getdiyi yolla deyil, özünüzəməxsus bir yolla getmiş, Azərbaycan və keçmiş SSRİ pedaqogika olimpinin zirvəsinə yüksələ bilmişsiniz.

Akademik M.Mehdizadə Azərbaycan pedaqogika elminin ilk bünövrə daşını qoyanlardan biri olmaqla, həmin elm sarayının ucaldılmasında fəhlə, bənna və mühəndis kimi tər tökmüş, yarım əsrdən artıq pedaqogika, sözün geniş mənasında antropoqogika sahəsində qələm işlətmiş, 20-dən çox kitab, monoqrafiya, 200-dən çox jurnal, 500-dən artıq qəzet məqaləsi yazmışdır. O, qabaqcıl məktəb və müəllim təcrübəsinin ayaq açıb yeriməsinə, vətəndaşlıq hüququ almasına yaşıl işıq yandırmış, Zahid Şöyübovun, Məhər Quliyevin və yüzlərlə başqa müəllimlərin şöhrətlənməsinə nail olmuşdur.



Mehdi müəllim ülvilik, paklıq, ideallıq, müqəddəslik rəmzi, həyatı – sözlə əməli işin, mənəvi və intellektual inkişafın, nəhayətsiz axtarışların parlaq nümunəsi olmuşdur. Mehdi müəllim müdrik dövlət xadimi, gözəl insan, tələbkar və qayğıkeş alim, həm də nəcib bir ata idi.



# O GÖRÜŞLƏRİ KİM UNUDAR?

***ƏBDÜL ƏLİZADƏ,***
*Psixologiya üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi, Prezident təqaüdçüsü*

M.M.Mehdizadə çağdaş Azərbaycan pedaqoji fikir tarixinə görkəmli alim, elm təşkilatçısı və maarif xadimi kimi daxil olmuşdur. O, məşhur akademik, müqtədir alim kimi böyük elmi nüfuz sahibi, respublikanın sınanmış maarif naziri idi, ancaq hamı ona Mehdi müəllim deyə müraciət edirdi və bu xoş kəlmənin sehrində də onu özlərinə doğmalaşdırırdılar, sözün əsl mənasında özlərinin həyat müəllimi sayırdılar.

Mən Mehdi müəllimin adını ilk dəfə 1952-1953-cü illərdə, Azərbaycan Dövlət Universitetində təhsil aldığım illərdə eşitmişəm. Sevimli psixologiya müəllimimiz Məmmədəli Məhərrəmov və pedaqogika müəllimimiz Zümrüd Axundova öz maraqlı mühazirələrində adətən Mehdi müəllimin də nüfuzlu sözünə əsaslanırdılar.

1957-ci ildə "Azərbaycan məktəbi" jurnalının redaksiyasında işləyirdim. Redaksiyada özünəməxsus yaradıcılıq ab-havası hökm sürürdü. Respublikanın görkəmli psixoloqları, pedaqoqları və metodistləri, qabaqcıl müəllimləri və məktəb direktorları redaksiya ilə yaxından əlaqə saxlayırdılar. Jurnalda tez-tez Mehdi müəllimin də məqalələri dərc olunurdu və həmişə də müəllimlər tərəfindən böyük rəğbətlə qarşılanırdı.

Mehdi müəllimin yeni bir kitabı nəşr olunanda, jurnalda və ya qəzetdə yeni bir məqaləsi dərc ediləndə redaksiyada öz-özünə bu barədə söhbət düşürdü. Söhbətdə



adətən redaksiya işçiləri ilə bahəm müəlliflər – görkəmli alimlər və qabaqcıl müəllimlər də iştirak edirdilər. Onların hamısı Mehdi müəllimi təkcə məşhur alim-pedaqoq kimi deyil, həm də böyük qəlbli insan kimi səciyyələndirirdilər. Sadəlik, təvazökarlıq, xeyirxahlıq, təmkinlilik, obyektivlik, prinsipiallıq – Mehdi müəllimi yaxından tanıyan, hətta uzun müddət bir yerdə işləmiş onlarla maarif xadimi onu bu sözlərlə səciyyələndirirdilər. Böyük şair və yazıçılar kimi böyük alimlər də, görünür, öz müasirlərinin nəzərində təkcə öz əsərləri ilə deyil, bəlkə də, ilk növbədə, şəxsiyyəti ilə bərqərar olur.

Mən Mehdi müəllimi ilk dəfə 1959-cu ildə noyabr ayında görmüşəm. Mehdi müəllim onda pedaqoji institutda kafedra müdiri işləyirdi. Mən də aspiranturaya daxil olmaq üçün ərizə vermişdim. Psixologiya və pedaqogika üzrə imtahan komissiyasının sədri Mehdi müəllim idi. Onun qayğılı baxışları indi də yadımdan çıxmır. Bu qayğılı baxışların mənasını mən indi daha aydın dərk edirəm. Mehdi müəllimi bu məqamda, görünür, Azərbaycan elminin gələcəyi düşündürürdü. O, imtahan zamanı gələcək alimlərin erudisiyasına, mühakimə tərzinə, məntiqinə xüsusi diqqət yetirirdi. Hansı əsərləri oxumusan? Hansı dilləri bilirsən? Neçə məqalən dərc olunub? Bu suallar Mehdi müəllimi daha çox maraqlandırırdı.

Bir neçə aydan sonra Mehdi müəllimi yenə də respublikanın maarif naziri təyin etdilər. 1960-cı ildən başlayaraq mənə Mehdi müəllimlə dəfələrlə görüşmək, bir yerdə olmaq səadəti nəsib olmuşdu. Mən Mehdi müəllimin kiçik qardaşı görkəmli Azərbaycan psixoloqu Zəkəriyyə Mehdizadə ilə bir kafedrada işləyirdim.

Zəkəriyyə müəllim məndən yaşlı olsa da, onunla dostlaşmışdım. Mehdi müəllim də bunu bilirdi. Zəkəriyyə müəllimlə birlikdə bəzən Mehdi müəllimgilə gedib, onunla görüşürdük. Mehdi müəllim Mərdəkanda istirahət evində dincələndə isə gedib ondan hal-əhval tuturduq. Mən sonuncu dəfə Mehdi müəllimi vəfatından 4-5 gün əvvəl görmüşdüm. Mehdi müəllim xəstəxanada yatırdı. Vəziyyəti ağır idi. Zəkəriyyə müəllimlə xəstəxanaya getdik.

Palatada Mehdi müəllimin həyat yoldaşı və bacısı səssiz-səmirsiz oturmuşdular. Onların baxışları qəmli-kədərli idi. Mehdi müəllim yuxuya getmişdi. Bir qədər keçdi. Mehdi müəllim gözünü açdı. Palataya göz gəzdirəndə bizi gördü. Ani də olsa gülümsündü... Zəkəriyyə müəllim onun qoluna girib palatada gəzdirmək istədi. Mehdi müəllim 3-4 addım atdı. Lakin yeriməyə taqəti qalmamışdı. Çətinliklə öz çarpayısına oturdu... O bikef görünürdü. Vəziyyətinin ağırlaşdığını, görünür, özü də hiss edirdi.

Mehdi müəllimlə hər bir görüş həyat məktəbi idi. O görüşləri kim unudar? Bəlkə də onların axarında, onların təsirilə bir kitab da yazmaq olar. Bir az əvvələ qayıdıram.

... Mərdəkanda istirahət evinin xiyabanında gəzirdik. Mehdi müəllim aram-aram danışırdı. Onun təmkinli səsi indi də xatirimdədir. Mehdi müəllim Azərbaycan məktəbinin inkişaf yollarını təhlil edirdi. o, respublikanın qabaqcıl müəllimlərinin iş təcrübəsindən fərəhlə danışırdı. Ancaq, Mehdi müəllimin fikrincə, psixologiya və pedaqogika hələ məktəb təcrübəsinə nüfuz etməyib. Təlim-tərbiyə prosesində özünü göstərən nöqsanlar da ilk növbədə, məhz bu zəmində meydana çıxır. Bizim



metodistlərimiz də, təəssüf ki, psixologiya və pedaqogikanın uğurlarından çox vaxt faydalana bilmirlər. Onların əsərlərində təsvirçilik meyli açıq-aşkar hiss olunur.

Mehdi müəllim psixologiya və pedaqogikanın məktəb təcrübəsi üçün əhəmiyyətini həmişə qeyd edirdi. ancaq bu görüşdə o, həmin məsələlərdən xüsusi vurğu ilə danışırdı. Bu isə, görünür, səbəbsiz deyildi.

Mehdi müəllim keçən əsrin 60-70-ci illərində tez-tez xarici ölkələrdə olurdu. O, YUNESKO-nun maarif və mədəniyyət komissiyasının üzvü kimi sayılıb seçilirdi. Bu, təkcə akademik M.M.Mehdizadənin bir görkəmli alim kimi elmi nüfuzunu deyil, həm də Azərbaycan pedaqogikasının uğurlarının beynəlxalq səviyyədə təsdiq olunması idi.

Mehdi müəllim YUNESKO-nun nümayəndəsi kimi xaricdə olarkən bu ölkələrin maarif sistemini ətraflı öyrənir, məktəb təcrübəsinin uğurlarını ətraflı təhlil edirdi. Qəlbində, fikrində isə onu narahat edən problemlər – Azərbaycan məktəbinin problemləri hakim idi. Fikrən hər şeyi müqayisə edirdi. Hər dəfə də bir alim-pedaqoq kimi ona yaxşı tanış olan bir həqiqəti məktəb təcrübəsi axarında yenidən kəşf edirdi: xarici ölkələrdə təlim-tərbiyə işi psixologiya və pedaqogikanın uğurlarına söykənir. Psixodidaktika, psixopedaqogika təlim-tərbiyə prosesinin "Arximed lingi" sayılır. Amerika məktəblərində psixoloji xidmətin az qala bir əsrlik tarixi var. İngiltərə, Fransa, Almaniya, Yaponiya məktəbləri bir-birindən nə qədər özgün xüsusiyyətlərlə seçilsələr də, bir vəsilədə bir-birlərinə necə də oxşayırlar. Onların hamısı psixologiya və pedaqogika elminin uğurlarına məharətlə arxalanır. Bizim

respublikamızda isə bu özəmli elmlərin imkanlarından səmərəli istifadə olunmur. Psixoloqlarımız və pedaqoqlarımızı bu məsələ xüsusi narahat etməlidir. Mehdi müəllimin bir obrazlı kəlamı indi də yadımdadır. O, deyirdi ki, psixologiya və pedaqogika müəllimin qoşa qanadıdır. Müəllim bu bənzərsiz elmlərə yiyələnəndə əsl tərbiyəçiyə çevrilir. Mehdi müəllimin 60-cı illərin sonu, 70-ci illərin əvvəllərində yazdığı əsərlərində özünün geniş əksini tapmışdır. Onun "Müasir dərs haqqında" məşhur məruzəsi xüsusilə əlamətdardır. Biz inanırıq ki, bu qiymətli əsər Azərbaycan psixoloji fikir səlnaməsində də özünə layiqli yer tutacaqdır.





# O BİZİ SAYIRDI...

***BƏŞİR ƏHMƏDOV,***

*pedaqogika üzrə elmlər doktoru, professor,*

*Beynəlxalq Pedaqoji Akademiyasının həqiqi üzvü*

Cavan vaxtım idi, rayonda müəllim işləyirdim. Azərbaycan dili dərsində şagirdlərə cümlə təhlil etdirməyi xoşlayırdım. Məndə belə bir inam vardı ki, cümləni yaxşı təhlil edən şagirdin qrammatik savadına söz ola bilməz. Məktəblilərdə cümlə təhlilinə güclü meyl yaranmışdı.

Bir gün müəllim başda olmaqla bütün sinif ciddi çətinlik qarşısında qaldı: "Zəng vurulduqdan sonra..." sözləri ilə başlayan cümlədə "vurulduqdan" sözünün şəkilçisini dəqiq müəyyənləşdirə bilmədik və bu, böyük mübahisəyə səbəb oldu. Başqa bir dərsdə "gülərüzlü" sözünün quruluşu bizi çətinliyə saldı.

Məktəbdə həmkarlarımla məsləhətləşdik, qonşu kəndlərin müəllimlərinə müraciət etdik, lakin mübahisəni kəsmək mümkün olmadı.

Bir axşam oturub "Azərbaycan müəllimi" qəzetinin redaksiyasına yazdım ki, yuxarıdakı məsələ ilə bağlı alimlərdən birinə məqalə sifariş versinlər. Qəzet isə mənim xahişimi bir tərəfə ataraq, "odlu" bir cavab məktubu göndərdi: "Bizim sizə müəllim deməyə dilimiz gəlmir, çünki olduqca savadsız adamsınız. Məgər kim bilmir ki, vurulduqdan sözündəki –duqdan feli bağlama şəkilçisidir?! Yəni onu da bilmirsinizmi ki, gülərüzlü mürəkkəb sözdür?! Sizə rəhm edirik, yoxsa diplomunuzu geri almaq barədə ciddi məsələ qaldırarıq..."

Məktubun tonu məni açmadı və onu zərfə qoyub nazirə göndərdim... Nazir məni məktuba qol çəkmiş cənabla görüşdürdü. Məlum oldu ki, əgər diplomun geri alınması zərurəti ortaya çıxarsa, əvvəlcə jurnalist diplomsuz qalmalıdır (o, əslində aspiranturada təhsilini başa vurmuş dilçi idi, ixtisası jurnalist deyildi). Barışdıq və dostlaşdıq.

Şübhə etmirəm ki, başqa nazir olsa idi, məktubu yenidən redaksiyaya göndərəcək, bununla da narazılığın artmasına təkan vermiş olacaqdı. Həssas, diqqətli, qayğıkeş insan olan Mehdi müəllim (biz ona həmişə belə müraciət edərdik) 1920-1980-ci illər arasında Azərbaycan maarifinə rəhbərlik edənlərin ən layiqlisi olmuşdu. Həm mütəxəssis, həm də insan kimi onun yeri məhz maarif idi. İnzibati-amirlik dövründə nazir olsa da, Mehdi müəllimin təbiəti amirlikdən uzaq idi. O, çox mülayim, səbirli, lakin tələbkar idi...

1964-cü ilin 4 oktyabrında "Azərbaycan müəllimi" qəzetində "Şagirdlərin təfəkkürünü və nitqini inkişaf etdirməli" adlı məqaləm çıxmışdı. Bir müddətdən sonra Mehdizadə yazılarının birində həmin məqaləyə münasibət bildirdi, lakin müəllifi dolaşıq salmış, Bəşir yerinə Camal sözünü işlətmişdir. O vaxt məni az adam tanıyırdı. Camal Əhmədovun isə qılıncının dalı da kəsirdi, qabağı da.

Xeyli əvvəllərin söhbətidir. ADPU-da bir elmi məclis keçirilirdi. Tədbir iştirakçıları salonu tərk edəndə Mirzə Məmmədov (Elmi-Tədqiqat Pedaqogika İnstitutunun direktoru idi) məni Mehdizadəyə təqdim etdi və dedi:



– İnstitutun elmi katibidir... Sonra gülərək əlavə etdi: özü də səndən inciyib, çünki onun məqaləsini Camalın adına çıxmısan.

Mehdi müəllim uşaq kimi başını aşağı salıb məndən üzr istədi. Mən bu sadəlik qarşısında heyran qaldım!

Növbəti yazılarında iri həcmli əsərlərində Camalın adını pozdu və mənim öz adımı yazdı. Məsələn, 1966-cı ildə nəşr etdirdiyi "Azərbaycan SSR-də məktəb təhsili yeni yüksəlişdə" (rusca) adlı 18 çap vərəqi həcmində olan monoqrafiyasında (səh. 62-63) həmin məqalənin təhlilinə xüsusi yer ayırmışdır.

Mehdizadə Azərbaycanda çıxan və dərc olunan hər bir müəllimin, aspirantın, alimin yazısına öz münasibətini bildirirdi. 1982-ci ildə nəşr etdirdiyi "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" (20 çap vərəqi) adlı əsərində Əjdər Ağayevin, Bağır Bağırovun, Zahid Qaralovun, Məzahir Quliyevin, Rasim Əsədovun, Əziz Əfəndizadənin, Məcid İsmixanovun, Yəhya Kərimovun, Nurəddin Kazımovun, Abdulla Nuruşovun, Yusif Talıbovun, İsrail Həsənovun, Zahid Şöyübovun, Sabir Şəfiyevin və bir sıra başqalarının yazılarını təhlil etmiş, onlara öz münasibətini bildirmişdir.

Bu qədər tanınmış, yüksək səviyyəli, böyük titullu alim olasan, amma Bəşir kimi balacaların yazılarını oxuyub qiymət verməyi unutmayasan... Bunun özü Mehdizadənin böyüklüyünə dəlalər edir!

Bizim nüfuzumuz niyə artmır? Ona görə ki, öz tay-tuşlarımızın özümüzdən kiçiklər haqqında müsbət söz deməyə dilim gəlmir. Mənim 30 yaşım olanda Mehdi müəllimlə əlaqəmin, demək olar ki, yoxluğu dövründə o, yazılarıma elə yüksək qiymət verib ki, indi 60 yaşımda o

cür tərifi heç bir qələmdaşımdan eşitməmişəm. Kiçiyə tərif deyən Mehdilər daha da böyüyür, biz nəinki kiçiyimizi, heç yaşıdımızı da tərifləmir, nəticədə özümüz də cılız qalırıq.

Ə.Seyidov, M.Mehdizadə, M.Muradxanov kimi sələflərimizdən çox öyrənməli və yaşatmalıyıq. Onu da öyrənməliyik ki, həmin alimlərin tənqidi də tərifi qədər xoş idi,faydalı idi. İki məsələdə Mehdi müəllimlə mənim fikrim arasında ziddiyyət olub: 1) Yazmışam: müəllim yeganə istehsalçıdır ki, öz məhsulunu özü qiymətləndirir. Yaxşı olar ki, şagirdi başqası qiymətləndirsin. 2) Yazmışam ki, məktəb təcrübəsini öyrənərkən həm müsbət, həm də mənfi işləri araşdırmaq və təhlil etmək lazımdır. Təkcə müsbət təcrübəni öyrənmək və onu mənfi təcrübədən təcrid etmək doğru sayıla bilməz.

Bu fikrin hər ikisi Mehdi müəllimin yazılarında ciddi tənqid edilib, mübahisəmiz də olub. Lakin bu elmi narazılıqlar şəxsi münasibətimizə əsla təsir göstərməyib. Əksinə, bizi daha da yaxınlaşdırıb. İnsani münasibətin bu cəhəti kaş hamımızda olaydı...





# UNUDULMAZ NAZİR, ALİM VƏ MÜƏLLİM

***FUAD QASIMZADƏ,***

*fəlsəfə üzrə elmlər doktoru, professor, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, Əməkdar elm xadimi*

Böyük müəllim kimi respublikamızda maarifə, təhsil sisteminə uzun müddət başçılıq etmiş akademik Mehdi Mehdizadəni çox yaxşı tanıyırdım. Dəfələrlə onunla ünsiyyətdə olmuşdum. O, mərhum atam akademik Feyzulla Qasımzadənin yaxın dostu və həmkarı idi. On illər ərzində birgə iş, xalqımızın maariflənməsinə, millətimizin böyüməkdə olan nəslinin təlim və tərbiyəsinə sərf etdikləri əmək onları qırılmaz tellərlə bağlamışdı. Mehdi müəllimin ailəsi ilə də yaxın idik. İçəri şəhərdə xalam Nərgiz xanım və onun həyat yoldaşı məşhur alim Murtuza Nağıyevin ailəsi ilə qapıbir qonşu idilər. Dəfələrlə biz onlara gedəndə Mehdi müəllimlə və ailəsilə görüşürdük. Anam Tubu xanım Mehdi müəllimin həyat yoldaşı Lətifə xanımla 50 ildən çox bir müddətdə dostluq etmişlər. Mehdi müəllimin ailəsilə yaxınlıq, səmimi ünsiyyət və dostluğumuz bir neçə xətlər üzrə mümkün olmuşdur. Mehdi müəllimin qızı Elmira xanım və mənim həyat yoldaşım, hazırda Bakı Dövlət Universiteti biologiya fakültəsinin dosenti Mələk xanım uşaqlıqdan səmimi dost, rəfiqə olmuş, orta məktəbdə on bir il bir sinifdə oxumuş, bir-birlərinin evinə dəfələrlə gedib gəlmişlər. Mələyin oxuduğu sinifdə Mehdi müəllimin

qızından başqa daha iki qızın adı Elmira imiş. Odur ki, Mələyin təklifi ilə qızlar Mehdi müəllimin qızını Elmira yox, Mehdizadə, – deyə çağırırlarmış. Hər dəfə evlərinə zəng edəndə "Mehdizadəni olar, zəhmət olmazsa, Mehdizadəni çağırın", – deyərlərmiş. Dəstəyi Mehdi müəllimin özü götürəndə gülə-gülə "A qızım, Mehdizadə elə mən özüməm də, dinləyirəm Sizi", – deyərmiş. Bu zaman Mələk və ya rəfiqələri isə "Mehdi müəllim, Sizin qızınız Mehdizadəni istəyirik", – deyə arzularını bildirərlərmiş.

Mehdi müəllim geniş biliyə, dünyagörüşə malik bir nazir, pedaqogika sahəsində keçmiş SSRİ-də tanınmış görkəmli alim, şərəfli bir müəllim və şəxsiyyət, ləyaqətli insan, gözəl ailə başçısı kimi tanınmışdır. Özü də hər şeydən əvvəl yüksək ixtisas biliyi, səriştəsi, işlədiyi və rəhbərlik etdiyi sahədə mötəbər nüfuzu, təcrübəsi, siqləti olan şəxs kimi. Yüksək ixtisas, peşəkarlıq, professionalizm ona xas olan ali keyfiyyətlər idi. Hər hansı sahə olursa-olsun orada müvəffəqiyyətin rəhni birinci növbədə ona başçılıq edən adamın ixtisasından, səriştəsindən, nəzəri bilik və təcrübəsindən asılıdır. Səriştənin, yüksək ixtisasın nə dərəcədə böyük əhəmiyyətə malik olduğunu bir sıra nümunələrlə göstərmək yerinə düşər:

– Neft sənayesinə Süleyman Vəzirov, Əli Əmirov kimi, neft və xüsusən qaz sənayesinə Sabit Orucov kimi görkəmli mütəxəssislərimiz, milli dram teatrımıza və kinostudiyamıza Adil İsgəndərov kimi istedadlı rejissor və aktyor, Bəstəkarlar İttifaqına və Konservatoriyaya dahi Üzeyir bəy və Qara Qarayev kimi ölməz bəstəkarlarımız, Yazıçılar İttifaqına Mehdi Hüseyn kimi qüdrətli



yazıçımız, Arxitektorlar İttifaqına böyük memar Mikayıl Hüseynov, respublikada ideoloji sahəyə Şıxəli Qurbanov kimi görkəmli alim və yazıçı başçılıq edəndə bu sahələrin işi necə deyərlər "su kimi, yağ kimi" gedir və böyük uğurlarla nəticələnirdi.

Təəssüf ki, həmişə və hər yerdə belə olmur. Bir də görürsən ki, mühüm bir sahəni tamamilə bu sahədən başı çıxmayan, səriştəsi, siqləti və nüfuzu olmayan, bir naşıya tapşırırlar və nəticəsi də acınacaqlı olur. O sahəni elə batırır, elə hala salır ki, sonralar uzun müddət onu düzəltmək mümkün olmur.

Mehdi müəllim isə bu baxımdan tamamilə öz yerində idi, düzünü desək, lap əvəzsiz idi. O, hələ 1921-ci ildən, lap gənc, əslində yeniyetməlik vaxtından maarif meydanına atılmış və bu sahədə uzun müddət külüng çalaraq sıravi maarif işçisindən – orta məktəb müəllimindən maarif nazirinə, keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyasının akademikliyinə, dünya miqyasında tanınmış pedaqogika alimliyinə qədər yüksəlmişdi.

Mən onun pedaqogikaya aid elmi əsərləri, nəşr olunmuş işləri barəsində yüksək fikirdəyəm. Xüsusən, onun Azərbaycan məktəbinin inkişafı tarixi haqqında doktorluq dissertasiyası, hələ 1959-cu ildə buraxılmış "Pedaqogika" (iki cilddə) dərsliyi, Azərbaycan məktəbinin başlıca problemlərinə həsr olunmuş tədqiqatları, bir sıra samballı əsərləri mühüm əhəmiyyət kəsb edir.

1980-ci ildə üç nazirin (Maarif, Ali və Orta İxtisas təhsili nazirləri və Peşə-Texniki Təhsil Komitəsinin sədri) Azərbaycanda xalq maarifinin tərəqqisinə həsr olunmuş və həcmi 250 səhifədən çox olan kitabın 180 səhifəsini

M.Mehdizadə yazmış, respublikada məktəb təlimi və tədrisinin bütün sahələrini ətraflı işıqlandırmışdır.

Azərbaycan Ensiklopediyasının bütün cildlərinin hazırlanmasında da Mehdi müəllimin xidmətləri böyükdür. O, Ensiklopediyanın Baş Redaksiya Heyyətinin üzvü idi. Pedaqogikaya, məktəb təliminə, maarifin tarixinə və nəzəriyyəsinə aid məqalələrin bir çoxunu o yazmışdı.

M.Mehdizadə rəhbər maarif işçisi kimi respublikada çox böyük nüfuz qazanmışdı. Bunu 1947-ci ildə Bakıdakı I nömrəli orta məktəbi qızıl medalla bitirərkən bir daha dərk etdim. Belə ki, bizim məktəbdən medala üç nəfər təqdim olundu. Bu, respublikada görünməmiş hal idi. O vaxt medal hər cəhətdən, istər maddi və istərsə də mənəvi-hüquqi baxımdan çox qiymətli idi. 22 qram çəkisi olan medal ən yüksək əyarlı qızıldan, "çervon" qızıldan düzəldilir və imtahan vermədən SSRİ-nin hər hansı bir ali məktəbinə dərhal daxil olmaq hüququ verirdi.

Sevincimin həddi-hüdudu yox idi. Lakin bir gün xəbər gəldi ki, mənə yalnız gümüş medal verəcəklər. Guya cəbr üzrə yazılı cavabımda kiçik bir səhv tapıblar. Məsələni, misalları tamamilə düz həll etmişəm, amma misalı qurtaranda nöqtəli vergül əvəzinə, yalnız nöqtə qoymuşam. Qaralamada isə düz olub, nöqtəli vergül var imiş. Elə buna görə də gümüş medal vermək istəyirlər. Bu xəbər mənə o qədər pis təsir etdi ki, balaca uşaqlar kimi hönkür-hönkür ağladım. Evə gəlib anama deyəndə də özümü saxlaya bilmədim. Yenə də ağlaşma... Anama dedim ki, heç bir haqq, ədalət yox imiş, mən nöqtəli vergülü qoymuşam. Axı bunun riyaziyyata nə dəxli. Bəs on illik zəhmətim... Hirsimdən səhərə kimi yatmadım. Ertəsi gün anam atamı o ki, var danladı. Dedi ki, "uşaq



özünü öldürür, ruhdan düşəcək, onda inamsızlıq yarana bilər, ali məktəbə girmək belə istəməz" və s.

Çox götür-qoydan sonra atam bu qərara gəldi ki, Mehdi müəllimə və o vaxt riyaziyyat üzrə metodist olan Əşrəf müəllimə desin (artıq o vaxt Mehdi müəllim maarif sistemində böyük və mötəbər nüfuzu olan şəxs, Əşrəf müəllim isə riyaziyyat sahəsində sözünün kəsəri olan metodist alim idi. Sonralar akademik oldu). İndi də yadımdadır, atamın onlara müraciəti belə odu: "Sizi and verirəm Allaha, Allah xatirinə bu işlə maraqlanın. Əgər ən kiçicik bir xəta, lap xırda bir səhv varsa, qoy elə gümüş medal olsun. Mən ömrümdə haram yeməmiş, ruzimə haram qatmamışam. Uşağıma da haram qızıl medal lazım deyil. Elə gümüş medalla da ali məktəbə imtahansız gələcək. Məsələ medalın qiymətində deyil. Uşaq özünü öldürür ki, ona qarşı haqsız hərəkət ediblər. Sizin mötəbər rəyiniz onu sakitləşdirər".

Mehdi müəllimin və Əşrəf müəllimin işə qarışması nəticəsində haqq, ədalət öz yerini tutdu. Məsələyə yenidən baxıb qızıl medal verməyi qərara aldılar.

İndi hər dəfə mənə verilmiş bu ilk dövlət mükafatına baxarkən hər üçünə: atama, Mehdi müəllimə və Əşrəf müəllimə qəni-qəni rəhmət deyirəm! Qəbirləri nurla dolsun!

Onu da deyim ki, atam elmdə, bilikdə heç bir güzəştə getməzdi. Düzlük, haqq, ədalət onun həyat çağırışı, ömür devizi olmuşdu. Elə buna görə də o, Mehdi müəllimlə yaxın dostluq edirdi.

Mehdi müəllimin böyüklüyünü göstərən başqa bir fakt. 60-cı illərin axırları idi. Hansı ilin olmasını dəqiq deyə bilmərəm. Yadımda yaxşı qalan o idi ki, atam Maarif

Nazirliyindən evə çox əsəbi qayıtmışdı. Evə girən kimi sözü bu oldu: "Nə yaxşı ki, Mehdi müəllim nazir imiş. İşini bilən və güclü adamdır. Əsl kişi kimi hərəkət etdi. Bir-iki müasir yazıçı az qalmışdı ki, klassik ədəbiyyatımızın, dərslik və proqramlarımızın evini yıxsın. Tələbləri bu idi ki, klassikləri azaldın, çıxardın, ixtisar edin, əvəzində bizi salın. Ayrı adam nazir olsaydı, bəlkə də niyyətləri baş tutardı. Amma Mehdi müəllim qoymadı. Klassik ədəbiyyatı şəxsən yaxşı bilir, sevir, əhəmiyyətini başa düşür. Buna görə də əsl dövlət adamı kimi, nazir kimi onun qayğısına qaldı. Yazıçılar incik getdilər.

Mehdi müəllim dedi: "Qoy getsinlər, mən milli ədəbiyyatımızı, təhsilimizin taleyini, balalarımızın taleyini bir-iki nəfərin ambitsiyalarına qurban verə bilmərəm. Nə qədər nazirəm, belə halların qarşısını qətiyyətlə kəsəcəyəm".

Maarif nazirliyində tədris proqramları müzakirə olunurmuş. Orta məktəblərimiz üçün dil və ədəbiyyat fənləri üzrə təqdim olunmuş proqramların və dərsliklərin layihələri nəzərdən keçirilirmiş. Özü də axırıncı dəfə, yüksək səviyyədə. Yığıncağa alimlər, tədris proqramları və dərsliklərin müəllifləri ilə yanaşı, bir sıra tanınmış yazıçılar, elm və mədəniyyət xadimləri də dəvət olunublarmış. Müzakirə zamanı bir neçə çağdaş yazıçı təkidlə tələb edib ki, proqramlarda klassik ədəbiyyata verilən saatlar xeyli azaldılsın, ixtisar edilsin, əvəzində sovet ədəbiyyatına, müasir yazıçılara verilən yer və saatlar genişləndirilsin, xeyli dərəcədə artırılsın. İddiaları da bu olur ki, indi Nizami, Nəsimi, Füzuli, Vaqif və ya Seyid Əzim vaxtı deyil. Onların vaxtı keçib. Müasir gəncliyə sovet ədəbiyyatı, kommunist ideyalılığı ilə dolu əsərlər



lazımdır. Onlara "sinfilik", "partiyalılıq", "xəlqilik" aşılayan, onları "kommunist partiyalılığı ruhunda" tərbiyə edən ədəbiyyat lazımdır. Məfkurə lazımdır. Klassik ədəbiyyat eşqdən, məhəbbətdən, aşiqanə hisslərdən "keçici hallardan" danışır.

Mehdi müəllim, atam, Məmməd Cəfər müəllim və başqaları buna etiraz edir, klassik ədəbiyyatın şərəfini müdafiə edir, mövqelərindən geri çəkilmirlər. Onda həmin yazıçılar, özü də o kəslər ki, ömrü boyu "sinfilik", "partiyalılıq", "xəlqilik" mövqeyindən çıxış edib, bədii ədəbiyyatı "ideoloji mübarizə" meydanına: "sinfi mübarizə" meydanına çevirib, hey kolxozdan, "yeni həyat tərzindən", "sovet vətənpərvərliyi" və xalqlar dostluğundan, "sosializm uğrunda mübarizədən" yazıblar, başlayırlar əsl hücuma. Nazirin və müəlliflərin üstünə hücum edir, hədə-qorxu gəlir, siyasi rəng verir və hətta birisi həyasızcasına deyir ki, "nə yapışmısız bu klassiklərdən. Məgər indiki şairlər klassiklərdən az iş görüb? Ya mən özüm, Mirzə Fətəlidən, Mirzə Cəlildən az iş görmüşəm?".

Mehdi müəllim bunlara əsla fikir vermir, sözündən dönmür, geri çəkilmir və qətiyyətlə bildirir ki, klassik ədəbiyyat başdan ayağa klassikadır. Nizami, Füzuli, Axundov, Sabir kimi klassiklər hər hansı bir xalq, hər hansı bir millətdə olsaydı, onlarla fəxr edər, qürurlanardı. Klassiklərimiz bizim şanlı tariximiz, ölməz və həmişəyaşar irsimiz, milli iftixarımızdır. Onları bilən məktəblilərimiz, gənclərimiz xalqla, millətin tarixilə, kökləriIə bağlanır və əsl vətənpərvər, əsl vətəndaş, layiqli övladlar kimi yetişirlər. Biz onları vətənpərvərlik tərbiyəsinin qüdrətli vasitəsindən, milli iftixar və əvəzsiz

zövq mənbəyindən böyük idraki əhəmiyyəti olan dəyərli bir qaynaqdan məhrum edə bilmərik.

Tale elə gətirmişdir ki, mənim bir neçə ən yaxın qohumlarım Maarif Nazirliyi və Mehdi müəllimlə əmək ünsiyyətində, iş əlaqələrində olmuşlar, özü də bu qətiyyən qohumbazlıqdan, dəstəkçilikdən irəli gəlməmişdir. Onların heç biri Maarif Nazirliyinin tabeliyində olan idarə və müəssisələrdə deyil, tamamilə başqa-başqa sahələrdə işləmişlər.

Uzun müddət "Maarif" nəşriyyatının direktoru olmuş mərhum qardaşım Hamidin də Mehdi müəllimlə iş əlaqələri, yaradıcılıq ünsiyyəti geniş idi. Tədris ədəbiyyatının, xüsusən dərsliklərin nəşrindəki müvəffəqiyyətlərinə görə dəfələrlə Maarif Nazirliyinin mükafat və təşəkkürünü almış, "Maarif əlaçısı" döş nişanı ilə təltif edilmiş, Mehdi müəllimin başçılıq etdiyi nümayəndə heyətinin tərkibində SSRİ müəllimlərinin qurultayında iştirak etmişdi. O, Maarif nazirliyində tez-tez olurdu və hər dəfə də çox razı qayıdırdı. Deyirdi ki, nazir işini bilən adamdır, kadrları da yaxşı tanıyır və qiymətləndirə bilir. Dərsliklərin nəşrinə xüsusi qayğı göstərir.

Baldızım Şövkət Abdullayeva da Mehdi müəllimin rəhbər işçi kimi qayğıkeşliyindən, obyektiv və prinsipial mövqe tutmasından, məktəb təliminə dərindən bələd olmasından və işə, tədbirlərə səriştəli münasibət bəsləməsindən və bütün bunların indi də maarif işçiləri üçün nümunə ola biləcəyindən danışır. O, xeyli müddət Azərbaycan Respublikası Gənclər Təşkilatı Mərkəzi Komitəsinin katibi (məktəblər üzrə) – pioner şurasının sədri olmuşdur. Məktəblərin gündəlik fəaliyyətilə



bilavasitə bağlı olan bir işçi kimi o deyir ki, Mehdi müəllim maarif aləminə dərindən vaqif olduğundan hər hansı təklif və tədbirə yaradıcı və tənqidi münasibət bəsləyirdi. İnandığına geniş yol açır, bəyənmədiyi və ya şübhə etdiyinə isə dərhal mənfi münasibətini bildirir və qarşısını alırdı.

Bəli, doğrudan da hər hansı bir işi, vəzifəni, xüsusən də çətin və mürəkkəb olanını, elə adama tapşırmalısan ki, onun öhdəsindən layiqincə gələ bilsin, fəaliyyəti məhsuldar, faydalı və uğurlu olsun. Xalqa xeyir versin. Atalar yaxşı deyib: "Çörəyi ver çörəkçiyə, birini də üstəlik", "Zərin qədrini zərgər bilər", "Bacarıq ağlın nişanəsidir".

Maarif sahəsi çox çətin, mürəkkəb, lakin xalqa çox vacib və lazım olan sahədir. Məsuliyyətli və şərəflidir. Amma çətindir və ağırdır. Xüsusilə bizim respublikamızda. Bunun obyektiv və subyektiv səbəbləri çoxdur. Hər şeydən əvvəl məktəblərimizin, ümumən maarifimizin maddi-texniki bazasının zəifliyi, məktəb binalarının, siniflərin çatışmazlığı, bir çoxunun iki növbədə işləməsi, müəllim əməyinin lazımınca qiymətləndirilməməsi və s. Uzun müddət ərzində maarifə, mədəniyyətə ikinci dərəcəli sahə kimi xor baxılması, maliyyələşdirilməsinin "qalıq prinsipi" əsasında aparılması, müəllimlərin, maarif işçilərinin maddi rifah halının aşağı olması, çoxmillətli respublikamızda tədrisin bir neçə dildə aparılması, dərsliklərin, məktəb ləvazimatının çatışmazlığı və s. də həmin səbəblərdəndir. Belə halda, belə şəraitdə maarifə başçılıq etmək müşkül məsələdir. Gör Mehdi müəllimdə maarifə nə qədər məhəbbət, həvəs və bu işdə bilik, ixtisas, səriştə, təcrübə,

obyektivlik, hamıya, bütün maarif ordusuna, onun sıravi əsgərlərindən tutmuş komandirlərinə qədər eyni gözlə baxmaq, eyni qayğıkeşlik və eyni tələbatla yanaşma, işə can yandırma olmuşdur ki, o, 25 ilə yaxın müddət ərzində (1952-1954 və 1960-1980) Maarif Naziri kimi mötəbər bir postda ayıq-sayıq dayana bilmişdir. Mən bu qədər uzun müddət nazir işləmiş ikinci bir adam tanımmışam. Həm də bu müddət ərzində o, irəli getmiş, SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü (akademiki), bir neçə çağırış Azərbaycan SSR Ali Sovetinin deputatı olmuş, ölkənin yüksək mükafatları – orden və medallarla təltif edilmiş, o vaxt hakimlik edən partiyanın rəhbər orqanlarına seçilmişdir. Özü də unutmayaq ki, onun nazir olduğu vaxtlarda respublikanın rəhbərliyi 4 dəfə dəyişmiş, o isə nazir vəzifəsində qala bilmişdir.

Mehdi müəllim vəzifəsindən heç vaxt sui-istifadə etməmiş, şəxsi mənafeyi naminə çalışmamış, bəziləri kimi vəzifədə olarkən dissertasiya müdafiə etməmişdir. 1954-cü ildə ilk dəfə Maarif Naziri vəzifəsindən azad edildikdən sonra yenidən V.İ.Lenin adına APİ-də pedaqoji fəaliyyətini davam etdirmiş, əvvəl apardığı tədqiqatların üzərində əzmlə işləmiş və 1956-cı ildə müvəffəqiyyətlə doktorluq dissertasiyasını müdafiə etmişdir.

Akademik M.Mehdizadə haqqında daha çox danışmaq, xatirələr söyləmək olar, fikrimizcə, elə dediklərimiz xalqımızın bu ləyaqətli oğlunun böyüklüyü, Vətənə, xalqa bağlı ömür yolu haqqında aydın təsəvvür yaradır.





# MAARİFİ ONUN QƏDƏR BİLƏN YOX İDİ

***RAMİZ MƏMMƏDZADƏ,***
*Azərbaycan Müəllimləri Yaradıcı İttifaqının sədri, AMİ-nin kafedra müdiri, professor*

Nəcib insan, gözəl maarifçi dedikdə ilk növbədə gözlərimiz qarşısında hamımızın tanıdığı Mehdi müəllim obrazı canlanır. Bu böyük şəxsiyyətin ünsiyyət mədəniyyəti, böyük-kiçik yeri bilməsi, yüksək mənəvi keyfiyyətlərə malik olması onu hamının sevimlisi etmişdi. Pedaqoji elmlər sahəsində sözün həqiqi mənasında ensiklopedik bilik sahibi olan M.Mehdizadə həmişə hərəkətlərində, fəaliyyətində, adamlara münasibətində başqalarına verdiyi məsləhətlərə birinci özü əməl edər, düşündüklərini, elmi axtarışlarının nəticələrini həyata keçirməyə çalışardı. Bakıda xarici ölkə müəllimlərinin yaradıcı ittifaqlarının Beynəlxalq Konfederasiyasının təsis qurultayı keçirilərkən bir qrup qonaqla Respublika Təhsil Nazirliyinin Məktəblilərin Estetik Tərbiyəsi üzrə Mərkəzinə getmişdik. Sənətdə kövrək addımlar atan balalarımızın yaradıcılıq işlərilə tanış olarkən, bu soyuq qış günündə beton döşəməli dəhlizlərdə onların tir-tir əsdiyini görüb mərkəzin binasının nə üçün qızdırılmadığını, dəhlizdə döşəmənin nə üçün taxta olmadığını mərkəzin direktorundan soruşduqda o, buna da şükür, – deyə cavab verdi. Bu sözlər məni düşündürdü və yadıma 50 il bundan əvvəl Mehdi müəllimlə bağlı bir əhvalat saldı.

İndiki kimi yadımdadır. 1961-1967-ci illərdə Sumqayıtda gənc şəhərin sürətlə artan əhalisinin tələbatını nəzərə alaraq çoxlu məktəb, texniki-peşə məktəbləri və uşaq bağçaları tikintisi gedirdi. Əlbəttə, o zamanlar şəhər partiya komitəsi, onun rəhbərliyi və şəhər soveti bu sahəni həmişə diqqət mərkəzində saxlayır və çalışırdılar ki, məktəblər bir qayda olaraq yeni dərs ilinə kimi istifadəyə verilsin. Yayın axırına yaxın tikilən məktəb bunalarının birində Şəhər Sovetinin o vaxtkı sədri mərhum Kamal Axundov (Allah rəhmət eləsin) və tikinti idarələrinin rəhbərləri ilə görüşdük. Məktəb binasını vaxtında istismara vermək haqda söhbətimiz oldu. İnşaatçılar Kamal müəllimin məktəbin vaxtında təhvil verilməsi tələbini yerinə yetirmək üçün binanın dəhlizinə parket əvəzinə beton plitələr döşəməyə icazə istədilər. Buna mən, əlbəttə, razı ola bilməzdim. Mübahisəmiz düşdü. Mübahisəyə son qoymaq üçün şəhər partiya komitəsinin birinci katibinə müraciət etdik. O isə: "Yaxşısı budur ki, Mehdi müəllimdən soruşun, maarifimizin ağsaqqalı nə desə, onu da edin" cavabını verdi. Ertəsi gün Mehdi müəllimi Sumqayıta dəvət etdik. Məsələdən hali olandan sonra əlini Kamal müəllimin çiyninə qoyub alicənablıqla dedi: "Kamal müəllim, inciməyin, Sizin çətin vəziyyətinizi başa düşürəm. Amma mən Ramiz müəllimin tərəfindəyəm. O, düz deyir, uşaqlarımıza beton döşəmə qıymaq olmaz, coşğun enerjili cocuqlarımız üçün həmin beton döşəmələr gələcəkdə fəlakətə çevrilə bilər: qaçarkən yıxılıb baş-gözlərini əzərlər. Biz buna necə razı ola bilərik? Həm də sizin bacarığınıza bələdəm, çalışsanız nəinki taxta, parket də taparsınız. Sənin hörmətin respublikada böyükdür. Belə etsən bu cavan katib də razı



qalar (mənim o vaxt 32-33 yaşım vardı)." Ağsaqqalın sözü yerə düşmədi. Məktəbə parket döşəndi.

Ancaq əfsuslar olsun ki, bu nəcib insanı başa düşməyənlər, incidənlər, qapı arxasında gözlədənlər də çox olmuşdur. Heç yadımdan çıxmaz, keçmiş Mərkəzi Komitə binasının 6-cı mərtəbəsində iş otağımdan çıxıb qonşu otağa gedirdim. Mehdi müəllimin dəhlizdə aramla var-gəl etdiyini gördüm. Ona müraciətlə: "Məni gözləyirsinizmi? Keçin içəri, bu dəqiqə qayıdıram", – dedim. "Yox, yox, işinizdə olun, Sizdən aşağıdakıları, ancaq özlərindən razı olanları gözləyirəm", – cavabını verdi. Mən Mehdi müəllimi onu gözlədən adamın otağına ötürmək istədikdə onun otaqda tək olduğunu görüb dedim: Mehdi müəllimi niyə qapıda gözlədirsiniz? Axı, o, bizim hamımızın ağsaqqalıdır!..

Bu hadisədən sonra əvvəllər baş vermiş bir məsələ də mənə aydın oldu. 1976-cı ildə Moskvadan Bakıya qayıdıb Mərkəzi Komitəyə ideoloji işlər üzrə katib seçilmişdim. Üçüncü gün idi ki, işləyirdim. Mehdi müəllim mənə zəng edib qəbuluma gəlmək istədiyini bildirdi. Dərhal razılıq verdim. Görüşüb salamlaşdıqdan sonra o, işdən getmək arzusunda olduğunu bildirdi və ərizəsini təqdim etdi. Mən cavabımda dedim ki, məgər mənim katib seçilməyimi gözləyirdiniz? Bilmirsinizmi nazirləri ərizə ilə təyin və azad etmirlər? (o vaxtlar istefa məsələsi yox idi).

Yadımdadır, Mehdi müəllimin sifətində bir nigarançılıq hissi duyulurdu. Mənə elə gəldi ki, onun utanaraq demədiyi sözlər mənim cavanlığıma, çox şeyləri bilməməyimə işarə idi. Cavabı isə belə oldu: "Hələ çox şey biləcək, eşidəcəksiniz". Bu hadisədən sonra mən işlədiyim dövrdə, həqiqətən, onu əvəz edə biləcək, maarifi

onun qədər bilən, müəllim şəxsiyyətinə hörmət edən, ancaq ondan cavan, onu əvəz edəcək şəxsi tanımadığım üçün onun əvəz olunmasının əleyhinə oldum və şöbə tərəfindən verilən namizədləri geri qaytardım. Həmin namizədlərin bəzisi məndən sonra təyin olundular, ancaq özlərini doğrultmadılar. O zaman mən dərk etdim ki, Mehdi müəllimin böyüklüyü, alicənablığı, maarifi dərindən bilməsi, lazım gəldikdə mədəni şəkildə, ancaq böyük mərdliklə maarifin, məktəbin, müəllimin mənafeyini müdafiə etməsi bəzilərinin xoşuna gəlmir, böyük bir sahənin müstəqilliyi onların ruhunu oxşamırdı. Məhz buna görə də onu aradan çıxarmağa, yaşı çatsa da ancaq düşüncələrində ayıq, yeni fikirli müasir bir naziri aradan götürməyə çalışırdılar. Sonralar onlar istədiklərinə nail oldular. Maarifimiz isə bundan çox şey itirdi. (həmin şəxslərin adlarını çəkmək istəmirəm, ona görə ki, həyat özü onların cavabını vermiş, bəziləri isə vaxtından qabaq dünyalarını dəyişmişlər). Hadisələrin sonrakı inkişafı göstərdi ki, maarifi onun qədər bilən yox imiş. Təəssüf... Təəssüf ki, bu imkandan lazımınca istifadə etmədik. Mehdi müəllim təqaüdə çıxandan bir neçə il sonra dünyasını dəyişdi. Allah ona rəhmət eləsin! Əlbəttə, əziz müəllimimiz M.Mehdizadə haqqıda, onun bənzərsiz şəxsiyyəti, şəxsi nümunəsi haqqında çox danışıb, çox yazmaq olar. Ruhu şad olsun böyük ustadımızın!





# AKADEMİK MEHDİ MEHDİZADƏ HAQQINDA XATİRƏLƏRİM

***İSA MƏMMƏDOV,***
*Psixologiya üzrə elmlər doktoru,*
*Azərbaycan Respublikasının Əməkdar müəllimi,*
*Sosialist Əməyi Qəhrəmanı*

Gözəl insan, görkəmli maarif və mədəniyyət xadimi, akademik Mehdi müəllim Mehdizadə Azərbaycanın yetirdiyi tanınmış şəxsiyyətlərdən biridir.

Əlbəttə, tanınmış pedaqoq alim, Azərbaycanda Xalq Maarifinin təşkilatçılarından biri olan Mehdi müəllimi 1952-ci ildən sonra Azərbaycan Respublikası Maarif Naziri təyin ediləndən sonra tanıdım və başqaları kimi mən də onun respublika yığıncaqlarında dəyərli çıxışlarını maraqla eşidirdim.

Mən onda Naxçıvan Muxtar Respublikasında Vilayət Komsomol Komitəsinin birinci katibi, Azərbaycan Komsomolu Mərkəzi Komitəsinin büro üzvü idim. 1954-65-ci illərdə Naxçıvan rayon və şəhər Xalq Maarifi Şöbəsinin müdiri, 1961-ci ildən Naxçıvan şəhərində olan internat-məktəbin direktoru vəzifəsində – bilavasitə Azərbaycan Respublikası Təhsil Nazirliyi sistemində fəaliyyət göstərdiyim üçün Mehdi müəllimi tez-tez görür və onun məzmunlu çıxışlarını eşidirdim.

Mehdi müəllimlə bilavasitə yaxın tanışlığım 1964-cü ildə Naxçıvan şəhərində olan internat-məktəbin direktoru, onun isə Azərbaycanın Maarif naziri işlədiyi dövrdə oldu.

1964-cü ilin may ayı idi. Xəbər tutduq ki, Mehdi müəllim Naxçıvana gəlib. Naxçıvan respublikasının o zamankı Maarif naziri Məmməd müəllim Bəktaşi mənə zəng vurub dedi ki, nazir Mehdi müəllim məktəbə gəlmək istəyir. Bir azdan o, Məmməd Bəktaşi ilə məktəbə gəldi. Mehdi müəllim Məmməd müəllimə dedi ki, Siz gedin işinizdə olun və özüm məşğul olacam. Yeri gəlmişkən deyim ki, Mehdi müəllim çox təm-təraq sevməzdi və istəmirdi ki, onu harasa müşayiət etsinlər. Özü məktəblərdə olarkən şəxsən işlərlə tanış olardı, müşahidələr aparardı.

Biz bunu bilirdik. Məktəblərdə olarkən çox sakit görünərdi, bütün məsələlərdə diqqətli, qayğıkeş, obyektiv olardı. Səsinin tonunu heç vaxt qaldırmırdı. Məktəbdə, maarifdə, təhsil sahəsində Mehdi müəllim o qədər səlis, aydın və inandırıcı və həm də həqiqəti danışırdı ki, heç kəs belə ağlına gətirmirdi ki, onun dediklərinə etiraz etmək olar. Pedaqoji işin, təlim və tərbiyənin bilicisi idi. Təhsil işçilərinin hamısı aşağıdan yuxarıya Mehdi müəllimdən öyrənirdi. Nöqsanlar mülayim, lakin həm də prinsipiallıqla nəzərə çatdırılır, elə o saat da onların aradan qaldırılması yolları göstərilirdi. Adama elə gəlirdi ki, bu alim, nazir hər şeyi bilir, düz bilir və nəyəsə etiraz etmək mümkün deyil.

Azərbaycanda internat-məktəblər keçən əsrin 50-ci illərindən təşkil olunmağa başlamışdı. Naxçıvan şəhərində olan inetnat-məktəb isə 1961-ci ildə açıldı. Naxçıvan Respublikasında yeganə olduğu üçün Muxtar Respublikanı əhatə edirdi. 460 nəfərlik internatı (yataqxanası ilə) vardı, ümumi oxuyanların sayı 800 nəfərdən çox idi.



Mehdi müəllim əvvəlcə mənimlə söhbət etdi, kim olduğumu tanısa da, tərcümeyi-halımı ətraflı öyrəndi. Dedi ki, müəllimlərin və Sizin dərslərinizdə olacam. Mənə daha nə göstərə bilərsiniz?

Mən cavab verdim ki, məktəbin coğrafiya meydançası, ayrı-ayrılıqda qızlar və oğlanlar üçün əmək təlimi kabinetləri, bütün fənlərə aid kabinetlər, kosmonavtlar, rəssamlıq, heykəltəraşlıq otaqları, Məktəb Tretyakov şəkil qalereyası, təsərrüfat hesabı ilə işləyən və 10 hektar torpağı əhatə edən tədris təcrübə sahəsi, avadanlıqla yaxşı təmin olunmuş idman və iclas zalları, digər lazım olan təhsil obyektləri var. Uşaqların tərbiyəsi, saxlanması və təhsili üçün demək olar ki, bütün şərait yaradılmışdır.

Məktəbdə yaxşı hazırlıqlı, təcrübəli, fərəhlə işləyən müəllim və tərbiyəçi kollektivi yaranmışdır.

İkinci günün sonunda Mehdi müəllim özünəməxsus çox sakit tonla dedi: “Məktəb çox xoşuma gəldi”. Mənim və məktəb kollektivinin sevincinin həddi-hüdudu yox idi. Bu sözləri biz nazirin, böyük alim-pedaqoqun dilindən eşidirdik. Bu sözlər məktəb kollektivinə, şagirdlərə də qol-qanad vermişdi. Bu yüksək qiymətdən sonra cəsarətləndim. Mehdi müəllimi evimə dəvət etdim. O, mənə dedi ki, yerim mehmanxanada var. Bir neçə dəqiqədən sonra bildirdi ki, qəlbinə dəymək istəmirəm, gedərəm. Əlavə etdi ki, evlərə getmir. Evdə bir tikə çörək yedik, utana-utana içki də təklif etdim. Ciddi baxışla, həm də yarızarafatla mənə dedi ki, deyəsən, sənə üz verdim. Mən azacıq alındım. Bir az sonra dedi: “Mən içmirəm, gətir nəyin var, sənin xətrinə bir qurtum içərəm, əlacım

yoxdur, görünür, səni çox tərifləmişəm. Mən tərif deməkdə bir az xəsisəm."

Mehdi müəllim məktəbdən gedərkən məktəb kollektivi haqqında yaxşı sözlərdən sonra mənə dedi: – "Niyə yazmırsan? Elmi işlə məşğul ol, nə kömək lazımdı edərik".

1964-cü ilin noyabr ayında Naxçıvan Muxtar Respublikasının 40 illiyi bayram edilirdi. Azərbaycanın o zamankı rəhbərləri Vəli Axundov, Ənvər Əlixanov, Məmməd İsgəndərov Naxçıvana gəlmişdilər. Naxçıvan Vilayət Partiya Komitəsinin birinci katini Hacı Xəlil oğlu İbrahimov mənə zəng vurub dedi ki, respublika rəhbərləri məktəbə gəlirlər. V.Axundov, Ə.Əlixanov məktəblə hərtərəfli tanış oldular, razı qaldılar və 40 illik tədbirlərin bir hissəsi məktəbin yaraşıqlı zalında və başqa yerlərində keçirildi.

Az müddət təhsil sahəsində işləsəm də, mənə də 1964-cü ildə Azərbaycan Respublikasının Əməkdar müəllimi fəxri adı verildi. Əvvəldən heç nə məlum deyildi. Adətən əməkdar adı üçün əvvəlcədən sənədlər hazırlanır, rəhbər partiya təşkilatları zəmanət verir və Mərkəzi Partiya Komitəsi Bürosunun qərarı olandan sonra Azərbaycan Respublikası Ali Soveti Fərman verirdi. Mənim üçün əvvəlcədən sənədlər hazırlanmamışdı. Mətbuatda Fərman dərc ediləndən sonra nazir Mehdi müəllim Bakıdan məktəbə zəng vurub məni təbrik etdi.

O, dedi ki, Mərkəzi Komitənin birinci katibi Vəli Yusifoviçin qəbulunda olarkən Naxçıvan internat-məktəbində işlərin yaxşı getdiyini ona çatdırmış, V.Axundov da internatda olduğunu və məktəbin onun xoşuna gəldiyini demişdir. Belə qərara gəliblər ki, Mehdi



müəllimin təqdimatı ilə mənə Respublikanın Əməkdar müəllimi adı verilsin.

Mehdi müəllimin mənim əməyimə yüksək qiymət verməsi gələcək fəaliyyətimə çox müsbət təsir etdi. 1965-ci ilin mart ayında mən Naxçıvan Muxtar Respublikasının Mədəniyyət Naziri vəzifəsinə irəli çəkildim.

Gözəl insan, görkəmli pedaqoq Mehdi Mehdizadənin Naxçıvan şəhərində olan internat-məktəbə verdiyi yüksək qiymət özünü doğrultdu. 1965-ci ildə internat-məktəbin birinci buraxılışı oldu. 10-cu sinfi qurtaran 32 nəfərin hamısı Bakı şəhərinin ali məktəblərinə qəbul edildilər. Bu, orta məktəb üçün çox yüksək, nadir göstərici idi. Həmin il məktəbi 6 nəfər qızıl və gümüş medalla bitirdi.

1970-ci ildən sonra Lənkəranda işlədiyim 10 ildən artıq bir dövrdə Maarifin inkişafında yaxşı göstəricilərə görə Lənkəran bir neçə dəfə Respublika hökumətinin Keçici bayraqları ilə təltif edildi və hörmətli Mehdi müəllim özü də bir dəfə bayrağı təqdim etdi.

1978-ci ilin iyun ayında Bakıda Müəllimlərin qurultayına və həmin ilin iyun ayının 29-da Moskva şəhərində Müəllimlərin birinci Ümumittifaq qurultayına da Azərbaycandan rayon partiya komitəsinin birinci katibi üçün bir yer ayrılmışdı, o da mənim payıma düşmüşdü. Heç şübhəsiz, burada da Mehdi müəllimin qayğısı və diqqəti olmuşdur.

Hörmətli akademik-pedaqoq, gözəl insan Mehdi müəllim, onu tanıyanların qəlbində əbədi yaşayacaqdır.



# GÖZƏL İNSAN, UNUDULMAZ MÜƏLLİM

*RƏFİQƏ MUSTAFAYEVA,*
*Pedaqogika üzrə elmlər doktoru, professor,*
*Beynəlxalq Pedaqoji Akademiyasının həqiqi üzvü,*
*Azərbaycan Respublikasının Əməkdar müəllimi*

Hələ universitetdə təhsil aldığımız illərdə adını eşidib, fəaliyyəti barədə məlumat almışdım. 1960-cı ildə pedaqoji fəaliyyətə başlayanda Mehdi müəllim nazirimiz idi.

1967-ci ilin soyuq dekabr ayında Moskvada keçirilən Ümumittifaq Pedaqoji Mühazirələrində respublikadan getmiş bir qrup maarif işçisi arasında mən də var idim. Məruzəm maraqla qarşılanmış, fəaliyyətim SSRİ Pedaqoji Elmlər Akademiyasının Fəxri fərmanı ilə təltif edilmişdi. Sonradan Moskvaya gəlmiş akademik M.Mehdizadə Respublika müəllimlərinin fəaliyyəti ilə maraqlanmış, nəticələrə sevinmişdi.

Bakıya gələndən sonra Mehdi müəllim də bizim xidmətimizi qiymətləndirdi. Onun imzası ilə bir qrup müəllimə, o cümlədən də mənə "Respublikanın Qabaqcıl Maarif Xadimi" döş nişanı verildi.

1969-cu ildə respublika pedaqoji mühazirələrində müvəffəqiyyətli çıxışıma görə nazir M.Mehdizadənin imzası ilə "Fəxri Fərman" aldım. Müəllimlik etdiyim müddətdə xeyli yazım çap olunmuş, təcrübəm respublika müəllimləri arasında təqdir olunmağa başlanmışdı.



1969-cu ilin aprel ayının 24-ü idi. Səhər tezdən işə gələndə müəllimlər otağında hamı məni sevinclə qarşıladı. Demə, dünən evə gedəndən sonra Mehdi müəllim məktəbimizə gəlmiş, rəhbərlik etdiyim ədəbiyyat kabineti ilə maraqlanmışdı. Kabinetin tərtibatı, xüsusilə məktəblilərin özlərinin yaratdıqları 5000 kitabdan ibarət kitabxana naziri çox razı salmışdı. Buna görə də o, məni yanına dəvət etmişdi.

Respublika müəllimlərinin xeyirxahı İmran Məmmədovla Mehdi müəllimin geniş kabinetinə gələndə, ayağa qalxıb məni böyük hörmətlə qarşıladı. Ədəbiyyat kabineti barədə razılıqla danışdı. Bir neçə yazımın adını çəkdi, hətta pedaqoji mühazirələrdəki çıxışımı da yadında saxlamışdı. Respublika pedaqoji-metodik mətbuatı barədə rəyimi soruşdu. Rəyimlə razılaşdı. "Azərbaycan dili və ədəbiyyat tədrisi" məcmuəsinin bir illik fəaliyyəti barədə rəy yazmağı tapşırdı. Rəy hazır olan kimi görüşünə gəlməyimi tapşırdı. Çox böyük məsuliyyətlə tapşırığı yerinə yetirdim, İmran müəllim arayışı oxuyanda bir neçə məsələni "yumşaltmağı" məsləhət görsə də, ondan üzr istəyib, yazımı olduğu kimi saxladım.

Mehdi müəllim bu dəfə məni daha böyük səmimiyyətlə qəbul etdi. Proqram-metodika idarəsinin əməkdaşlarından İ.Məmmədov, M.Səfərov, A.İbrahimov da bu görüşdə iştirak edirdilər. Arayışı özümə oxutdurdu. Axıradək diqqətlə qulaq asdı. Sonra aramla, özünəməxsus danışıq tərzi ilə üzünü oturanlara tutub dedi: "Bax, belə. Müəllimənin fikri tamamilə doğrudur. Cəsarətli fikirləri var. Gərək redaktor da burada olaydı. Bu arayışın bir surətini ona çatdırarsınız. Deyilənləri nəzərə alsın". Sonra üzünü mənə tutdu: Uşaqların şeiri sevirlər. Yazılarından

bilirəm. Amma bütün müəllimlərimiz sənin kimi işləmirlər. 54 il bundan əvvəl biz çalışırdıq ki, uşaqlara daha çox şeir əzbərlədək. (İndi yadımdan çıxıb, amma T.Fikrətin, M.Hadinin, M.Ə.Sabirin, A.Səhhətin adlarını çəkdiyi xatirimdə qalıb.) Onlar da həvəslə əzbərləyərdilər. Müəllimlərimiz özləri az şeir bilirlər. Uşaqlardan şeiri əzbər soruşanda kitaba baxırlar. Belə olmaz. Sən Şahini yaxından tanıyırsan? ("Azərbaycan müəllimi" qəzetinin redaktorunu nəzərdə tuturdu.) Sinədəftərdir. Sən də onun kimi ol. Dərs dediyin uşaqlara da çox şeir öyrət.

Mehdi müəllimin otağında çıxanda hamı məni təbrik etdi. M.Səfərov isə zarafatla dedi: "Axır sənin hesabına Mehdi müəllim bizimlə də zarafat edib güldü".

1970-ci ildə respublikada ədəbiyyat üzrə ilk tədris filminin yaradılması məsələsi qaldırılanda, Mehdi müəllim tərəddüd etməyib mənim adımı çəkmişdi.

Sonradan mənim və şagirdlərimin iştirakı ilə çəkilmiş "Xalq şairi Səməd Vurğun" filminə baxış keçiriləndə Mehdi müəllim mənimlə əlaqədar razılığını bildirmiş, filmin çoxaldılması barədə sərəncam vermişdi.

Aradan xeyli keçmişdi. Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda baş elmi işçi işləyirdim. Xalq şairi S.Vurğunun anadan olmasının 70 illiyi münasibətilə elmi-praktik konfrans keçirilirdi. Mən də məruzəçi idim. Mehdi müəllimin məclisdə iştirakı mənim məsuliyyətimi bir az da artırdı. Məruzəni kağıza baxmadan sinədəftər oxudum. Akademikə xoş gəlsin deyə, şeirləri bir az da pafosla söylədim. Dinləyicilər sürəkli alqışlarla təşəkkürlərini bildirdilər. Mehdi müəllim ayağa durub əlimi sıxdı. "Sağ ol, çox xoşuma gəldi", – dedi. Nazirimizin bu yüksək



qiyməti mənim üçün böyük mükafat idi. İnstitutumuzda bir neçə gün bu barədə razılıq hissi ilə söhbət getdi.

Günlərin birində müsabiqə yolu ilə indi çalışdığım Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutuna keçmək istədim. Mütləq nazirin razılığını almaq lazım idi. O mənim adımı eşidən kimi dərhal razılıq vermişdi.

Bu böyük insanın 80 illik yubileyi də unudulmaz bir xatirədir. Yuxarılar misilsiz pedaqoqun, gözəl insanın əsl qiymətini verməK istəməsələr də, xalq, pedaqoji ictimaiyyət, maarifpərvərlər Mehdi müəllimin yubileyini Azərbaycan maarifinin bayramına çevirmişdilər. Soyuq, küləkli bir gün olmasına baxmayaraq, o vaxtı Gənc Turistlər Stansiyasının iclas zalı başdan-başa gül-çiçəyə qərq edilmişdi...

Təntənənin sonunda hamı yubilyarın əlini sıxır, uzun ömür, can sağlığı arzulayırdılar...

Yaxınlaşıb əlimi uzadanda, hər iki əli ilə əlimi sıxdı:

– İşlərin necədir? İnanıram ki, sən bundan sonra daha yaxşı müəllim olacaqsan, – dedi.

Təəssüf ki, az sonra bu əziz insanın, müəllimlərin, alimlərin yaxın dostunun, Azərbaycan maarifinin sərkərdəsinin ağır xəstələnməsi məni sarsıtmışdı... Bir dəstə yaxın dost-tanışla xəstəxanaya ona baş çəkməyə getmişdik. Vəziyyəti yaxşı deyildi. Ayrılanda bildim ki, bu böyük insanla son görüşümdür...

Onu son mənzilə yola salanda bir daha əmin oldum ki, xalqının xidmətində duranlar, qayəsi yaxşılıq, xeyirxahlıq etmək olanlar dünyalarını dəyişsələr də, mənən əbədi olaraq yaşayırlar!...

# HƏR KƏSİN ÖZ QİYMƏTİ

*İMAMVERDİ ƏBİLOV,*
*filologiya üzrə elmlər doktoru, professor, Azərbaycan Respublikasının Əməkdar müəllimi*

Tərbiyəçinin şəxsiyyəti tərbiyənin məzmununu müəyyənləşdirir. Tərbiyənin səmərəsi tərbiyəçinin nəcabətindən soraq verir. Biz "tərbiyəçi" dedikdə, öncə bağça və məktəbi nəzərdə tuturuq. Bəzən nəzərə almırıq ki, ev də, körpələr evi də, bağça da, orta ümumtəhsil, ali və orta ixtisas məktəbləri, hərbi xidmət, habelə idarə və müəssisələr də səriştəli tərbiyəçiyə həmişə güclü ehtiyac duyublar. Başqa cür desək, işıqsız ev qurumuş çay, çeşməsi tükənmiş bulaq kimidir. Biz Mehdi Mehdizadəni həmişə, hər yerdə müəllim kimi tanımışıq. İnstitutda dərs deyəndə də, Maarif Naziri olanda da... Özü də həmişə xeyirxah, məğrur, təvazökar, sadə... O, həmişə öz təbiətinə sadiq yaşadı – sıravi müəllim kimi dərs deyəndə də, prorektor, rektor işləyəndə də, iyirmi beş il daşıdığı dövlət vəzifəsində – Respublikada Maarif Naziri kimi fəaliyyət göstərəndə də...

Yaxşı yadımdadır, Mehdi Mehdizadə Azərbaycanda maarif naziri işləyəndə ondan şəxsi məktub aldım. Həmin vaxt idi ki, "Gəlinlər qayınana olur" adlı məqaləm "Azərbaycan qadını" jurnalında dərc olunandan sonra qızğın mübahisə başlanmış və məqalə jurnalın növbəti nömrələrində ehtiraslı müzakirə obyektinə çevrilmişdi. Mehdi müəllim məqaləni oxumuş, mülahizələrimə münasibətini bildirməyi özünə borc bilmişdi: "Məqalənizi... diqqətlə, maraqla oxudum. Mübaliğəsiz deməliyəm ki, yazılarınız çox xoşuma gəlir. Əvvəla ona görə ki, qələmə aldığınız mövzular, sifariş xatirinə işıqlandırılana yox, yazıçılıq cığırına düşmüş qələm adamının qəlbindən qopan (təbii ki, həyatın təsiri altında) mövzulardır. İkinci, ona görə ki, mövzunu açmaq üçün sözlər, ifadələr, fikirlər ürəkdən gələnə oxşayır. Xüsusilə gəlin və qayınana haqqında hadisələrin psixoloji ifadələrini verməniz daha çox qəlbə yatır... Qəhrəman müəllimlərimizə həsr edilən bədii əsərin olmamasında da mütəəssirəm. Yazın! Sizə böyük yaradıcılıq nailiyyətləri arzulamağı özümə borc bilirəm...

Müəllimlər kollektivimizə mənim salam və xoş arzularımı bildirmənizi də xahiş edirəm. Hörmətlə. M.Mehdizadə – maarif naziri. Bakı, 5.II.1979". Məktubu büsbütün köçürmək fikrindən daşınıram, ona görə ki, mətləbi uzatmaq istəmirəm, həm də Mehdizadə şəxsiyyətindəki həssaslığı ifadə etmək üçün yuxarıdakı qeydlər də kifayətdir zənnindəyəm. Fenomen dedikdə, təsəvvürümüzdə qeyri-adi bir aləm və bu aləmin mərkəzində dayanmış əsrarəngiz vücud canlanır. M.Mehdizadə maarif fenomeni idi. O, sözün ən ülvi mənasında saf, nəcib, təmənnasız adam olduğu üçün kütləvi adiləşmə mühitində də böyük idi. Bu böyüklüyün səbəbi haqqında çox düşünmüşəm. Axı elə adamlar var ki, istedadı da, səlahiyyəti də, fəqət bir şəxsiyyət kimi təqdim olunmur. Niyə? Fikrimizcə, ona görə ki, belə adamlarda fitri müdrikliklə sadəliyin vəhdəti çatışmır.

Mehdi müəllimi bizə sevdirən ən mühüm cəhət bu idi ki, onda bu iki mənəvi keyfiyyət kip birləşmişdi, bir-birini tamamlayırdı. Alim üçün sadəlik zəruri mənəvi yaraşıqdır.

Lakin hökumət üzvü olan nazir üçün, nə qədər zəruri olsa da, bu mənəvi keyfiyyəti arzuladığımız qədər görmürük.

Səlahiyyətin böyüklüyü onları çox vaxt çaşdırır, xalqdan ayrı salır. Ancaq M.Mehdizadə fitrətən alicənab olduğu üçün əsrin dörddə biri nazir olduğu müddətdə sadəliyi özünə şüar elədi. Yazılarında da, fəaliyyətində də. 1976-cı ilin oktyabr ayı idi. Maarif Naziri M.Mehdizadə rayona gəlmişdi. RİK sədrinin müşayiəti ilə Bankə qəsəbəsindəki iki məktəbə baş çəkdi. Məni əvvəldən tanıyan Mehdi müəllimin xahişi ilə işdən ayrılıb onlarla birgə maşında əyləşmişdim. Neftçalaya qayıdarkən altı gün əvvəl torpağa tapşırdığım dost həmkarım Akif Cəfərovun yas çadırının yanından keçməli olduq. Maraqlandı. "Vəfat edən kimdir ki?" – sualının müqabilində hər şeyi danışdım. Mərhum haqqında ürək sözlərimi dedim. Cavab verdi: "Elə isə, hüzrə niyə getmirik ki?" Ürəyimcə olan bu sorğu yenidən məni dilləndirdi: "Mən hər gün orada oluram və bunu özümə borc bilirəm. Lakin... Sizə minnətdarlıqdan başqa nə deyə bilərik ki?..." Maşın geri döndü, çadırdan içəri keçdik. Xahiş etdi ki, gedişini reklam etməsinlər. Yerli molla hədis danışırdı. Səbirlə qulaq asdıq. Fatihə surəsi oxundu, salavat çevirdilər. Razılığını almadan Maarif Naziri Mehdizadənin hüzrə gəldiyini məclisdəkilərə söylədim. Bu reklam idimi? Bilmirəm. Amma onu bilirəm ki, biz nəcabəti elan etmək yox, təbliğ etməliyik ki, digər səlahiyyətli adamlara ibrət olsun. Yalnız planlaşdırılmış iclaslarda iştirak edən, "nəzərdən keçirilib" təsdiq olunmuş mətnləri oxuyan natiqlər dərk etmirdilər ki,



ömrün günləri "proqramlaşdırılanda" mənəvi darısqallıq daha aşkar duyulur.

Mehdi müəllim rəsmi fəaliyyət – vəzifə həddində də, qeyri-rəsmi münasibətlərdə də dəqiq, ardıcıl, həssas idi. 1979-cu il, 30 noyabr Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutunun keçmiş binası yanındakı turist bazasının iclas salonunda maarif fəallarının respublika müşavirəsi keçirilirdi. Dəvət olunmuşdum. İclas saat 14-də başlanacaqdı. Nazirliyin o vaxtkı idarə rəisi Zəhra Əliyeva təxminən saat 10-da mənə dedi ki, çıxış etməliyəm. O vaxtlar belə tələblər adi hal almışdı və bu adiləşmiş dəbə qarşı çıxmaq da olmazdı. Lakin həmin gün vaxt, imkan yox idi ki, çıxış mətnini yazıb makinaya verəsən, sonra redaktə edib nazirə təqdim edəsən. Sadəcə olaraq, çıxışdan imtina etdim. Lakin mümkün olmadı. Söhbət məktəb islahatı ilə əlaqədar problemlər kompleksindən gedir, yaradıcı, ziyalı, təcrübəli müəllim kimi Siz danışmayacaqsınızsa, bəs kimlərə söz verək?, – deyə məzəmmət olundum. Fəqət dediyimdən də dönmədim. Nazirə zəng vurub məsələni danışdılar. M.Mehdizadə məni söhbətə dəvət elədi. Elə mehriban, səmimi qarşıladı ki, haqlı etiraz eləsəm də, inadkarlığıma peşman oldum. Söhbətimizin təfsilatı yadımdadır:

– Sən ki, heç dözümsüz adam deyilsən? Gündəlikdə çıxışın nəzərdə tutulubsa, deməli çıxış etməlisən. Bu sahədə səriştənizə bələdəm. 25-30 il əvvəl filarmoniyada etdiyin çıxış yaxşı yadımdadır. Mirzə Ələkbər Sabirin arvadının adı ilə əlaqədar, Nizaminin, Füzulinin, Vaqifin həyat yolunun dərsliklərdə işıqlandırılması sahəsində yol verilmiş nöqsanlar barəsində yürütdüyün mühakimələr, konkret dəlillər... Yadında deyilmi, necə hərarətlə

qarşılandı? Rəhmətliyin oğlu, o vaxtdan bir igidin ömrü keçib. Ömrünün püxtə çağında başlamısan ki, hazır deyiləm, nə bilim, daha nə....

– Professor, məni qınamayın, nitq də, yazı da sərbəstlik sevir. Axı bu dar macalda mən standart cümlələr, xoşa gələn sitatlar tapmalı, onları yazmalı, sonra da üzündən oxumalıyam. Bir də ki, xatırlatdığınız bir qərinə əvvəlki çıxışımı mən unutmamışam. Səhv etmirəmsə, onda da hazır mətni oxumadım, tezis-qeydlər əsasında danışdım.

– Səninlə şərikəm. O vaxt kürsüyə mətnsiz qalxmaq olurdu. Amma indi... Elmi məclislə, işgüzar iclasın, rəsmi müşavirə ilə yığıncağın arasında fərq qalmayıb. Unutma ki, mətnsiz çıxış edəcəksənsə, danlağı mənə dəyəcək.

"Danlağı mənə dəyəcək!" Bu sözləri akademik M.Mehdizadə deyirdi. Bu böyük maarifçini, pedaqoji elm korifeyini danlamağa kimin haqqı var idi? Heç kimin! Həm də çoxlarının! O çoxlar ki, elmdən bixəbər, şəxsiyyətcə Mehdizadədən çox-çox aşağı pillədə dayanırdılar.

– Vaxtın varsa bir mətn yaz, ver Zəhra xanıma, amma yazdığın kimi yox, istədiyin kimi danışa bilərsən. Özü də bunu sənə keç kim deməyib...

Dediyinə əməl etdim... Və həqiqətən yazdığım kimi yox, istədiyim kimi danışdım. Müəllim nüfuzunun aşağı düşməsinə səbəb olan bir sıra amilləri sadaladım, müəllimin maddi ehtiyacının, mənəvi kasadlığının real səbəbləri haqqında danışarkən, rəyasət heyətindən mötəbər vəzifəli şəxsin kinayəli atmacasını eşitdim:

– Bəlkə bizə yol göstərib dərs verəsiniz ki, necə işləyək, necə davranaq?



Cavab verməmək olmazdı:

– Bura sinif otağı deyil, iclas zalıdır, dərsi sinifdə keçərlər. Bir də Sizin yolunuz rəsmi partiya-dövlət sənədlərində aydın əks olunubsa, təkrar yol göstərənə ehtiyac yoxdur.

Sözümə davam etdim. Çıxışımı qurtarıb əyləşmişdim ki, rəyasət heyətindən mənə bir vərəqə gətirdilər. Kiçik vərəqədə göy mürəkkəblə yazılmış qeyddə belə bir cümlə vardı: "Mənəviyyat sözünün "mənlik" məfhumuna yaxınlığı var..." İndi həmin kağız parçasını evimdə ona görə əziz bir əmanət kimi qoruyuram ki, Mehdi müəllimin həssaslığına dəlalət edən qiymətli bir ərmağandır.

1980-ci ildə "Azərbaycanda xalq maarifinin sürətli inkişafı" adlı bir kitab "Maarif" nəşriyyatı tərəfindən Azərbaycan və rus dillərində geniş tirajla çapdan çıxdı. Tanış müəllimlər məni təbrik etdilər – müəllif M.Mehdizadənin öz kitabında məndən açdığı geniş, səxavətli söhbətə görə. Bu barədə məlumatım yox idi. Kitabı tapdım, oxudum, bu nəcib insanın mənə, əməyimə verdiyi müstəsna qiymətə görə özümü mənəvi "borc" içərisində gördüm... İndi Mehdi müəllim yoxdur!...

Nədənsə, günlərin birində, yataqdan çox əzgin qalxdım. Yəqin bu halı hamı yaşayıb – adam nə üçün darıxdığını bilmir, amma darıxır, səbəbini bilmədən darıxır. Günorta poçt gəldi. Vaqif Səmədoğlunun bir misrası gözlərimdən qəlbimə yol saldı: "Quşlar saatla yox, işıqla başlayırlar oxumağa". Günəş öz vaxtında qalxır, məqamında batır. Heç kimlə, heç nə ilə hesablaşmadan, batır ki, yenidən doğsun. Mehdi müəllim kimi təkrarsız şəxsiyyətləri günəş timsalında təsəvvür edənlərə təkrar-təkrar haqq qazandırdım. Belələrinin günəş ömrü batır ki,

sabah yenidən pardaxlana-pardaxlana bizi həyata, fəaliyyətə səsləsin.

M.Mehdizadə xalq maarifimiz tarixində ad-sanı, elmi yaradıcılığı həmişə bizə örnək olan işıqlı mütəfəkkir timsalında qalacaq.

Neftçalada küçələrə ad verən komissiyanın rəhbəri kimi yeni adlar müəyyənləşdirərkən Dədə Qorqud, Əcəmi, Xətai... ilə yanaşı, Yusif Məmmədəliyevin, Xudu Məmmədovun, Mehdi Mehdizadənin adlarını təklif edəndə təəccüblənənlər, qətiyyətsizlik göstərənlər oldu. Fəqət burda təəccüblü nə var ki? Adətən biz öz münəvvər övladlarımızın xatirəsini əbədiləşdirərkən soy-kökümüzün uzaq qərinələrdən eşidilən səsinə yox, bürokratik rəhbərliyin amiranə sərəncamına daha meyilli olmuşuq. Mehdizadəni tanıyanlara onun böyüklüyünü sübut etməyə hacət yox idi. Y.Məmmədəliyev, X.Məmmədov haqqında da elə... M.Mehdizadənin həyat yolu, elmi fəaliyyəti haqqında geniş danışandan sonra onun adına küçənin vacibliyini nəinki lazım bildilər, bu işıqlı tədbirin ardınca o kişinin adına layiq daha samballı tədbirlər görüləcəyinə söz verdilər.

Bəli, tarix öz nadir övladlarının qiymətini verməkdə həmişə gecikir. Xalqına, dövlətinə, ömrü boyu sədaqətlə qulluq edən bu nəhəng elm xadimi, təvazökar müəllim, obyektiv düşüncəli, xeyirxah qayəli, nəcib niyyətli parlament üzvü, nazir kimi tanınıb sevilən Mehdi Mehdizadə ümumittifaq əhəmiyyətli fərdi pensiyaya çıxandan sonra ehtiram və məhəbbətin hərarəti ilə fasiləsiz isinməyə haqlı imiş. Çox eşitmişik: "Sağlığında qiymət verin insanlara". Nə qədər demişik: "Gecikmiş yardım kimsəyə gərək?".



Hamı eyni cür doğulur, müxtəlif cür yaşayır... Hamı cəmiyyətə eyni cür xidmət göstərmir, eyni səviyyədə fayda vermir. Buna görə adamların nüfuzu da, mövqeyi də müxtəlif olur. Axırıncı dəfə onunla İçərişəhərin qoşa qapısı önündə qarşılaşdım. Sübh şəfəqini xatırladan yanaqları avazımışdı. Təbii ki, görüşüb əhvallaşdıq. Heç vaxt dilindən giley eşitmədiyim Mehdi müəllim bu dəfə də kimsədən şikayət etmədi, amma mən onun səssiz-sözsüz gileyini "eşitdim". – Telefonum susur, – dedi. Bəzən elə bilirəm ki, işləmir, amma dəstəyi götürəndə görürəm ki, yox, səs gəlir, sükut səsi, lap mənim ömür yoluma oxşayan uzun, uğultulu səs...

– Hə, yaxşı yadıma düşdü, bir dəfə respublika müşavirəsində yanıqlı bir çıxış etdin, sonra mübahisə doğuran bir şeir də dedin, gərək ki, yetmiş doqquzuncu il idi.

– Yadımdadır, Mehdi müəllim.

– Şeir necə? O da yadındadır?

– Yaddaşımdan bədgüman deyiləm. Deyəsən unutmamışam.

– Mümkünsə, tələsmirsənsə, onu söyləsənə!... Xahiş edirəm, təklifim yersiz görünməsin. Kövrək şeirlər adama təsəlli verir.

Doğrusu tutuldum. Axı, Qala divarının qabağında dayanıb şeir demək nə dərəcədə münasib idi?! Ancaq Mehdi müəllimin xahişinə əməl etməmək də olmazdı.

– Bilirəm, qeyri-mətbuat şeiridir, amma ehtiyat etmə.

– Nə danışırsınız, Mehdi müəllim, onu dəst-xəttimlə yazıb ünvanınıza göndərərəm.

– Sağ olun, minnətdaram, elə isə bizim evədək, yol boyu həmin şeiri eşidim. Xahişindən çıxa bilmədim. Asta addımlarla irəliləyə-irəliləyə həmin uzun şeiri söylədim:

Mən ki, deməmişəm heç "mənəm", "mənəm",
Allah, mən ki, sənin aciz bəndənəm.
Qəlbimi-qəlbimə daşıdım hər gün,
Anlaya bilmədi o da dərdimi.
Yoxdan yaratmısan məni sən özün,
Ya məni yox elə, ya da dərdimi...

Mənzilinin qabağında dayandıq, evə keçməyi xahiş etsə də üzr istədim, əl tutub ayrılanda təbəssümlə şeirin son misrasını təkrarladı:

"Ya məni yox elə, ya da dərdimi..." Yaman deyib! Dərdlə qoşa yaşamaq çətindir, çox çətin... Bəli hər kəsin öz qiyməti vaxtında verilsə, dərd özünə həmdəm tapmaz! Əfsus...





# ONUN HƏR KOLLEGİYA İCLASI BİR UNİVERSİTET DƏRSİ İDİ

*ƏJDƏR AĞAYEV,*

*Pedaqoji elmlər doktoru, professor, Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü, əməkdar müəllimi, Prezident təqaüdçüsü,*

Allahdan olan kimi taleyimə M.Mehdizadə ilə çox yaxın ünsiyyətdə işləmək qisməti yazılıbmış. Bu, mənim "Azərbaycan məktəbi" jurnalının baş redaktoru kimi fəaliyyət göstərdiyim 1974–1981-ci illərə aiddir. Doğrudur, hələ iki il əvvəl o, çalışdığım Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnsititutunun şöbə müdiri ilə birlikdə məni də öz kabinetində dinləmişdi, pedaqogika tarixi üzrə mütəxəssis olduğumu öyrənmişdi, şöbədə aparılan tədqiqatlarla əlaqədar öz elmi məsləhətlərini verərkən onunla mükalimədə olmuşdum. Və bu zaman mən M.Mehdizadənin nazir kimi elmi-tədqiqat işlərinə nə qədər diqqətlə yanaşdığını, alim kimi pedaqoji problemlərə dərindən bələd olduğunu öz aləmimdə təqdir etmişdim. Lakin nazirliyin elmi-pedaqoji, metodik mətbiat orqanına rəhbərlik etdiyim zaman mətbuat işlərinə də mükəmməl bələd olduğunun şahidinə çevrildim. Hər kollegiya iclasında isə onun müzakirə edilən bir-birindən fərqli məsələlərə, problemlərə peşəkarlıqla, kamil biliciliklə yanaşmasına, düzgün, dəqiq, həyati, nəzəri və

praktik əhəmiyyətli göstərişlər verməsinə, qərarlar çıxarmasına heyran qaldım.

Akademik, professor elmi adları olmasına baxmayaraq, hamı ona "Mehdi müəllim" – deyə müraciət edərdi. Onun özü də "müəllim" sözündən xoşhal olardı. Çünki "müəllim" sözünü peşə istilahı kimi yox, hörmətli, nüfuzlu qabil bir şəxsə, ustada deyilən ad kimi işlədərdi.

Mehdi müəllim çox sadə, mehriban, səbirli, təmkinli və vüqarlı bir insan idi. Əsəbiləşəndə qızarardı, amma söz mədəniyyəti həddini keçməzdi. Obyektiv, həqiqətpərəst, yüksək mənəviyyatlı, təmənnalılıqdan uzaq olması bu sadəliyində onu əlçatmaz etmişdi. Biz onunla görüşə, onu dinləməyə can atardıq. Eşidəndə ki, Mehdi müəllim yanına çağırıb, həvəslə gedərdik, çünki bilirdik ki, işimiz, təqdirimiz öz yerində, danlağından da nəyisə öyrənib faydalanacağıq. Bununla belə, onun yanında böyük məsuliyyət hissi keçirərdik. Maraqlanacağı problemlə qabaqcadan tanış olmağa çalışar və ciddi, həm də praktik bələdlik cəhətdən hazırlaşardıq. "Azərbaycan məktəbi" jurnalının hər nömrəsi işıq üzü görən kimi məni ya yanına dəvət edər, ya da telefonla məqalələr haqqında öz rəyini söyləyərdi. Tənqidi qeydlərini deyib, məsləhətlər verərdi. Ayda bir dəfə Bakı şəhərinin qabaqcıl məktəb rəhbərlərini, müəllimlərini yanına çağırıb onlarla iş təcrübəsinə aid müzakirələr keçirərdi, kimin mülahizələri, təcrübəsi xoşuna gəlsəydi, onlara fikirlərini məqalə kimi yazmağı tapşırardı. Bir də görürdüm ki, 30-40 müəllimin məqaləsini oxuyub, redaktə edib, rəyi ilə dərc olunmağa göndərib. Sonra da o məqalələrin dərcini izlərdi, məqalələr dərc olunduqdan sonra mənə zəng edib deyərdi: necədir, xoşunuza gəldimi? Yeri gəlmişkən qeyd edim ki,



ondan 35 yaş kiçik olmağıma baxmayaraq mənə həmişə "Əjdər müəllim", - deyə müraciət edər, "Siz"lə danışardı. Mehdi müəllim zorla təsir göstərməyi, nazir missiyası və imtiyazlarından sui-istifadəni sevməzdi. Onun göndərdiyi məqalələri mən bir-bir, ya iki məqaləni bir nömrədə dərc edərdim. Redaksiyanın daxili poçtuna və sifarişlərinə üstünlük verərdim. Çox sonralar anladım ki, mən nazirin təşəbbüsü ilə edilən işə xəsisliklə yanaşmışam. Özüm, bunu dərk elədim, amma Mehdi müəllim bu barədə narazılığını bildirmədi. Etiraf etməliyəm ki, Mehdi müəllimin göstərdiyi maraq və praktik kömək nəticəsində həmin illərdə "Azərbaycan məktəbi" və onun əlavələri çox yüksək səviyyədə buraxılırdı. Mehdi müəllim Moskvaya – SSRİ PEA-nın iclaslarına gedəndə orada görüşdüyü görkəmli alimlərə "Azərbaycan məktəbi"nə yazmaq üçün sifariş verərdi. Dünyada tanınan M.Skatkinlə, İ.Lernerlə, M.Mahmudovla və başqa görkəmli pedaqoqlarla Azərbaycan pedaqoji mətbuatının işgüzar əlaqəsi beləcə yaranardı. Mən redaksiyadan yazılan məktublarla bu əlaqənin çevrəsini daha da genişləndirər, alimlərlə yanaşı, digər respublikaların pedaqoji jurnalları ilə də əməkdaşlıq yaradırdım. Təsadüfi deyildir ki, həmin illərdə Bakıya gələn görkəmli pedaqoq-alimlər, pedaqoji jurnalistlər mütləq "Azərbaycan məktəbi" redaksiyasına baş çəkər, yaradıcı heyətlə görüşərdilər. Professor İ.Maryenko, bəstəkar D.Kobalevski, musiqişünaslar B.Dimentman, V.Popov və digər xadimlərlə görüşləri bu gün də çox səmərəli, faydalı nəticə verən əməli işlər kimi xatırlayıram. Bu əlaqələr nəticəsində Rusiyanın "Narodnoe obrazovanie", "Fizkultura v şkole", "Russkiy yazık v naçalnoy şkole", Ukraynanın "Radyanskaya

skola", Belorusiyanın "Narodnaya asveta", Başqırdıstanın "Başkerdostan ukıtıvçısı" jurnalında dərc edilən məqalələrim Azərbaycan maarifi, mətbuatı haqqında digər respublikalarda özünütanıtma işinə xidmət edirdi və bunlar akademik M.Mehdizadə elmi ziyası və nüfuzunun təsirindən meydana çıxırdı. Çox xoşbəxtəm ki, M.Mehdizadə nüfuzlu bir nazir kimi işlədiyi nazirliyin orqanı olan "Azərbaycan məktəbi" jurnalını da, onun baş redaktorunu da Pribaltikada, Orta Asiyada, Güney-Qafqazda, Rusiyada tanıtdırmışdı.

Mehdi müəllimlə görüşüb, məsləhətləşmədən o zamankı mərkəzdəki elmi dairəyə çıxmaq mümkün deyildi. Yadımdadır. 1975-ci ildə SSRİ PEA-nın Ümumi Pedaqogika ETİ-də görkəmli pedaqoq-alim M.Ş.Şabayeva ilə görüşüb, bir tədqiqat problemi ilə əlaqədar məsləhətləşmək istədim. O, soruşdu:

- Siz bu barədə M.Mehdizadə ilə danışmısınızmı?

- Xeyr, - dedim.

Təəccüblə soruşdu:

- Niyə?

Vəziyyətdən çıxış üçün dedim ki, onunla görüşmək çətindir.

M.Şabayeva dedi:

- Mən onu tanıyıram. O, elmi söhbət üçün həmişə vaxt tapa bilər. Onun fikrini bilmədən yerli problemə aid öz sözümü deyə bilmərəm. Gedin onun yanına.

1975-ci ildə "Azərbaycan məktəbi"ndə mənim "Azərbaycan pedaqoji fikrinin başlıca problemləri" adlı bir elmi məqaləm dərc edilmişdi. Mehdi müəllimlə görüşərkən həmin məqalədəki məsələlərə aid xeyli yeni məlumat verdi və birdən soruşdu: "Rəhbər" jurnalının



neçə nömrəsi çıxıb? Dedim ki, yazılanlara görə 6 nömrəsi çıxıb, amma mən 5-ni görmüşəm, 6-cısını tapa bilmirəm. Dedi: "Mən də tapa bilməmişəm. Əgər arxivdə rastına gəlsə, mənə də yerini de". Beləcə onunla ikilikdə görüşlərdə xidməti məlumat, izahat, ya tapşırıqdan sonra, mütləq Azərbaycan pedaqoji fikrinin müxtəlif problemlərindən söhbət açardı. Həm nəyisə soruşardı, həm də özü məlumat verərdi. Mehdi müəllimlə elmi-əməli söhbətimiz mənim tədqiqatçılıq vərdişlərimdən soyumağıma imkan vermirdi. Keçirilən respublika elmi-praktik konfranslarında, müşavirələrdə nazirin məruzəsindən sonra mən çıxış etməli olurdum. Bilirdim ki, bu Mehdi müəllimin təşəbbüsüdür. Mənim simamda nazirliyin mətbuat orqanının intellekt, peşəkarlıq səviyyəsini tanıtmaq istəyir. Hətta bir gün Azərbaycan televiziyasının uşaq verilişləri baş redaksiyasında mənə dedilər ki, Maarif Naziri sədrimiz Elşad Quliyevə məktub yazıb. Məktubda sənin müəllifi və aparıcısı olduğun "Həyat bizi səsləyir" verilişi təqdir olunur, verilişin yuxarı sinif şagirdlərinin mənəvi tərbiyəsində böyük əhəmiyyəti olduğu göstərilir. Çox sevindim. Amma bu barədə Mehdi müəllim özü mənə bir söz demədi ki, mən fürsət tapıb təşəkkürümü bildirim. 1975-ci il idi. Yevlax rayonundakı Xaldan kənd orta məktəbinin direktoru Zahid Şöyübovun kompleks təhsil məktəbinin təcrübəsi haqqında qızğın söhbətlər gedirdi. Bir çox qəzet və jurnalda Z.Şöyübovun fəaliyyətindən, təcrübəsindən, təşəbbüskarlığından bəhs edilirdi. Xaldanda dövlət tədbiri səviyyəsində respublika müşavirəsi keçirilirdi. Nazirlikdən mənə zəng etdilər ki, Mehdi müəllim dedi ki, Əjdər müəllim çıxış üçün hazır olsun, lazım gəlsə ona söz veriləcək. Xaldanda olarkən

nazirimizin şərqlilərə məxsus digər bir alicənablığı ilə tanış oldum, o pedaqoji kollektivə linqafon kabinetini hədiyyə gətirmişdi.

Bir gün nazirlə aramızda bərk narazılıq oldu. Sən demə, mənim müvəffəqiyyətlərimdən narahatlıq keçirən adamlar (bunlar əvvəllər işlədiyim ETPEİ-də, nazirlikdə və redaksiyada da var imiş) nazirdə mənə qarşı antipatiya yaratmağa çalışırmışlar. Nazirə mənim guya özümü sərbəst aparmağımdan, baş məqalələrdə nazirliyi tənqid etməyimdən və s. aravuran xəbərlər çatdırırmışlar. Onu da bildirim ki, mən Mehdi müəllimlə heç vaxt yerli-yersiz "bəli, baş üstə" ilə danışmazdım. Bəzən olurdu ki, onun təklifinə qarşı çıxırdım. O, məndən tələb edirdi ki, nazirliyin idarə rəislərinə, aparıcı mütəxəssislərinə məqalə sifariş eləyim, onları hərəkətə gətirim, yaradıcı düşünməyə vadar edim. Mən ha sifariş verirdimsə, onlar hərəkətə gəlmirdilər. Yalnız iki nəfər – Əyyub İmaməliyev və Nəriman Abdullayev fəallıq göstərirdilər. Nazir məni qınayırdı ki, qalanlarına təsir göstərə bilmirəm. Mən isə təkidlə sifariş verməyin əleyhinə idim. Bu məsələdə nazirlə razılaşmırdım. Bir də rus dilində yazan yerli müəllimlərin məqalələrinin tərcümə edilərək "Azərbaycan məktəbi"ndə dərc edilməsinə etiraz edirdim. Təklif edirdim ki, onlar yaxşı olar ki, o zamankı rus dilli ölkə mətbuatında çıxış etsinlər. Nazir isə bu fikrimlə qətiyyən razılaşmırdı. Onlar da Azərbaycandakı məktəblərdə çalışırlar, təcrübələri bizim işimizin nəticəsidir, - deyirdi.

Başqa bir mübahisəmiz alimlərin məqalələrinə tənqidi münasibətin gücləndirilməsi təklifimlə bağlı oldu. Mən bir neçə məqaləni nazirə göstərib dedim ki, bu yazılarda müəlliflər Rusiyada çıxan kitabları təbdil



etmişlər, faktları yerli şəraitə uyğunlaşdırmışlar. Hətta elə məqalə də olur ki, aztirajlı nəşrlərdən bir paraqrafın və ya fəslin tam tərcüməsi üzərində qurulur.

Mehdi müəllim məni səbirlə dinləyib təmkinlə cavab verdi:

- Sən pedaqogika tarixçisisən. Arxiv sənədləri, tarixi faktlar üzrə orijinal şərhə alışmısan. Amma nəzəri məsələlərdə başqalarının həmin problem üzrə fikirlərindən istifadə etmək imkanı vardır. Sən buna qısqanclıq göstərmə. Məqalə iki səviyyədə ola bilər: bir, tənqidi, bir də təbliği. Təbliği məqalələr digərlərini ümumiləşdirib yayır. Bunun eybi yoxdur. Qoy yazsınlar, oxucular heç olmasa bu yolla mövcud elmi fikirlə tanış olsunlar.

Bax beləcə ara-sıra mübahisələrimiz olan vaxtlarda paxıllarım gizlincə məndən nazirə yaltaqlana-yaltaqlana deyirdilər: jurnalın baş redaktoru indi heç naziri də saymır. Belə bir psixoloji hazırlıq zəminində nazirin məndən həqiqətən narazı düşməsinə məqam yarandı. Bu, necə oldu? Moskvada nəşr olunan "Pedaqoji fikir və məktəb tarixi oçerkləri" kitabında Mehdi müəllimin Azərbaycan pedaqoji fikri və məktəb tarixini əks etdirən iri həcmli materialı (ayrıca fəsil) nəşr edilmişdi. Professor Hüseyn Əhmədov həmin fəslə geniş rəy yazıb redaksiyaya təqdim etmişdi. Planlaşdırma apararkən həmin məqaləni çap üçün hazırlamaq nəzərdə tutuldu. Nömrənin şöbə redaktoru, məsul katib, baş redaktor müavini tərəfindən çap üçün imzalanmış materiallarını oxuyarkən Hüseyn Əhmədovun həmin məqaləsindən narazı qaldım. Məqalə, əsasən, tənqidi ruhda, həm də subyektiv yazılmışdı. Məqalənin yenidən işlənməsi barədə fikrimi müavinimə bildirdim. Görünür, özüm də tarixi mövzularda tədqiqat

apardığım üçün məqalənin qeyri-obyektiv yazıldığını israr etdim. Müavinim isə məni inandırmağa çalışdı ki, Mehdi müəllim tənqiddən narazı qalmaz. Məqaləni ləngitmədən verək. "Axı tənqid qeyri-obyektivdir", - dedim. Qərarlaşdırdıq ki, hazırlanmış materialı Mehdi müəllimə göndərək, tanış olsun. Belə də etdik. Düz 20 gündən sonra Mehdi müəllim məni kabinetinə çağırdı. Redaksiyada işlərimizin necəliyini soruşduqdan sonra həmin yazıdan danışmağa başladı. Müəllifin subyektivliyindən, bizim onunla həmfikir olmağımızdan narazı qaldığını bildirdi. Sözləri indiki kimi yadımdadır: "Axı sən özün də tarixçisən. Sən faktlara da bələdsən, onu neçə cür yazmaq oları da bilirsən. Axı sən özün bu rəyin qiymətini düzgün verməyə qabilsən. Onu niyə mənə göndərmisən? Əgər sənə gələn materialları mən redaktə etməliyəmsə, səni niyə baş redaktor təyin etmişəm?" O, dedikcə mən əzab çəkirdim. Ona əzab çəkirdim ki, nazirlə mənim münasibətimi korlamaq istəyənlərin dəyirmanına öz əlimlə bilmədən su tökmüşdüm. Bəlkə də bu işi elə bu məqsəd üçün qurublarmış. Amma nazirə demədim ki, elə mən də Sizin fikirdəyəm, mənim fikrimlə razılaşmayanlar var, ona görə də Sizə göndərmişəm.

Nazir məqalədə göstərilmiş iradları bir-bir faktlarla təkzib etdi. Sonra da soruşdu: "Mənimlə räzılaşırsınızmı?" Dedim: "Bəli". Məqaləni mənə uzatdı. Redaktorsan, özün bilərsən, istəyirsən, olduğu kimi ver, mən də mətbuatda sizi təkzib edərəm.

Mehdi müəllimə mehriban münasibətimi hiss etdirmək üçün dedim: "Məqaləni Sizə bir alim, müəllif kimi göndərmişəm, nazir kimi yox". Bu cümləm də yersiz oldu. Mehdi müəllim dedi: "Redaksiyanın işini



kollegiyada müzakirə edərik, mənim nazir olduğumu da yaddan çıxarmazsınız".

Bu neçə ildə ilk dəfə Mehdi müəllimin kabinetindən məyus, dalğın halda çıxdım. Qəlbən ona haqq qazandırırdım. Düzgün hərəkət etməmişdim. Məqaləni Mehdi müəllimin mənə dediyi təkzib əsasında redaktə etdim və eləcə də dərc olundu.

Aradan iki ay keçdi. Bizim söhbətimiz 1977-ci ildə olmuşdu. İndi isə 1978-ci il idi. Bir gün nazirliyin bir inspektoru redaksiyaya gəlib mənə nazirin əmrini göstərdi. Həmin əmrlə redaksiyada yoxlama aparmaq ona tapşırılmışdı. Vəziyyəti bu səviyyəyə çatdırmış paxıllarım şaiyə yayırdılar ki, nazir Əjdəri baş redaktorluqdan azad edəcək. Nə isə, yoxlamanın nəticələri kollegiya müzakirəsinə verildi. Yoxlayıcı siyasi, pedaqoji, maliyyə qüsuru tapa bilməmişdi. Amma buraxılmış vergülləri, qoyulmamış nöqtələri sayına qədər elə pafosla deyir, elə mənalandırırdı ki, sanki baş redaktoru dünəndən işdən götürmək lazım idi. O müzakirə mənim üçün adamları tanımaq mənasında əsl sınaq oldu. Müzakirədə hər gün hörmət etdiyim adamların bir qismi susurdu. Amma az tanıdığım, kömək gözləmədiyim adamlardan bir neçəsi həqiqətin açıq-açığına müdafiəsinə qalxdılar. Onlardan bəziləri bu gün dünyasını dəyişib. Allah onların qəbrini nurla doldursun!

Həqiqətin əsl müjdəçisi yenə də Mehdi müəllim oldu. Mənim işimdən razılığını bildirdi, müavinimi isə təcrübəli olduğu halda, məsuliyyətsizlik göstərməkdə günahlandırdı. Mənə töhmət, müavinimə şiddətli töhmət elan olundu. Üç ay sonra Mehdi müəllim zəng vurub, dedi ki, ərizə yazın, töhmətinizi götürüm. Unudular, sonra

xətası çıxar. Onun dediyi kimi etdik. Amma yenə də Mehdi müəllim mənim nəzərimdə nazirdən daha çox müdrik ağsaqqal, nüfuzlu alim, büllur kimi saf şəxsiyyət kimi qaldı.

Mən baş məqalələr yazarkən tez-tez onun əsərlərindən bəhrələnərdim. Xüsusilə idarəetmədən bəhs edərkən ona istinad edərdim. Keçmiş ittifaqda da onu bu sahədə ən müqtədir mütəxəssis sayırdılar. Keçmiş SSRİ-nin maarif naziri M.Prokofyev çıxışlarında, məqalələrində M.Mehdizadənin adını maarifə xidmət edən görkəmli pedaqoq-alim kimi dəfələrlə çəkmişdi.

Mehdi müəllim məqalələrinə qarşı çox diqqətli idi. Məruzələrini, çıxışlarını, məqalələrini həmişə özü yazardı. Mətbəədə yığılıb gəlmiş ottiskləri də özü oxuyardı. Düzəltdiklərini düzəldər, əlavə fikri olardısa, onu nazirə məxsus vərəqdə yazıb göndərərdi. Onun bayramlarda mənə göndərdiyi təbrikləri əziz xatirə kimi digər yazıları ilə birlikdə sevə-sevə qoruyub saxlayıram.

1979-cu ilin sonlarına doğru ara-bir söz gəzirdi ki, Mehdi müəllimi çıxardacaqlar. Elə mən də yorulmuşdum. Məni işdən azad etməsi haqqında bir ərizə yazıb yanına getdim. Ərizəmi oxudu. Sonra dedi: “Sizi əvəz eləyəni mən hardan tapım?” Dedim: “Mehdi müəllim, əvəz olunmaz adam yoxdur”. Dedi: “Düz deyirsiniz, amma mən sizi beş ildir ki,. kadr kimi hazırlayıram”. Əsl püxtələşmiş vaxtınızdır. Siz həm elmi-tədqiqat işini, həm də praktik müəllimliyi yaxşı bilirsiniz, həm də jurnalist kimi yetişmisiniz, jurnalı az bir müddətə əsl elmi-metodik istinad mənbəyinə çevirməyə nail olmusunuz, işgüzar, qabiliyyətli kollektiv yaratmısınız, mən sizi buraxa bilmərəm.



Az sonra Mehdi müəllimi təqaüdə çıxması ilə əlaqədar nazir vəzifəsindən götürdülər. Elmira Qafarova ilə işləməli oldum. Mənim üçün onların arasında işıqlı dünyadan qaranlıq aləmə düşmək qədər fərq var idi. Mehdi müəllim kadrların peşə hazırlığına, qoyulan vəzifəyə yararlığına xüsusi diqqət yetirirdi. Elmira xanım isə partokrat mövqeyindən çıxış edərək, lazım bildiyi adamı istədiyi vəzifəyə təyin edirdi. Mən Elmira xanıma onunla işləmək istəmədiyimi bildirdim. 6 aydan sonra o məni baş redaktor vəzifəsindən Azərbaycan ETPEİ-yə bölmə müdiri vəzifəsinə köçürdü. Artıq Mehdi müəllim orada elmi məsləhətçi idi. İnstitutun direktoru Zahid Qaralov Mehdi müəllimə xüsusi qayğı göstərirdi. Mehdi müəllim az müddətə iri həcmli bir monoqrafiya yazıb tamamladı. Ümumtəhsil məktəblərində təlim-tərbiyə işlərinin təkmilləşdirilməsi yollarından bəhs edən bu kitabın elmi redaktorluğunu mənə tapşırmışdılar. “Maarif” nəşriyyatı bu fundamental tədqiqat əsərini 1982-ci ildə çap etdi. Çalışdıq ki, kitab Mehdi müəllimin 80 illik yubileyinə nəşr olunub buraxılsın. 1983-cü ilin yanvarında Maarif Nazirliyi Mehdi Mehdizadənin yubileyini təntənə ilə keçirdi. Mehdi müəllimin həyat yolu və fəaliyyətindən bəhs edən məqalə ilə “Azərbaycan müəllimi” qəzetində çıxış etmək səadəti də o zaman mənə nəsib oldu. Kitabın siqnal nüsxəsinin alınmadığını görüb, mətbəəyə getdim, təkidlə xahiş edərək 3 nüsxə cildlətdim (təkcə cildləmə işi qalmışdı). Hazır kitabları götürüb yubiley keçirilən yerə gəldim və elə yığıncaqda rəyasət heyətində oturmuş Mehdi müəllimə təqdim etdim.

Mehdi müəllim məktəbli şəxsiyyətinin tərbiyəsi probleminə həsr edilən kitab üzərində işləyirdi. Tez-tez

onunla əlaqə saxlayırdıq. Elə olurdu ki, müxtəlif tədbirlərə xeyir-şər işlərinə baş çəkməyə o, Z.Qaralov və mən birlikdə gedirdik. Maşınla gedib, onu Qız qalasının yanından götürərdik. Evi Qız qalasına yaxın idi. Bir dəfə maşının qabaq qapısını açıb, "Mehdi müəllim, buyurun, əyləşin", - dedim. Mehdi müəllim "elə aramızda siz cavansınız, özünüz oturun", - dedi və keçib arxada əyləşdi. Z.Qaralov da onunla yanaşı oturdu. Mən məcbur olub irəlidə əyləşdim. Yola düşəndə Mehdi müəllim aradakı narahatlığı götürmək üçün bir türk qonağı ilə olan maraqlı əhvalatı danışmağa başladı.

Bir gün Bakıya Türkiyədən rəsmi bir qonaq gəlir. Ertəsi gün baxılası obyektə Mehdi müəllimlə getməli olur. Mehdi müəllim hörmət əlaməti olaraq qonağı maşının qabaq oturacağında oturdur, özü isə arxada əyləşir. Bir həftə sonra Mehdi müəllim Moskvaya gedir və orada həmin türklə rastlaşır. "Əfəndim, necəsiniz?", - deyə soruşanda Türkiyə türkü hirslə cavab verir: "Məni təhqir etməyiniz yetmir, hələ bir kefimi də soruşursunuz?" Mehdi müəllim təəccüblənir: "Əfəndim, mən sizin xətrinizə nə vaxt dəymişəm?" – deyə soruşur. Türk deyir ki, Bakıda, maşının qabaq oturacağında sürücü ilə yanaşı oturdanda. Nə isə, aydın olur ki, Türkiyədə sürücünü xidmətçi hesab etdiklərindən ağalar onlarla yanaşı oturmurlar. Mehdi müəllim ona anladır ki, bizdə bu, əksinə, hörmət əlamətidir...

Arabir bu və ya digər işlə əlaqədar olaraq Mehdi müəllimin evinə getməli olurdum. 1981-84-cü illər arasında bir neçə dəfə mən onun sadə evində halal çörəyini kəsdim. Söhbətlərinin birində bildirdi ki, nazir işləyərkən "Azərbaycan məktəbi" jurnalının nömrələrini



diqqətlə oxumağa lazımınca vaxtı olmayıb. İndi onları bir də nəzərdən keçirir. Mən sizin işinizdən, redaktorluğunuzla çıxan nömrələrin səviyyəsindən çox razıyam. Beləcə iş elə gətirdi ki, onun elmi rəhbərliyi ilə Moskvada nəşr olunmaq üçün "Azərbaycan pedaqoji fikir antologiyası" kitabının tərtibinə girişdik. O, aparıcı ilk məqaləni yazmağa başladı, amma, amma.... başa çatdıra bilmədi. Gümrah, çevik, hər gün 8-10 saat işləyən Mehdi müəllim birdən-birə xəstələndi. Həkimlər müalicəsini düzgün aparmayıb, onun vəziyyətini daha da ağırlaşdırdılar. Tez-tez xəstəxanaya onu yoluxmağa gedirdik. Sağalacağına inamlı idi. Amma belə olmadı. Onu – qiymətli gövhəri, əvəzsiz şəxsiyyəti, pedaqoji elmimizin və təhsilimizin görkəmli təşkilatçısı və ağsaqqalını itirdik. Əlbəttə, o, cismən bizdən ayrılsa da, ruhən ayrılmadı. Birlikdə başladığımız antologiyanı biz – onun şagirdləri başa çatdırdıq. Yazmağa başladığı aparıcı ilk məqaləni tamamlamaq da mənə etibar edildi. Mehdi müəllim pedaqoji fikrimizdə - həmin antologiyada Nizami, Tusi, A.Bakıxanov... ölməzlik yerini tutdu. Onunla sıx yaradıcı işgüzar ünsiyyətdə olduğum on ilimi – 1974-1984-cü illəri ömrümün ən bəhrəli, ən unudulmaz yaşantısı hesab edirəm...

***"Azərbaycan müəllimi" qəzeti,***
***31 yanvar-6 fevral №5(8009), 2003-cü il***



# O İLLƏRI XATIRLAYARKƏN ...

*NƏCƏF NƏCƏFOV,*
*"Azərbaycan məktəbi" jurnalının baş redaktoru, filologiya elmləri namizədi, dosent, əməkdar müəllim, akademik Mehdi Mehdizadə adına mükafat laureatı*

Azərbaycanın təhsil işçiləri, 23 ildən çox maarifimizin başında duran və bütün ömrünü Azərbaycan təhsili və pedaqoji elminin inkişafına həsr edən akademik Mehdi Mehdizadəni həmişə minnətdarlıqla xatırlayırlar. Neçə illərdir ki, Mehdi müəllimin eynək altından mənalı baxışlarını görmür, məsləhət və tövsiyələrini eşitmirik, onun müdrik kəlamlarından bəhrələnmirik. Ağsaqqal, nurani, həmişə çevik və enerjili görünən Mehdi müəllim xatirələrdə necə var elə də yaşayır. Onunla bir yerdə işləyənlər o illəri ömrün ən mənalı günləri sayırlar. Pedaqoji aləmdə çox böyük nüfuza malik olan Mehdi müəllimlə nəinki çiyin-çiyinə çalışan, hətta əlinə qələm alan, məqalə, kitab yazan pedaqoqlarımız da onun fikirlərinin Mehdi müəllim tərəfindən necə qarşılanacağını intizarla gözləyirdilər. Əsrin ən böyük pedaqoqlarından olan Mehdi müəllimin gözləri önündə və bilavasitə onun iştirakı ilə yetişən görkəmli pedaqoq alimlərimiz H.Əhmədov, Z.Qaralov, N.Kazımov, Y.Talıbov, Ə.Əfəndizadə, B.Əhmədov, Y.Kərimov, Ə.Ağayev həmişə onunla tez-tez görüşür, məsləhətlərinə ehtiyac duyurdular. Mehdi müəllim isə onların hər birinə saatlarla vaxt ayırmağa hefslənmirdi. Belə söhbətlər öz gözəl nəticələrini də verirdi. Məhz bu alimlərin bilavasitə əməyi ilə o illərdə «Azərbaycan dili və ədəbiyyatın tədrisi»,



«Tarix, coğrafiya və ictimaiyyət», «Fizika və riyaziyyatın tədrisi», «Kimya və biologiyanın tədrisi», «Əmək təlimi və peşəseçmə», «Orta məktəbdə bədən tərbiyəsi», «İbtidai məktəb və məktəbəqədər tərbiyə» və başqa jurnallar işıq üzü görür və müəllimlərimizin köməyinə gəlirdi. Bu jurnallar vasitəsilə keçmiş Sovet məkanında olan yeniliklər, Respublikamızdakı qabaqcıl təcrübə ardıcıl olaraq oxuculara çatdırılırdı.

«Azərbaycan məktəbi» jurnalının hər nömrəsi məhz onun məsləhətləri ilə ərsəyə gəlirdi. Mehdi müəllim bunların hamısına vaxt tapırdı və yeri gəldikcə, pedaqoji jurnal və məcmuələrə öz iradlarını və tənqidi qeydlərini də deyirdi. Hamı istəyirdi ki, Mehdi müəllim jurnalı, orada gedən məqalələri oxusun. Nazirliyin əməkdaşlarının çoxu, əlbəttə, ən təcrübəlilər onun zəmanəti ilə bu məcmuələrdə redaksiya heyətinin üzvü olurdu.

Mehdi müəllim alimləri də, Nazirliyin əməkdaşlarını da ən aktual məsələlər barədə məqalələr yazmağa təşviq edirdi. Hətta mövzunun da adını deyirdi. Belə tövsiyələrin tez-tez şahidi olurduq. O, məqalə, kitab yazmağa işçinin inkişafı kimi baxırdı. Müəllimlərin təkmilləşdirilməsinə dair o illərdə silsilə məqalələr yazmağımı da mənə məhz Mehdi müəllim məsləhət görmüşdü.

Yadımdadır, bir gün kollegiya iclasında görkəmli alimlərimizdən birinə irad tutdu ki, onun yazıları çıxmır. O isə «Məktəbdə komsomol təşkilatının işinə dair mətbuatda mənim bir sıra məqalələrim getmişdir, yoldaşlar niyə oxumurlar?», cavabını verdi. Mehdi müəllim isə, «Sən didaktikadan yaz, buna hamının ehtiyacı var, sənin də buna imkanın var, boşluğu doldurmaq lazımdır» sözlərini dedi. Doğrudan da o zaman

bu mövzuya az toxunulurdu. Mərkəzi mətbuatda bu mövzu geniş işıqlandırılmırdı, bizdə də axsayırdı. Mehdi müəllim elmi-tədqiqat mövzularının müəyyənləşdirilməsində də gənc alimlərə kömək edirdi. Bunlar hamısı bizim gözümüzün qarşısında cərəyan edirdi. Onlarla məsləhətləşməyi də unutmurdu. O, gənclərin gələcəyinə ümidlə baxırdı. Təbiətcə çox xeyirxah olan Mehdi müəllim gənclərə böyük ümidlə yanaşdığı üçün onlara daha çox vaxt sərf edərdi. Kiçik bir qığılcım görəndə onun parlamasına rəvac verərdi. İşinin çoxluğuna baxmayaraq, müdafiə edənlərə aponent də olardı. Hamımızın yaxşı xatirindədir. Yusif Talıbovun Bakı Dövlət Universitetində təşkil olunan doktorluq dissertasiyasının müdafiəsində opponent olan Mehdi müəllimin çıxışı necə əhəmiyyətli rol oynadı. Mübahisəli fikirlərə neçə ayıdınlıq gətirildi. Hətta SSRİ AAK-da onun opponentliyinin də az əhəmiyyəti olmadı. Belə hallar akademik Mehdi Mehdizadənin həyatında çox olmuşdur. Mehdi müəllim Azərbaycan Dövlət Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunu həmişə öz kurasiyasında saxlayırdı və onun işini də şəxsən özü istiqamətləndirirdi. O zaman bu institutun yerinin darısqallığı onu çox narahat edərdi. Ona görə də institutu indi Təhsil Problemləri İnstitutunun yerləşdiyi binaya köçürmüşdü. Bəzi anlaşılmazlıqlar olsa da, o öz fikrindən dönmədi. O bu institutun Nazirliyin yaxınlığında olmasını istəyirdi. O zaman isnstitutun «Elmi əsərləri» də nəşr olunurdu. Pedaqogika elmini həmişə diqqət mərkəzində saxlayan Mehdi müəllim nazir vəzifəsindən azad olunandan sonra da, bu institutda elmi məsləhətçi işləyirdi.



O zaman AETPEİ-nin direktoru işləyən Z.Qaralov özü də Mehdi müəllimə yüksək səviyyədə hörmətlə yanaşırdı. Hətta bir dəfə Zahid müəllim mənə məsləhət görmüşdü ki, Mehdizadənin pedaqoji görüşlərinə dair doktorluq dissertasiyası yazım. O istəyirdi ki, Mehdi müəllimin haqqında tədqiqatı onu şəxsiyyət kimi yaxşı tanıyanlardan biri aparsın. Çünki Mehdi müəllim təvazökarlığın və böyük qəlbliliyin müçəssəməsi idi. O heç zaman kiçik hisslərlə yaşamır, bir şəxsiyyət kimi hər şeydən əvvəl özünə və qarşıdakına hörmət qoyurdu. Onun nüfuzuna xələl gətirən heç bir söz demirdi.

Deyirlər ki, MK-da onun nazir vəzifəsindən azad olunmaq məsələsi həll olunanda Mehdi müəllimdən soruşublar ki, ona nə kimi kömək göstərilsin, arzusu nədir? Mehdi müəllim cavab vermişdir ki, onun əsərlərinin çap olunmasına, elmi-tədqiqat işlərinin genişləndirilməsinə şərait yaratsınlar. Bəli, böyük alim öz alimliyinə həmişə sədaqətli qalmışdır. Azərbaycanda pedaqogika elminin çiçəklənməsi onun idealı idi. Halbuki o öz uzunmuddətli xidlmətləri müqabilində hökumətdən çox şey tələb edə bilərdi. Buna haqqı da çatırdı. Hamıya məlumdur ki, o, ömrünün sonunadək içəri şəhərdəki köhnə evlərdən birində yaşayırdı. Mehdi müəllim heç zaman başqa bir yaşayış tərzi barədə düşünmürdü. O, ömrünün qalan hissəsini də pedaqogika elminin inkişafına həsr etmək istəyirdi. Belə də oldu. Mehdi müəllim təmtəraqdan, hər cür şan-şöhrətdən uzaq yaşamağın tərəfdarı idi. Yadımdadır, nazir olanda ad günündə iki kollegiya üzvi onun kabinetinə bir dəstə güllə daxil olub, onu təbrik etmək istədi. Bu onun xoşuna gəlmədi…

Mehdi müəllim hər kəsin layiq olduğu kimi qiymətləndirilməsinə qayğı ilə yanaşırdı. O illərdə Mərkəzi aparatda təcrübəli işçilər az deyildi. Proqram metodika idarəsinin rəisi, respublikanın əməkdar müəllimi İmran Məmmədov da belələrindən idi. İmran müəllim çox səliqəli, təvazökar, azərbayjanlılara məxsus abır-həyalı kişi idi. Mehdi müəllimin ona münasibətindən asılı olmayaraq hər işi vaxtında, keyfiyyətli görərdi. İşinə çox məs`uliyyətlə yanaşardı. Həm də yaxşı bilirdi ki, Mehdi müəllimi proqram və dərsliklər, tədris prosesinə dair təlimatlar daha çox maraqlandırır. Mən deyərdim ki, o vaxtlar proqram və təlimatların «qızıl dövrü» idi. İndi «Azərbaycan məktəbi» jurnalının redaktoru, respublikanın əməkdar müəllim, pedaqoji ictimaiyyətin yaxşı tanıdığı Zəhra Əliyeva o zaman çox gənc idi. Lakin erudisiyalı işçi idi. Namizədlik dissertasiyasını da təzəcə müdafiə etmişdi. O, proqram-metodika idarəsinə inspektor-metodist vəzifəsinə dəvət edildikdən sonra orada canlanma başladı. İxtisasca Azərbaycan dili və ədəbiyyatı müəllimi olan Zəhra xanım Azərbaycan dili və ədəbiyyatı üzrə proqram, dərslik və başqa təlimatların hazırlanması və nəşrini zərgər dəqiqliyi ilə, həm də vaxtında həll edirdi. Doğrudan da, Azərbaycan dili və ədəbiyyat digər fənlərin şahı səviyyəsinə yüksəlmişdi. İndi dövlət dilinə belə yüksək qiymət verildiyi vaxtda Zəhra xanımın o illərdəki xidmətlərini yada salmamaq olmur. O illərdəki işi ona böyük şərəf gətirmişdi. Bir dəfə İmran müəllim Mehdi müəllimin yanında avqust müşavirələrinə gedən nümayəndələrin qarşısında Zəhra xanımın Azərbaycan dili və ədəbiyyat fənninə dair məlumat verməsini təklif etdi. Mehdi müəllim bununla razılaşdı. Ancaq «İmran, bəs



bizdə başqa fənlər yoxdur?» iradını da dedi. Hamıya hər şey aydın oldu. Hər fənnin sahibi olmalıdır ki, onu bu səviyyəyə qaldıra bilsin. Zəhra xanım danışdıqca Mehdi müəllimin sifətindəki tanış cizgilər aydın sezilirdi.

Təsadüfi deyildir ki, Mehdi müəllim Zəhra xanımı bu keyfiyyətlərinə görə Baş Məktəblər İdarəsinə rəis vəzifəsinə təyin etdi. O, kollegiyanın üzvü təsdiq olundu. Hamı da şahiddir ki, Zəhra xanım bu vəzifədə necə vicdanla işlədi. Mehdi müəllim peşiman olmamışdı. Biz rəislər Zəhra xanımın iş üslubundan çox şey əxz etmişdik.

Mehdi müəllim yaşından və vəzifəsindən asılı olmayaraq maarifimizə dərindən bələd olan adamlarla tez-tez görüşər, zəngləşər, məsləhətləşərdi. O zaman Azərbaycan ETPİ-nin direktoru Zahid Qaralov, Mərkəzi Komitədə təlimatçı işləyən Əlimirzə Əhmədov, Nazirlər Sovetində referent işləyən Hasil Əliyev (o, hazırda da həmin vəzifədədir), «Azərbaycan məktəbi» jurnalının baş redaktoru Əjdər Ağayev, Bakı MTİ-nin direktoru Arif Muradov və başqaları ilə yaxından əlaqə saxlayırdı. Həm də onları Nazirlyin işi ilə mə”lumatlandırırdı. Qarşıya qoyulan vəzifələrin məqsədəuyğunluğunu ilk növbədə onlardan eşitmək istəyirdi. Kollegiyalarda üzünü tez-tez Zahid müəllimə tutardı. Ondan fikrini bildirməsini xahiş edərdi. Hər bir yeniliyin elmi əsaslarının açılmasını istəyirdi. Elmi rəhbərlik onun fəaliyyətinin əsasını təşkil edirdi. Bu mövzuda çoxlu məqalələri çap olunmuşdu və SSRİ PEA-da çıxış da etmişdi.

Mehdi müəllim kollegiyalarda, müşavirələrdə, «Sovetskaya pedaqogika», «Narodnoye obrazovaniye», həmçinin «Azərbaycan məktəbi» jurnalını təbliğ edirdi. Oradakı məqalələr barədə rəyini söyləyirdi. O bizim

alimlərin, maarif işçilərinin mərkəzi, respublika mətbuatında çıxışlarını yüksək qiymətləndirirdi. Tabeliyindəki işçiləri də bu işə ruhlandırırdı. Yadımdadır, bir dəfə bütün fənlər üzrə məcmuələrdə rəislərin, o jümlədən mənim çıxış etməməyimin səbəbini soruşdu və cavab gözləmədən tövsiyələrini verdi. Biz də öz səhvlərimizi anladıq. Bu iraddan sonra mən də özüm üçün nəticələr çıxarmalı oldum. Onun fikrinə görə, müəllimlərimiz ümumrespublika miqyaslı kadr potensialından xəbərdar olmalıdırlar. Müəllim yalnız öz işinə qapanıb qalmamalıdır. "İbtidai məktəb və məktəbəqədər tərbiyə", «Azərbaycan dili və ədəbiyyat tədrisi» «Kimya və biologiya tədrisi», «Məktəbdə bədən tərbiyəsi», «Əmək təlimi və politexnik təlim» və başa məcmuələrdə dərc olunan məqalələrim məhz onun tövsiyəsi ilə yazılmışdı. «Azərbaycan məktəbi» jurnalında Nazirliyin idarə rəislərinin imzasını tez-tez görmək istəyirdi. İnsafla desək, o zaman baş redaktor Ə.Ağayev belə yazılara geniş yer ayırırdı. İndiki kimi, o da bizə sifarişlər verirdi, bizim aktual problemlər üzərində işləməyimizə şərait yaradırdı.

Mehdi müəllim «Azərbaycan müəllimi» qəzetinə daha çox diqqət yetirirdi. Yadımdadır, bir dəfə kollegiyada «Azərbaycan müəllimi» qəzetinə dair məsələ müzakirə olunurdu. Qəzetin redaktoru respublikanın əməkdar müəllimi, dərin biliyə və mütaliə mədəniyyətinə malik olan Şahin Səfərovun məlumatı dinlənildikdən sonra Mehdi müəllim ondan soruşdu ki, nə üçün qəzetdə kənd müəllimlərinin məqalələri az dərc olunur. Şahin müəllim cavab verdi ki, bir çox məqalələr zəif olur. Ona görə də hamısını çap etmək olmur. Müxbirlər onları çapa



hazırlaya bilmirlər. Mehdi müəllim isə özünə məxsus təmkinlə, «kömək edin, qüvvəli olsun». Sonra da əlavə etdi ki, sizə müraciət edən, məktub yazan heç bir müəllimin məqaləsi diqqətdən kənarda qalmamalıdır. Çap eləməyə heç cür imkan olmasa, siz «Bizə yazırlar» rubrikası açın, müəllimin nədən yazmasını bir cümlə ilə deyin. Müəllim öz adını doğma qəzetində oxuyanda, sevinəcəkdir, ruhlanacaqdır. Bu yolla da o, yazmağa vərdiş edəjək və nəticə də yaxşı olacaqdır. O, qəzetin geniş oxuculara, müxbirlərə sahib olmasını istəyirdi. Bundan sonra «Azərbaycan müəllimi» qəzetində «Bizə yazırlar…» rubrikası açıldı və uzun müddət davam etdi. Bunu indiki pedaqoji mətbuatın da nəzərə alınması məsləhətdir.

O hər bir müəllimə öz iş təcrübəsi barədə yazmağı tövsiyə edərdi. Bütün görüşlərində bu məsələlərə toxunardı. Ayrı-ayrı müəllimlərlə bu mövzudakı söhbətdən sonra qəzetdə qabaqcıl iş təcrübəsinə dair çoxlu yazılar dərc edilərdi. O illərdə təhsil sistemində R(Ş)TŞ müdirləri, metodkabinet direktorları, əmək təlimi inspektorları və orta məktəb direktorları (Bakı və Naxçıvandan başqa) Nazirliyin nomenklaturasında idi. Mehdi müəllim onların hər biri ilə fərdi söhbət etməyə vaxt ayırırdı. İlk sualı da çox zaman bu olurdu ki, işin barədə danışa bilərsənmi? Onu necə qurmalısan? Onlara diqqətlə qulaq asardı. Hətta səhvlərə də dözürdü. Öz işinin «ağası» olanlara daha çox maraq göstərirdi. Bir dəfə Füzuli RTŞ-dən əmək təlimi inspektoru vəzifəsinə namizəd göndərilmiş Rüstəm müəllimi dinlədikdən sonra üzünü mənə tutdu və «Görürsənmi, elə bil hekayə danışır, bax, hamı işini belə aydın təsəvvür etməlidir, belə olanda

işləmək də asan olur» - dedi. Çox zaman bizə tapşırıq verərdi ki, belələrinin iş təcrübəsini yazılı şəkildə alın. Bunlar vasitəsilə o, müəllimlərin fikir və düşüncələrinə yol tapmaq istəyirdi. Məruzə və çıxışlarında bu yazılara istinad edərdi.

Hamı bilirdi ki, Mehdi müəllimlə məsləhətləşəndə o, çox dəyərli fikirlər söyləyir. Ona görə də hamımız fikirlərimizi onunla bölüşmək istəyirdik. Bir dəfə söhbət zamanı «Azərbaycan məktəbi» üçün «Rəhbər pedaqoji kadrlarla aparılan ideya – tərbiyə işlərinin vəziyyəti» adlı məqalə yazdığımı ona dedim. Mehdi müəllim məni dinlədi və bu sahədə aparılan işlərdən razı qalmadığını dedi və əlavə etdi ki, maarif sistemində orta pillə kadrlar sayılan orta məktəb direktorlarının ixtisasının artırılması forması onu qane etmir. O dedi ki, bu barədə onun başqa bir fikri də var. Rəhbər kadlara verilən tələblər gündən-günə artırdı. Belə bir məlumat verdi ki, müttəfiq respublikalarda orta məktəb direktorları daha yüksək ixtisaslı mütəxəssislərin olduğu ali məktəblərdə kursdan keçirilir. Bizdə buna Azərbayjan Pedaqoji İnstitutunda imkan vardır. O dedi ki, bu sahədə yenilik yaradılmışdır. Anjaq hələ tam razılaşma yoxdur. Bir neçə gündən sonra məni yanına çağırdı. Hiss etdim ki, nəsə ciddi bir iş vardır. O zaman APİ-nin rektoru işləyən prof. H.Ağayevlə telefon əlaqəsi saxladı və məsələni, direktiv orqanlarla razılaşdırıldığını da dedi. Orta məktəb direktorlarının elmi-nəzəri hazırlığının və pedaqoji ustalığının artırılmasının vacibliyindən danışdı. Bu iki görkəmli alimin danışığına qulaq asmaq özü də bizim üçün tarix idi. Mehdi müəllim direktorlarla iş aparmağın zəruriliyini dönə-dönə qeyd etdi və təklifini də bildirdi. Beləliklə, az



bir müddətdə APİ-də orta məktəb direktorlarının ixtisasartırma fakültəsi işə başladı və hər çağırış iki ay olmaqla ildə dörd çağırış planlaşdırıldı. Bu sahədəki işlərin gedişinə dair hər gün məndən məlumat istəyirdi. Bunu başçılıq etdiyim kadrlar idarəsinin əsas işi sayırdı. Mehdi müəllimin özü də bu kurslarda mühazirə oxuyurdu. Fakültə APİ-nin nəzdində olsa da ona Nazirlikdən rəhbərlik edilirdi. Sonralar keçmiş SSRİ miqyasında dəfələrlə Azərbaycanın bu sahədəki işi təqdir edilmişdi. İldə 400 nəfər burada öz ixtisasını artırırdı. Hətta bir dəfə Riqada keçirilən İttifaq müşavirəsində bu mövzuda mənim məruzəm də dinlənilmiş və bəyənilmişdi. Digər müttəfiq respublikalar bizim işimizə maraq göstərirdilər.

Mehdi müəllim fakültənin işi ilə, orada kimlərin mühazirə oxuması ilə, Mərkəzi aparatın rəhbər işçilərinin mövzuları ilə yaxından maraqlanırdı və kadrlar idarəsinə müvafiq göstərişlər verirdi. Çox təəssüf ki, 80-cı illərin sonunda ölkədə yaranan dözülməz vəziyyət bu fakültənin də fəaliyyətinin dayandırılması ilə nəticələndi.

Mehdi müəllim rəhbər kadrlarla yanaşı, müəllimlərin təkmilləşdirilməsi işlərinə də böyük əhəmiyyət verirdi. Məhz onun təşəbbüsü ilə 1971-ci ildə Gəncədə zona Müəllimləri Təkmilləşdirmə İnstitutu yaradılmışdı, bu məqsədlə o zaman Azərbaycan Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutunun direktoru Baləli Vəliyev dəfələrlə Gəncəyə ezam edilmişdi. Yenə də onun təklifi və səyi ilə indiki Azərbaycan Müəllimlər İnstitutunun yerləşdiyi əzəmətli binanın tikilməsi layihələşdirilmişdi. Binanın yerini də o özü seçmişdi. Mehdi müəllim təkmilləşdirmə institutuna ezam olunan müəllimlər üçün mehmanxana şəraiti yaradılması arzuları ilə yaşayırdı. Bu

işin Özbəkistanda çox yaxşı təşkil edilməsini dəfələrlə bizə nümunə göstərmişdi. Moldovada sanatoriya-proflaktariya tipli kurslar da onu maraqlandırırdı. Sonralar bu ideya bizim respublikada da reallaşdı. Bunun ilk nəticələri də uğurlu oldu.

Bu sahədə keçmiş SSRİ-də olan təcrübəni öyrənmək məqsədilə o bizim MTİ direktorlarını Moskva, Sankt-Peterburq şəhərlərinə, Ukrayna, Belarus, Moldova respublikalarına ezam etmişdi. Bir qayda olaraq Nazirlikdə bu sahəyə cavabdeh şəxs kimi mən də onlarla birlikdə gedirdim. O bizdən yazılı arayış istəmirdi, bu, hesabat üçün lazım idi. Ancaq gördüklərimizi nəql etməyi tələb edirdi. Möhkəm yaddaşa malik olmasına görə canlı danışıq ona hər cür arayışdan daha qiymətli görünürdü. Hər dəfə belə söhbətlərdə hiss edirdik ki, bizim söylədiklərimizin çoxu ilə o tanışdır. Moskvadakı müşavirələr, mətbuat və digər informasiya mənbələri vasitəsilə İttifaqda görülən işlər barədə ətraflı məlumatı olurdu. Məsələlərin mahiyyətini təfərrüatı ilə bizdən soruşurdu. Biz buna adət etdiyimizdən həmişə məlumatlı olmağa çalışırdıq.

Bu gün ölkəmizdə ixtisasartırmanın geniş şəbəkəsinin mövcudluğu da Mehdi müəllimin adı ilə bağlıdır. Kollegiyalarda Mərkəzi İnstitutun, Bakı, Naxçıvan, DQMB, Gəncə zona müəllimləri təkmilləşdirmə institutlarının apardığı işlərin müzakirəsi tez-tez təşkil olunarda. Yerlərdə müəllimlərlə aparılan işlər onu çox maraqlandırırdı. O bu istitutların işinə böyük əhəmiyyət verirdi.

O, dəfələrlə vurğulayırdı ki, təhsildə bütün uğurlar müəllimlərin işi ilə bağlıdır. İcraçı onlardır. Ona görə də



bütün diqqət müəllimlərlə aparılan pedaqoji, metodiki işlərə yönəldilməlidir. Müəllimin elmi-nəzəri hazırlığı və pedaqoji ustalığı rəhbər işçiləri hər gün düşündürməlidir.

Akademik Mehdi Mehdizadənin elmi-pedaqoji əsərləri məqalə və çıxışlarında irəli sürdüyü fikirlər bu gün də öz əhəmiyyətini saxlayır. Onlar bizim milli pedaqogikamızın ən qiymətli işçilərindəndir. Görkəmli pedaqoqun həyatı da böyük bir epoxanın salnaməsidir. Onu təfərrüatı ilə öyrənib gənc nəslə çatdırmaq, ilk növbədə onu tanıyanların vəzifəsidir. Gələcək nəsillər isə illər ötdükcə onun dəyərli, nəsillərə nümunə olan irsindən bəhrələnəcəklər.



# MEHDİ MÜƏLLİM NURUN ZİYASI İDİ

*ALİYƏ TƏHMASİB,*
*Azərbaycan Respublikasının əməkdar müəllimi, Prezident təqaüdçüsü*

Əgər mən 40 ildən çox bir müddətdə Azərbaycan dili və ədəbiyyatı müəllimi, 25 il ərzində Bakının mərkəzində yerləşən və dahi Hüseyn Cavidin adını daşıyan, qədim və zəngin ənənələri ilə tanınan məktəbin direktoru vəzifəsində can-başla çalışıb, sayılıb-seçilmişəmsə buna görə unudulmaz Mehdi Mehdizadəyə minnətdaram.

Hələ orta məktəb illərindən maarif naziri, maarif quruculuğunun böyük memarı kimi tanıdığım Mehdi müəllim ziyası bitib-tükənməyən bir insan kimi müxtəlif nəsildən olan insanların qəlbində mərhəmət çırağı yandırmağı bacarırdı. Mehdi müəllimin parlaq siması, görnüşü insandan ədəb, mərifət tələb edirdi. 1967-ci ildə Bakıdakı 132 nömrəli orta məktəbdə pedaqoji fəaliyyətə başladığım andan şahidiyəm ki, bu və ya digər tədbirlə bağlı Mehdi müəllimlə görüşən hər kəs qabaqcadan özünü səhmana salmağa, bir növ onun qarşısında ədəbli-ərkanlı nəzərə çarpmağa çalışırdı. Mehdi müəllim eyni zamanda bizim qonşumuz idi. İçərişəhərdə məşhur Qız qalası ilə üzbəüz olan yaşadığı ev bizim evimizə çox yaxın idi. Mehdi müəllim işdən qayıdarkən maşından düşüb evə gələndə küçədə oynayan uşaqlar da tələsik



divar dibinə çəkilib əllərini yanlarına salar, böyük hörmət və ehtiramla ona baxardılar.

Mehdi müəllim çox mehriban insan idi. Uşaqlara salam verər, onları səmimi təbəssümlə seyr edərdi. Təbiətən pedaqoq idi. O, respublikamızda Maarif Nazirliyinə rəhbərlik etdiyi illərdə çalışırdı ki, müəllimlər ölkəmizin, cəmiyyətimizin ən nüfuzlu ziyalıları olsun. Onun mənə qarşı olan diqqət və qayğısını da heç zaman unutmaram.

1979-cu ildə X çağırış SSRİ Ali Sovetinə deputat seçilməyimdə də o zamankı nazirimiz Mehdi müəllimin rəyi, xeyir duaları mühüm rol oynamışdır. Ölkənin ali məclisinə deputat seçilərkən məni ilk dəfə səmimi qəlblə təbrik edənlərdən biri də Mehdi müəllim idi. Onun tam səmimiliklə aşılanan bu sözlərini indi də minnətdarlıq hissi ilə xatırlayıram:

- Aliyə, unutma ki, SSRİ kimi böyük bir dövlətin ali məclisində müəllimlərin səlahiyyətli nümayəndəsisən. Maarif sistemində yeni-yeni nailiyyətlərin qazanılması naminə sən də həvəslə, yaradıcılıqla çalışmalısan...

Əlbəttə, mən böyük müəllimimizin arzu və istəklərini heç zaman yadımdan çıxarmırdım.

Tale elə gətirdi ki, SSRİ Ali Sovetinə deputat seçildiyim həmin ildə Bakıda keçirilən mühüm bir tədbirdə də Mehdi müəllimlə geniş fikir-rəy mübadiləsində oldum.

«Fəal həyat mövqeyinin formalaşdırılması: mənəvi tərbiyənin təcrübəsi və aktual problemləri»nə həsr olunan və 25 aprel 1979-cu ildə Bakıda keçirilən Ümumittifaq elmi-praktik konfransının bölmə iclasında Mehdi müəllimin geniş məzmunlu məruzəsini dinlədim.

Akademik nazir M.Mehdizadə öz məruzəsində inandırıcı dəlillərlə sübut edirdi ki, fəal həyat mövqeyinin formalaşdırılması işinə məhz ümumtəhsil məktəblərindən başlamaq lazımdır. Sinifdənxaric və məktəbdənkənar məşğələlərin, müxtəlif xarakterli tədbirlərin, əlbir fəaliyyətin pedaqoji-metodik əsaslarına istinad etmək səmərəli nəticələr verir.

Mənim üçün fərəh doğuran cəhət o idi ki, həmin tarixi konfransda mən də Mehdi müəllimlə bir bölmədə çıxış edirdim. Onu da deyim ki, Mehdi müəllim maarif sistemində çalışan və konfransda məruzə edənləri diqqətlə dinləyir, yeri gəldikcə onları dəyərləndirir, lazımi tövsiyələrini verirdi. Problem həqiqətən çox maraqlı və aktual idi. Təsadüfi deyildir ki, o möhtəşəm tədbirdən sonra akademik M.Mehdizadə məktəblilərdə fəal həyat mövqeyini formalaşdırmağın bir neçə başlıca məsələlərini tədqiq etdi. Özünün sağlığında işıq üzü görən və pedaqoji ictimaiyyət tərəfindən maraqla qarşılanan «Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları» əsərinin 1-ci fəslini «Məktəblilərin fəal həyat mövqeyinin formalaşdırılması»na, 2-ci fəslini isə «Şagirdlərdə idrak fəallığı mövqeyinin formalaşdırılması»na həsr etmişdir.

Mehdi müəllim xalq maarifi sisteminin fədakar qurucusu, ilhamverici təşkilatçısı idi. O, məktəblərimizdə yaranan qabaqcıl iş təcrübəsini diqqətlə izləyir, ayrı-ayrı müəllimlərlə onların iş yerində və nazirlikdə müvafiq mütəxəssislərin iştirakı ilə görüşür, onları ruhlandırır, rəğbətləndirirdi.

Ümumtəhsil məktəblərimizdə tədris prosesinin mükəmməl proqram və dərsliklərlə təmin olunmasını



diqqət mərkəzində saxlayırdı. Azərbaycan ədəbiyyatı fənninin tədrisində klassik şair və yazıçılarımızın əsərlərinə xüsusi diqqət yetirməyi həmişə aktual olan problem səviyyəsində dəyərləndirirdi.

Mehdi müəllimlə bu və ya digər tədbirdə görüşərkən fikir mübadiləsində olmaq adamda böyük ruh yüksəkliyi yaradırdı. İşində, əməlində nəzərə çarpan dəyişiklik etməyə mənəvi ehtiyac duyurdu.

Mehdi müəllim mənəviyyat tarixində izi olan elə bir şəxsiyyətdir ki, onun elmi-pedaqoji irsi bu günkü gənclərimiz, böyüməkdə olan nəslimiz üçün də örnəkdir, parlaq, səfərbəredici nümunədir. O, xalqımızın fəxri, böyük oğlu, ziyası bitib-tükənməyən dühasıdır. Onun geniş, həmişəyaşar irsi daima öyrənilməli indiki və gələcək nəslə çatdırılmalıdır. Gərək unutmayaq ki, Mehdi müəllimin həyatı, fəaliyyəti, şərəfli ömür yolu pedaqogika tarixinin diqqətəlayiq şanlı səhifələridir. Ədəbiyyatçıların dili ilə desək, pedaqoji poemadır. Bu poema əsasında hələ bundan sonra da sağlam mənəviyyata malik gənc pedaqoqlar nəsli yetişdirmək olar.



# MAARİFİN CANLI TARİXİ, ƏSL YARADICISI İDİ

*KAMAL AĞAYEV,*

*Azərbaycan KP Cəbrayıl rayon partiya komitəsinin sabiq I katibi*

Mehdi müəllimlə ilk tanışlığım 1954-cü ildə oldu. Belə ki, mən 1952-ci ildə indiki Bakı Dövlət Universitetinin şərqşünaslıq fakültəsini bitirdikdən sonra bir qrup yoldaşlarla başqa nazirliyə işə göndərilmişdik. İş elə gətirdi ki, 1954-cü ilin mart ayında atamın vəfatından sonra rayona qayıtmalı oldum. O zaman müəllimlər yalnız Azərbaycan Maarif Nazirliyinin əmri ilə işə təyin olunurdular. Bu məqsədlə mən Ucar rayon Xalq Maarif şöbəsindən məktub aldıqdan sonra Maarif Nazirliyinə gəldim. Qəbul günü olmasa da, rayondan gəldiyimi nəzərə alaraq elə həmin gün Mehdi müəllim məni qəbul etdi. Çox qısa söhbətdən sonra göstəriş verdi ki, məni nazirliyin əmri əsasında Rayon Xalq Maarif şöbəsinin sərəncamına göndərsinlər. Mehdi müəllimlə ilk tanışlıq belə oldu. Sonralar mən rəhbər işlərdə çalışdığım dövrdə Mehdi müəllimlə tez-tez görüşməli oldum. Geniş dünyagörüşə, nadir bilik və istedada malik olan Mehdi müəllim təmkinliyi, qanunpərəstliyi, dəqiqliyi, diqqətliliyi, səmimiliyi ilə adamı heyran qoyurdu.

Yaxşı yadımdadır, Ucar RİK-in sədri işləyirdim. Şəhərin mərkəzində orta məktəb binası inşa olunurdu. Layihəyə görə məktəbin damı qırla örtülməli idi. Bu da, Şirvan bölgəsinin həddindən artıq isti olması ilə dabana zidd gəlirdi. Məktəbin damı yerli şəraitə uyğun tikilməli idi. Bu məsələ böyük söz-söhbətə səbəb oldu. Nazirliyə qədər kimə müraciət edirdiksə də, məsələ həll olunmamış qalırdı. RİK-in sədri kimi məsələni Mehdi müəllimə çatdırmalı oldum. Məni dinlədikdən sonra göstəriş verdi ki, yerli şərait nəzərə alınsın, məktəbin üstü şiferlə örtülsün.



Daha sonralar mən Qubadlı və Cəbrayıl rayonlarında (1964-1980-ci illərdə) Partiya Komitəsinin I katibi işlədiyim müddətdə Mehdi müəllimlə tez-tez görüşməli olurdum. Bunun əsas səbəbi o idi ki, bu rayonlarda başqa rayonlara nisbətən məktəb tikintilərinə və tədris ləvazimatına ehtiyac daha çox idi.

1965-ci ildə Qubadlı rayonunun dağ kəndi Göyərçiyə getmişdim. Məktəbə baş çəkdim. Siniflərin birinə daxil olduq. Riyaziyyat müəllimi yazı taxtası olmadığından misalları vərəqə yazıb sinəsindən asmışdı ki, uşaqlar köçürə bilsinlər. Buna bənzər mənzərə həmin rayonun Məlikəhmədli səkkizillik məktəbində və başqa kənd məktəblərində də var idi. Belə ki, bir sıra məktəblərdə hətta uşaqlar skameyka əvəzinə daş üstündə oturub dərs keçirdilər. Mən belə bir xoşagəlməz vəziyyət barəsində o zaman Azərbaycan KP MK-nın I katibi V.Y.Axundov yoldaşa məlumat verəndə, səhv etmirəmsə, Ə.H.Kərimov mənə dedi ki, siz elə danışırsınız ki, guya Qubadlıda 1920-ci ildir. Mən çəkinmədən dedim ki, vəziyyəti yerlərdə yoxlatdıra bilərsiniz.

Rəhbərliyin göstərişi ilə Qubadlı məktəblərinə 1000 ədəd yazı taxtası, xeyli skameyka və başqa məktəb ləvazimatı verildi. Sonralar bu işlərin səhmana

düşməsində Mehdi müəllimin xeyli köməyi oldu. Bu rayonda bir neçə yeni məktəb binaları tikildi.

Qubadlıdan sonra Cəbrayıl rayon Partiya Komitəsinin I katibi vəzifəsində işləyərkən rayonda məktəb tikintisi barədə, xüsusilə, Cəbrayıl şəhər orta məktəbin 100 illik yubileyi ilə əlaqədar Mehdi müəllimlə tez-tez görüşməli olurdum. Bu məktəbin 100 illiyinin keçirilməsi necə oldu?

1975-ci ilin bir yay günü idi. Səhiyyə Nazirinin I müavini Rizvan Cavadov Cəbrayıla gəlmişdi ki, ətraf rayonların həkimlərinin elmi konfransını təşkil etsin. Söhbət əsnasında o, mənə dedi ki, bir tibb jurnalında Cəbrayıl qəzası haqqında oçerkə rast gəlib. Mən jurnalın bizə göndərilməsini xahiş etdim.

1885-1888-ci illərdə Cəbrayıl qəzasında həkim işləmiş Q.Urazovun yazdığı 45 səhifəlik yazı 1889-cu ildə, o zaman Tiflisdə çıxan bir tibb jurnalında dərc edilmişdir. Orada Cəbrayıl qəzası haqqında ətraflı məlumat var idi. Bu həkim qəzada səhiyyə işi ilə yanaşı, demək olar ki, bu yerləri diqqətlə hərtərəfli öyrənmiş, öz müşahidəsini qeydə almış, sonra da çap etdirmişdir. Açığını etiraf edim ki, bu oçerk məni çox düşünməyə vadar etdi.

1976-cı ildə 100 yaşı tamam olacaq məktəbin yubileyinin geniş keçirilməsini qərara aldım. Bu məsələ ilə əlaqədar olaraq, Mehdi müəllimlə məsləhətləşdik, çox götür-qoy etdik. Yubileyin respublika səviyyəsində keçirilməsini, məktəbin tarixi barədə kitab buraxılmasını, məktəbə, onun qabaqcıl müəllimlərinə fəxri adlar verilməsi və s. işlərin görülməsi üçün tədbirlər planı hazırladıq. Lakin nədənsə Mehdi müəllim fikrə getdi.



Sonra dedi, Kamal müəllim, bu işi Mərkəzi Komitəsiz görmək olmaz.

Mən gülümsündüm, sizi başa düşdüm, Mehdi müəllim. Mən Heydər Əliyev yoldaşın adına məktub hazırlayaram, amma xahişim budur ki, icazə verin məktub Maarif Nazirliyi ilə birgə olsun. Bundan sonra yenə də Mehdi müəllim bir qədər fikrə getdi. Mehdi müəllim, siz bir şey itirmirsiz. Çünki bu, sırf məktəb işidir. Əgər bu məsələ baş tutmasa, mənə deyəcəklər ki, səni raykom katibi göndərmişik, yoxsa məktəbin yubileyini keçirməyə, kitab yazmağa?..

Mehdi müəllim özünəməxsus tərzdə gülümsündü: «Yaxşı, razıyam. Sən məktubu hazırla, kitabın materiallarını topla, başla yazmağa. MK-dan icazə alan kimi işi sürətləndirərik. Allah qoysa, 100 illik yubileydə özüm də iştirak edəcəyəm».

Məktubu hazırladım. Gəldim Mehdi müəllimin yanına. O, məktubu imzaladı. Ancaq çox narahat idim. Çünki orta məktəbin yubileyi respublikada ilk dəfə idi ki, keçirilirdi və bu məsələ o vaxt yuxarı təşkilatlar üçün o qədər də əhəmiyyətli məsələ hesab edilmirdi. Nəhayət, məktəbin 100 illiyinin keçirilməsi haqqında Azərbaycan KP MK-nın qərarı çıxdı.

Məktəb haqqında kitab üzərində işləyəndə də Mehdi müəllimlə bir neçə dəfə görüşdüm. Bir dəfə yanında olanda sözarası dedim ki, Mehdi müəllim, icazə verin sizin də şəklinizi kitabda əks etdirim. Gülüb cavab verdi ki, mənim kitabım da çoxdur, şəkillərim də. Siz çalışın ki, həmin məktəbi qurtaran məzunlar haqqında müfəssəl məlumat verin. Belə kitab yəqin ki, birinci dəfədir çıxır.

Kitabı yazarkən Mehdi müəllimin bir çox məsləhətlərini nəzərə aldım. Mehdi müəllimin yaxından köməkliyi ilə «Maarif» nəşriyyatı çox qısa müddətdə «100 yaşlı məktəb» adlı həmin kitabı 3 min nüsxə ilə nəfis şəkildə çap etdi. 27 fevral 1976-cı il tarixli qərarla Cəbrayıl orta məktəbi Azərbaycan Ali Sovetinin Fəxri Fərmanı ilə təltif olundu. Məktəbin direktoru Məmmədov İslam Həmzə oğluna və müəllimi Məmmədov Rəşid Əsəd oğluna respublikanın Əməkdar müəllimi adı verildi. Məktəbin müəllimlərindən Hüseynova Həcər Süleyman qızı, Mehdiyev Bahadır Həsənqulu oğlu, Rzayev Oruc Ədil oğlu Ali Sovetin Fəxri Fərmanları ilə təltif olundular. Fevralın 28-də ətraf rayonların nümayəndələrinin, məktəbi bitirmiş məzunların, alimlərin, yazıçıların, dövlət xadimlərinin, SSRİ-i Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, Azərbaycan SSR Maarif Naziri M.Mehdizadənin, Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvü Ə.Hüseynovun, fəlsəfə elmləri doktoru M.Nəcəfovun, tarix elmləri doktoru, professor D.Qüdrətovun, Azərbaycan KP MK-nın şöbə müdiri F.Əhmədovun, «Azərbaycan müəllimi» qəzetinin redaktoru Ş.Səfərovun, «Maarif» nəşriyyatının direktoru H.Qasımzadənin və başqa görkəmli adamların iştirakı ilə Cəbrayıl şəhər M.Qorki adına orta məktəbinin 100 illik yubileyi keçirildi. Kütləvi informasiya vasitələri bu şənliyi geniş işıqlandırdılar.

Mehdi müəllim yubileydə iştirak etdi. Həmvətənlərinə ürəkdən gələn xoş sözlər söylədi. Qabaqcıl maarif işçilərinə mükafatlar təqdim etdi. Sonra məktəb haqqında yazılmış həmin kitab 2000 tirajla rus dilində də çap olundu. 100 illiklə əlaqədar yeni tikiləcək



orta məktəbin yeri müəyyənləşdirildi və orada yeni bina inşa olundu.

Mehdi müəllim haqqında xatirələrim çoxdur. Cəbrayılın bir sıra kəndlərində yeni məktəb tikilməsi məsələsi ortalığa çıxanda mən RİK-in sədrinə çatdırdım ki, Daşkəsən kəndində də məktəb binası pis vəziyyətdədir. Orada da səkkizillik məktəb binasının tikintisi plana salınsın. Kəndlərdə məktəb binasının tikilməsinin planının təsdiqi gəldi, lakin Daşkəsən kəndində məktəbin tikilməsini planda görməyəndə təəccübləndim. Soruşanda cavab verdilər ki, həmin kəndi Mehdi müəllim özü plandan çıxarıb. Deyib ki, bu mənim doğma kəndimdir, söz-söhbətə səbəb ola bilər. Mən planı geri qaytardım və Bakıya gələndə getdim Mehdi müəllimin yanına. Kabinetə girən kimi gördüm Mehdi müəllim gülümsəyir. Salamdan sonra dedim ki, Mehdi müəllim, nə vaxtdan qadağan olub ki, nazirin kəndində yeni məktəb binası tikilməməlidir?! Mən məsələni belə qoydum ki, Əmirvarlı kənd məktəbi ilə (bu kənddə akademik Əşrəf Hüseynov anadan olmuşdur) Daşkəsən kənd məktəbi paralel tikilməlidir. Yoxsa başqa məktəblər də tikilməyəcəkdir. Nə isə, Mehdi müəllimi razı saldım. O kənddə də yeni tipli səkkizillik məktəb binası tikdik.

Mehdi müəllim haqqında çox danışmaq olar. Elə bil tale insanlığa xas olan ən gözəl keyfiyyətlərin hamısını Mehdi müəllimdə cəmləşdirmişdir. O, Azərbaycan xalq maarifinin canlı tarixi, XX əsr təhsil qurucularından biri, əsl maarif fədaisi idi.



# HAMI ONA "MEHDİ MÜƏLLİM" – DEYƏ MÜRACİƏT EDİRDİ

*NAZİM ƏHMƏDOV,*
*Pedaqogika üzrə fəlsəfə doktoru, professor*

Görkəmli pedaqoq Mehdizadənin çox titulları olsa da hamı ona "Mehdi müəllim" – deyə müraciət edirdi. Yaxşı yadımdadır, uzun müddət maarif naziri vəzifəsində işləyən Mehdizadəyə nazirlik aparatının işçilərindən təkcə bir nəfəri "professor" – deyə müraciət edirdi. Hamı da hiss edirdi ki, Mehdi müəllimin bu müraciət formasından xoşu gəlmir. Lakin müraciət edənin vəzifəli və yaşlı adam olduğunu nəzərə alan Mehdi müəllim ona irad tutmurdu. Amma bir dəfə üstüörtülü şəkildə həmin müraciət formasına münasibətini ifadə edərək bildirdi ki, belə müraciət "elmi şurada" bəlkə də yerinə düşər. Bu sadə insan heç vaxt elmlər doktoru, professor, akademik, nazir olduğunu qabarıq şəkildə ön plana çəkilməsini xoşlamazdı.

Mənim Mehdi müəllimlə ilk şəxsi tanışlığım 1965-ci ildə Mingəçevir maarif şöbə müdiri vəzifəsinə təyin olunduğum günə düşdü. Etiraf edim ki, həmin vaxtadək onun haqqında çox eşitmiş olsam da, nə özü ilə, nə də əsərləri ilə yaxından tanışdım. İlk görüşümüzdə onun verdiyi tövsiyələr məni sanki oyatdı. Bəlkə də bu ilk görüş mənim sonralar bir məktəbşünas kimi formalaşmağıma səbəb oldu.

Deyə bilərlər ki, Mehdizadə məktəbşünaslıq sahəsində geniş tədqiqatlar aparmayıb. Doğrudur, lakin



uzun illəri əhatə edən nazirlik fəaliyyəti, yüksək təşkilatçılıq bacarığı nümunəsi böyük maarif təşkilatçıları nəsli yetişdirmişdir. Nazirliyin kollegiya iclasında iştirak edən aparat işçiləri, maarif şöbə müdirləri, məktəb direktorları və digər maarif təşkilatçıları Mehdi müəllimin verdiyi tövsiyələrdən faydalanır və öz idarəetmə fəaliyyətlərini təkmilləşdirirdilər. Şəxsən mən öz fəaliyyətimdə bunu daha qabarıq şəkildə hiss etmişəm. Sonralar məktəbşünaslıq sahəsində tədqiqat apararkən onun tövsiyələrinə istinad etmişəm. Yaxşı yadımdadır, bir dəfə nazirliyin kollegiya iclasında Qusar rayonu məktəblərinin yoxlanması nəticələrinə dair məsələ müzakirə olunurdu. Nazirliyin inspektoru yoxlamanın nəticələrinə dair arayış oxudu. Arayışda bir sıra məktəblərin fəaliyyəti kəskin tənqid olunurdu. Nazir Qusardan dəvət olunmuş yoldaşlara müraciət edərək kimin danışmaq istədiyini soruşdu. Heç kim dillənmədi. Onun təkrar müraciətinə də cavab verən tapılmadı. Bu zaman Mehdi müəllim arayışı əlinə alıb adı tənqid olunan məktəb direktorlarından birini ayağa qaldırıb dedi:

– A kişi, səni yıxıb sürüyürlər, bu qədər tənqid edirlər, niyə durub danışmaq istəmirsən?

Həmin direktor bir qədər duruxduqdan sonra ləzgi aksenti ilə bildirdi:

– Mehdi müəllim, mən lap məəttəl qalmışam. Bir ay bundan əvvəl indiki arayışı oxuyan inspektor bizim məktəbdə yoxlamada olarkən mən onun yanından heç yana getmirdim. O nəyi yoxlayırdısa "əla" – deyirdi. İndi bilmirəm necə oldu ki, hər şey pis oldu?

Mehdi müəllim özünəməxsus etika ilə inspektora müraciət etdi:

– Bu kişi düz deyir?

İnspektoru gülmək tutmuşdu, əvvəlcə başının hərəkəti ilə direktorun dediyini təsdiq etdi. Sonra özünü yığışdırıb açıqladı:

– Mehdi müəllim, o kişi düz deyir. Mən onun yanında əla sözünü çox işlətmişəm. Amma o məni düz başa düşməyib. Mən onun işinin əla olduğunu bildirmirdim. Əksinə, demək istəyirdim ki, kollegiya iclası üçün "əla" fakt tapmışam. Nazirin sorğu-sualından məlum oldu ki, yoxlama komissiyasının üzvləri nəzarətin yekunlarını yerdə müzakirə etməyib, nöqsan sahiblərinə heç bir göstəriş və ya məsləhət verməyiblər. Mehdi müəllim nəzarətçilərə çox kəskin iradlar tutdu. Fikrini belə ümumiləşdirdi ki, hər cür nəzarət nöqsanları yerindəcə düzəldilməsinə istiqamətləndirilməlidir. Mən məktəbdaxili nəzarətin forma və metodlarını təsdiq edərkən bu fikri məktəbdaxili nəzarətə verilən tələblərdən biri kimi formalaşdırdım. Mehdi müəllim barədə çox söz söyləmək olar. Onun haqqında xatirələri bir-iki səhifəyə sığışdırmaq mümkün deyil. Lakin onun xeyirxahlığı haqqında bir-iki epizodu qeyd etməyi lazım bilirəm.

Mənim bir mingəçevirli dostum namizədlik dissertasiyası müdafiə edirdi. Mehdi müəllim elmi şuranın üzvü idi. Bir qədər ona yaxın oturmuşdum. Elmi şuranın sədri dissertanta 7 sual verdi. Mehdi müəllimin sual verməyə hazırlaşdığını görüb onu fikrindən çəkindirməyə çalışdım. Zarafatla bildirdim ki, "əyalət aliminə" çox sual vermək onu pis vəziyyətdə qoya bilər. O isə mənə bildirdi ki, onun sualları xeyirxahlıq məqsədi daşıyır və dissertantın xeyrinədir. Mən bunu elə müdafiə prosesində hiss etdim. Əvvəla, dostum Mehdi müəllimdən əvvəl



verilmiş 7 sualın dördünə cavab tapdı, ikincisi də mənə aydın oldu ki, protokolda dissertantın akademikin suallarına qənaətləndirici cavab verə bildiyi qeyd olunacaqdır ki, bunun da Ali Attestasiya komissiyası üçün əhəmiyyəti az deyil.

70-ci ilin son aylarında Sumqayıtda maarif şöbə müdiri vəzifəsində işlədiyim zaman şəhərdə siyasi hakimiyyət dəyişdi. Mənə sifariş çatdırdılar ki, köhnə rəhbərliyin adamı olduğuma görə "başıma çarə qılmalıyam". Birinci katibin qəbuluna düşmək istədim, baş tutmadı. Nazirin qəbuluna asanlıqla düşdüm və vəzifəmdən azad olunmağımı xahiş etdim. Mehdi müəllim qəti etiraz etdi və bildirdi ki, Sumqayıt maarifi qabaqcıllar sırasındadır. O, bunu mənim qiymətim kimi qiymətləndirib əlavə etdi ki, maarif şöbələrinə və məktəblərə alimlərin rəhbərlik etməsi ilə fəxr edir (O zaman elmlər namizədi olan maarif şöbə müdirləri tək-tək idi). Nazir azad olunmaq haqqında ərizəmi qəbul etmədiyindən onu məzuniyyətə buraxmaq ərizəsi ilə əvəz etdim, lakin işə qayıtmayacağımı bildirdim. Məzuniyyətdən qayıtdıqdan sonra işdən azad olunmağım barədə həm nazirə, həm də şəhər rəhbərliyinə ərizə göndərdim və işə çıxmaqdan imtina etdim.

Bir gün evdə oturmuşdum. Telefonla zəng vurub bildirdilər ki, Mehdi müəllim gəlib məni gözləyir.

Gedib Mehdi müəllimlə görüşdüm. O, məndən əvvəl şəhər rəhbərliyi ilə görüşüb söhbət edibmiş. Mənə bildirdi ki, şəhər rəhbərliyinin mənim haqqında fikirləri müsbətdir. Lakin mən təkid etdim ki, vəzifəmdən azad etsin. O, məni yaxşı başa düşdü və səhəri günü qəbul etdi. Ancaq məni təkcə azad etmədi. "Hələ səndən keçməmişik" – deyə,

ETPEİ-yə baş elmi işçi götürülməyim barədə əmr verdi. Mehdi müəllim belə xeyirxah, alicənab insan idi.





# AZƏRBAYCAN MAARİFİNİN PARLAQ ULDUZU

***AĞƏLİ BƏDƏLOV,***
*"Azərbaycan müəllimi" qəzetinin şabiq redaktoru, əməkdar müəllim*

Mehdi müəllim dedikdə gözlərimin önündə 1930-1984-cü illərdə respublikamızda pedaqoji elmin inkişafına, müəllim kadrlarının hazırlanmasına başçılıq edənlərdən birinin surəti canlanır. O, pedaqoji fəaliyyətə 18 yaşında bir dərəcəli kənd məktəbindən başlamış, 1926-cı ildə Azərbaycan Pedaqoji İnstitutunun fizika-riyaziyyat fakültəsini bitirmişdi. Kənd müəllimindən Respublikanın Maarif Naziri, keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü kimi şərəfli yaradıcılıq yolu keçmişdi. 1952-1954 və 1960-1980-ci illərdə maarif naziri işləmişdi. "Pedaqogika", "Pedaqoji institutların tələbələri üçün tədris vəsaiti", "Məktəbdə təlim-tərbiyə işlərinin yenidən qurulmasının bəzi məsələləri", "Ümumtəhsil məsələlərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" və s. Kitablar Mehdi müəllimin qələminin məhsuludur.

1930-1933-cü illərdə Azərbaycan Ali Pedaqoji İnstitutunda təhsil alanda Mehdi müəllim mənim müəllimim olub. Müəllim sözü ona yaraşan kimi çoxlarına yaraşmır. Elmlər doktoru, professor, akademik idi. Ancaq ona Mehdi müəllim deyə müraciət edərdik. Çünki müəllim sözü anlayışının bütün tərkib hissələrinin cəmi Mehdi müəllimin özü idi. Bu sözdən onun özünün də xoşu

gəlirdi. “Azərbaycan müəllimi” qəzetində işlədiyim 16 ilə yaxın bir dövrdə həmişə Mehdi müəllimin qayğı və köməyini hiss etmişəm. Qəzetin hər yeni nömrəsinin ilk oxucusu olardı. Səhər tezdən işə gələn kimi qəzeti ona çatdırardıq. Oxuyub qeyd və tövsiyələrini deyərdi. Redaksiya işçilərini qəbul edib, məsləhətlər verərdi.

1936-cı ildə Ağdam Pedaqoji məktəbində müəllim işləyirdim. Müəllimlər attestasiyadan keçməli idilər. Bundan ötrü xüsusi attestasiya komissiyası yaradılmışdı. Komissiyaya sədrlik edən Bakıdan gəlmiş Mehdi müəllim idi. O dərsimi dinlədikdən, özümlə müsahibə apardıqdan sonra orta məktəb müəllimi adı verilməsi barədə qərara gəldi.

Böyük Vətən müharibəsi yenicə qurtarmışdı. 1946-cı ildə Bakının Caparidze rayon Xalq Maarif Şöbəsində müdir vəzifəsində çalışır, həm də 190 nömrəli məktəbdə dərs deyirdim. Mehdi müəllim Pedaqoji İnstitutda işləyirdi, bizim rayondakı məktəblərin, xüsusilə 190 nömrəli məktəbin müəllimlərinin iş təcrübəsi ilə maraqlanırdı.

Mehdi müəllim bütün həyatını Azərbaycanda xalq maarifinin inkişafına həsr etdi. O, daim müəllimlər, maarif işçiləri arasında olardı, elmi nəzəri və praktik konfransların, rayon müşavirələrinin hazırlanıb keçirilməsinə başçılıq edərdi.

Azərbaycan müəllimlərinin IV qurultayına (12-16 noyabr, 1960-cı il) aparılan hazırlığa Mehdi müəllimin nə qədər əmək sərf etdiyinin canlı şahidiyəm. Qurultay Azərbaycan Elmlər Akademiyasının binasında keçirilirdi. O günlər “Azərbaycan müəllimi” qəzetinin redaksiyası da demək olar ki, bu binaya köçmüşdü. Qəzet hər gün çıxırdı.



Mehdi müəllimlə Moskvada maarif işçiləri həmkarlar ittifaqı qurultayında, Daşkənddə milli məktəblərdə rus dilinin tədrisi vəziyyətinə həsr edilmiş Ümumittifaq müşavirəsində, Tbilisi Zaqafqaziya ziyalıları yığıncağında birgə keçirdiyim o unudulmaz günləri xatırladıqca bu böyük insanın, dahi şəxsiyyətin Vətən – xalq qarşısında xidmətləri daha parlaq şəkildə nəzərə çarpır.



# İDEAL SANDIĞIM ŞƏXS

*MƏHYƏDDİN ƏBDÜLOV,*
*jurnalist, Azərbaycan Respublikasının əməkdar mədəniyyət işçisi*

"Azərbaycan müəllimi" qəzetinin redaksiyasında iş vaxtı yenicı başlamışdı. Əməkdaşlar, həmişə olduğu kimi, yenə də gündəlik qəzetləri nəzərdən keçirir, ölkədə, dünyada baş verən hadisələrdən xəbər tutur, ayrı-ayrı məqalələr haqqında fikir yürüdürdülər. Katibənin məni redaktorun çağırdığını xəbər verməsi ilə səs-küyə, mübahisəyə son qoyulması bir oldu.

Üz-gözündən nur yağan, ürəyinin işığından sifətinə şəfəq saçan redaktorumuz – Ağəli Bədəlov məni mehriban qarşıladı. Ötəri hal-əhvaldan sonra nazirin məni görmək istədiyini söylədi.

Qeyri-adi həyəcanlandım. Bu müəmmalı görüşdən bir şey anlaya bilmədim.

– Narahat olma, dünənki yazın xoşuna gəldiyindən müəlliflə şəxsən görüşmək, söhbət etmək istəyir, – deyə Ağəli müəllim təbəssümlə əlavə etdi.

Nigarançılıqdan qurtardım. Dəftər-qələm götürüb nazirin kabinetinə yollamdım. Qəbul otağına gəlib özümü katibəyə nişan verdim. Katibə daxili telefonla nazirlə danışdı. Dəstəyi yerinə qoyub "keçin içəri", – dedi.

Nazir geniş və işıqlı, hündür pəncərələri dənizə açılan otağın qapı ilə üzbəüz baş tərəfində oturmuşdu. Məni görən kimi ayağa durub əl verdi. Özünə yaxın stula



dəvət etdi. Adımı soruşdu. Təhsilimlə, ailə vəziyyətimlə maraqlandı. Nəhayət, mətləbə keçdi.

– "Azərbaycan müəllimi"nin dünənki nömrəsində təlim prosesində şagirdlərə vətənpərvərlik hissinin aşılanması ilə bağlı yazdığın məqalə xoşuma gəldi. Ümid edirəm ki, gənc müəllimlər üçün maraqlı olacaqdır. Göstəriş vermişəm ki, məktəblərdə oxuyub müzakirə etsinlər. Müəllimlərin bu cür öyrədici xarakter daşıyan yazılara ehtiyacı var...

Azərbaycan xalq maarifinin inkişafında misilsiz xidmətləri olan nazir-akademik Mehdi Mehdizadə bir saata yaxın mənimlə söhbət etdi. Vaxtaşırı məktəblərdə olmağımı, müəllimlərin dərslərində tez-tez iştirak etməyimi, yaxşı təcrübəni ümumiləşdirib qəzet səhifəsinə çıxarmağımı məsləhət bildi. Öz üzərimdə çalışmağımı, elmi-pedaqoji yeniliklərlə tanış olmağımı, tapa bilmədiyim kitabları ondan almağımı tövsiyə etdi...

Mehdi müəllimlə ilk şəxsi tanışlığım belə başladı və bu görüş məndə unudulmaz, xoş bir hadisəyə çevrildi.

Bundan sonra Mehdi müəllimlə tez-tez görüşdüm. Müxtəlif səviyyələrdəki məruzə və çıxışlarını verdiyi tezislər əsasında yazmağımı, rus dilində özünün hazırladığı məqalələri, kitabları Azərbaycan dilinə tərcümə etməyimi xahiş edir, ərkyana müxtəlif tapşırıqlar verir, gülə-gülə onun yazı üslubunu düzgün tutduğumu bildirirdi.

Birgə əməkdaşlıq şəraitində bu böyük vətəndaş–insana qəlbən vurulur, onun çoxsahəli səmərəli fəaliyyətində vətənə, xalqa xidmətin parlaq nümunəsini görür, hər dəfə malik olduğu yüksək, bəşəri keyfiyyətlərlə

tanış olurdum. Bunlar ancaq dahilərə, nəcib hisslərlə yaşayan şəxslərə xas olan keyfiyyətlər idi.

... Oktyabr inqilabının 60-cı ildönümü münasibətilə müttəfiq respublikalardan Azərbaycanda xalq maarifinin inkişafı ilə əlaqədar məqalə ilə çıxış etmək sifarişi almışdı. Telefonla yanına çağırıb həmin sifarişlə məni də tanış etdi. Əsas istiqaməti göstərməklə geniş bir məqalə hazırlamağımı xahiş etdi.

Üç-dörd gündən sonra məqalə hazır oldu. Birlikdə oxuduq. Xoşuna gəldi və elə həmin gün məqalə on dörd respublikaya yola salındı.

Bu hadisədən təxminən iki ay sonra katibə zəng edib Mehdi müəllimləin məni görmək istədiyini bildirdi. Qəbul otağında xeyli adam olsa da, katibə içəri keçməyimə işarə etdi.

Mehdi müəllim tanıdığım iki nəfər şəxslə söhbət edirdi. Məni görən kimi söhbətini kəsdi, stolun üstündən ağzı bağlı zərfi götürüb mənə uzatdı və söhbətini yenidən davam etdirdi.

Həmişə olduğu kimi, indi də zərfdə yazılacaq məqalənin mövzusu, zəruri faktlar olduğunu düşünüb kabinetdən çıxdım. Redaksiyaya qalxdım. (Həmin illərdə nazirlik Hökumət evinin ikinci, "Azərbaycan müəllimi" qəzetinin redaksiyası isə onbirinci mərtəbədə yerləşirdi).

Zərfi açdım və qəribə mənzərə ilə rastlaşdım: On dörd respublikadan göndərilən qonorar qəpiyinə qədər, ayrı-ayrı, göndəriş kağızı da üstünə bərkidilməklə zərfə qoyulmuşdu.

Zərf əlimdə lifti belə gözləmədən ikinci mərtəbəyə endim. Nazir tək idi. Məni görən kimi eynəyini çıxarıb



əlinə aldı. Qaşları düyünləndi və "xeyir ola", – deyə təəccüblə soruşdu.

– Mehdi müəllim, hazırladığım məqalə ilə əlaqədar haqqım artıqlaması ilə ödənilmişdi. Xahiş edirəm bunları geri götürəsiniz, – deyə zərfi stolun üstünə qoydum. Çıxmaq istərkən nazir məni saxladı. Yenidən zərfi götürdü. Ayağa qalxıb mənə yanaşdı, mülayim, xoş səslə dedi:

– Əmək haqqın ödənilib deyirsən. Çox gözəl. Bəs onda bunlar kimin əmək haqqıdır? Yox, əzizim, bunlar sənə, yalnız sənə çatacaqdır.

O, zərfi yenidən mənə verib yola saldı, özü isə eynəyini taxıb xəfif təbəssümlə pəncərədən dənizə, sakit, əngin sinəli doğma Xəzərə tamaşa etdi...



# MEHDİ MÜƏLLİM NECƏ VARSA...

*GÜLMİRZƏ ƏLİYEV,*
*Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun sabiq şöbə müdiri, Pedaqoji elmlər namizədi, dosent*

Mən Mehdi müəllimi ilk dəfə hələ 60-cı illərdən onun əsərləri ilə tanıdım. Onu da qeyd edim ki, müəllimlik fəaliyyətinə başlayanda pedaqoji təhsilim yox idi, topoqraf idim. O vaxt mövcud olan qərara əsasən orta məktəbi rusca qurtaranlara orta məktəbdə rus dili dərslərini aparmağa icazə verirdilər.

Müəllim yoldaşlardan biri məsləhət bildi ki, Mehdi müəllimin əsərlərindən başlayım. Mən bu məsləhətə əməl etdim. Yaxşı müəllim olmağımda böyük rolu olan bu nəcib insana, uzaqgörən rəhbər və görkəmli alimə – Mehdi müəllimə borcluyam.

Mehdi müəllimlə ilk görüşüm 1967-ci ildə oldu. Saatlı rayon Xalq Maarifi Şöbəsində metodkabinəyə müdir təyin olunmuşdum. Bununla əlaqədar Bakıya təsdiq olunmağa gəlmişdim. Nazir müavinlərinin yanında oldum (onlardan biri məni yalnız üçüncü gün qəbul etdi). Sonra Mehdi müəllimin qəbulunda oldum. Qəbul cəmi 15 dəqiqə çəkdi. Bu qısa müddət ərzində Mehdi müəllim mənim tərcümeyi-halımı, ümumi və pedaqoji hazırlığımı, bu işə marağımı və həvəsimi müəyyənləşdirib, məktəbin və maarifin qarşısında duran vəzifələri açıqladı və mənə lazımi istiqamət verdi. Bu məsləhətlər mənə bəs elədi.

Mehdi müəllim Maarif Naziri işlədiyi vaxt tez-tez bizi yanına çağırar, fərdi söhbətlər edər, təlimin məzmunu



və metodlarından, məktəb təcrübəsindən söhbət açar, yeni pedaqoji və metodiki fikirləri təhlil edərdi. Onun bu söhbətləri heç vaxt amiranə, deklarativ xarakter daşımazdı. O, bizi səliqə ilə, həssaslıqla, diqqətlə dinləyər, əzizlədə-əzizlədə pedaqoji axtarış sahəsində yeni pöhrələnən fikirlərin inkişaf istiqamətlərini tövsiyə edərdi.

Hər dəfə onun otağından çıxanda məni bir sual düşündürərdi: Mehdi müəllim necə vaxt tapıb bu yenilikləri hamıdan öncə oxuyur, mənimsəyir, yaradıcı inkişaf etdirib bizə tövsiyə edir ki, biz onu həyata keçirək. Mən bu suala cavab tapmırdım. Ona görə tapmırdım ki, o məsələlərin çoxunu Mehdi müəllim heç yerdən oxumazdı. Onlar Mehdi müəllimin apardığı dərin tədqiqatların elmi və praktik nəticələri idi.

Mehdi müəllimin apardığı kollegiya iclaslarında iştirak etmək mənə dəfələrlə nəsib oldu. Bu iclaslarda çoxlu vacib məsələlər müzakirə olunurdu. Müzakirələr, diqqətli, operativ, ətraflı, demoktarik şəraitdə keçirilirdi və həmişə kollegial qərarlar qəbul edilirdi. Bu məsələlərlə bağlı əvvəlcədən düşünülmüş hazırlıq işləri aparılırdı. Əgər məsələ tam hazır deyilsə, onun müzakirəsi heç vaxt təşkil edilmirdi. Ən vacibi də o idi ki, istər müzakirə vaxtı, istərsə də qərar qəbul edilən prosesdə insana olan diqqət, qayğı, onun düşdüyü şərait hərtərəfli nəzərə alınırdı. Burada heç vaxt tələsikliyə yol verilmirdi...

Mehdi müəllimin verdiyi tapşırıqlar həmişə çox aydın olardı. Bir dəfə bizi çağırıb tapşırıq verdi ki, başqa tədqiqatlarla yanaşı, proqram, dərslik və tədrisin vəziyyətini təhlil edib tövsiyələr hazırlayaq. Sözün düzü biz hamımız daxilən çox narazı olduq ki, məgər müəlliflər üçün işləməliyik? Buna baxmayaraq, Mehdi müəllimin

izahatından sonra biz işə başladıq. Bu iş çox zəhmətli, münaqişəli (müəlliflər bizə hücuma keçirdilər) və ağır idi. Nəticədə bizim hamımız proqramları, dərslikləri, tədrisin vəziyyətini yaxşı öyrəndik və bu sahənin təkmilləşdirilməsini çox yaxşı təşkil etdik. Yadımdadır, 1979-cu ilin may ayında Daşkənd şəhərində rus dili üzrə Ümumittifaq konfransının yekun iclasında SSRİ Maarif Naziri Prokofyev qeyd etdi ki, Azərbaycan Respublikası təlimin məzmun və metodlarının təkmilləşdirilməsi sahəsində ittifaqı ən azı beş il qabaqlayıb.

Şübhəsiz bu Mehdi müəllimin uzaqgörənliyinin parlaq nəticəsi idi. Bir dəfə Mehdi müəllim bizi (məni, Laptevi və Dexnoviçi) yanına çağırıb bir məsələ ilə əlaqədar tapşırıq verdi. Mən bu məsələnin ciddi olduğunu hiss etdim və materialı böyük məsuliyyətlə hazırlayıb (üç variantda: birincisi 17s., ikincisi 51 s., üçüncüsü 144 s.) nazirliyə təqdim etdim. Müəyyən vaxt keçəndən sonra Mehdi müəllim bizi yanına çağırdı. Adətən sakit olan Mehdi müəllim bu dəfə çox əsəbi idi. Üzünü Laptevə tutub dedi: – Vladimir İvanoviç, Siz 30 ildir ki, nazirlikdə işləyirsiniz. Heç utanmırsız? Bu nə materialdır? (Yazısını qaytardı özünə) Sonra başqa bir qovluğu atdı Daxnoviçin qarşısına və dedi: – Andrey Qriqoryeviç, bu nədir? Siz elə hamını pisləyirsiniz – kobuddur, savadsızdır və... (Daxnoviç milli kadrları belə qələmə verərmiş). Materialı belə hazırlayarlar? Alın oxuyun, gələn dəfə Sizi çağıraram.

Burada mən birinci dəfə Mehdi müəllimi əsəbi gördüm. Bu hadisədən sonra onun mənə münasibəti xeyli yaxşılaşdı. Növbəti dəfə Mehdi müəllimin yanında olanda, telefon zəngi çalındı. Mehdi müəllim dəstəyi götürdü.



Üzünü mənə tutub dedi: – Gülmirzə, səni istəyirlər. Düzü mən çox təəccübləndim ki, bu kimdir və nə üçün nazirin otağına zəng vurub məni soruşur? Dəstəyi götürdüm. Danışan Babanlı Rövşən idi. O dedi: – Sən bir evə get, qızın Esmira balkondan yıxılıb, aparıblar Sabunçuya xəstəxanaya. Bir şey olmayıb qorxma. Mən soruşdum: Balkonda ya balkondan?

Mehdi müəllim nə baş verdiyin soruşdu. Mən işin nə yerdə olduğunu dedim. Mehdi müəllim dərhal qarşısındakı kağızları yığışdırıb dedi: – Get uşaqla məşğul ol. Vəziyyət yaxşı olanda gələrsən, işə davam edərik. Mənə zəng vurub uşağın vəziyyətini bildir və bir şey lazım olsa, utanma de. Mən sağollaşıb Sabunçuya getdim.

Bu hadisə zamanı mən Mehdi müəllimin həm baxışında, həm səsində, həm də hərəkətində yalnız diqqət, həssaslıq və səmimi qayğı gördüm.

Bir dəfə Mehdi müəllim məni yanına çağırıb təklif etdi ki, "Azərbaycan məktəblərində rus dili və ədəbiyyatı" metodik jurnalına redaktor olum. Mən etiraz etdim. Bir anlıq fasilədən sonra dedi: Mən səndən elə bu cavabı gözləyirdim. Yaxşı ki, mən səhv etməmişəm, çünki alim redaktor olanda bütün yeni fikirlərini başqalarının məqalələrində işlədir, özünə isə demək olar ki, bir şey qalmır. Bir də madam ki, sən elmlə məşğul olmağı fərdi minik maşını, kabinet və sairədən üstün tutdun, sağ ol, başqa bir namizəd fikirləş.

Bir əhvalat da heç yadımdan çıxmır. Necə oldusa mən Mehdi müəllim ilə MK-da bir şöbə müdirinin kabinetinin qapısında görüşdük. Söhbət edirdik. Birdən məni qəbula dəvət etdilər. Mən özümü itirib çaşdım. Necə olur ki, Mehdi müəllimi gözlədib məni qəbul edirlər.

Bunu hiss edən Mehdi müəllim yalnız ona məxsus sakit və çoxmənalı tərzlə dedi: – Gülmirzə, get, səni çağırırlar. Onların günahı yoxdur. Quruluş bizi belə tərbiyə edib.

Mehdi müəllim bir cümlə ilə quruluşun əcaibliyini, xalqımızın gözəl ənənəsini, böyüyə hörmətin unutqanlığını nəzərə çatdırdı.

1979-cu ilin mayında Daşkənddə Ümumittifaq rus dili konfransına Azərbaycan nümayəndəliyi də gedirdi. Təyyarə limanının deputat zalında toplaşmışdıq. Nümayəndəlik 35 nəfərdən ibarət idi. Burada MK-nın təlimatçısı Əlimirzə Əhmədov, Nazirlər Sovetinin sədr müavini Kamran Hüseynov, Maarif Naziri Mehdi Mehdizadə, Ali və Orta İxtisas Təhsili Naziri Qurban Əliyev, Peşə Təhsili Komitəsinin sədri Tofiq Allahverdiyev, Maarif Nazirliyi Baş məktəblər İdarəsinin rəisi Zəhra Əliyeva və başqa maarif, mətbuat işçiləri var idi. Əlimirzə müəllimin təklifi ilə məni nümayəndəliyə rəhbər seçdilər. Təyyarəyə minərkən Mehdi müəllim dedi:

– Gülmirzə, tələsmə bir az da havada olaq.

Burada Mehdi müəllim respublikamızda rus dilinin tədrisi sahəsində milli kadrların inkişafı ilə əlaqədar maraqlı söhbət etdi və Daxnoviçlərin, Yüzbaşovların bu sahənin inkişafına nə qədər mane olduqlarını açıqladı və qeyd etdi ki, təlimin məzmunu milliləşdirilməlidir. Bu söhbətə qədər mənə elə gəlirdi ki, Mehdi müəllim onları müdafiə edir. Lakin Mehdi müəllimin həmin söhbəti məni o fikirdən uzaqlaşdırdı.

Moskvaya ezamiyyətlərin birində SSRİ PEA-nın mehmanxanasında Qırğızıstan Elmi Tədqiqar Pedaqogika İnstitutunun direktoru, akademik Əziz İzmaylov ilə qonşu otaqda qalmalı oldum. Axşamlar oturub müxtəlif



mövzularda söhbət edirdik. Bir dəfə akademik özünü saxlaya bilməyib dedi: – Siz azərbaycanlılarla ona görə ünsiyyət maraqlı və xoşdur ki, sizin Mehdi müəllim kimi ağsaqqal aliminiz, naziriniz var. Bu fikrə yaxın və oxşar fikirləri mən dəfələrlə professor İ.V.Barannikov, V.V.İvanov, akademik V.Q.Kostamarov, A.Azimov və başqalarından da eşitmişəm.

Mehdi müəllimlə bağlı xatirələrim çoxdur. Bir gün işlədiyim elmi-tədqiqat institutunun direktoru məni yanına çağırtdırıb dedi:

– Gülmirzə müəllim, köməyinizə ehtiyacım var. Bilirsiniz ki, Mehdi müəllim təqaüdə çıxıb. Məndən xahiş edib ki, maşınımı verim onu bağa Bilgəhə aparsın. Sürücü nədənsə ləngiyib gəlib çıxmır. Xahiş edirəm, Mehdi müəllimi Siz Bilgəhə aparıb axşam isə geri gətirəsiniz. Mən razılıq verərək Mehdi müəllimi və həyat yoldaşını evlərindən götürüb Bilgəhə apardım. Mənim onda köhnə bir "Moskviç" markalı maşınım var idi. (Hələ aspirant yoldaşlarım o maşına "Torpedo" adını qoymuşdular). Yolda Mehdi müəllim soruşdu:

– Gülmirzə, bu maşının nəyə görə belə səs edir?

Mən dedim ki, köhnəliyinə görə. Onda Mehdi müəllim dedi:

– Gülmirzə, sən ki, tez-tez yanımda olurdun, nə üçün demirdin ki, sənin üçün bir maşın ayıraq. Söhbətə Mehdi müəllimin həyat yoldaşı Lətifə xanım qoşulub dedi: – İndi belə deyirsən, nazir olanda əlli cür bəhanə gətirərdin.

Nə isə gedib bağa çatdıq. Axşama qədər Mehdi müəllimlə bağda müxtəlif işlər gördük, maraqlı söhbətlər etdik. Mehdi müəllim meyvə-tərəvəzi qış üçün tədarük etməyim barədə faydalı məsləhətlər verdi. Bəli, onunla

keçən hər an mənalı idi. Mən onda gördüm ki, Allah Mehdi müəllimi necə yaratmışdısa, elə də var idi. Sadə, mehriban, təmiz qəlbli, zəkalı...





# MEHDİ MEHDİZADƏ ÖZÜ BÖYÜK MƏKTƏB İDİ

*MALİK MİRZƏYEV,*
*Coğrafiya elmləri namizədi, dosent, akademik Mehdi Mehdizadə adına mükafat laureatı*

Azərbaycan respublikası dünya xəritəsində çox kiçik yer tutur. Əhalisi isə məşhur İstanbul şəhərinin əhalisindən də azdır. Bu həqiqətin içində bir həqiqət də var. Azərbaycanı bütün dünya tanıyır. Bu qədim diyara maraq gündən-günə artır. Azərbaycanı dünyada tanıtdıran və eləcə də dünyanı Azərbaycana tanıtdıran bizim korifeylərimizdir. Əgər istedadlı alimlərimizi, söz sərraflarımızı, müsiqiçilərimizi, el sənətkarlarımızı və digər məşhurlarımızın sayını ərazimizin sahəsinə bölsək onda görərik ki, Azərbaycan dünyamızın çox nəhəng bir məmləkətidir. O elə bir zirvədir ki, onu okenaın o tayından, şimal və cənub qütbündən, yer kürəsinin hər hansı bir nöqtəsindən daha aydın görmək olar. Mehdi Mehdizadə yurdumuzun çox istedadlı alimi, dövlət xadimi, vətənsevər bir vətəndaş oğlu idi. Düzdür, o da başqaları kimi məktəb qurtarmışdı, ustadından dərs almışdı, amma onun özü böyük məktəb idi. Mənim yaşım, vəzifəm və mövqeyimlə əlaqədar onunla o qədər də çox ünsiyyətdə olmamışdım. Amma iş elə gətirirdi ki, söhbətini dinləmək mənə də qismət olurdu.

Akademik Mehdi Mehdizadənin sadəliyi, səmimiliyi, təvazökarlığı, obyektiv mövqedən çıxışı, haqqı müdafiə etməsi bir insan kimi məni məftun etmişdi. Onu

dinləməkdən zövq alır, onunla bir eloğlu kimi fəxr edirdim. Bir dəfə Kəlbəcərdən dostum Şamil Əsgərov Bakıya gəlmişdi. Çox həyəcanlı idi. Qışın çiləsində 1 nömrəli məktəbin istilik sistemi xarab olmuşdu, uşaqlar dərsə gedə bilmirdilər. Onunla birgə Maarif Nazirliyinin Təchizat Bazasına yollandıq. Öyrəndik ki, həmin sistem üçün yarayan qurğu – cihaz var, amma nazirin sərəncamındadır. Onun icazəsi olmadan verə bilməzlər. Ş.Əsgərov çox dil tökdü, onları əmin etdi ki, nazirdən icazə ala biləcək. Lakin razılıq vermədilər. Nazirliyə – nazirin yanına yollandıq. Qəbulunda çoxlu adam vardı. Şamil müəllim nazirin qəbul işlərinə baxan qıza yaxınlaşdı. Kəlbəcərdən gəldiyimi ona deynən, sonrasıyla işin yoxdur, – dedi. Qız çətin olsa da içəri girdi. Çox keçmədən qayıdaraq, Şamil müəllim içəri keçin, nazir sizi gözləyir, – dedi. Ş.Əsgərov içəridən gülə-gülə çıxdı. Əlində balaca bir kağızda Mehdizadənin qolu vardı. Hər şey qaydasına düşdü.

Bir dəfə Qız qalasının yanında yaşadığı evə anasının vəfatı ilə əlaqədar ona baş sağlığı verməyə getmişdik. Müxtəlif söhbətlər oldu, yaşından asılı olmayaraq, ana itkisinin ağırlığından söz açdı. Müəllim yoldaşlardan biri ortaya müəllim hazırlığı ilə bağlı bir söhbət saldı və qeyd elədi ki, biz APİ-də tələbələrə təlimin texniki vasitələrini belə göstərə bilmirik. Avadanlığımız, vəsaitlərimiz çatışmır. Mehdi müəllim diqqətlə müəllimi dinlədikdən sonra dedi: – Kəlbəcərdə elə məktəbimiz var ki, orda 6 kinoqurğusu var, dərslər hamısı kabinetlərdə keçirilir, bütün müəllimlər kino qurğusundan sərbəst istifadə etməyi bacarırlar. Mən bilməmişdim ki, sizin institutda vəziyyət beləymiş. O sonra əlavə etdi: – Ölkədə bütün



pedaqoji institutlar Maarif Nazirliyinə baxır. Bizim respublikamızda isə Ali Təhsil Nazirliyinə. Eyb etməz, mən gələcək müəllimlərin xatirinə Sizə kömək edərəm. Nə lazımdırsa, siyahısını hazırlayın, məktubla gəlin, necə olsa Sizə kömək edərəm...

Elə də etdi. Sözü bütöv adam idi. Söz verdiyi işi yerinə yetirən idi. Ona süründürməçilik, “get, bir həftədən sonra gəl” kimi “iş üsulu” yad idi. Bu onun böyüklüyündən, Xalqa – Vətənə can-başla xidmətindən irəli gəlirdi.

M.Mehdizadə maarif fədaisi, maarid təşkilatçısı, pedaqogika elminin kamil bilicisi idi. O, qabaqcıl müəllimləri, məktəbləri yaxşı tanıyırdı. Ayrı-ayrı dərslik və proqramların məzmununu mükəmməl bilirdi, onların müəllifləri ilə tez-tez görüşürdü. Mətbuatda müəllim haqqında yazılanlardan xəbər tutar, ayrı-ayrı müəllifləri rəğbətləndirərdi.

İş elə gətirdi ki, mən Azərbaycan ETPEİ-də işləyərkən onunla yol yoldaşlığı da elədim. Onu maşınımla bəzən Bilgəhdəki bağına aparası olurdum. Yol boyu maraqlı söhbətlər edərdi. Mənim ixtisasımın coğrafiya olduğunu biləndə, elə bil kişinin dərdi açıldı: – Mən istərdim ki, bizim dərsliklərimizdə Azərbaycan təbiəti ilə bağlı yığcam hekayələr, şeirlər verilsin. Bu məsələ böyük məsələdir, lakin ləngiyirik. Hələ heç doğma təbiətimizdən bəhs edən təbiətşünaslıq kitabımız da yoxdur. Bu sahədə türkmənlər, estonlar bizi qabaqlayıb. Kiçik yaşlarından təbiətin timsalında uşaqlara vətənpərvərlik tərbiyəsi aşılamaq lazımdır. Eh, bilirsən, söz verirlər, amma işə gələndə eləmirlər. İndi adamlar qəribə olublar. Hər şeyi tənqid edirlər. Dərslikləri

deyirəm. Deyirlər, dərsliklərdəki mətnlər, bədii parçalar yaxşı deyil, zəifdir.

Elə bununla əlaqədar bir dəfə yazıçılarımızdan bir qrupunu yanıma çağırtdırdım. Onlara dedim ki, bizim dərsliklərimiz üçün həyatımızdan, təbiətimizdən doğan yığcam, məzmunlu hekayələr işləyin, vaxt da müəyyən etdik. Söz verdim ki, qonorarı da 3-4 dəfə artıq verdirəcəyəm. Hamısı söz verdi, inandım. Lakin vədə çatanda heç bir hekayə də gətirən olmadı.

Nazir işləyərkən ilin əvvəllərində institutumuzun əməkdaşlarını şöbələr üzrə qəbul edərdi. Kiminin apardığı elmi-tədqiqat işinin aktual olmasına xeyir-dua verər, kiminə isə "məsləhət bilirəm ayrı mövzu işləyəsən", – deyərdi. Məqsəd məktəbin dərd-səri ilə bağlı işlərin aparılmasına rəvac vermək idi. O zaman mən utana-utana M.Mehdizadədən xahiş elədim ki, mənə köməklik eləsin. İlk dəfə sinifdənxaric oxu kitabı kimi yazdığım orijinal bir kitabın çap olunmasına sərəncam versin. "Səhər gələrsən, ərizə də yaz, işi də gətir", – dedi. Səhərisi ərizəmin üstünü yazdı. Həmin kitab 1990-cı ildə "Doğma yurdu gəzə-gəzə" adı ilə işıq üzü gördü. Təəssüf ki, mən o kitabın müəllif nüsxəsini ona bağışlaya bilmədim.

Onunla səfərdə olanlar həmişə söyləyirdilər ki, Mehdizadənin çox yaxşı yoldaşlığı vardı. Özünü heç kəsdən üstün tutmaz, yoldaşlarına çox qayğıkeşliklə yanaşardı. Yoldaşlıqda çox pak, düzgün idi. Heç vaxt mövqeyindən sui-istifadə etməz, haqq-hesabda qarşı tərəfi gözləyərdi.

Professor Zahid Qaralov danışır ki, bir dəfə onunla Moskvaya getmişdik. Beş-altı gün qalasıydıq. Mehmanxanada yerləşən kimi mənə dedi:



– Zahid, hələ ki, burdayıq xərc bir adamın əlindən çıxsın. Yeməyimizə nə xərcləsən qeyd elə, sonra hesablaşarıq. Dedim ki, professor burda nə var ki, səhər-səhər bir stəkan smetan, qatıq içirik, buna nə pul verirəm. Dinmədi... Gəlməyə bir-iki saat qalmış əlində tutduğu pulu cibimə qoydu.

Akademik M.Mehdizadə qohumbazlıqdan, yerlipərəstlikdən uzaq bir şəxs idi. Bunu mən çox yaxşı bilirəm. Biz universiteti 1961-ci ildə qurtararkən Cəbrayıldan Tamara və Solmaz adlı qızlar da bizimlə oxuyurdu. O vaxt təyinat yerində 6 ay işlədikdən sonra arayışa görə diplomu verirdilər. Biz elə bildik ki, bu qızlar Bakıda qalacaqlar (o zaman çoxları Bakıda qalmaq həvəsində idilər). Axı onların valideynləri Mehdizadəni yaxşı tanıyırdılar. Gözlədiyimizin əksi oldu. O qızların ikisi də rayona təyinat aldı.

Akademik M.Mehdizadə dünya miqyaslı, geniş diapozonlu alim idi. O YUNESKO xətti ilə nəinki Azərbaycanı, həmçinin keçmiş sovetlər birliyini təmsil edirdi. Bu böyük alim, böyük müəllim ikinci dəfə 20 ildən artıq bir vaxtda nazir işlədi. Xalqına, elinə-obasına xeyir verdi. M.Mehdizadə vəzifədən təqaüdə çıxandan və dünyasını dəyişəndən sonra da sevildi. O, indi daha böyük və daha əzəmətli görünür. Xalqı, milləti onunla fəxr edir. Nə qədər ki, Azərbaycan xalqı var, nə qədər ki, Azərbaycan təhsil sistemi var, nə qədər ki, pedaqoji tədqiqatlar var, akademik Mehdizadə və onun pedaqoji irsi də var. İnanırıq ki, zaman keçdikcə bu zəngin irs elm-təhsil yollarında etibarlı bələdçi olacaq.

# GÖRKƏMLİ MAARİF VƏ ELM FƏDAİSİ

***MƏCİD İSMİXANOV,***
*Pedaqogika üzrə fəlsəfə doktoru, dosent*

XX əsr Azərbaycan elminin, maarif və mədəniyyətinin görkəmli simaları içərisində akademik Mehdi Mehdizadə görkəmli yer tutur. Azərbaycan pedaqoji fikrin inkişafında, pedaqogikanın bir elm kimi formalaşmasında, pedaqoji kadrların yetişməsində, maarif quruculuğunda onun əvəzsiz xidmətləri olub. Yorulmaz tədqiqatçı alim kimi o, milli pedaqoji fikrimizin tarixinə dair bir çox iri həcmli əsərlərin, pedaqogikadan ilk dərsliklərin müəllifidir. 25 ilə yaxın bir müddətdə Respublikanın Maarif Naziri kimi məsul vəzifə daşıdığı dövrdə vaxtının azlığına baxmayaraq, bir an da olsa elmi işdən ayrılmamışdır. Həmin illərdə o, Azərbaycanda xalq maarifinin inkişafına dair üç monoqrafiya (1958, 1967, 1980) məktəbdə təlim-tərbiyə prosesinin təkmilləşdirilməsinə dair iki böyük əsər yazıb çap etdirmişdir. Sonuncu monoqrafiya “Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları” (1982) müasir pedaqoji nəzəriyyənin və qabaqcıl təcrübənin ciddi təhlili və ümumiləşdirilməsi əsasında yazılmışdır. 80 illik mənalı ömrünün, 60 illik narahat pedaqoq həyatının, 30 illik yaradıcı alim ömrünün zirvəsindən qələmə alınmış bu əsər Azərbaycan pedaqoji fikrinin inkişafına böyük töhfədir.



M.Mehdizadə bacarıqlı elm və maarif təşkilatçısı, fədaisi idi. Onun belə gərgin əməyini nə ilə izah etmək olar? Bizcə, bunu görkəmli maarifçi alimin respublikamızda xalq maarifinin və böyüyən nəsillərin inkişafına, müəllimlərimizin qabaqcıl pedaqoji təcrübə və elmi biliklərlə silahlandırılmasına göstərdiyi hədsiz qayğı ilə izah etmək olar. O, dincliyini, şəxsi firavanlığını, səhhətini, bütövlükdə ömrünü bu böyük amala həsr etmişdi. Gələcəyimizə, onları yetişdirən müəllimlərimizə diqqət və qayğı bu fədakar insanı ömrünün sonuna qədər tərk etməmişdi.

Yadımdadır, Mehdi müəllim 70-ci illərin sonunda nazir kimi işinin aşıb-daşdığı vaxtlarda, “Azərbaycan məktəbi” jurnalı redaksiyasının fəaliyyətində böyük canıyananlıqla iştirak edirdi. Redaksiya heyətinin üzvü kimi, iclaslara vaxtlı-vaxtında gələr, dərc olunmuş məqalələr haqqında öz mülahizələrini bildirər, qabaqcıl pedaqoji təcrübənin işıqlandırılmasına fikir verər, jurnalın işini yaxşılaşdırmaq üçün faydalı tövsiyələr irəli sürərdi. Jurnalın baş redaktoru – filologiya elmləri namizədi Zəhra Əliyeva Mehdi müəllimin jurnala doğma münasibətini onun xalq maarifinə qayğısının bir təzahürü kimi yüksək qiymətləndirirdi. O, məktəb və elmi problemlərindən, insani münasibət və keyfiyyətlərdən söz düşəndə həmişə ehtiramla Mehdi müəllimdən misallar gətirərdi. Mehdi müəllim hər sahədə – insan kimi, müəllim və alim kimi, ailə başçısı və nazir kimi əsl nümunə idi.

Akademik M.Mehdizadənin əsas fərqləndirici xüsusiyyəti onun respublikamızda elmi-pedaqoji kadrların inkişafına heç bir təmənna gözləmədən qayğı ilə yanaşması olmuşdur. 60-70-ci illərdə onun bilavasitə

rəhbərliyi altında bir çox məktəb rəhbərləri, müəllimlər aktual pedaqoji mövzularda tədqiqat işi aparmış, namizədlik dissertasiyaları müdafiə etmişlər. Akademik M.Mehdizadənin qayğısı sayəsində Məhər Quliyev, Zahid Şöyübov, Süleyman Zeynalov, İsrail Həsənov, Yaqub Bünyadov və onlarca digər qabaqcıl müəllimlər nəzəri və praktik cəhətdən yetkinləşmiş, respublikamızda və onun sərhənlərindən kənarda tanınmışlar.

Mehdi müəllimin gənc elmi kadrlara hədsiz və təmənnasız qayğısını mən də öz üzərimdə hiss etmişəm. 1968-ci ildə mən APİ-də görkəmli alim, respublikamızda pedaqogika elminin yaradıcılarından biri olan professor Mərdan Muradxanovun elmi rəhbərliyi ilə azkomplektli ibtidai məktəblərdə təlim prosesinin təkmilləşdirilməsi problemi üzrə namizədlik dissertasiyasını yazıb başa çatdırmışdım. İnstitutun elmi şurasında rəsmi opponentlər təyin edilməli idi. Mərdan müəllim Maarif Naziri akademik M.Mehdizadəyə zəng vurub, onun birinci rəsmi opponentliyə razı olub-olmaması məsələsindən danışdı. Mehdi müəllim dissertasiya və avtoreferatla tanış olandan sonra rəyini bildirəcəyini söylədi. Mən dissertasiya işini aparıb nazirin köməkçisinə təqdim etdim. Özlüyümdə fikirləşdim ki, nazirin – akademikin vaxtı haradadır ki, heç tanımadığı, yuxarı vəzifələrdə adamı olmayan (o vaxtlar bu yüksək qiymətləndirilirdi) adi bir dissertantın əsərin oxusun və rəy yazsın. Lakin tezliklə mən Mehdi müəllim haqqında təsəvvürümün yanlışlığına inandım. Bir neçə gündən sonra M.Mehdizadə M.Muradxanova zəng vurub, dissertasiyanın rəsmi opponentliyinə razılığını bildirdi. Müzakirəyə bir həftə qalmış akademik M.Mehdizadənin imzası ilə APİ-nin elmi katibinə geniş rəy daxil oldu. Mən



rəylə tanış oldum, bir qədər də təəccübləndim. Axı, az vaxtda geniş həcmli dissertasiya işi ilə belə dərindən və dəqiqliklə tanış olmaq, onu nəzəri və praktik cəhətdən geniş təhlil edib qiymətləndirmək, elmi cəhətdən əsaslandırılmış konkret iradlar, tövsiyələr irəli sürmək çox çətindir. Bu akademik M.Mehdizadənin pedaqoji problemləri, məktəb quruculuğunu dərindən bilməsinə, hətta xırda görünən məsələlərə nüfuz etmək bacarığına, ciddi təhlil, ümumləşdirmə və elmi qiymətləndirmə səriştəsinə dəlalət edirdi.

Dissertasiya müdafiəsindən bir qədər sonra məni nazirliyin tədris-metodika idarəsinə dəvət etdilər. O vaxt idarə rəisi işləyən mərhum İmran Məmmədov mənə bildirdi ki, nazir azkomplektli ibtidai sinif müəllimləri üçün metodik tövsiyə yazıb hazırlamağı və bu işi Sizə tapşırmağı məsləhət görüb. Elə həmin il (1968) mənim “İkikomplektli məktəbdə təlim işlərinin planlaşdırılması” adlı metodik tövsiyəm çap olundu. Bununla mən Mehdi müəllimin məktəbə qayğısının nə dərəcədə ardıcıl və əməli xarakter daşımasının, elmi kadrların inkişafına, onlara əsərlər sifariş verilməsinə nə qədər xeyirxah niyyətlə yanaşmasının bir daha şahidi oldum.

Elmə, elmi kadrlara, kitab nəşrinə akademik M.Mehdizadənin belə təmənnasız münasibətini qiymətləndirməkdə çətinlik çəkirəm. Vaxtilə və indinin özündə də bəzi “alimlərin”, vəzifə sahiblərinin min bir oyundan çıxaraq, rüşvət və təmənna ilə özləri kimi “alimlər” nəsli yetişdirmələri, şərikli kitablar nəşr etdirmələri halları ilə müqayisə etdikdə Mehdi müəllimin nə dərəcədə təmiz, mənəvi cəhətdən pak bir şəxsiyyət, düzlük və saflıq nümunəsi olduğunu aydın görmək olar.

O, bir nazir kimi şəxsi mənafeyi üçün deyil, Azərbaycan maarifinin mənafeyi üçün yaşayırdı.

M.Mehdizadə böyük və saf olduğu kimi, həm də sadə və təvazökar idi. Sadəlik onun geyimindən tutmuş, mənzil-məişət şəraitinə qədər bütün sahələrdə həmişə özünü göstərmişdir. Mehdi müəllimin başqa nazirlər kimi, firavan həyat sürməyə, dəbdəbəli yaşayış evi, bağ imarəti tikdirməyə imkanı var idi. Lakin o, sadə yaşamağı, halallığı, təmizliyi bunlardan üstün tutmuşdur.

Mən sonralar akademik M.Mehdizadə ilə müxtəlif elmi konfranslarda, iclas və müzakirələrdə, habelə qeyri-rəsmi şəraitdə təmasda olmuşam. O, bir cəhətdən də həmişə diqqətimi xüsusi cəlb edib. Böyük və məsul dövlət vəzifələri, akademik səviyyəsinə qədər artan elmi titullar Mehdi müəllimin xarakterini, daxili mədəniyyətini dəyişə bilməmişdi. O, elə əvvəllərdə olduğu tək sadə, təvazökar, son dərəcə səmimi, xeyirxah bir insan, sözün əsl mənasında ziyalı, alicənab şəxsiyyət kimi qalmışdı. O vaxtlar dəbdə olan "Mehdi Mamedoviç" müraciətinə etiraz edib deyirdi: "Məni sadəcə Mehdi müəllim kimi çağırın". Mehdi müəllim bütün vəziyyətlərdə, hətta əsəbi şəraitdə belə təmkinini pozmamış, adamlara mədəni, səmimi münasibət bəsləmişdir. Mən onun bir dəfə də olsun səs tonunu qaldırdığını, kobudluq etdiyini, kiminsə qəlbinə toxunduğunu görməmişəm.

Mehdi müəllim sağ olsaydı, biz indi ondan daha çox məsləhət alardıq. Lakin həyatın da, zamanın da öz müəmmaları, öz hökmü var. Doğru deyirlər ki, yaxşı adamlar həyatdan tez köçürlər. Zaman keçdikcə biz Mehdi müəllimin böyüklüyünü, qiymətini daha aydın dərk edirik. O, Azərbaycan maarifinin dan ulduzu kimi həmişə



yolumuzu işıqlandırmış və bundan sonra da işıqlandıracaq. Ruhu şad olsun böyük müəllimimizin!..

## MAARİFİMİZİN AĞSAQQALI

***TOMAS İSMAYILOV,***
*filologiya üzrə fəlsəfə doktoru, dosent*

Görkəmli şəxsiyyətlər haqqında xatirə yazmaq nə qədər şərəflidirsə, bir o qədər də çətin və məsuliyyətlidir. Şərəflidir ona görə ki, onun keçdiyi ləyaqətli və ibrətamiz həyat yolu haqqında gənc nəslə yeni bir şey deyir, parlaq həyat yolunun təqdirə və təqlidə layiq cəhətləri haqqında məlumat verir və bu keyfiyyətlərin bərqərar olması üçün nəsə bir iş görürsən. Çətin və məsuliyyətlidir ona görə ki, belə əzəmətli və çoxcəhətli şəxsiyyətə layiq olan söz tapmaq, fikir söyləmək üçün ciddi axtarışlar aparmalı olur, dərin məsuliyyət hissi keçirir, necə deyərlər, ceyran dağına çıxmalı olursan. Mehdi müəllim də maarifimizin zirvəsində əbədi şöhrət çələngi qurmuş belə şəxsiyyətlərdən biri, bəlkə də birincisidir.

Uzun illər xalq maarifi sahəsində çalışdığımdan (orta məktəbdə müəllim, məktəb direktoru, məktəb inspektoru, maarif şöbəsinin müdiri) Mehdi müəllimlə bilavasitə və dolayısı ilə təmasda olmuş, mükalimələr keçirmiş, nitqlərini dinləmiş, nazir olduğu dövrlərdə kollegiya iclasları, müşavirə və qurultayların iştirakçısı olmuş, məruzələrinə qulaq asmış, problemlərə həssaslıqla yanaşmaq, mahiyyətli fikir söyləmək, orijinal-

mühakimələr yürütmək bacarıqlarının canlı şahidi olmuşam. Onun şəxsi məziyyətlərini, bəs deyincə, qəlbimə hopdurmuş, varlığıma aşılamışam, çox vaxt da bu heyrətamiz ədalar və rəftar çalarlarına heyran olmuş, qibtə etmişəm. Mehdi müəllim elə bir canlı varlıq təcəssümü idi ki, bu insanın daxili aləmi ilə hamının müşahidə etdiyi xarici təzahür formaları arasında azacıq da olsun fərq görünmür, əksinə, bu iki aləm arasındakı ahəngdarlıq, bir-birini tamamlamaq meyli, bütövlük, hər dəfə möhtəşəm insan varlığını xatırladırdı. Onun təmiz, səliqəli, göz oxşayan geyimindən tutmuş, qara meşin qovluğunu sol əli ilə böyrünə sıxaraq şahanə görkəmlə ahəstə atdığı addımlara qədər, insanla danışarkən üzündə heç bir cizgi dəyişikliyi etmədən müsahibinin varlığına dərindən nüfuz edən qayğıkeş baxışlarından tutmuş, yığcam, mənalı, əsl hədəfə vuran, dəqiq mizan-tərəzini andıran aydın və səlis sözlərinə qədər, susarkən belə müdriklik təcəssümünə çevrilən hər bir şeyə qibtə ilə baxır, təəccüblə dolu heyranlıq bolluğuna düşürdün.

Mehdi müəllimi, hər cəhətdən, bütün ömrüm boyu təqlidəlayiq şəxsiyyət kimi mənəviyyat tacı hesab etməyimə baxmayaraq ona, ürək sızıltıları ilə acıdığım vaxtlar da olub. O vaxtlar ki, partokratiya tüğyan edir, ağına-bozuna baxmadan insanların şəxsiyyəti təhqir edilir, alçaldılırdı. Belə səhnələrlə tez-tez mərkəzi komitədə, nazirlər sovetində rastlaşmaq olurdu. Buralarda maariflə bağlı məsələlərin müzakirə olunduğu məclislərdə dəfələrlə şahidi olmuşam ki, Mehdi müəllimlə istehzalı danışılır, amiranəlik edilir, təhqiramiz iradlar tutulur, onu təkrar ayağa qaldırır, uzun müddət ayaq üstə saxlayır, abrından, həyasından qıpqırmızı olan bu böyük insana oturun



deməyi də "yaddan" çıxarırdılar. İlahi, o zamanlar necə dəhşətli anlar keçirir, qəlb sıxıntılarına məruz qalır, rəhbər işçilərin belə hoqqabaz ədalarına dərindən-dərinə nifrət edirdim. O, kreslo fəttahları və vəzifə düşgünləri, özlərini, hər şeyi bilirmiş kimi göstərməyə çalışan o yazıqlar, haradan biləydilər ki, istehza və eyhamla danışdıqları bu sadə və təvazökar insanın qəlbində xalqın mənəvi saflığı, onun maarifinin boy atıb çiçəklənməsi naminə gecəli-gündüzlü qayğı göstərən bağban ruhu yaşayır, sönmək bilməyən əbədi Ələddin çırağı yanır...

Mehdi müəllimin kollegiya iclaslarının hər biri, mübaliğəsiz demək olar ki, yüksək ustalıqla aparılan əsl tərbiyə məktəbi idi. O, səs tonunu qətiyyən dəyişməzdi, həmişə eyni templə danışardı. Eynəyinin altından zillənən aydın baxışları ilə dərhal bütün salonu cazibə əhatəsində saxlardı. Hamının diqqəti, istər-istəməz, müzakirə olunan problem üzərində cəmləşər, bütün proses özünün lakonikliyi ilə seçilərdi. Xatırlayıram ki, 1971-ci il idi. Kollegiya iclaslarının birində Astara Rayon Xalq Maarif Şöbəsinin hesabatı dinlənilirdi. O zaman Xalq Maarif Şöbəsinin müdiri, nazirliyin axşam məktəbləri şöbəsinin inspektoru işləyən rəhmətlik Cəlal Məmmədovun qardaşı idi. Mərhum Cəlal həm də nazirlikdə yerli komitənin sədri işləyirdi. Belə güman etmək olardı ki, yüksək nüfuza malik olan qardaşına görə maarif müdirinə münasibət yumşaq olacaq, müzakirə də dərindən keçməyəcəkdi. Amma heç də belə olmadı. Müdirin məruzə xarakterli çıxışından sonra qızğın müzakirələr başlandı. Rəhmətlik Cəlalın özü də çıxış edib rayondakı qüsurlardan, xüsusilə Həmkarlar İttifaqı Rayon Komitəsinin fəaliyyətindən bəhs etdi, axşam məktəblərindəki yarıtmaz vəziyyətdən danışdı.

Mehdi müəllim hamını axıra qədər diqqətlə dinləyir, heç kəsin sözünü kəsmir, ürəklərin boşalmasına şərait yaradırdı. Arabir də əlindəki karandaşla qarşısındakı bloknotda qeydlər edir, başını qaldırıb salona baxırdı. Axırda özü çıxış etdi. Deyilən nöqsanları və qeyd olunan məziyyətləri qruplaşdırdı. Şöbənin fəaliyyətini səciyyələndirən ən mühüm məsələləri ön plana çəkib hamının diqqətini onlara cəlb etdi, qarşıda duran vəzifələri müəyyənləşdirirdi. Axırda dedi:

– Bir zamanlar Astara rayonundan respublikanın, SSRİ-nin bütün rəhbər orqanlarına, hətta dünyanın bir sıra təşkilatlarına teleqramlar vurulur, məktublar göndərilirdi ki, Astarada yarım əsrdən çoxdur ki, sovet hakimiyyəti qurulub, amma bir dənə uşaq kombinatı (bağça–körpələr evi) yoxdur. Arazın o tayından durbini gözlərinə qoyub bu taya baxır, təəcüb və rişxəndlə deyirlər ki, bu da sovet hökuməti, bir dənə də bağçaları da yoxdur, hərə öz körpəsini dalına şəlləyib iş dalınca gedir. Biz də Nazirlər Soveti ilə danışdıq, sağ olsunlar, vəsait ayırdılar, material buraxdılar. Astaranın səfalı bir yerində ikimərtəbəli, yaraşıqlı uşaq kombinatı tikdik. İçini də hər cür avadanlıqlarla təchiz etdik, hətta bulaq suyu da çəkdirdik, idman qurğuları da yaratdıq. Lakin həmin bina artıq iki ildir ki, bomboşdur, istifadəsiz qalmışdır. Qapısından asılmış qıfıl pas atıb. Görəsən, indi həmin o adamlar Arazın o tayından durbini yenə gözlərinə qoyub bu taya baxaraq demirlərmi ki, bu gözəl bina nə üçün ağzıbağlı, boş qalıb?...

Hamı gülüşdü, salondan çalım-çarpaz uğultular keçdi. Lakin Mehdi müəllimin üstündə azacıq da olsun, dəyişiklik əmələ gəlmədi. Elə bil ki, bu sözləri o deyil,



başqası demişdi. Nəzərlərini camaatın üzündə gəzdirir, reaksiyasını müşahidə edirdi. Az sonra hamı sakitləşdi, dərin sükut yarandı. Bu çalım-çarpaz uğultudan, ya sonrakı sükutdan razı idimi, narazı idimi, bunları müəyyənləşdirmək çətin idi...

Kollegiyada bu qəbildən olan nüanslar tez-tez baş verirdi. Mehdi müəllim ağır qəbahət işlətmiş işçini belə başa salmağa, tərbiyələndirməyə çalışır, ona öz imkanlarını səfərbər etməsi üçün qüvvəsinə inam yaratmağa səy edir, ağsaqqal tövsiyələrini əsirgəmirdi. Lazım gəldikdə isə öz işçilərini qoruyur, ən yüksək dairələrdə müdafiə edirdi...

Lenin (indiki Sabunçu) rayonunda işlədiyim vaxta qayıdıram. Yeni təyin olunduğum aylar idi. Hiss edirdim ki, rayon partiya komitəsində mənə soyuq münasibət var. Yəqin ki, mənim 26-lar (indiki Səbail) rayonundan gəlməyim burada bəzilərinin ürəyincə deyildi. O zaman mərhum Vəli Məmmədov Bakı şəhər partiya komitəsində katib işləyirdi. Vəzifəyə təyin olunma qabağı məni qəbul edərkən dedi ki, Lenin rayonunda maarif müdiri uzun müddət qala bilmir. Hərə bir il, uzaq başı ilyarım işlədikdən sonra çıxarılmalı olur. Son doqquz ildə orada altı müdir dəyişib. Halbuki bizim başqa rayonlarımızda müdirlər on beş – iyirmi illərlə işləyirlər. Biz sizin namizədliyinizə tərəfdarıq, amma bir tapşırığım olacaq. Orada maarif müdirinin uzun müddət işləyə bilməməsinin səbəbini araşdırmağa çalışın. Lazım bildiyiniz vaxtda bizə yazılı məlumat verin. O biri müdirləri deyə bilmərəm, özümə olan münasibət ona görə yaxşı olmadı ki, mən yerli kadr deyildim. Ona görə də elə vəziyyətdə qalmalı idim ki, yerli hakimiyyət orqanları öz təşəbbüsləri ilə

qoyduqları kadrların bacarıqsızlığına haqq qazandıra bilsinlər. Yəni, deyə bilsinlər ki, buyurun, bu da sizin göndərdiyiniz kadr, o da bacarmadı. Şakir Kərimov birinci katib kimi rayona məndən bir neçə ay sonra gəldi. O zaman rayonun ideoloji məsələlərinə Nikolskaya Qalina Andreyevna adlı bir qadın rəhbərlik edirdi. Hansı bir təşəbbüslə yanına gəlirdimsə, ağzımdan vurub geri qaytarırdı. İndi məktəb direktorları işləyən İbrahim Səmədov, Səfərəli Səfərəliyev və adlarını unutduğum bir neçə bacarıqlı, milli ruhlu gənclərin şəxsi işləri yaxına buraxılmır, təkidimə baxmayaraq, onları rəhbər işə yaxın qoymurdular. Necə deyərlər, hərəsinə bir mız qoyurdular. Kadr məsələsində, maliyyə məsələlərində, bəzi strukturların dəyişdirilməsində, nə bilim, daha nələrdə, gündəlik işlər o qədər idi ki, bu qadınla razılığa gəlmək mümkün olmurdu. Axırda məcbur olub Mehdi müəllimin yanına getdim. Bütün vəziyyəti təfərrüatı ilə ona danışdım. Diqqətlə dinlədi. Axırda, düz gözlərimin içinə baxıb, – bu partiya işçiləri belədir, gərək onlarla ehtiyatlı olasan, – dedi. Mən belə güman etdim ki, daha görüş başa çatdı, getmək məqamıdır. Ürəyimdə öz-özümü danladım ki, kişini nahaq yerə narahat etdim, qanını qaraltdım. Qalxmağa hazırlaşırdım ki, Mehdi müəllim əlini hökumət telefonuna uzatdı. Mən bu telefonun hökumət telefonu olduğunu ondan bildim ki, cəmi üç nömrə yığdı və Bakı şəhər partiya komitəsinin birinci katibi Abdulla Qədirovla danışdı. Qətiyyətlə bildirdi ki, partiya işçiləri maarifin işinə mane olurlar, kadrlara işləməyə imkan vermirlər, qəyyumçuluq ifrata varıb... Katibin nə dediklərini bilmirdim. Yalnız bunları Mehdi müəllimin üzündən, səs tonundan oxumağa çalışırdım. Bu da çətin məsələ idi.



Mehdi müəllim bərk qızarmışdı. Dəstəyi yerinə qoyub, o qədər də inamlı olmayan səslə, – gedin, hələlik işləyin, – dedi, görək nə olur, söz verdi ki, rayon rəhbərləri ilə də danışacaq...

Mehdi müəllimlə son görüşümüz təsadüfən baş verdi. Bilgəh kəndinin qurtaracağında, dənizə tərəf alçaq damlı bir təsərrüfat malları mağazası vardı. Biz oradan aşsüzən alıb çıxırdıq. Mağazanın qarşısında QAZ-24 markalı ağ rəngli bir maşın dayandı. Qabaqda oturan Mehdi müəllim idi, mən onu uzaqdan tanıdım, arxada isə iki qadın vardı. Mən maşına yaxınlaşdım, əlimi dəstəyə uzatmaq istəyirdim ki, özü qapını açıb düşdü və gülümsəyərək əl uzatdı. O, güləndə üzündə batıqlar əmələ gəlirdi. Eşitmişdim ki, bir neçə aydır təqaüddədir, bağ evində qalır, şəhərə az-az gedir. Ona bu maşını da hörmət naminə vermişdilər. Mehdi müəllimin çox illər keçməsinə baxmayaraq, məni öz adımla çağırmasına təəccüb etdim. Amma yaxşı hafizəsi olduğunu da bilirdim. Söhbət əsnasında məktəb direktoru olduğumu, maarif əlaçısı nişanını aldığımı xatırladı. Maarifin vəziyyətindən çox ciddiyyətlə danışdı. Ürək ağrısı ilə dedi ki, təhsilə maraq çox zəifləyib, bilik meyar olmaq etibarilə itmək üzrədir, gənc nəslin vəziyyəti ağırlaşır, rüşvət milləti məhv edir... Vəziyyəti ilə maraqlandım, bir şeyə ehtiyacı olub-olmadığını soruşdum. Sağ olun, – dedi, heç nəyə ehtiyacım yoxdur. Çox vaxt bağla, bağçayla məşğul oluram, amma bir az duruxdu, azacıq fasilə verdi, – bilirsən, – dedi, günlər yaman ləng keçir, adam işləyəndə bunu hiss etmir. Mehdi müəllim şuxluğunu saxlamışdı. Onu təqaüdə göndərməkdə tələsmişdilər, hələ maarif işinə çox fayda verə bilərdi. Qadınlar maşına tərəf gəldikdə,

Mehdi müəllim əlini çiynimə qoyub bizi (mən də ailəm ilə idim) bağına dəvət etdi, həm də təkidlə, gedəyin, – dedi, istirahət edin, axşamüstü qayıdarsınız. Lakin körpə uşaq olduğundan şəhərə qayıtmalı idik. Ayrılarkən söz verdik ki, mütləq bağ evinizə qonaq gələcəyik...

Mehdi müəllimin maşını səmtini çevirib ensiz, işıldaq asfaltla dənizə doğru şütüdü. Biz isə şəhərə qayıtdıq. Bu mənim Mehdi müəllimlə, maarifimizin ağsaqqalı ilə son görüşüm oldu. Az sonra eşitdim ki, o dünyasını dəyişmişdir... Qəbri nurla dolsun!

Allah ona qəni-qəni rəhmət eləsin!





# RUHUN ŞAD OLSUN BÖYÜK USTADIMIZ!...

**MƏMMƏD MİRZƏLİYEV,**
*müharibə və əmək vetranı*

Ulu tanrının xalqımıza bəxş etdiyi elə insanlar var ki, onlar sağlığında və dünyasını dəyişəndən sonra da yaddan çıxmır, tez-tez xatırlanır. Onların nümunəsi böyük bir həyat məktəbi kimi mühüm əhəmiyyət kəsb edir. Belə insanlar böyük yaradanın xalqımıza bəxş etdiyi qənimət insanlar kimi qəlblərdə şərəfə-şöhrətə layiq yer tuturlar.

Unudulmaz Mehdi müəllim də müxtəlif nəsildən olan insanların və xüsusilə onu tanıyanların, hazırda bizimlə birgə ömür yaşayan insanların qəlbində özünə möhkəm yer tutan böyük şəxsiyyətlərdəndir.

İnsanlığı-insanlıq aləmini zinətləndirən «elə yaşa ki, öləndən sonra ölmə» sözlərini xatırlayanda da gözlərimiz qarşısında Mehdi müəllimin surəti, nəsillərə nümunə olan həyatı canlanır. Elə gün, elə həftə, ay olmaz ki, elmdən, təhsildən söhbət düşəndə Mehdi müəllimi xatırlamayım. Yeri gəldikcə onun xalq ruhu ilə aşılanan gözəl əməllərini, xalqa, maarifimizə xidmət etmək nümunəsini konkret fakt və hadisələrlə yada salır, ruhuna rəhmət, ruhu şad olsun,- deyirəm.

Xətrini çox istədiyim, böyük qardaşım saydığım Mehdi Mehdizadə ilə ilk dəfə 1948-ci ildə tanış olmuşam. O zaman 45 yaşı olmasına baxmayaraq hər cəhətdən müdrikliyə layiq böyük bir insan, şəxsiyyət kimi tanınırdı. Respublikamızda müəllim kadrlarının hazırlanmasında çox böyük mövqeyi olan Azərbaycan

Dövlət Pedaqoji İnstitutunda çalışırdı. Kafedra müdiri, dekan, elmi işlər üzrə direktor müavini, direktoru vəzifələrində yüksək peşəkarlıq nümunəsi göstərən Mehdi müəllim çox böyük nüfuz sahibi idi. 1951-ji ildə Bakı Şəhər Soveti İcrayyə Komitəsi sədrinin müavini vəzifəsinə, habelə Dəstəfur seçgi dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdi. Elə həmin ərəfədə 1952-ci ilin martında Azərbaycan SSR Maarif Naziri vəzifəsinə təyin olundu. Əlbəttə, o dövrdə belə bir vəzifəyə təyinat həmkarları tərəfindən yüksək qiymətləndirilirdi. Maraqlı cəhət bu idi ki, o dövrdə baş nazir - Respublika Nazirlər Sovetinin sədri Teymur Quliyev də Qarabağın dilbər guşələrindən sayılan Cəbrayıl elinin yetirməsi idi. Onun ağır-ağayana təbiəti, təşkilatçılıq, dövlətçilik təcrübəsi Azərbaycan KP MK-nin birinci katibi Mircəfər Bağırov kimi mürəkkəb xarakterə malik bir insanla yola getməyə, müharibədən sonrakı quruculuq işlərində maksimum fəallıq göstərməyə zəmin yaradırdı. O dövrdə maarif, mədəniyyət nazirliklərinin işinə xüsusi diqqət yetirilirdi. Nazirliklərin aparatına işgüzar kadrlar cəlb edilirdi. Tale elə gətirdi ki, həmin dövrdə mən də Azərbaycan Respublikası Mədəniyyət Nazirliyində məsul bir işə dəvət olundum. Bir qədərdən sonra isə Azərbaycan SSR Nazirlər Sovetində çalışmağımı lazım bildilər. Bu iş də həm maraqlı, həm də məsuliyyətli idi. Respublikanın ayrı-ayrı nazirlikləri, o cümlədən Maarif Nazirliyi ilə sıx əlaqə şəraitində fəaliyyət göstərirdik. Nazir M.Mehdizadə ilə yaxından tanışlığım da həmin illərə təsadüf etdi. Hər dəfə görüşəndə onun geniş, əhatəli biliyinə, dünyagörüşünə heyran qalırdım. O mühüm



dövləti əhəmiyyət kəsb edən hər hansı tədbirlə bağlı fikrini deməyə tələsmirdi. Müvafiq mütəxəssislərin fikrini, rəyini öyrənirdi, onlarla hesablaşırdı. Özlüyündə müvafiq təhlil, müqayisələr aparırdı, bundan sonra sözünü deyirdi. Hökumətin yuxarı dairələrində onun bu xüsusiyyətlərini bəyənir, təqdir edirdilər, onunla hesablaşırdılar. Açığını deyim ki, Mehdi müəllimin idarəçilik səriştəsi, tabeliyində olan işçilərə son dərəcə qayğılı, həm də tələbkar münasibəti məni də ruhlandırırdı. Verilən tapşırıqlara məsuliyyətli münasibətim, tapşırılan işi vaxtında və lazımi tələblər səviyyəsində yerinə yetirməyim Mehdi müəllimin nəzərindən yayınmırdı. Buna görə də o 1960-cı ildə respublikada ikinci dəfə maarif naziri vəzifəsinə təyin olunandan sonra da işgüzar səmimi münasibətimiz davam etdi. Onun tövsiyəsi ilə nazirlikdə aparıcı mütəxəssis kimi fəaliyyət göstərir, partıya və həmkarlar təşkilatının işində yaxından iştirak edirdim.

Mehdi müəllim çox sadə və qayğıkeş insan idi. O aparat işçilərinin hər birinə xüsusi qayğı göstərirdi, onları öz dilində danışdırırdı. Bu və ya digər məsələlərin müzakirəsində, həllində, xüsusilə kollegiya iclaslarında həmişə diqqətli idi. Hər kiçik qüsurdan ötrü kadrların ləkələnməsinə yol verməzdi. Akademik nazirin iş üslubu nəinki respublikamızda, hətta keçmiş SSRİ məkanında bəyənilir, təqdir olunurdu. O çox böyük hörmət-izzət sahibi idi. 12 fevral 1980-ci ildə xalq maarifi sahəsində uzun illər səmərəli işlədiyinə görə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edildi. 24 fevral 1980-cı ildə isə təqaüdə çıxması ilə əlaqədar Azərbaycan SSR Maarif Naziri vəzifəsindən azad ediləndən sonra da ona çox böyük hörmət, diqqət və

qayğı göstərilirdi. Əlbəttə, bu faktın özü də onun Vətənə, xalqa sədaqətli xidmət etdiyini parlaq şəkildə nəzərə çatdırırdı. Xalqımız, müxtəlif nəsildən olan insanlar Mehdi müəllimə nazir vəzifəsini tərk edib Azərbaycan Elmi Tədqiqat Pedaqoji Elmlər İnstitutunda elmi məsləhətçi kimi çalışanda da çox böyük hörmət və ehtiram bəsləyirdilər. 1 may 1984-cü ildə dünyasını dəyişəndən sonra ölməz surəti, böyük bacarığı ilə yaddaşlarda xatirələrdə özünəlayiq yer tutdu. Akademik nazir Mehdi Mehdizadə ilə 25 ilə yaxın bir müddət ərzində keçdiyim ömür yollarını xatırladıqca qəlbimin diktəsi ilə dilimdən bu sözlər qopur: Ruhun şad olsun, həmişəyaşar Mehdi müəllim!





# ƏVƏZİ OLMAYAN NAZİR, PEDAQOQ İDİ

***TƏDBİR MAHMUDOV,***
*Azərbaycan Respublikasının Təhsil Əlaçısı*

Uzun illər xalq təhsili sahəsində çalışan Zəhra xanım Əliyeva akademik M.Mehdizadə haqqında bir xatirə yazmağı məsləhət görəndə, düzü bir az tutuldum. Axı mən Mehdi müəllim haqqında nə yaza bilərəm? Xatirəni yaxın dost, uzun illər bir-birini yaxından tanıyan, bir yerdə oturub-duran, ağır dəqiqələrdə bir-birinə sığınıb dərdləşənlər yaza bilərlər. Bununla belə, yaddaşımın gücünə arxalanıb Xalq Təhsili Şöbəsinin müdiri işlədiyim 4 il (Mehdi müəllimin nazir olduğu vaxtda) müddətində müşahidələrimi, ən xarakterik məsələləri yadıma salmağa çalışacağam.

Onunla ilk görüşüm 12 noyabr 1977-ci ildə oldu. Neftçala rayon Xalq Maarif Şöbəsinə müdir vəzifəsinə təsdiq olunmalı idim. Nazirliyin kadrlar idarəsinin rəisi Nəcəf Nəcəfov şəxsi işimi hazırladı, həyəcanlı olduğumu görüb dedi:

– Təbdir müəllim, narahat olma, Mehdi müəllim çox nəcib adamdır, indi özün görəcəksən. Onun qəbulunda çox gözləmədik. Məni Nəcəf müəllimlə birlikdə qəbul etdi. Ayaq üstə qalxıb əl verib görüşdü və yer göstərdi. Sual-cavabı rayonda xalq təhsilinin vəziyyətindən oldu, onsuz da özü hər şeyi bilirdi. Bankə qəsəbə 1 saylı məktəbi soruşdu, keyfiyyətsiz tikilməsini bildirdi və dedi:

– Məktəbə köçmək lazımdır, yoxsa bərbad hala düşər.

Sonra kadrlara qayğı ilə yanaşmağı, tez-tez kadr dəyişikliyinə yol verməməyi və bir sıra dəyərli məsləhətlər verib, uğur arzuladı. İlk tanışlığım belə başladı. Daha sonralar onu müşavirələrdə, kollegiya iclaslarında, hesabatların qəbulu prosesində və s. tədbirlərdə tez-tez dinləyərdim. Kollegiyada konkret danışardı, artıq söz işlətməzdi.

Mən onunla nazir oğduğu vaxt çox az işlədim, cəmi 4 il. Amma bu az vaxtda ondan çox şey öyrəndim, çox şey götürdüm. Vəzifədən çıxandan az sonra, hökumət evinin qarşısında, girəcəkdə bir neçə yoldaşlarla dayanmışdı. Onunla görüşməyə tərəddüd etdim, bunu duyurmuş kimi, özü məni çağırdı, əl verdi, hal-əhval tutdu. İlk sualı maariflə bağlı oldu:

– Neftçala necədir? Müəllimlərin əhval-ruhiyyəsi necədir? Bankə orta məktəbini və başqa tikintiləri soruşdu.

– Tikintiləriniz yaxşıdır, keyfiyyətinə ciddi nəzarət edin, – dedi.

Yaddaşına heyran qaldım.

Sadə, gözəl insan, əvəzsiz müəllim-pedaqoq, özünə və başqalarına qarşı tələbkar, əsil iş adamı idi, Mehdi müəllim.

Vəzifəsinin fövqündə dayanan, böyük nüfuz sahibi, sadə geyimi, təbiətən zahiri mədəniyyəti ilə daxili mədəniyyətini özündə birləşdirən, insanlığa örnək olan bir şəxsiyyət idi, Mehdi müəllim.

Mehdi müəllim 1976-cı il oktyabrın 29-da Neftçalaya gəlmişdi. O vaxt 26 Bakı Komissarı adına qəsəbədəki orta məktəbin direktoru, respublikanın



əməkdar müəllimi Akif Cəfərov vəfat etmişdi. Mehdi müəllim hüzür yerinə getdi və müəllimin ailəsinə baş sağlığı verdi.

Mehdi müəllimin yaddaşımda qalan tövsiyələri:

– Elə iş görün ki, Sizi müdafiə etməyə imkanım olsun. Kadrları tez-tez dəyişməyin, adi məsələlərdən ötrü onların korlanmasına imkan verməyin. Məktəb direktoru ən azı 20-25 il işləməlidir.

– Gündəlik müəllimi sabahkı dərsə hazırlayır. Müəllimi məcbur edir ki, sabahkı dərsə hazırlaşsın, heç olmazsa, ən azı dərsliyi vərəqləyib zəruri məsələləri nəzərdən keçirsin.

Mehdi müəllim əvəzsiz nazir idi, hamı onun haqqında belə deyir. Mehdi müəllimin bir nazir kimi, təşkilatçı alim-pedaqoq kimi, əsl maarif fədaisi kimi yeri, yoxluğu indi daha çox hiss olunur.

Alim, pedaqoq, təşkilatçı, əsl insan... Mehdi Mehdizadə mənim yaddaşımda belə qalıb.

Qədirbilən xalqımız, əbədiyyətə qovuşan bu maarif fədaisini öz qəlbində, duyğularında, yaddaşında həmişə əziz saxlayacaq, onun xatirəsini uca tutacaq.

Mərhum şairimiz Rəsul Rzanın “Vaxt var ikən” şeirindəki bu misralar sanki Mehdi müəllim haqqında deyilib:

... Vaxt var ikən,
Elə yaşa, elə çalış.
Bir gün sən olmayanda,
Hər kəsə aydın görünsün,
Yerində qalan boşluq...

# GÖRKƏMLİ ALİM VƏ PEDAQOQ MEHDİ MEHDİZADƏNİ DÜŞÜNƏRKƏN...

*HÜSEYN HÜSEYNOV,*
*Azərbaycan Respublikasının Əməkdar müəllimi*

Mərhum M.Mehdizadə Cəbrayıl rayonuna gəlmişdi. Mənə də məlumat vermişdilər ki, oradan Füzuliyə gələcək, məktəblərdə olacaq, müəllimlərlə görüşəcək. Təlim-tərbiyə keyfiyyətini yüksəltmək məsələlərinə həsr olunmuş yığıncaq keçirəcək.

Mən bir gün əvvəl Cəbrayıl rayonunun Daşkəsən kəndinin qonşuluğunda olan Horovlu kəndinə getdim. Nazirlə həmin kənddəki məktəbdə görüşdük. Sonra Daşkəsən məktəbində olduq. Nazir hər iki məktəbdə müəllimlərin fəaliyyəti ilə tanış oldu, səmimi, işgüzar söhbətlər apardı, yaxşı məsləhətlər verdi. Sonra Cəbrayılda fəallar yığıncağı keçirdi. Füzuliyə birlikdə gəldik. Sabahısı günü bir neçə məktəbdə oldu və günün axırına yaxın çoxdan tanıdığım və bələd olduğum Mehdi müəllimdə bir sıra yeni yüksək keyfiyyətlərin şahidi oldum.

O, ətrafında toplaşmış kəndlilərlə görüşdü. Əlində yaba olan bir kişi görüşmək üçün əlini nazirə uzatdı, əlinin təmiz olmadığını görüb tez geri çəkildi. Nazir kişinin bu hərəkətini görən kimi onun əlini özü tutdu, iki əli ilə. Dedi ki, bax, bu əllərin zəhmətidir insanları yaşadan. Ehtirama layiqdir bu əllər. Çörək və yavanlıq qazanan bu əllərlə fəxr etmək lazımdır. Nazirin bu hərəkəti böyük rəğbətlə



qarşılandı. Nurani bir kişi irəli çıxıb onu qucaqladı. Çox sağ ol, – dedi, – sən ki, bu ürəyin sahibisən, sən doğrudan əsl xalq adamısan! Böyük adam olmusan, amma bəziləri kimi xalqdan ayrı düşməmisən. Kaş böyüklərimizin hamısı bu qəlbdə olaydı!

Mehdi müəllim son dərəcə gözü, könlü tox adam idi. Onda zərrə qədər tamahkarlıq yox idi. Varlanmaq hərisliyinə qarşı kəskin nifrəti vardı. Mən qəti inanmışdım ki, həyatı boyu o, bir qurtum su qədər haram görməyib.

Pambıq yığımının qızğın dövrü idi. Biz rayon partiya komitəsi binasının qarşısında əmək iqtidarlı əhalini tarlaya yola salırdıq.

Bir nəfər yanaşıb dedi ki, nazirin anası rəhmətə gedib. Bu gün Daşkəsəndə dəfn olunacaq. Biz 6 nəfər toplaşıb yaxşı bir erkək, bir kisə qənd aldıq, iki maşınla yola düşmək istəyirdik ki, nazirin qara "QAZ-24" minik maşını yanımızda dayandı. Sürücü bizimlə görüşdü, məni kənara çəkib dedi: "Məni nazir göndərib ki, Hüseyn müəllim dəfnə gəlsə, heç bir şey gətirməsin, yoxsa geri qaytaracam. Camaat içində onun xətrinə dəyər. Hökmən əliboş gəlsin. Bir də ki, bura müəllim və ya məktəb rəhbərlərinin gəlməsi də məsləhət deyil".

Biz pərt olduq. Əvvəl istədim sözə baxmayıb elə belə də gedək. Sonra fikirləşdim ki, bu kişi ordan bura maşın göndərib. Dediyindən dönən deyil. Qoyunu da, qəndi də qaytardıq geri. İkicə nəfərlə yasa getdik. Orada gördüm ki, bu qadağa hamıya verilib. Heç kəsdən heç nə qəbul olunmur. Camaata rahat yemək verilir.

Mehdi müəllim son dərəcə az yeyən idi. Cəbrayılda, Füzulidə, Ağdamda onunla bir süfrə arxasında oturmuşuq. Cəbrayılda onu qohumu rəhmətlik Əhməd kişi evinə

qonaq apardı. Cəbrayıl rayonunun o vaxtkı Maarif Şöbə müdiri İslam İsmaylov və mən də onunla getmişdik. Çox gözəl süfrə açılmış, hər cürə ləziz yeməklər düzülmüşdü. Mehdi müəllim bir az çörəklə bir-iki qaşıq plov, bir tikə kabab və bir alma yeyib süfrədən əlini çəkdi. İçki də ki, içməzdi. İslam müəllim mənə pıçıldayıb zarafatla gileyləndi ki, bu kişi yemədi və bizim də əlimiz çıxdı bu gözəl yeməklərdən. Füzulidə, Ağdamda onu beləcə az yeyən gördüm.

Mehdi müəllim son dərəcə obyektiv və ədalətli adam idi. Hamını bir gözdə görərdi. Onun üçün qohum da , yad da bir idi, fərq qoymazdı.

Qohumluq, yaxınlq adı ilə ondan istifadə etmək mümkün deyildi və heç kəs də buna cürət etməzdi.

Xidməti iş üçün nazirliyə getmişdim. Səhər saat on olardı. Həmyerlimiz Musa kişi ilə nazirlikdə görüşdük. Soruşdum ki, Musa kişi xeyir ola? Yoxsa kişinin yanından çıxırsan? (Bu adam Mehdi müəllimin qızının qaynatası idi). Dedi yox, dünən axşam gəlmişəm. Gecə onlarda idim. Səhər işə gələndə onunla gəldim bura.

Eşitdim ki, nazirlikdəsən. Gəldim ki, pedməktəbi qurtaran qızımın (Atlasın) təyinatını Füzuliyə düzəldəsən. Onun təyinatını Sabirabada veriblər.

Musaya məsləhət gördüm ki, nazirə desin, mənim üçün çətindir. Musa bildirdi ki, bu sözü ona heç evdə də açıb deyə bilmədik. Xahiş edirəm özün təhər çək. Mehdi müəllimə belə xahiş deyə bilmərəm.

Mən Musa kişini apardım nazirin birinci müavini Rəfiqə Hüseynova yoldaşın yanına. Əhvalatı ona danışdım. Təəccüblə başını buladı, güldü: – Qəribə kişidir, – dedi. Sonra daxili telefonu götürüb kadrlar şöbəsinin



rəisinə tapşırdı ki, A.Şamıyevanın təyinatını Sabirabaddan çıxar, Füzuliyə yaz.

Mən raykom katibi işləyəndə nazir Füzuliyə gəlmişdi. Onun qəbulunda olanların şikayətinə son dərəcə obyektiv baxdı. Yersiz, qanunsuz xahişlər həll olunmadı. Axşam yeməyindən sonra söhbət zamanı dedi ki, yəqin işi düzəlməyən adamlar məni karsız adlandırırlar.

Dedim yox, professor, belə söhbət yoxdur. Gülə-gülə dedi ki, mən özüm bilirəm ki, onlar məni karsız adam hesab edirlər. Xüsusilə, tanış və qohum adamlar. Bilirsiniz, belə hesab edin ki, mən pay paylayıram. Hərəyə bir çömçə verməliyəm. Qohumlar, yaxınlar istəyirlər ki, onlara camaatdan fərqli olaraq üç-dörd çömçə çox verim. Bu isə mümkün deyil, ədalətsizlikdir. Mən onların belə haqsız istəklərinə əməl etmədiyimə görə “karsız” adam hesab edilirəm. Eybi yoxdur, qoy belə hesab etsinlər. lakin mən onların istədiyi vəziyyətdə “karlı” olmaq istəmirəm.

Mehdi müəllim heç kəsi öz kölgəsində saxlamağı, günahları ört-basdır etməyi sevməzdi.

Bilirdim ki, işimdən razıdır və buna görə də mənə xüsusi hörmət edirdi. Amma bilmirdim ki, mənə güzəştə getməz, təklifimi, xahişimi eşitməz.

Kollegiyada bizim rayonun bir məktəbinin məsələsi müzakirə olunurdu. Mən məktəb direktorunu müdafiə mövqeyindən çıxış etdim. Gördüm xoşuna gəlmədi. Direktorun azad olunması təklifi qoyulanda təkrarən nə qədər söz istədimsə, söz vermədi. Mənim mövqeyim konkret şəraitdə düz deyildi. Mən öz payımı götürdüm.

Çağırışla nazirliyin kollegiyasına gəlmişdim. Kollegiyadan sonra iş gününün axırına yaxın bəzi məsələlərin həlli üçün nazirin qəbulunda oldum.

Xahişlərimi dedim. Hər şey müsbət həll olundu. Ona çay gətirdilər. Mənə də çay gətirildi. Ailədə xəstəmiz olduğunu bilirdi. Qayğıkeşliklə onu soruşdu. Vəziyyətimdən hal-əhval tutdu. Nə isə onda xüsusi bir mehribanlıq hiss etdim. Xudahafizləşib çıxdım. Rayona gələndən iki həftə sonra Maliyyə Nazirliyinin Baş Təftiş İdarəsindən bir nəfər yoldaş gəldi və material əsasında təftişə başladı. Material nəzarətdə idi. Təftiş çox ciddi aparılırdı. Təftişlə pis bir şey aşkar edilməmişdi. Ona görə də təftşçi məni sənədlərlə tanış etdi. Mənə aydın oldu ki, Mehdi müəllim məni qəbul etdiyi gündən iki gün əvvəl yuxarı rəhbər təşkilatdan daxil olan və nəzarətə götürülmüş həmin materialın ciddi surətdə yoxlanması, günahkar barədə (yəni mənim barəmdə) cinayət işi qaldırmaq üçün təftiş nəticəsini nazirliyə bildirmək barədə Maliyyə Nazirliyinə xahiş məktubu imzalayıb.

Boynuma alım ki, əvvəlcə qəlbimdə incik oldum ki, yaxşı bəs nazir niyə heç olmazsa, məni xəbərdar etməyib. Amma dərhal düşündüm ki, Mehdi müəllim ayrı-ayrı adamların adamı deyil, o hamının adamıdır. İctimai xadimdir. O, mənə yoxlama barədə xəbə versəydi, onda yəqin ki, hamının tanıdığı Mehdi müəllim olmazdı.

Mehdi müəllim doğma ana dili kimi rus dilini də təmiz bilirdi. Ancaq heç vaxt nitqində rus sözləri işlətmirdi.

Bir dəfə nazirlə danışarkən "Qoradiz" sözü işlətdim. Nazir bunu mənə irad tutdu və soruşdu:

– Hüseyn, sən niyə Horadiz sözü əvəzinə "Qoradiz" deyirsən?

Mən özümü itirdim, xəcalət çəkdim, narahat oldum və ondan üzr istədim.



Zaman keçdikcə görkəmli pedaqoq, akademik Mehdi Mehdizadənin yüksək insani keyfiyyətləri, pedaqoji əsərlərinin dəyəri daha parlaq şəkildə nəzərə çarpacaq, onun xatirəsi daim yad ediləcəkdir.



# DAHİ PEDAQOQ, NƏCİB, XEYİRXAH İNSAN

*BAHADUR MEHDİYEV,*
*Azərbaycan Respublikasının Qabaqcıl Maarif Xadimi, akademik Mehdi Mehdizadə adına mükafat laureatı*

Dahi pedaqoq, böyük və nəcib insan akademik Mehdi Məmməd oğlu Mehdizadə haqqında söz demək çox çətin və şərəflidir. Ancaq mən vaxtilə ondan dərs almış bir tələbə və təcrübəli müəllim kimi bu böyük şəxsiyyətin insanı məftun edən bir sıra ülvi xüsusiyyətləri – xarakteri və mənəviyyatı barədə ürək sözlərimi deməyi özümə borc bilirəm.

Hələ uşaqkən M.Medhizadəni qiyabi surətdə tanıyırdım. Onun haqqında dayım İsi İsmayılov bizə danışar, böyük insani qabiliyyətə malik olmasından tez-tez söhbət açardı. İsi dayım Mehdi müəllimlə birlikdə Cəbrayılda beş sinifli rus-tatar məktəbində oxumuşdular.

Tale elə gətirdi ki, bu böyük insanla daha yaxından tanış oldum, hikmətlə aşılanan söhbətlərini təkrar-təkrar dinlədim.

1949-cu ilin avqustun 8-i idi. Orta məktəbi bitirib, ali məktəbə qəbul olmaq üçün Bakıya oxumağa getmişdim. Həmin dövrdə ali məktəbə qəbul qaydalarında indikinə oxşamayan cəhətlər mövcud idi. Elə oldu ki, sənədlərimi V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutuna verdim. Beş gün ərzində (4-8 avqust arasında) altı fəndən imtahan verdim. Hamısından da əla qiymət aldım. Bu



göstərici o vaxt çox qəribə göründü. Bu həmin institutun direktoru olan professor Əhməd Seyidovun da marağına səbəb olmuşdu. Bir anlıq müsahibədən sonra qəbul komissiyasının məsul katibinə dedi:

– Sən bir Mehdi müəllimi bura çağır. O cəld otaqdan çıxdı. Professor yaranmış imkandan istifadə edərək məndən soruşdu:

– A bala, sən Mehdi müəllimi tanıyırsanmı?

Mən qorxa-qorxa – yox, – dedim. Bir neçə dəqiqədən sonra bəstəboy, qarayanız, çox təmkinlə, astadan danışan bir kişi içəri daxil oldu. Direktor çox mülayimliklə soruşdu:

– Mehdi müəllim, bu cavan oğlanı tanıyırsanmı?

Suala sualla cavab verən Mehdi müəllim isə çox qayğıkeşliklə üzünü mənə tutdu:

– A bala, haralısan?

– Cəbrayılın Qaracallı kəndindənəm, – dedim.

– Oradan bir adam desəm tanıyarsanmı?

– Əlbəttə tanıyaram, – dedim.

– Qaracallıda İsi kişi var, onu tanıyırsanmı?

– Bəli, o mənim doğma dayımdı, – dedim.

Mehdi müəllim üzünü professor Ə.Seyidova tutub dedi:

– Bu uşağın dayısı İsi kişiylə mən Cəbrayılda rus-tatar məktəbində bir yerdə oxumuşam. Əgər təhsilini davam etdirsəydi, heç şübhəsiz, o da professor olardı, – deyərək otaqdan sakitcə çıxdı. Onda mənə aydın oldu ki, dayımın dediyi Mehdi müəllim bu adam imiş.

Mehdi müəllimin sakitcə çıxıb getməsi mənim haqqımda şübhəyə son qoymaqla, ali məktəbə qəbul olmağım üçün müvafiq əmrin verilməsiylə nəticələndi.

Yeri gəlmişkən deyim ki, çox hörmətli professor Əhməd Seyidov Mehdi müəllimi ürəkdən sevir, onunla tam hesablaşırdı.

Tələbəlik illərində Mehdi müəllimi tez-tez görür, öz ehtiramımı bildirirdim. İş elə gətirdi ki, iki ildən sonra M.Mehdizadə ilə bir daha yaxından görüşmək mənə nəsib oldu. Yaxşı xatırlayıram, 1951-ci ilin yazı idi. Tarix fakültəsində həmkarım Sərxan Verdiyev və coğrafiya fakültəsində Budaq Budaqov (indi o Azərbaycan Elmlər Akademiyasının həqiqi üzvüdür) institutu Stalin adına təqaüdlə bitirdilər. Həmin tələbələri əvəz etmək üçün məni və coğrafiya fakültəsindən Mehparə Quliyevanı o vaxt institutun direktoru vəzifəsini icra edən Mehdi müəllimin hüzuruna gətirdilər. Mehdi müəllim məni görən kimi dedi:

– A bala, İsi kişi necədir?

Mən bir an dinmədim. Bir azdan ikinci dəfə soruşdu:

– İsi kişi necədir? – deyirəm.

Ürəyimə damdı ki, bu sözə cavab vermək mənim üçün təqaüdə yox deməkdir. Kövrəldiyimi görən Mehdi müəllim asta-asta ayağa durub mənə yaxınlaşdı. Başımı sığallayaraq dedi:

– Sən incimə, oğul. Fakültədə iki adlı təqaüd var. Birini sənin əmioğlun alır. (Mehdi müəllim həmkəndlim Sərxan Verdiyevi nəzərdə tuturdu.) İndi o ali məktəbi bitirir. Ondan sonra həmin fakültədə adlı təqaüdü sənin almağın bir o qədər də düz deyil. Axı sən də Cəbrayıllısan. Sərxan da sənin əmioğlundur. Eyni zamanda sənin familiyan mənim familiyamdı. Bu da məsələni bir qədər çətinləşdirir.



Nə qədər qəribə olsa da, o, bu sözləri elə nəvazişlə, elə mülayimliklə, əsaslı şəkildə dedi ki, daha mənim danışmağa cəsarətim qalmadı.

Bax belə şəxsiyyət idi Mehdi Mehdizadə. Onun üçün qohum, dost, yerli, qardaş, bacı ifadəsinin zirvəsində bir məslək dururdu. Düzlük, doğruçuluq, ədalət. Onu da qeyd edim ki, mən yeganə əlaçı kommunist tələbə idim fakültədə. Buna baxmayaraq, Mehdi müəllim təqaüdü riyaziyyat fakültəsindən atasını itirmiş Qazaxlı qızı Şəfiqəyə verdi.

Mehdi müəllim böyük xeyirxah, alovlu vətənpərvər idi. Lazım gələndə haqq-ədalət naminə sözdeməyi, onu həyata keçirməyi özünə borc sayırdı.

50-ci illərdə V.İ.Lenin adına APİ-də baş vermiş bir əhvalatı indi də həyəcanla xatırlayıram. O vaxt Azərbaycan gənclərinin fəxri, öz istedadı və qabiliyyəti ilə hamını heyran qoyan, milli müstəqilliyimizin ilk qaranquşu olan Şıxəli Qurbanov (o, APİ-də komsomol komitəsinin katibi idi.) "Molodej Azerbaydjana" qəzetində milli özünü dərk səpgisində bir məqalə ilə çıxış etmişdi. Bu o vaxt çox böyük risq hesab edilirdi, millətçilik sayılırdı. Məsələ böyüdü, institutun açıq partiya iclasında baxmalı oldular. Mən də kommunist tələbə kimi həmin iclasda iştirak edirdim. O vaxt M.M.Mehdizadə Respublika Maarif Naziri vəzifəsinə irəli çəkilmişdi. Ancaq institut partiya uçotundan çıxmadığı üçün heç kəsin gözləmədiyi halda iclas keçirilən böyük zala gəldi və ilk sırada oturdu. İclasın sədri nə qədər təkid etdisə də, onu rəyasət heyətinə çıxara bilmədi. "Natiqlər" bir-birini əvəz etdi. Şıxəli Qurbanov institut Komsomol Komitəsi katibliyindən, İnsitutut Partiya Bürosu üzvlüyündən azad

edildi. Stalin adına təqaüddən məhrum olunması və partiyadan xaric edilməsi məsələləri də qaldırıldı. Sonuncu həlledici sözü Mehdi müəllim dedi:

– Yoldaşlar! Xahiş edirəm bu cavan oğlan haqqında bir qədər xeyirxah olun, onu partiyadan xaric etməyin. (O vaxt bu çox ağır cəza idi.) Mən respublikanın gələcəyini bu oğlanda görürəm, – deyərək çıxıb getdi. Səs verməyə qalmadı. Nə yaxşı ki, iclas Mehdi müəllimin səsini-sözünü eşitdi...

Sonralar Ş.Qurbanov partiya işinə irəli çəkildi. O, Azərbaycan KP Bakı komitəsi Təbliğat və Təşviqat şöbəsinin müdiri, Bakı şəhər Voroşilov adına rayon Partiya Komitəsinin birinci katibi, Azərbaycan KP MK-nın Təbliğat və Təşviqat şöbəsinin müdiri və Azərbaycan KP MK-nın katibi vəzifələrində işləyərkən parlaq istedad, təşkilatçılıq qabiliyyəti nümayiş etdirdi. Azərbaycan xalqının milli mütəqilliyinin ilk nəzəriyyəçisi – praktiki hamımızın sevimlisi oldu Ş.Qurbanov. Məhz Mehdi müəllimin xeyirxahlığı və ədalətli mövqeyi nəticəsində. Sonralar biz bir daha M.Mehdizadənin uzaq görənliyinə, alicənablığına heyran qaldıq...

1953-cü ildə ali məktəbi bitirərkən, təyinatla bağlı Mehdi müəllimlə Maarif Nazirliyində görüşdüm. O, mehribanlıqla ötən anları xatırlatdı:

– Hə, o vaxt deyəsən məndən incimişdin?

– Əsla, – dedim. Mehdi müəllim, heç Sizdən inciməkmi olar? Ancaq nadan adamlar Sizdən inciyə bilər.

– Hə, de görüm indi nə üçün gəlmisən?

– Mehdi müəllim, ali məktəbi fərqlənmə diplomu ilə bitirmişəm. İstəyirəm öz rayonumuza təyinat alım. Ailə vəziyyətim tələb edir bunu.



Mehdi müəllim bir an sükutdan sonra təəssüflə dedi:

– Sizin kimi gənc kadrlara ehtiyacımız çoxdur. Bizə elm də lazımdır, məktəbə müəllim də. Yaxşı, madam ki, kəndə gedirsən, sözüm yoxdur. Sabah gəlib əmrini aparارsan.

Ertəsi gün Respublika Maarif Nazirinin birinci müavini Rəhimlinin yanında oldum. O, mənə doğma rayonumuza – kəndə getməyim haqqında əmri uzatdı Əmrdə yazılmışdı: “Mehdiyev Bahadır Həsən oğlu – ali təhsilli tarix müəllimi, Cəbrayıl rayonu Daşkəsən kənd orta məktəbinə direktor təyin edilsin. Nazir M.Mehdizadə.”

Bir müddət özümə gələ bilmədim. Fikirləşdim ki, gör Mehdi müəllim mənə necə etimad göstərir. İnstitutu yenicə bitirmiş 21 yaşlı bir gənci doğma kəndindəki məktəbə direktor təyin edir.

Mehdi müəllimlə hər görüş əlamətdar olurdu. Respublikada təhsil sistemi ilə bağlı keçirilən mötəbər məclislərdə, elmi-praktik konfranslarda məzmunlu söhbətlərimiz olurdu. Mən Cəbrayılın “kiçik akademiyası” sayılan və indi Akademik Mehdi Mehdizadənin adını daşıyan orta məktəbdə müəllim işləyərkən Mehdi müəllimlə dəfələrlə görüşmüş, onun həmişə təzə, dəyərli fikirlərlə dolu söhbətlərini dinləmiş və onlardan bəhrələnmişəm. O, məktəbə nazir kimi deyil, həmişə öyrətməyə can atan alim-metodist kimi gələrdi. Yaxşı yadımdadır, bir dəfə Mehdi müəllim Respublikanın Əməkdar müəllimi Rəşid Məmmədovun üç saat riyaziyyat dərsini dinlədi, dərslərin yüksək səviyyədə qurulduğunu, elmi metodik əsaslarını göstərdi və tövsiyə etdi ki, Rəşid müəllimin iş təcrübəsini yaysınlar. 70-ci illərdə akademik

M.Mehdizadənin bir nazir, zəngin təcrübəli pedaqoq kimi geniş, çoxcəhətli elmi-pedaqoji fəaliyyəti daha çox diqqəti cəlb edirdi. Həmin dövrdə məktəb pedaqogikasında belə bir problem xüsusi dəqqət mərkəzində idi. Mehdi müəllim müasir dərs, onun problemləri, dərsə verilən müasir tələblər üzrə yaradıcılıq axtarışlarında olan pedaqoqları bir yerə toplayırdı. Bu problem üzrə öz sözü, dəsti-xətti olan 36 nəfər yaradıcı müəllimi öz kabinetinə dəvət etmişdi. O, hamı ilə çox səmimi, böyük ehtiramla, mən deyərdim, yoldaş kimi, əsil müəllimin əlaçı şagirdləri ilə görüşdüyü kimi hal-əhval tutandan sonra dedi:

– Mənim əzizlərim! Bilirsiz sizi niyə çağırmışam? Məqsədimin sizin şəxsinizdə respublikada qabaqcıl təcrübəni ümumiləşdirib yaymaqdan ibarətdir. Odur ki, siz öz təcrübənizdən bəhs edən yazılarınızı mənə təqdim etməlisiniz. Ancaq elə söz deməlisiniz ki, indiyə kimi onu başqası deməmiş olsun.

Biz xoş təəssüratla Mehdi müəllimdən ayrılıb işə başladıq. Bir müddətdən sonra yenidən onun kabinetində yığışdıq. Hamımızı dinləyəndən sonra növbəti elmi-praktiki konfransda çıxış etməyimizi məsləhət gördü. Beləliklə, Mehdi müəllim 36 qabaqcıl müəllimin iş təcrübəsinə hörmət və ehtiramla yanaşaraq, özünün "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı məşhur əsərini yazdı. İş təcrübəmizi də ümumiləşdirərək orada əks etdirdi. O, bu hərəkəti ilə hamımıza, o cümlədən mənə də böyük qiymət vermiş, etimad göstərmişdir. Bunun üçün Mehdi müəllimə ömrüm boyu minnətdaram.

Milli mütəqilliyimizi qazandıqdan sonra Mehdi müəllimə olan ehtiramımı, mənəvi borcumu ödəmək üçün



bitirdiyim və 20 il müəllim işlədiyim Cəbrayıl şəhər orta məktəbinə kollektivlə birlikdə vaxtilə həmin məktəbi bitirmiş Azərbaycanın müəllimlər müəllimi Akademik M.Mehdizadənin adını verdik. Şübhə yoxdur ki, Mehdi müəllimin adı Azərbayan məktəbi – Azərbaycan pedaqogikası, pedaqoji fikir tarixi ilə əbədi səslənəcək. Müasir Azərbaycan müəllimləri Mehdi Mehdizadənin irsindən bəhrələnəcək, elmi-pedaqoji, mənəvi səviyyəsini daima zənginləşdirəcəkdir.



# UNUDULAN DEYİL...

***VİDADİ XƏLİLOV,***
*Pedaqogika üzrə elmlər doktoru, professor, Pedaqoji və Sosial Elmlər Akademiyasının akademiki, Azərbaycan Respublikasının əməkdar müəllimi*

Allahın XX əsrdə Azərbaycan xalqına bəxş etdiyi dühalar, elm korifeyləri içərisində özünəməxsus könül dünyası ilə qəlbləri riqqətə gətirən Mehdi müəllim haqqında xatirələrimi bir ahənglə ipə-sapa düzməkdə çox çətinlik çəkirəm. Dahi Azərbaycan filosofu Bəhmənyarın bu sözləri yadıma düşür, köməyimə gəlir:

"Elə adamlar axtarın ki, onlarla söhbət yaxşı kitaba bərabər olsun, elə kitablar da axtarın ki, mütaliəsi filosofla söhbətə dəysin."

Böyük filosof alimin zəngin həyat müşahidələri əsasında dediyi bu sözlər unudulmaz, həmişə yeri görünən akademik Mehdi Mehdizadəyə necə də gözəl yaraşır. Bəli, Mehdi müəllimlə hər görüşün, hər söhbətin nəticəsi çox yaxşı, əl-ələ gəzən zəngin bir kitabı oxumağa bərabər idi. Maarifimizin inkişaf yolları, pedaqogika eminin əsas istiqamətləri, perspektiv, mühüm əhəmiyyət kəsb edən məsələləri haqqında aydın təsəvvür oyadırdı.

Elm, sənət–mədəniyyət aləminin başbilənlərindən bir çoxunun fikrincə, Ü.Hacıbəyov musiqidə, S.Vurğun poeziyada, S.Bəhlulzadə təsviri sənətdə kimdirsə, M.Mehdizadə də maarif-pedaqogika aləmində məhz həmin zirvəyə yüksəlmiş böyük alim, görkəmli şəxsiyyətdir. Humanizmi, bənzərsiz xarakteri və fərdi intellektual qabiliyyətləri ilə tanıyanların könlünü



oxşayan, həmişə, hər yerdə heyranlıq yarada bilən müəllimlər-müəllimi, alimlər-alimi M.Mehdizadə çox böyük vətənpərvər, elm-maarif fədaisi, xalqına, elinə-obasına qəlbən bağlı adam idi. İlahi, insan nə qədər böyük, böyüklüyü qədər sadə, təvazökar, mətin, iradəli, dözümlü olarmış?...

Mehdi müəllimin böyük alim və dövlət xadimi olması haqqında ilk məlumatı 1953-cü ildə Cəbrayıl rayonunun Çərəkən kənd 7-illik məktəbində oxuyarkən ömrünün 60 ildən çoxunu balalarımızın təhsilinə, tərbiyəsinə həsr etmiş qocaman maarif xadimi, o illərdə məktəb direktoru işləyən Cəlil Mirzə oğlu Xəlilovdan eşitmişdim. O, bizimlə sinifdənxaric tədbirlərdə Bakıda mühüm dövlət əhəmiyyətli işlərdə çalışan həmyerli ziyalılardan söhbət açarkən professor M.Mehdizadənin və məşhur riyaziyyatçı alim Əşrəf Hüseynovun adlarını iftixarla çəkərdi. M.Mehdizadənin istedadlı pedaqoq alim və Respublika Maarif Naziri kimi böyük nüfuz qazanmasından fərəhlə danışardı və bizə deyərdi ki, Sizin içərilərinizdə də gələcəyin Mehdizadələri, Əşrəf Hüseynovları var. Çalışın, səylə oxuyun, elimizi-obamızı, xalqımızı şöhrətləndirən bu görkəmli elm xadimlərinə oxşayın, onların yolu ilə gedin. Elə o vaxtdan bu görkəmli elm adamlarını daha yaxından görmək, onların hikmət dolu söhbətlərini dinləmək arzusunda idim. Bu arzum 1960-cı ildə V.İ.Lenin adına APİ-nin I kursunda oxuyarkən həyata keçdi. Bizi – fəal tələbələri institutun məşhur akt zalına dəvət etdilər. Dedilər ki, ikinci dəfə Respublikanın Maarif Naziri vəzifəsinə təyin edilmiş professor M.Mehdizadənin gələcəyin pedaqoqlarına sözü – tövsiyəsi var. Hələ o zaman gördüm ki, çox böyük

şəxsiyyət olan bu insan elinə-obasına, onun maarif quruculuğu işlərinə ürəkdən yanır, istəyir ki, hər yerdə maarif işığı gur yansın, ömür yollarını nura qərq etsin.

Aradan bir neçə il keçdi. 1968-ci ildə Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnsititutunun aspiranturasına daxil olandan sonra Mehdi müəllimin – bu böyük vətəndaş alimin, nazirin maarif işığı ilə aşılanmış məruzələrini, söhbətlərini müntəzəm dinləmək səadəti mənə də nəsib oldu. O, nazirliyin həyata keçirdiyi bütün tədbirlərdə institutumuzun bütün elmi əməkdaşlarının, o cümlədən aspirantlarının da yaxından iştirak etməsinə imkan və şərait yaradırdı. Rayon, şəhər müəllimlərinin o zaman çox təntənəli şəkildə keçirilən ənənəvi avqust, yanvar konfranslarının, müşavirələrinin mütəşəkkil keçirilməsi işinə, geniş şəkildə aparılan eksperimentlərə biz aspirantlar da nazirliyin nümayəndələri kimi cəlb olunurduq.

Nazir M.Mehdizadə adəti üzrə müəllimlərin avqust konfranslarını, yanvar müşavirələrini keçirmək üçün yerlərə təhkim olunmuş nümayəndələri hökumət evinin ikinci mərtəbəsində yerləşən və ona çox yaraşan kabinetinə yığar, həmin tədris ili üçün qarşıda duran vəzifələri, onların əsas mahiyyətini, hər rayon, şəhərlə bağlı məsələləri xüsusi şərh edər, konkret göstərişlər verərdi. Bütün bunlardan sonra konfransın, müşavirənin keçiriləcəyi yerin təşkilinə xüsusi diqqət yetirərdi. Avqust konfransını keçirəcək nümayəndəyə dönə-dönə tapşırardı ki, əməli iş şəraitinin yaradılmasına xüsusi fikir versin. O, tövsiyə edirdi ki, müəllimlərin konfransda iştirakı nümayəndəlik qaydası ilə təşkil olunsun. Bütün məktəblər, məktəbəqədər və məktəbdənkənar tərbiyə ocaqları əhatə



edilsin. Zalda lazımi şərait yaradılsın ki, hamının diqqəti müzakirə olunan məsələlərə yönələ bilsin. Hamin gün üçün ictimai-iaşə xidmətinin nümunəvi təşkilini də vacib sayırdı. O, bütün bu təşkilati məsələləri nümayəndələrin nəzərinə çatdırırdı və sonra da imkan dairəsində necə yerinə yetirilməsinə nəzarət edirdi.

Yaxşı yadımdadır, 1971-ci ilin avqust ayı idi. Mən də ETPEİ-nin aspirantı-əməkdaşı və nazirliyin nümayəndəsi kimi müəllimlərin ənənəvi avqust konfransını keçirmək üçün Ucar rayonuna təhkim olunmuşdum. 25 avqustda artıq rayonda idim. Nazirin tapşırıqları əsasında fəaliyyətə başlamışdım. 28 avqust 1971-ci il. Saat 10-a az qalırdı. Konfransın keçiriləcəyi mədəniyyət evində Mehdi müəllimin tapşırıqlarına necə əməl edilməsilə maraqlanırdım. Elə bu vaxt şöbə əməkdaşlarından biri həyəcanla mənə dedi ki, Maarif Naziri M.Mehdizadə həyətdədir, Sizi çağırır. Düzü bu qəfil xəbərdən mən də tutuldum. Axı Mehdi müəllim nümayəndələri nazirliyə toplayanda hansı rayonda olacağı barədə bizə heç nə deməmişdi. Nə isə, tələsik həyətə çıxdım. Gördüm ki, Ucar və Göyçay rayon partiya komitələrinin birinci katibləri Sərxan İsmayılov və Rüstəm Səfərəliyevlə bir yerdədir. Səmimi görüşdük. Tapşırıqlarının necə yerinə yetirilməsi ilə maraqlandı. İşlərin öz qaydasında olduğunu bildirdim. Oradan Kürdəmirə – yeni tikilən məktəb binasına baş çəkməyə gedəcəkdi. Buna baxmayaraq bir saata qədər konfransda iştirak edəcəyini nəzərə çatdırdı.

Ucarın maarif işçiləri nazir M.Mehdizadəni çox səmimi, mehriban qarşıladılar. Əsas məruzələrdən sonra Mehdi müəllim ucarlılara xoş arzularını bildirib getmək istəyirdi. Lakin konfrans iştirakçılarının hamısı ayağa

qalxıb, bir ağızdan xahiş etdilər ki, o, konfransın işində axıradək iştirak etsin. Mehdi müəllim bu xahişə əməl etməli oldu. Bütün məruzə və çıxışları diqqətlə dinləyir, özünə müəyyən qeydlər götürürdü. Fikir verirdim, o, bütün çıxışlara diqqətlə qulaq asır, yaşlı müəllim, məktəb direktoru çıxış edəndə hörmət əlaməti olaraq ayaq üstə durar, bəzi məsələləri dialoq şəklində elə oradaca müəyyənləşdirərdi. Xüsusən onun nisbətən yaşlı müəllimlərə "Ay bacı, ay qardaş, indi Siz nə təklif edirsiniz, necə edək ki, bu məsələni həll edək, yoluna qoyaq?", – deyə bu şəkildə onlara müraciət edər, dərin və ehtiramını bildirərdi.

O, dönə-dönə tövsiyə edirdi ki, məktəbin – müəllimin iş təcrübəsini hər vasitə ilə, əsaslı şəkildə öyrənmək lazımdır. Kənd rayonlarındakı məktəblərdə çalışan müəllimlərin əməyini yüksək qiymətləndirərdi. Deyirdi ki, onlar təhsillə yanaşı, il boyu şəxsi və ictimai təsərrüfatlarda da çalışır, buna baxmayaraq bir çox sahələrdə nümunə göstərirlər.

70-80-ci illərdə respublikada keçirilən müxtəlif məzmunlu elmi-praktik konfranslarda şəhər, rayon ümumtəhsil məktəbləri müəllimlərinin fəal iştirakını, iş təcrübəsindən bəhs edən məruzələrlə çıxış etmələrini zəruri sayırdı. Mehdi müəllim intibah dövrünün böyük sənətkarı, alim və filosofu Leonardo da Vinçinin bu sözlərini tez-tez nəzərə çatdırardı: "Elm sərkərdə, təcrübə isə onun əsgəridir". Bu istiqamətdə o, pedaqoji tədqiqatlarda məktəb təcrübəsinin geniş əks olunmasını, müəllimlərin elmi mənbələrdən necə bəhrələnməsinin səviyyəsinin hər vasitə ilə üzə çıxarılmasını həmişə aktual, mühüm əhəmiyyət kəsb edən bir məsələ hesab edirdi...



1980-ci il fevral ayının 12-də xalq maarifi sahəsində uzun illər səmərəli işlədiyinə görə Mehdi Məmməd oğlu Mehdizadə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif olunub və ondan bir neçə gün sonra təqaüdə çıxması ilə əlaqədar nazir vəzifəsini tərk edəndən sonra da o, xalqın, çoxsaylı maarif ordusu üzvlərinin sevimlisi oldu. Fəal çıxışları, yeni-yeni əsərləri ilə elmi-pedaqoji ictimaiyyətin dərin rəğbətini qazandı. Təqaüdə çıxandan sonra ictimai əsaslarla Azərbaycan ETPEİ-nin elmi məsləhətçisi kimi fəaliyyət göstərəndə mən onunla daha tez-tez görüşürdüm. Belə ki, o, institutda yeni yaranan "Mühüm pedaqoji problemlər" üzrə elmi-nəzəri seminarın rəhbəri, mən isə elmi katibi idim. Ayda bir dəfə keçirilən məşğələlərin mövzusu, keçirilmə vaxtı "Azərbaycan müəllimi" qəzetində elan olunur, maraqlananlar dəvət edilirdilər. məşğələlər canlı və maraqlı, faydalı müzakirə şəraitində keçirdi.

Akademik M.Mehdizadə seminar məşğələlərinin mövzularını müəyyənləşdirərkən tanınmış pedaqoq-psixoloq alimlərlə yanaşı, hələ adı-sanı olmayan elmi işçilərin, aspirantların da çıxışlarını plana daxil etməyi məsləhət görürdü. Belə işlərdə yüksək titul məsələsinə o qədər də əhəmiyyət vermirdi. Deyirdi ki, elə mövzu, problem var ki, onu tədqiq edən aspirant, kiçik elmi işçi daha yaxşı bilir. Bu imkandan layiqincə istifadə etmək lazımdır. Mehdi müəllimin alicənablığı, humanistliyi, hamıya, hər kəsə qayğı ilə yanaşması burada da özünü göstərirdi.

M.Mehdizadənin səyi və təşəbbüsü ilə 1980-1983-cü illər arasında təlim və tərbiyənin bir sıra aktual problemləri, o cümlədən estetik tərbiyə problemi üzrə

respublika elmi-praktik konfransları keçirildi. O, həmin konfranslarda ediləcək məruzələrlə maraqlanır, müəlliflərlə görüşür, onlara faydalı istiqamət verirdi. Çox möhkəm yaddaşı var idi. Antik dövrdən üzü bu yana bütün mütəfəkkirlərin, filosof, pedaqoq alimlərin fikirlərini sitat şəklində əzbər deyirdi. Mehdi müəllimlə hər görüşü qənimət sayırdıq. Buna görə də tez-tez onun Bilgəhdəki çox sadə bağ evində olurduq. Yol boyu və bağda işləyərkən də elmdən söhbət açır, ümumi inkişafda, tərəqqidə elmin aparıcı rol oynamasını tutarlı dəlillərlə izah edirdi.

Mehdi müəllimin keçmiş SSRİ Pedaqoji Elmlər Akademiyasında da nüfuzu çox böyük idi. 1978-ci ildən fəaliyyətini dayandıranadək akademiyanın Estetik Tərbiyə üzrə Elmi-Problem şurasının üzvü kimi Moskvada ezamiyyətlərdə olarkən görürdüm ki, Bədii Tərbiyə İnstitutunun direktoru Boris Timofeyeviç Lixaçov, Tərbiyənin Ümumi Problemləri İnstitutunun direktoru Georgi Nikolayeviç Filonov və başqaları hələ Mehdi müəllimin sağlığında onu yüksək qiymətləndirir, bir sıra məsələlərdə onunla məsləhətləşirdilər. Təsəvvür edin, SSRİ PEA-da ən mübahisəli məsələlərin müzakirəsində əksər hallarda son sözü akademik M.Mehdizadə deyirmiş. Ən mübahisəli məsələlər üzrə seçkilərdə komissiyanın sədri M.Mehdizadə olarmış. Yaxşı bilirlərmiş ki, Mehdi müəllim olan yerdə haqq-ədalət, şəxsiyyətə hörmət var. Bəli, ittifaq miqyasında belə tutumlu nüfuz qazanmaq hər adama nəsib olan iş deyil.

Mehdi müəllimin arzuları çox böyük idi. O, XXI əsr məktəbinin başlıca problemləri üzrə tədqiqatlara indidən başlamağı tövsiyə edirdi. Özü də bu işdə fəal olacağını



bildirirdi. Lakin amansız ölüm onu cismən bizdən ayırdı. 1984-cü il mayın 1-də dünyasını dəyişdi. Onsuz keçən ötən illərdə mənən həmişə Mehdi müəllimlə bir yerdə olmuşuq. Hər addımda onu dönə-dönə məhəbbətlə xatırlayırıq, nurani simasını görürük, səsini eşidirik, müdrik nəsihətlərini dinləyirik. Onun zəngin pedaqoji irsi, bir-birindən dəyərli, fundamental əsərləri xalq maarifinin, pedaqogika elminin ən müasir problemlərinin tədqiqi, həlli yolunda karımıza gəlir, ziyası tükənməyən bir mayak kimi bizə doğru, düzgün yol göstərir.



# İLLƏR ÖTÜB KEÇSƏ DƏ...

*LƏTİFƏ MEHDİZADƏ,*
*həyat yoldaşı*

Mehdi müəllim həyatın hər anında diqqətli və qayğıkeş olmuşdur. Belə ki, o, müharibə illərində dörd il ordu sıralarında xidmət edərkən göndərdiyi qayğı dolu məktubları ilə bizi sevindirmişdir. Hər məktubunda ailənin dolanacağı, uşaqların vəziyyəti ilə maraqlanar və bizə təsəlli verərdi. Mən isə o ağır illərdə Cəbrayıl rayonunda qəsəbə orta məktəbində işləyir, ailənin dolanacağını təmin edirdim. Müharibə qələbə ilə qurtardıqdan sonra sevinc dolu, xoşbəxt günlərimiz öz qaydası ilə davam etməyə başladı. Mehdi çox qayğıkeş, diqqətli ailə başçısı və mehriban ata idi. Hamı ilə səmimi rəftar edərdi. Əlli ildə onun bir dəfə də olsun bərkdən danışdığını, səsinin tonunu qaldırdığını eşitmədim. Nəvələr bizdə olarkən onlarla maraqlı söhbətlər etməkdən doymazdı. Kiçik yaşlı uşaqlar onu işdən ayırsa belə, onlara acıqlanmaz, arzularına müvafiq əyləncələrlə onları məşğul edərdi.

Qonaq getməyi bir o qədər də xoşlamazdı. (Bu cəhət işinin həddindən çox olması ilə bağlı idi.) Qonaq qəbul etməkdən isə xüsusi zövq alardı. Xüsusən, kənddən gələn qonaqlarımız olanda kənd həyatından məzəli söhbətlər edər, keçmiş günlərdən şirin xatirələri yada salardılar. Anasına və mənim anama qarşı daha diqqətli idi. Anası xəstə yatarkən hər gün ona baş çəkər, hal-əhval tutardı. Mənim anama qarşı da eyni xoş münasibət, səmimiyyət göstərərdi. Anam bizdə xəstə yatarkən (Mehdinin tapşırığı



ilə bizdə qalardı) onun müalicəsi ilə yaxından maraqlanardı. Heç yadımdan çıxmaz, yaxın qohumlarımdan anamı yoxlamağa gəlmişdilər. Xəstəni ağır vəziyyətdə görüb onu öz evinə aparmaq istədilər. Anam isə hörmət və ehtiram əlaməti olaraq Mehdidən icazə almalarını xahiş etdi. Mehdi isə qohumların, həm də anamın xətrinə dəyməmək üçün "Kəbleyi ana, özün ixtiyar sahibisən, ürəyin necə istəyir, elə də et", – deyə fikrini bildirdi. Bəli, sözlə deyə bilmədiyim bu xoş münasibətlər qohumlar və yaxınlar arasında onun hörmətini qat-qat artırırdı. Məhz bu kimi xüsusiyyətləri ilə onu tanıyanların qəlbində özünə möhkəm yer tutmuş, respublikanın çoxsaylı müəllim ordusunun etimadını qazanmışdı. Bax elə buna görədir ki, indi də yeri gələndə həmkarları, dost-tanışları onun haqqında xoş məramlı söhbət edir, ruhuna rəhmət deyirlər.

1981-ci il oktyabr ayının 3-də M.F.Axundov adına Azərbaycan Dövlət Opera və Balet Teatrının binasında müəllim günü münasibətilə yığıncaq keçirilirdi. O vaxt Mehdi müəllim artıq nazir deyildi. Təqaüdə çıxmışdı. Buna baxmayaraq, həmin təntənəli tədbirə dəvət olunmuşdu. Xalq yazıçısı İsmayıl Şıxlı öz çıxışında müəllimlik sənətinin müqəddəsliyindən söhbət açarkən Mehdi müəllimin adını böyük iftixarla çəkdi, şəxsi nümunəsini yüksək qiymətləndirdi. O sözünü qurtarmamış yığıncaq iştirakçıları ayağa qalxaraq Mehdi müəllimi sürəkli alqışlarla qarşıladılar. Təəssüf ki, bu mənzərə o zaman təntənəli yığıncaqda iştirak edən Azərbaycan KP MK-nın nümayəndəsinin xoşuna gəlmədi (həyatdan getdiyi üçün adını çəkmək itəmirəm). O, nəinki alqışlara qoşuldu, hətta zala çəpəki nəzər salaraq öz narazılığını

bildirdi. Evə qayıdanda məclis iştirakçılarından bəziləri bu münasibət ilə maraqlandıqda cavabı belə oldu: Yüksək kürsüdə oturanlar adət ediblər, özləri alqışlananda məmnun olurlar. Belə hallara çox da fikir verməyin. Bəli, həyat çoxdan sübut edib ki, el üçün, xalq üçün ürəkdən, təmənnasız çalışanlar xalq tərəfindən qiymətləndirilir, dünyasını dəyişəndən sonra belə xalqın qəlbində əbədi yaşayırlar. Nə yaxşı ki, Mehdi müəllimin övladları da elm-maarif yolunu seçdilər. Oğlumuz Rafiq texnika elmləri doktoru, professordur. Qızlarımız Elmira və Nailə Azərbaycan Dövlət Neft Akademiyasının dosentidirlər. Zemfira Mehdizadə isə pedaqoji elmlər namizədidir.

## O HAMINI XOŞBƏXT GÖRMƏK İSTƏYİRDİ...

***NAİLƏ MEHDİZADƏ,***

*qızı,*

*Azərbaycan Dövlət Neft Akademiyasının dosenti*

Əsil insanlığa layiq olan bütün keyfiyyətlər atamın şəxsiyyətində parlaq şəkildə nəzərə çarpırdı. Hamını xoşbəxt görmək istəyirdi. Heç kəs haqqında pis fikrə düşməzdi, pis söz söyləməzdi. Çalışırdı ki, qarşısındakı insanda olan yaxşı keyfiyyətləri görsün. Onun özünə həmin keyfiyyətləri elə ustalıqla izah edirdi ki, istər-istəməz heyranlıq yaradırdı.

Atam təbiətən çox mülayim insan idi. Qan qaralığa – əsəb gərginliyi yaratmağa meyl etməzdi. Ailə üzvləri və



onun qəbuluna gələnlər üçün hər hansı bir məsələni çox böyük nəvazişlə, həyati faktlarla izah edirdi, başa salırdı. Buna görə də heç kim ondan incimirdi, hamı razı qalırdı. Bəzən hər hansı hərəkətimizdən narazı qalsa da bizə bir söz deməzdi. Öz hərəkəti və xarakterik misallarla bizə müsbət təsir göstərərdi.

O, hamıya əsil insani münasibət bəsləyərdi. Qonşularla, qohumlarla da səmimi münasibətdə olurdu. İşinin çox, gərgin olmasına baxmayaraq evə gələndən sonra hər birimizin təhsili, həyat tərzi ilə maraqlanardı.

Atam heç vaxt işdə olanları evdə danışmazdı. Evdə ancaq həyat-məişət məsələləri haqqında söhbət gedərdi. Belə söhbətlər qış aylarında daha maraqlı keçər, saatlarla davam edərdi. Kənddə yaşayan qohum-tanışlardan xəbər tutar, dəyərli məsləhətlərini nəzərə çatdırardı.

Ömrünün sonuna qədər dəyişmədiyi, çox da münasib olmayan mənzilimiz məşhur Qız qalasının lap yaxınlığında yerləşirdi. Buna görə də axşamlar dənizkənarı bulvarda gəzməyi çox xoşlayardı. Adətən biz də onunla gedirdik. Yeri gəlmişkən deyim ki, o vaxtlar (keçən əsrin 60-70-ci illərini nəzərdə tuturam) şəhərin ən görkəmli, tanınmış adamlarının, ziyalıların, ədəbiyyat-incəsənət xadimlərinin, şairlərin, yazıçıların, bəstəkarların, rəssamların demək olar ki, əksəriyyəti dənizkənarı bulvara axşam gəzintisinə çıxardılar. Atam onların hamısı ilə səmimi görüşər, onları bizə tanıdardı. Biz də bu tanışlıqdan məmnun olardıq. Maraqlı cəhət bu idi ki, atamın həmin ziyalılar, söz-sənət adamları haqqında aydın təsəvvürü var idi. Hər birini xarakter əlamətləri ilə dəyərləndirirdi.

Atam sözün həqiqi mənasında böyük pedaqoq, maarifçi, tərbiyəçi idi. Bizə doğru-düzgün yol göstərərdi. Deyirdi ki, hər biriniz həyatda müstəqil olaraq öz yolunuzu seçməlisiniz, bu yolda inamla addımlamağı bacarmalısınız.

Seçdiyiniz yol aydın məqsəd naminə inama, hərəkətə zəmin yaratmalıdır. Bu yol saf arzu və amalla aşılanmalıdır. Həmişə, hər an ömrünüzün müxtəlif anlarında başınızı uca etməlidir. Bu gün çox böyük fəxr və iftixarla deməliyəm ki, qardaşım Rafiq, bacılarım Elmira, Zemfira bu geniş həyat yollarında atamın nəsihətlərini heç zaman unutmadılar. Tam əminliklə deyə bilərəm ki, qədirbilən xalqımızın qəlbində həmişəyaşarlıq yeri tutan atamın ruhu şaddır. Vaxtilə onun tələbələri sırasında olanlar, 25 ilə yaxın bir müddətdə respublikanın maarif naziri vəzifəsində çalışarkən əhatəsində, tabeçiliyində olan mütəxəssislərin müxtəlif yığıncaqlarda, əlamətdar tədbirlərdə, radio-televiziya verilişlərində, mətbuat səhifələrində əziz, unudulmaz atamız haqqında xoş söz söyləyərkən qəlbimiz qanuni iftixar hissi ilə döyünür.

Çox şadıq ki, onu həmişə, hər an böyük məhəbbətlə xatırlayırlar, yada salırlar. Buna görə də Mehdi Mehdizadələr ailəsi, yaxınları, doğmaları adından qədirbilən xalqımıza böyük ehtiram və minnətdarlığımızı bildiririk.



# HƏKK OLUB ŞÜURLARA DƏRSLƏRİ MEHDİZADƏNİN

*Bu şeir pedaqoji elmlər doktoru, professor Vidadi Xəlilovun, tədqiqatçı biblioqraf, respublikanın təhsil əlaçısı Hidayət Musayevin tərtibçiliyi və pedaqoji elmlər doktoru, professor Əjdər Ağayevin elmi redaktorluğu ilə çap olunmuş "Akademik Mehdizadə ömrünün işığı" kitabının təsiri ilə yazılmışdır. Kitabın nəşrində əməyi olanlara Mehdizadələr ailəsi adından dərin minnətdarlığımızı bildiririk!...*

Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

Ömrünün altmış ilin maarifə qurban elədi,
Gətirib çox yenilik, çoxların heyran elədi.
Pedaqoq alim idi elmini şayan elədi,
Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

O, müəllim adını daim uca tutmuş idi,
Müəllim əməyinə hörmətlə yanaşmış idi.
Tutduğu kürsüyə öz zəhmətilə çatmış idi,
Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

Xatirə söyləyərək ruhunu şad eylədilər,
Verərək qiymıəti ustadı rəşad eylədilər.
Sevindirərək bizi, bax necə şad eylədilər,

Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

Vaxtını sərf eləyərdi elmin inkişafına,
Təhsilin sirlərini açardı məsləkdaşına.
Elə fərq qoymaz idi yoldaşına, qardaşına,
Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

O ağsaqqal idi pedaqoji elmimizə,
Onu təbliğ eləyən alim idi ölkəmizə.
Elmdə örnək ola yaşlı, cavan nəslimizə,
Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

Ömrünün işığıydı verdi ona qiymətini,
Dostları yad elədi bir də onun xidmətini,
Getməyən heç də hədər ömrü boyu zəhmətini.
Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

Onun əməllərini biz də sizintək sevirik,
Açdığı yollar ilə biz də sizintək gedirik,
Elm fədaisinə daima rəhmət diləriк.
Var imiş gör nə qədər dostları Mehdizadənin?!
Həkk olub şüurlara dərsləri Mehdizadənin!

**RAMİZ MEHDİZADƏ**



## MÜNDƏRİCAT

«Nərgiz-R» Nəşriyyat-Poliqrafiya firması

**«Nərgiz» nəşriyyatı**

Texniki redaktor: ***Kəmalə Məmmədova***
Korrektor: ***Yasəmən İsmayılova***
Dizayn: ***Yeganə İmanova***
Mətn yığımı: ***Lətifə Məhərrəmova***
Mətbəə müdiri: ***Akif Musayev***
Çapçı-operator: ***Nail Əliyev***

Çapa imzalanmışdır: 05.09.2012
Kağız formatı: 60x84 1/16
Həcmi: 29,75 çap vərəqi
Tiraj: 500 nüsxə; Sifariş: 909



Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyi tərəfindən 1998-ci ildə qeydə alınmışdır.
Şəhadətnamə № 45.
Ünvan: 8-ci km qəsəbəsi R.Rüstəmov küç. 36
Nəşriyyatla əlaqə telefonları: 323-69-53
050-738-37-22



## XƏLİLOV VİDADİ [redacted]

25 dekabr 1942-ci ildə Cəbrayıl [redacted] kəndində anadan olub. 1959-cu ildə orta məktəbi, 1964-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu (indiki Azərbaycan DÖvlət Pedaqoji Universitetini) bitirmişdir. Azərbaycan Dövlət Elmi-Tədqiqat Pedaqogika İnstitutunun (indiki Təhsil Problemləri İnstitutunun) aspirantı (1968-1971-ci illər) olmuşdur.

Aspiranturanı bitirdikdən sonra institutda kiçik elmi işçi, baş elmi işçi, estetik tərbiyə şöbəsinin müdiri (1977-2000-ci illər) vəzifəsində çalışmışdır. 1975-ci ildə namizədlik, 1994-cü ildə doktorluq dissertasiyasını müdafiə etmişdir. Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının 14 noyabr 1997-ci il tarixli qərarı ilə ona professor elmi adı verilmişdir. Professor V.C.Xəlilov gənc nəslin estetik tərbiyəsi probleminə həsr olunan 40 adda monoqrafiya, proqram və dərsliyin, metodik vəsaitin, yüzlərlə elmi məqalənin müəllifidir. 2011-ci ildə Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü (akademik) seçilmişdir.

Azərbaycan Dövlət və Radio Verilişləri Şirkətinin qızıl fondunda saxlanılan "Əsrə bərabər ömür" (akademik M.Mehdizadəyə həsr olunub), "Bəstəkar Süleyman Ələsgərov" televiziya filmlərinin ssenari müəllifidir.

Azərbaycan Respublikası Prezidentinin 2006-cı il 26 dekabr tarixli sərəncamı ilə təhsilin inkişafında xidmətlərinə görə ona Azərbaycan Respublikasının əməkdar müəllimi fəxri adı verilmişdir.

---

## MUSAYEV HİDAYƏT AĞAKİŞİ OĞLU



1956-cı ildə Qərbi Azərbaycanın Allahverdi rayonunun Böyük Ayrım kəndində anadan olub. 1979-cu ildə Bakı Dövlət Universitetini bitirib.

H.Musayevin Respublika Elmi Pedaqoji Kitabxanasının xətti ilə 1992-ci ildə çap etdirdiyi "Akademik M.Mehdizadə" biblioqrafik məlumat kitabçası (anadan olması münasibətilə 90 illiyi münasibətilə) bu böyük alimin, ictimai xadimin həyat və fəaliyyəti haqqında aydın təsəvvür yaradır.

"Bayatı estetikası" (1996), "Mehdizadə ömrünün işığı" (V.Xəlilovla birlikdə, 1997), "Laylalı bulaq" (şeirlər), "Elxan Xəzər özü və sözü" (2005), "Göy var göydən yuxarı" (2012) kitablarının, "Əhməd Seyidov" (1992), "Professor Vidadi Xəlilov" (1999) biblioqrafik göstəricilərinin, 3 adda elmi-metodik kitabçanın müəllifidir. Akademik Mehdi Mehdizadə adına, "Qızıl Qələm" mükafatları laureatıdır.

H.Musayevin təşəbbüsü və elmi redaktorluğu ilə çap olunan bir sıra vəsaitlər respublikamızda maarifçilik işlərinin səmərəliyinə, təhsil islahatının uğurla həyata keçirilməsinə əhəmiyyətli təsir göstərmişdir.